**Ə.Məmmədov. Köhnə tanışlar.**
Bakı, "Şərq-Qərb" Nəşriyyat evi, 2011, 568 səh.

Əvəz Məmmədovun bu kitabında yeni satirik və yumoristik şeirlər və əvvəllər çapdan çıxmış "Dədəmin məsləhəti", "Gülmə qonşuna...", "Niyə susdun", "Sənə nə", "Dünya çətin düzələ" və "Qalmaz bu dünya belə..." kitablarına daxil olmuş seçilmiş yazılar toplanmışdır.

Bu şeirlər cəmiyyətimizdə kök salmış əliəyrilərin, rüşvətxorların, bürokratların ifşasına yönəlmişdir.

Müəllif əruz vəzninin müxtəlif bəhrlərində yazdığı satirik şeirlərdə inkişafımızı ləngidənlərin, yüngül həyat tərzi keçirənlərin iç üzlərini açmağa çalışmışdır.

**ISBN 978-9952-34-729-6**

© Ə.Məmmədov, 2011
© "Şərq-Qərb", Nəşriyyat evi, 2011

# ÖN SÖZ

Şairlik Allah tərəfindən verilən fitri istedaddır. Onu nə təhsillə, nə də mütaliə ilə qazanmaq mümkündür. Kimin qəlbində poeziya qığılcımı, odu varsa, gec-tez onun “tüstüsü” çıxmalıdır. Poeziya təkcə söz sənəti ilə deyil, başqa-başqa sənət növlərində də özünü büruzə verir. Mən ustad bir xanəndənin şaqraq zənguləsini, çiçəkli dağ yamacında sürüsünü yaylıma verən çobanın yanıqlı “Çobanbayatı” çalmasını, cavan xalçaçı qızın ürəkdən vurduğu min bir rəngli naxışlarını öz qəlbinin poeziyasını ifa etməsi kimi baxıram.

Şair dostum Əvəz Məmmədov da fitri istedad sahibidir. Ə.Məmmədovun həyatı keşməkeşli və əzablı olub. Kiçik yaşlarından atasını itirmiş, böyük qardaşının himayəsində ali təhsil ala bilmişdir. Azərbaycan Politexnik İnstitutunun mexanika fakültəsinin avtomobil şöbəsini bitirdikdən sonra təyinatla Şimali Osetiyada avtonəqliyyat müəssisəsində əmək fəaliyyətinə başlamışdır. Bir müddətdən sonra Bakıya gələrək Azərbaycan Respublikasının Nəqliyyat Nazirliyində müxtəlif vəzifələrdə çalışmışdır. Hələ orta məktəbdə ikən satirik şerlər yazmışdır. Artıq qırx ilə yaxındır ki, dövrü mətbuatda satirik şerlərlə çıxış edir. Beş kitabın və “İki məhəbbət”, “Şirinlik”, “Sələmçi” kimi 3 musiqili komediyanın libretto müəllifidir. “Şirinlik” pyesi Bakı Tənqid Təbliğ Teatrının kollektivi tərəfindən 1994-cü ildə hazırkı Ümummilli Liderimiz Heydər Əliyevin adını daşıyan sarayda tamaşaya qoyulmuşdur.

Ə.Məmmədov əlinə qələm aldığı gündən ancaq bir janrda – satira janrında yazıb-yaradır və ömrü boyu bu janra sadiq qalır. söhbətlərində və böyük satirik şairimiz Sabirə yazdığı nəzirələrdə həmişə bu ölməz sənətkarı özünə müəllim hesab edir. Onun şerləri günün nəbzini tutmaq cəhətincə Sabir ruhuna çox yaxındır. Məlum olduğu kimi, poeziyada əruz vəzni ən çətin vəzn hesab olunur. Ə.Məmmədov əksər şerlərini bu vəzndə yazır və müvəffəq olur.

*Elmə həvəsim söndü zəmanə dəyişəndən,*
*Yumşaq yerə göydən naşı zənbillə düşəndən.*
*Gündən-günə xeyli kökəlib, qarnı şişəndən, -*
*Diplomsuz əgər ildə tapırsa təzə bir post,*
*Diplom nə gərəkdir mənə bundan belə, ey dost!*

Əvəz gözü ilə gördüyü, qulağı ilə eşitdiyi mövzuları yazır. O, şeirlərini çap etdirməyə tələsmir. Onların üzərində zərgər dəqiqliyi ilə işləyir.

Ə.Məmmədov altmışıncı illərdən dövrü mətbuatda satirik şerləri ilə çıxış edir. İlk şeri "Təbliğatçı" jurnalında dərc edilib. "Kirpi", "Bakı", "Azərbaycan gəncləri", "Ulduz" jurnalı və "Ədəbiyyat qəzeti" onun ən çox çap olunduğu mətbuat orqanlarıdır. "Gülmə qonşuna", "Dədəmin məsləhəti", "Niyə susdun", "Sənə nə?", "Dünya çətin düzələ" kitablarında toplanan şerləri onu püxtələşmiş bir şair kimi tanıda bilmişdir.

Müasirlik onun şerlərinin başlıca meyarıdır.

"Vallah, belə olmaz!" şerində yazır:

*Hay-küylü qəzet var ki, yolundan azır hərdən,*
*Əndazəyə heç sığmayan hədyan yazır hərdən.*
*Bədbəxtdi, özüyçün beləcə gor qazır hərdən*
*Yazdıqları qondarmadı, yaxud da ki, lağ-lağ,*
*Uydurma yazır, millәti çaş-baş salır ancaq.*

Əvəz Məmmədov sədaqətli dost, səmimi, mehriban bir insandır. Onunla etdiyim qırx illik dostluqdan fəxarət duyuram. Ona can sağlığı və yeni yaradıcılıq uğurları arzu edirəm.

**Əli Səmədli**

## EY DOST!

Əsrin yaşına çatmağa can atmamışam mən,
Dövran çox atıb qəm gölünə, batmamışam mən.
Ömrümdə gəda kölgəsində yatmamışam mən.
Bədxah olanın da yerini etməmişəm dar,
Allaha təvəkkül, yazıram, çünki səbəb var.

Yazdıqlarımın ağrısını çəkmişəm hərdən,
Əfsus ki, nə baş verdiyini bilməmisən sən.
Allah özü imdada çatıb dikəlmişəm mən.
Zərbə vuran hərçənd utanıb, etmədi heç ar,
Allaha təvəkkül, yazıram, çünki səbəb var.

Dünyanın əgər faniliyin bilirsə hər kəs,
Neyçün görəsən haqqa dayaq az tapılır bəs?!
Cürət eyləyib arxalı da çıxartmır heç səs.
Şəksiz ki, bu halı aləmə etməliyəm car,
Allaha təvəkkül, yazıram, çünki səbəb var.

Dövran dəyişir, tək-tük "alaqlar" kök atırlar,
İstəklərinə min cürə yollarla çatırlar.
Dinc durmayıb, hərdən aranı hətta qatırlar.
Vallah, bədəməl əvvəl-axır olmalıdır xar,
Allaha təvəkkül, yazıram, çünki səbəb var.

Dünya malını qamarlayan indi də çoxdur.
Gendən baxan ancaq düşünür ki, gözü toxdur.
Dindir, görəcəksən ki, heç insanlığı yoxdur.
Tənqid də belə tiplərə əsla eləmir kar.
Allaha təvəkkül, yazıram, çünki səbəb var.

*27.11.2008*

## DUR

Olmasa mərdimazar, bağda çəpər-zad nə gərək,
Eləsi olsa qohum, şər atmağa yad nə gərək.
Olsa bir nəm-nişanı, tanıtmağa ad nə gərək
Çox güman isti aşa soyuq suyu qatan odur,
Özgənin bostanına qərəzlə daş atan odur.

Yastı-yastı danışar, gizli tələ qurmaq üçün,
Gözləyər, məqam gəzər, qəfil zərbə vurmaq üçün.
Çəkinib ar eyləməz, hətta üzə durmaq üçün.
Uyduran, düzüb-qoşan, yağlı yalan satan odur,
Özgənin bostanına qərəzlə daş atan odur.

Aramızda hələ ki, sayca elə çox da deyil.
Vərdişindən əl çəkən, bəlkə də var, yox da deyil.
Dolanan var kefikök, amma gözü tox da deyil.
Gözü əllərdə qalan, qoltuqlarda yatan odur,
Özgənin bostanına qərəzlə daş atan odur.

Olsa lap vəzifədə, tərgitməyir bəd əməlin.
Çünki bu adətinin, çoxdan qoyubdur təməlin.
Tövbə etməz beləsi, lap "kəsələr" də bir əlin.
Şübhəsiz, ömrü boyu çox günaha batan odur,
Özgənin bostanına qərəzlə daş atan odur.

Tarixən mərd adamın namərd olubdur qənimi.
Ev yıxanda, bu işin tapır əlüstü çəmini.
Səmti azdırmaq üçün dəyişsə də görkəmini,
Çoxları agah olur, maskalı şarlatan odur.
Özgənin bostanına qərəzlə daş atan odur.

*28.04.2009*

## SƏNƏ NƏ?

Kəmsavad arxa tapıb, keyfə baxırsa, sənə nə...
Cibinə müftə gəlir, hardan axırsa, sənə nə...
Bərq vuran, şölə saçan üzük taxırsa, sənə nə...
Başa düş zəman qəni, sus, daha çıxmasın səsin,
Harda olsa bir tikə ruzisi vardır hər kəsin.

Müşkül iş olsa əgər, "mən taparam çarə", demə,
Yığıla cümlə cahan, sən "qatığa qarə", demə. –
"Dara düşsəm, çatacaq dadıma pul-parə", demə,
Allaha bağla ümid, ta tükənincə nəfəsin,
Harda olsa bir tikə ruzisi vardır hər kəsin.

Döşünə döyənlərin bir parası düşdü dara,
Varı da, dövləti də gəlmədi hərçənd ki, kara.
Bilmədik heç nə zaman "dincəlməyə" getdi hara.
Bundan ibrət götürüb, hər yetən "mən", "mən" deməsin,
Harda olsa bir tikə ruzisi vardır hər kəsin.

El gözündən düşən, heç vaxt gedə bilməz qabağa,
Yad eylə keçmişini, çıxma cızından qırağa.
Heç zaman lovğalanıb, arxasızı qoyma lağa.
Yaxşılıq et ki, səni ömrü boyu yad eləsin,
Harda olsa bir tikə ruzisi vardır hər kəsin.

Hər işə qəmiş qoyub ağıllı sayma özünü,
Vadar etmə heç kəsi nöqsana yumsun gözünü,
Cürətin varsa əgər, şax üzə de hər sözünü,
Eybi yoxdur nə olar, dinləməyən, dinləməsin.
Harda olsa, bir tikə ruzisi vardır hər kəsin.

Rubəru dayanmısan çətin zamanla, səbr eylə,
Günü vursan da başa ahu-amanla, səbr eylə.
Hələlik sən də barış, yaxşı-yamanla, səbr eylə.
Fani dünyada çalış taleyin üzü dönməsin,
Harda olsa, bir tikə ruzisi vardır hər kəsin.

*28.04.2009*

## KÖHNƏ DÖVRAN DƏYİŞİB...

Kor atı köndələnə şəstlə çapanlar var idi,
Hər qəliz müşkül işə çarə tapanlar var idi.
Muzdunu hopp eyləyib göydə qapanlar var idi.
Atsa da bu gün kaman, bir hədəfə dəyməz oxu,
O zaman kef çəkənin indi lüt-üryandı çoxu.

Mat qalır yoldan ötən bəzisinin üst-başına,
Zəmanə çünki soyuq su qatdı isti aşına.
Geydiyi "Retro" libas da heç yaraşmır yaşına.
At nədi, lap ulağa bəlkə minər çatsa "duxu",
O zaman kef çəkənin indi lüt-üryandı çoxu.

Hara getdi görəsən dövləti, malı... nə bilim...
Kövrələr bəlkə çoxu görsə bu halı... nə bilim...
Düşünər ki, bəd atıb, olub havalı... nə bilim...
Mülkü yox, sərvəti yox, bircə otaqdı var-yoxu,
O zaman kef çəkənin indi lüt-üryandı çoxu.

Zamanın məngənəsi qudurğanı sıxdı, özü,
Atılıb-düşsə də çox birdəfəlik yıxdı, özü.
Müftə yığdıqlarının axırına çıxdı, özü.
Düşünəndə keçmişi, zənn eyləyir görüb yuxu,
O zaman kef çəkənin indi lüt-üryandı çoxu.

Arxayın olmasın heç kəs, nə yığıbsa qalacaq,
Tanrı çox yaxşı görür, haram nə varsa alacaq.
Çox güman, müflis olan düz yolu çaşbaş salacaq
Tanrı eyni yaradıb çox heyf ki, acla toxu...
O zaman kef çəkənin indi lüt-üryandı çoxu.

*11.09.2007*

## LƏKƏ SALMA ADINA...

Çox da çəkmə özünü, bəllidi keçmişin sənin,
İndi də qərəzlidi, ay kişi, hər işin sənin.
Nəfsinin “bəhrəsidir” bəlkə bu vərdişin sənin.
Baxma ki, işdə sənin çoxdu keçən sağ-soluna,
Ləkə salma adına, qayıt Allahın yoluna!

Daş atıbsan nə qədər tuşladığın səmtə sarı,
Düz yola gəlməmisən, ömrünü etsən də yarı.
Bəd əməldən nə ola, əl çəkəsən indi barı.
Çox zaman qulbeçələr, hətta girirlər qoluna,
Ləkə salma adına, qayıt Allahın yoluna!

Hələ də göylə gedirsən, yerə dəymir ayağın,
Çox güman ki, pul olur lap bəd ayaqda yarağın
Şübhəsiz, fısın yatar, laxlasa arxan-dayağın.
Tərpədərlər səni də, arxayın olma puluna,
Ləkə salma adına, qayıt Allahın yoluna!

Bilmək olmur, a kişi, sən nə sayırsan özünü,
Yığdığın pul-paralar yoxsa tutubdur gözünü”?
Yan cibin xətrinə bəzən də danırsan sözünü.
Görünür müftə pulun sən də dönübsən quluna,
Ləkə salma adına, qayıt Allahın yoluna!

Əbədi mənzilini unutma, hərdən yada sal,
Sərvətin olsa belə, sən necə varsan elə qal!
Haqq yolun tutanlara yoxdu bu dünyada zaval!
Kaş ki, bu beş-on sözüm yaddaşına həkk oluna,
Ləkə salma adına, qayıt Allahın yoluna!

*27.08.2010*

## YOXDU ZAVAL

Yel əsən səmtə əyildin, ləkə saldın adına,
Bu işin aqibətin salmadın əsla yadına.
Yan cibin doldusa da, getdin axırda badına.
Sancıb artıq dalağın, başlayacaq sorğu-sual,
Günahı olmayana məhkəmədə yoxdu zaval.

Kef çəkibsən, tutalım xeyli zaman, bəs axırı?
Gördüyün çirkli işin çıxdı axır ki, paxırı,
Var məsəl: bircə dana rüsvay edər bir naxırı.
Sən də etdiklərini unutmusansa, yada sal,
Günahı olmayana məhkəmədə yoxdu zaval.

Azdırdı ağlını da pul-paranın gəlhagəli,
Son zamanlar dəyişib sən olmuşdun, sanki, zəli,
Bilməliydin ki, yıxır hər kəsi öz bəd əməli.
Şəkk edirsənsə əgər, dost-tanışından xəbər al,
Günahı olmayana məhkəmədə yoxdu zaval.

Müftə pul pərdələdi gözlərini, ağ eylədin.
Toyda-yasda gördüyün tay-tuşuna lağ eylədin,
Başına fırlananın kef damağın cağ eylədin.
Zənn edirdin olacaq şəkk qulağı kar, dili lal,
Günahı olmayana məhkəmədə yoxdu zaval.

Kürsüdən dil-dil ötən, indi döyürsən gözünü,
Kişisən, boynuna al günahını, de, sözünü.
Ağ yalanlar uydurub, haqlı sayırsan özünü?!
Heç utandınmı barı, dönüb baxanda sənə zal,
Günahı olmayana məhkəmədə yoxdu zaval.

Toplamışdın başına çox güman öz taylarını,
Xor baxıb el malına, alırdılar “paylarını”.
Sayacaqlar “orada” günlərini, aylarını.
Ayıq ol, kəsildi iş, topla gör oldu neçə “bal”,
Günahı olmayana məhkəmədə yoxdu zaval.

*30.08.2007*

## DAŞ ATIB, BAŞ TUTACAQ...

Dəm vurarsan, a kişi, haqdan, ədalətdən özün,
Əməlinlə niyə bəs tərs mütanasibdi sözün.
Yerli-yersiz baş əyən, yaltağı görmürmü gözün?!
Sənin də bostanına xəlvəti hərdən daş atır,
Görünür sərfəlidir ki, hələ kölgəndə yatır.

Səsdədir şəkk qulağı, pıçıltını göydə qapır,
Ovcuna qoymaq üçün tez səni "sim-sim"lə tapır.
Köhlənin köndələnə xəlvəti ünvana çapır.
Bitdə-bitdə danışıb, aləmi bir anda qatır,
Görünür sərfəlidir ki, hələ kölgəndə yatır.

Özgəyə "torba tikən" qulbeçə vardır hələ də,
Çıxır hər bir tələdən, "quyruğu" qalmır tələdə.
Hələ at oynadacaq bəlkə də bundan belə də.
Çünki o, ağ yalanı doğru libasında satır,
Görünür sərfəlidir ki, hələ kölgəndə yatır.

Daş atıb, baş tutacaq sən üzünə vursan, əgər,
Danacaq, and içəcək lap üzünə dursan, əgər.
Şərləyir, sən ipini bir balaca bursan, əgər.
Belə kəslər adamın ovqatına zəhər qatır,
Görünür sərfəlidir ki, hələ kölgəndə yatır.

Qurdala yaddaşını, dar gününü sal yadına,
Az qala getmişdin ha... sən bu gədanın badına.
Bəs deyildir, nə qədər xələl gətirdi adına?!
Ayıq ol, bu əbləhin "sim-sim"i hər yana çatır,
Görünür sərfəlidir ki, hələ kölgəndə yatır.

*19.02.2010*

## DEDİLƏR

Çox dedilər: ay kişi, olmaz belə,
Ağ eləmə, yoxsa qurarlar tələ.
Bir də görərsən ki, keçibsən ələ.
Vallah, əlindən çoxu gəlmiş zara,
Düşsən ora, yatır da gəlməz kara.

Bələdsən ki, bir çoxunun halına,
Baxmadılar "dəymişinə", "kalına".
Daş atdılar dövlətinə, malına.
Olub qanı itin qanından qara.
Düşsən ora, yatır da gəlməz kara.

Zabitən olsun, işi gör ağılnan,
Baş girləmə boş söhbətnən, nağılnan,
Çörək kəsmə, üzə gülən paxılnan,
Beləsi gözləyər qarışsın ara,
Düşsən ora, yatır da gəlməz kara.

Müxtəsəri, budur sözümün canı:
Mənəm deyənlər gözə dəymir, hanı?!
Sən də çalış zəmanə dostun tanı,
Deşməyəsən "dostun" əliylə dara,
Düşsən ora, yatır da gəlməz kara.

Çox güvənmə, arxanda dağ olsa da,
Müftə gəlir yan cibinə dolsa da,
Kef-damağın, ay kişi, cağ olsa da
Düşün, bu yol səni aparır hara,
Düşsən ora, yatır da gəlməz kara.

*04.08.2008*

## AY SMS

Güvənib öz səsimə, mən də qoşuldum yarışa,
Evimizdə, dədə vay, az qala aləm qarışa.
Məbləği alsam əgər, bəlkə küsənlər barışa.
Amanın bir günüdür, dadıma çat, ay SMS,
Ümidim tək sənədir, ol mənə dayday, SMS.

Bəzi münsiflərə də var deməyə yağlı sözüm,
Oxudum, gülüşdülər, kəlləmə lap çıxdı gözüm.
Korlayardım işləri, olmasaydı məndə dözüm.
Çox güman yıxar məni, etdiyim ah-vay SMS,
Ümidim tək sənədir, ol mənə dayday, SMS.

Çox güman, getsə belə, mən qalacam xeyli dala,
Hey deyirlər: başına çarə elə, sən a bala!
Kaş ki, bir arxam ola, işləri sahmana sala.
Göndərə pul yerinə, ünvanıma pay, SMS,
Ümidim tək sənədir, ol mənə dayday, SMS.

Təkcə sayəndə sənin, mən keçərəm lap qabağa,
Elə zənn eyləyərəm ki, ürəyim dönüb dağa.
Yoxsa vallahi, məni bambılılar qoyar lağa.
Etmə “atkaz”, mən ölüm, ver səsimə hay, SMS,
Ümidim tək sənədir, ol mənə dayday, SMS.

Bəd ayaqda çatmısan bir çoxunun imdadına,
Çox təəssüf ki, səni bəzisi salmır yadına.
İtirən haqqı-sayı, gedər şakərin badına.
Bataram, zəhmətimiz olsa əgər zay, SMS.
Ümidim tək sənədir, ol mənə dayday, SMS.

Taleyim sapdan asılmış, nəzərə al, nə olar?!
Fərz eylə, kimsəsizəm, qayğıma sən qal, nə olar?!
Belə bir müşkül işi sən yoluna sal, nə olar?!
Yatsan hərgah, çalaram mən sənə lay-lay, SMS,
Ümidim tək sənədir, ol mənə dayday, SMS.

*04.04.2008*

## BELƏSİ...

Tuşlamazdı hədəfə boş yerə “Pulgir” oxunu,
Qəflətən ilişməyi qorxuya salmış çoxunu.
İndidən sahman edir bir parası var-yoxunu.
Deyəsən duyuq düşüb, sorğu-sual başlanacaq.
Beləsi nəfsin odunda çırhaçırtnan yanacaq.

Yata bilmir gecələr, var-gəl edir sübhə qədər,
İtirib lap başını, çulğalayıb qüssə, kədər.
Zənn edir ki, çatacaq dadına pul, amma hədər.
Düşünür ki, bəd ayaqda nə alıbsa, danacaq,
Beləsi nəfsin odunda çırhaçırtnan yanacaq.

Qalmışam mat hələ də fil qulağında yatana,
Güvənib arxasına, günahsıza şər atana.
Daha bilmir ki, fələk də əl uzatmır batana.
Qurşanan əyri yola, səhvini bir gün qanacaq,
Beləsi nəfsin odunda çırhaçırtnan yanacaq.

Aramızda hələ var müftə pulun aludəsi,
Cibi şişdikcə, demə, almağa artır həvəsi.
Anlamır ki, bu yetim, bəd əməlin çıxsa səsi.
Qapısı, pəncərəsi, darvazası bağlanacaq,
Beləsi nəfsin odunda çırhaçırtnan yanacaq.

Görünür pul hərisi seyfə qoyur vicdanını,
Tanıdıb müşkül işə düşənlərə ünvanını.
Aldığı “əlmuzdular” indi qaraldıb qanını.
Hakimin hökmünü o, orda çox illər anacaq,
Beləsi nəfsin odunda çırhaçırtnan yanacaq.

*28.03.2007*

## NEYLƏSİN ÇƏRXİ-FƏLƏK...

Tutdular bənd-bərəni, çatmadı lövbərin sala.
Öyrəşib vəzifədə keyfə baxa, ləzzət ala.
Tükənib əsginası, heç dözə bilmir bu hala.
Ümidi bircə qalıb kənddə qohum qardaşına.
Neyləsin çərxi-fələk, nəfsi bəladır başına.

Zənn edirdi olacaq ömrü boyu arxa-dayaq,
Girləyərdi başını, “kəbin kəsən” mollasayaq.
Laxladı dayaqları, işləri oldu baş-ayaq.
Qatdılar soyuq suyu isti buğlanan aşına,
Neyləsin çərxi-fələk, nəfsi bəladır başına.

Bələd olmuşdu “kişi” dolların aləm “dadına”,
Doluxur keçmişini indi salanda yadına.
Çünki getdi güdaza, aldı-verdinin badına.
Əbləhi tənbeh edən baxmadı əsla yaşına,
Neyləsin çərxi-fələk, nəfsi bəladır başına.

Zəmanə yaman sıxıb, dəyişdirib dağ “kişini”,
Hardasa, çömçətutan get-gələ salmış işini.
Qalmayıb bir çöpü də qurdalamaqçün dişini.
Görən olsa, mat qalar biçarənin üst-başına,
Neyləsin çərxi-fələk, nəfsi bəladır başına.

Aramızda neçə cür, köklü “alaqlar” hələ var,
Yüz dəfə bəd əməlin eyləsən də aləmə car.
İki dünya bir ola, etməyəcək zərrəcə kar.
Ah çəkər, köks ötürər, olsa baxan dam-daşına,
Neyləsin çərxi-fələk, nəfsi bəladır başına.

Qapı qalmayıb döyüb, əl uzadan yoxdu hələ,
Çünki vaxtilə özü çoxlarına qurub tələ
Dinc oturmur, qələmin salıb xoda, yazır elə...
Hələ yəqin ki, başı dəyməyib əlhəd daşına
Neyləsin çərxi-fələk, nəfsi bəladır başına.

*06.10.2010*

## SƏNƏ DƏRS OLMADI BƏS?

Görürəm ki, hələ də rüşvətə var səndə həvəs,
İlişib gör neçəsi, heç sənə dərs olmadı bəs?

Sən ümidsən yenə də bir quru töhmət alasan,
Tapdığın isti bucaqda necə varsan qalasan?
Yolunu gözdən iraq döngə-dalandan salasan...
Baxasan keyfə özünçün belə ki, çıxmaya səs,
Neçəsi gör ilişib, ay kişi, dərs olmadı bəs?

Bilirik ki, niyə sən çox əl atırsan kələyə,
Bu əməldən ilişib tez düşəcəksən tələyə.
Köməyi olmayacaq, yalvarasan lap fələyə.
Deyəcəksən, bilirəm, burda elə söhbəti kəs,
Neçəsi gör ilişib, ay kişi, dərs olmadı bəs?

Sənə min yol demişəm: qonşuya bax, ibrət elə,
Getdi əmlakı, bağı, dönməyib "ordan" da hələ,
Tamahın at daşını, sən də dolan zəhmət ilə.
Bu sayaq işlərinin, bil, olacaq axırı nəhs,
Neçəsi gör ilişib, ay kişi, dərs olmadı bəs?

Gəz dolan, hər yana bax, gör necə dövran dəyişir,
Yığışıb əyrilərə indi el-aləm gülüşür.
Onu bil ki, ilişən öz tamahından ilişir,
Görürəm müftə pula var hələ də səndə həvəs,
Neçəsi gör ilişib, ay kişi, dərs olmadı bəs?
Dediyim hər nə ki var, bunları sən sanma əbəs,
Ağlını yığ başına, ay kişi, olsun sənə dərs...

## SƏNDƏ DƏ VAR, MƏNDƏ DƏ

Dostuna dost tən gərək, sən də alansan demə...
Sən də alansan demə, sən də kalansan demə...
Yağlı yerə lövbəri sən də salansan demə...
Ay kişi, imkan desən, səndə də var, məndə də,
Hər cürə nöqsan desən, məndə də var, səndə də.

Göydə qapıb kəlməni, sən də qanansan, demə...
Dost-tanışın halına, sən də yanansan, demə...
Eylədiyin qeybəti sən də danansan, demə...
Goplamağa söz desən, səndə də var, məndə də,
Əlli cürə üz desən, məndə var, səndə də.

Söz deməmiş hay salıb, sən də coşansan, demə...
Gözləməyib, həddini sən də aşansan, demə...
İş ki düşür əngələ, sən də çaşansan, demə...
İşləri burmaq desən, səndə də var, məndə də,
Şax üzə durmaq desən, məndə də var, səndə də.

Ay kişi, böhtan ki var sən də yazansan, demə...
Özgəyə dərin quyu sən də qazansan, demə...
Öz yolunu pullanıb, sən də azansan, demə...
Hər ədabazlıq desən, səndə də var, məndə də,
Ağlı dayazlıq desən, məndə də var, səndə də.

Var tanıyanlar bizi, bilməmişəm mən, demə...
İşdir ilişsək əgər, mən deməsəm, sən demə.
Düşsən əgər lap dara, hər sözü birdən demə.
Hər nə fırıldaq desən, səndə də var, məndə də,
Arxada bir “dağ” desən, məndə də var, səndə də.

## ÖZ-ÖZÜNÜ ALSIN ƏLƏ

Elmə sahib birisi kəsdirir hər gündə tini,
Qurşanıb badəyə o, badə yıxıbdır evini,
Gətirib zara kişi evdə də öz külfətini,
Kövrəlir, həm acıyır kimsə onu görsə belə,
Kişidir, qeyrəti var, öz-özünü alsın ələ.

Sığmayır indi daha heç cürə əndazəyə o,
Dəyişib mənliyini can dediyi badəyə o.
Tay olub gör necə də bəzi haramzadəyə o.
Əl əsir, bel bükülür, var ümidi təkcə dilə,
Kişidir, qeyrəti var, öz-özünü alsın ələ.

Nə nəsihət verəcək siz bilən övladına o?
Verib öz ömrünü də badələrin badına o.
Ləkə vurdu adına, sevgili arvadına o.
Badənin düşkünüdür, az qalıb artıq üzülə,
Kişidir, qeyrəti var, öz-özünü alsın ələ.

Bu həyat xeyli şirindir, niyə qanmır beləsi,
Yarıcandır, niyə bəs halına yanmır beləsi.
Hamı nifrətlə baxır, amma utanmır beləsi.
Badənin xətri üçün ömrünü tez verdi yelə,
Kişidir, qeyrəti var, öz-özünü alsın ələ.

## GÜLSATAN

Qiymətinə pəl vurub, salma haray, müştəri!
Getmə uzaqdan belə, gəl bəri, ay müştəri!

Hey alıram ilboyu gül kimi güldən bəhər,
Sən elə zənn etmə ki, girlənirəm birtəhər.
Başqa işim olmayıb, burdayam axşam-səhər.
İsti bucaq seçmişəm, dəmdədi çay, müştəri!
Getmə uzaqdan belə, gəl bəri, ay müştəri!

Sən də bir az baməzə, mən də bir az baməzə,
Sən mənə pul ver təzə, mən sənə gül təptəzə.
Qıymayacaqsan məgər bir manat hər nərgizə?
Dəstəni mən bağlayım, sən pulu say, müştəri!
Getmə uzaqdan belə, gəl bəri, ay müştəri!

Burda məni tapmasan, bil ki, qovublar tinə,
Çox da dəyənlər olur gülsatanın xətrinə.
Məst olur, hər kəs düşür güllərimin ətrinə,
Keç bu tərəfdən, canım, eylə "oxqay", müştəri!
Getmə uzaqdan belə, gəl bəri, ay müştəri!

Xoş keçir illər boyu burda hər anım mənim,
Ay kişi, zövqümcədir güllü məkanım mənim.
Alveri tərgitmərəm, çıxsa da canım mənim.
İşdir ilişsəm də lap, söyləmə "vay", müştəri!
Getmə uzaqdan belə, gəl bəri, ay müştəri!

## DÜZƏLƏR AXIRI

Möhtəkirlər yığılıb zəbt eyləyiblər bazarı,
Var deyənlər ki, bazarkomda da var pul azarı,
Heç müfəttiş lələnin də bura düşmür güzarı,
Hərənin öz yeri, öz guşəsi, piştaxtası var,
Nə qədər tənqid edirsən də düzəlmir bu bazar!

İşləyib pul həvəsi çoxlarının qanına da,
And içir müştəriyə, yüz dəfə vicdanına da.
Gecələr orda yatıb, qəsd eyləyir canına da,
Bəd əməllər edəcək axırı bir gün onu xar,
Nə qədər tənqid edirsən də, düzəlmir bu bazar!

Bu qədər möhtəkiri kimdir alan kölgəsinə,
Hay-haray salsa belə, müştəri gəlmir səsinə.
Pul tutub gözlərini, heç nə görünmür gözünə,
Hərdən haqqın yerinə alma alır, şaftalı, nar,
Nə qədər tənqid edirsən də, düzəlmir bu bazar!

Elə ki, gəldi müfəttiş bazara basdı ayaq,
Burda alverçilərin hər biri qazdan da oyaq,
Sürüşüb qeybə çıxır dal qapıdan ta bu sayaq,
Olacaq çünki onun axırı bir gün yeri dar,
Nə qədər tənqid edirsən də düzəlmir bu bazar!

Müştəri dözsə də bu hala, haray salmayacaq,
Bərkə düşsə, baha qiymətlə malı almayacaq.
Çünki vardır gümanı iş busayaq qalmayacaq.
Hələlik indi bazarkom qağamız olsa da kar,
Var güman ki, düzələr axırı bir gün bu bazar!

## GƏLDİM GÖZƏ

Abşeronun bağları cənnətə bənzər, inan,
Cənnətə düşmək, kişi, çox da deyildir asan,
Var evim üç mərtəbə, bəsləyirəm orda can,
Düşsə güzarın bizə, gör necə yurd salmışam.

Yazma sən ünvanımı, qoy hələ qalsın o sirr,
Dövrəsi daşdan hasar, aləmə "gəl-gəl" deyir,
Şanısı baldan şirin, "Təbrizi" erkən dəyir,
Kefdə keçir günlərim, indiyəcən kalmışam.

Bəsdi bu cənnətdəki cahi-cəlalım mənə,
Hamı deyir, sən demə, barı "a zalım" mənə.
Gör necə ləzzət verir indi bu halım mənə,
İlboyu eyvanda hey zurna-qaval çalmışam.

Kombinatımdan gəlir yağ, təzə ət, ay kişi,
Mən qədəhi doldurdum, manqala qoy sən şişi,
Badəni nuş eyləyək, salma yada təftişi,
"Yağlı", "yavan" töhməti yüz dəfədir almışam.

Sən demə mən kefdəyəm, amma düşüblər izə,
Şübhələnib qəflətən gəldi müfəttiş bizə,
Gördü ki, nöqsanlarım işdə çıxıbdır dizə,
Bəlkə də gəldim gözə, lap quruyub qalmışam.

## ŞƏKK EDİRDİM YUXUMA

Axtarırmış elə bil, gördü məni, yanladı o,
Turşudub üz-gözünü siftə yaman danladı o.
Başa saldım müdiri, məqsədimi anladı o.
Dedi bax indicə bildim ki, sən öl, bir dənəsən,
Keyfimiz saz olacaqdır, dayaq olsan mənə sən.

Hey şişirdib olanı, sahmana saldım planı,
Vardı həm mənfəəti, həm də qaralmırdı qanı,
Him edirdi: – Ayıq ol, qurdalayan olsa tanı,
Öyrədim mən çəmini, qalma işindən yenə sən,
Keyfimiz saz olacaqdır, dayaq olsan mənə sən.

Yola saldıq beləcə ayları bir-bir üzüağ,
Zənn edirdik gedəcək yağ kimi işlər bu sayaq.
Demə varmış demaqoq, kaş ki, yatıb durmaya sağ.
Çox dedi arvad-uşaq: – Qoyma bizi pis günə sən,
Mən deyirdim ki, nə vardır, dayaq olsan mənə sən.

Başladı sorğu-sual, növbə gəlib çatdı bizə,
Nə qədər zir-zibilim oldu köpük, çıxdı üzə.
Dədəvay! Məndə ürək var belə bir dərdə dözə?
Qorxudan saçlarıma düşdü mənim gör necə dən,
Olacaq işlərimiz, ay kişi, əngəl deyəsən?!

Müdirin arxası vardı, quru çıxmışdı sudan,
Hökm oxundu, elə bil vurdu mənim beynimə qan,
Sanki, röyada idim mən, dik atıldım yuxudan,
Bəlkə heç görməmisən mən kimi bir tir-tir əsən,
Şəkk edirdim yuxuma, doğru çıxıbdır deyəsən.

## BƏS DEYİRDİN...

Dayıcan, yoxdu halımdan nə zamandır xəbərin,
Batıram lap quyusunda bu ağır dərdi-sərin,
Çarə qıldın başına, indi də cənnətdi yerin,
Çıxmışam çul-çuxadan, həm də canımdan bezaram,
Bəs deyirdin, dayıcan, dağ kimi arxanda varam?

Eyləməzdim ki, güman sən də vəfasız çıxasan,
Bəd ayaqda məni də kəlləmayallaq yıxasan.
Yanmayıb halıma bir, indi kənardan baxasan.
Təzə rəislə mənim sən ki, bilirsən yox aram,
Bəs deyirdin, dayıcan, dağ kimi arxanda varam?

Anbarın kəm-kəsirin sən demədin boynuna al?
Baş-ayaq işlərini sən də çalış sahmana sal?
Demədin aldığımı görməmisən, ol dili lal?
Sən özün yaxşı bilirdin ki, lalam, həm də karam,
Bəs deyirdin, dayıcan, dağ kimi arxanda varam?

Keçmisən yaxşı işə, tək məni qoydun avara,
Mənə yanpörtü baxırlar gedirəm indi hara,
İşsizəm, evdə gəlib arvad-uşaqlar da zara,
Açaram sirrini, bil, yoxdu daha başqa çaram,
Bəs deyirdin, dayıcan, dağ kimi arxanda varam?

## TAMAH

Bəsdir, ay arvad, daha qamçılama kölgəmi,
Ortaya qoy hər nə var, çünki gəlibdir dəmi.
Vurmalıyam bir qədər, bəlkə dağıtdım qəmi,
Korlamışam işləri, səndə də çoxdur günah,
Ömr eyləyir qüssəsiz, kimdə ki, yoxdur tamah.

Hey alıb-aldatmışam, gözdən uzaq olmuşam,
Mən ilişib qəflətən, bax, saralıb-solmuşam.
Lap elə kövrəlmişəm, bir buludam dolmuşam,
Qoy valı, arvad, yenə zurnada çalsın segah,
Ömr eyləyir qüssəsiz, kimdə ki, yoxdur tamah.

Möhtəkirə dal qapı oldu açıq taybatay,
Düşdü duyuq müştəri, saldı, ay arvad, haray,
İndi deyirlər mənə günlərini sən də say,
Gözləyirəm təftişi, hey çəkirəm gündə ah,
Ömr eyləyir qüssəsiz, kimdə ki, yoxdur tamah.

Müftə gəlir olsa da, dolmadı cib, dolmadı,
Köhnə ilişmək mənə bəs niyə dərs olmadı?!
Məhkəməyə düşməyə şübhə yeri qalmadı,
Ərşə çıxıbdır yuxum, gəl ki, açılmır sabah,
Ömr eyləyir qüssəsiz, kimdə ki, yoxdur tamah.

Mən elə bildim gəmim, bir də toxunmaz daşa,
Mən əsir oldum tamam gündə gələn daşbaşa,
Dərd alıb, arvad, məni, az qalıb ağlım çaşa,
Gah oluram sərsəri, səksənirəm həm də gah,
Ömr eyləyir qüssəsiz, kimdə ki, yoxdur tamah.

# A MÖHÜR

Vardı əyyam, a möhür, şölə saçardın üzümə,
Güc verərdin dizimə, nur da verərdin gözümə.
Baş əyənlər var idi "bəli" deyib hər sözümə.
Bağlamışdım adına şöhrətimi mən, a möhür,
Niyə düşdün sən uzaq bir belə məndən, a möhür?

Salavat bağlı imiş yaxşı deyiblər ki, gücə,
Açılardı üzümə darvazalar hətta gecə.
Axı bəxt ulduzumu mən unudum indi necə?
Gülşənim görməz idi əsla duman-çən, a möhür,
Niyə düşdün sən uzaq bir belə məndən, a möhür?

Vardı imkan eləyim hörmətimi dosta, yada,
Belə minvalla yəqin mən də çatardım bir ada.
Özgədən yox gileyim, öz qohumum verdi bada.
Axı ondan da mənə doğma idin sən, a möhür,
Niyə düşdün sən uzaq bir belə məndən, a möhür?

Elə döydüm döşümə, öz-özümü yıxdı dilim,
Demə aşkarda imiş gör nə qədər zir-zibilim,
Getdin əldən, elə bil, şaqq eyləyib sındı belim.
Baxıram indi sənə gör necə gendən, a möhür,
Niyə düşdün sən uzaq bir belə məndən, a möhür?

Baxıram indi sənə, odsuz-alovsuz yanıram,
Sən ki yoxsan, özümü sən kimi cansız sanıram.
Şöhrətim səndə imiş, mən bunu çox gec qanıram.
Ötüşüb günlərimiz gör necə də şən, a möhür,
Niyə düşdün sən uzaq bir belə məndən, a möhür?

## GƏTİRİB CANA MƏNİ

Düşdüm əldən, a kişi, yollayır hər yanə məni,
Pah atonnan, belə arvad, gətirib cana məni!

Bir bəladır, boğazımdan yapışıb xeyli zaman,
Ad günüm olmalıdır! – söyləyib heç vermir aman,
Borca qalmışdı ümid, qonşumuza vardı güman,
Dedi: – Əlborcu get al! – Yollayır hər yana məni,
Pah atonnan, belə arvad, gətirib cana məni.

Qoca vaxtında düşüb ad günü birdən yadına,
Söyləyib: – Siz də gəlin, – qonşuların arvadına!
Hökm edir töhfə alım, layiqi olsun adına,
Xalasından ötəri yolladı Şirvana məni,
Pah atonnan, belə arvad, gətirib cana məni.

Günah etdim ki dedim, qonşuda toydur deyəsən,
Baxdı, turşutdu üzün, söylədi: – Keysən, ay Həsən!
Ad günümçün sataram evdə nə var, çıx göyə sən.
Satıb həsrət qoyacaq yastığa, yorğana məni,
Pah atonnan, belə arvad, gətirib cana məni.

– Kişinin borcu olar, – gündə deyir şax üzümə,
Borc elə sən də bir az, şuba alım mən özümə.
Odlanar qonşu görəntək əməl etsən sözümə.
Salacaqdır bilirəm dillərə, dastana məni,
Pah atonnan, belə arvad, gətirib cana məni.

Elədi kim onu ürcah mənə hardan, nə bilim,
Belə zillətlə, zəlalətlə keçib əlli ilim.
Dərdimi söyləməyə, ay kişi, gəlmir də dilim,

Edəcəkdir bilirəm lap dəli-divanə məni,
Pah atonnan, belə arvad, gətirib cana məni.

Elədim ad gününü, sandı bütün el gələcək,
Gəldi ancaq xalası – töhfəsi bir dəstə çiçək.
Düşdü yorğan-döşəyə, bəlkə də arvad öləcək,
Göndərir indi də hər gün dava-dərmana məni,
Pah atonnan, belə arvad, gətirib cana məni.

## KİM ƏNCAM ÇƏKƏCƏK?

(*şikayətçinin dilindən*)

Öz yerində bu müdiri tapa bilsəm mən əgər,
Dərdimi ərz eylərəm, bəlkə də bir çarə edər,
Çox təəssüf ki, onu gözləməyim getdi hədər,
Söylədi katibəsi: – Xəstələnib, gəlməyəcək,
Bilmirəm dərdimə heç indi kim əncam çəkəcək?

Ötdü həftə, təzədən bir başa yollandım ora,
Gördüyüm mənzərənin oxşarı vardı bazara,
Deyinirdi birisi: – Olmuşuq hər gün avara,
Güman etdim müdiri tapsa o, abrın bükəcək,
Bilmirəm dərdimə heç indi kim əncam çəkəcək?

Xəbər aldım neçə yol, olmadı gördüm də deyən,
Guya obyektdə olur, şəkk edirəm doğrusu mən,
Ah çəkib katibəsi, söylədi: – Gəldin yenə sən?
Güldü, bildim ki, məni sözlə başından əkəcək,
Bilmirəm dərdimə heç indi kim əncam çəkəcək?

Gördüm aşkar bu hərif girləyir ancaq başını,
Bir sayaq cəhd eyləyib saldırır öz daşbaşını.
Belə olmaz ki, dedim, katibə tez göz-qaşını
Oynadıb, söylədi: – Get sən, bala, öz dərdini çək,
Bilmirəm dərdimə heç indi kim əncam çəkəcək?

Düşdüm əldən, müdirin görmədim ancaq üzünü,
Dedilər: – İndi şikayətçi görüblər özünü,
Dayanıbmış qapıda, amma döyürmüş gözünü,
Köhnə işçün darıxır, orda qalıb katibə tək,
Bilmirəm dərdimə heç indi kim əncam çəkəcək?

# DƏDƏMİN MƏSLƏHƏTİ

Dədəcan, sözlərini hey salıram gündə yada,
Demisən yoxlamanı qoyma müfəttiş uzada.
Düşdü fürsət, him eylə, anlayar, arifdir o da.
Əl uzatsan cibinə, çıxmayacaq səs-səmiri,
Atalar yaxşı deyib: isti döyərlər dəmiri.

Xeyli vaxtdır edirəm sən deyənə mən də əməl,
Şəkk edirsənsə əgər, sal yolunu, bir bizə gəl.
Bax müfəttiş qağama, şəstlə verir gör necə əl.
Eylə hörmət o kəsə, hörmətin olsun səməri,
Atalar yaxşı deyib: isti döyərlər dəmiri.

Dükana basdı ayaq, tez çəkirəm xəlvətə mən,
Ona çay, badə, filan, başlayıram xidmətə mən.
Eylə ki yatdı sapa, əl atıram rüşvətə mən,
Beləsi gündə gələ, var gözüm üstündə yeri,
Atalar yaxşı deyib: isti döyərlər dəmiri.

Vay o gündən ki, onun baxmayasan heç üzünə,
Qurd kimi gözlərini zilləyəcəkdir gözünə.
Gec deyildir nə qədər, başqa iş axtar özünə.
Ya da ki, göz-qulaq ol, hey gələcək gündə biri,
Atalar yaxşı deyib: isti döyərlər dəmiri.

Bir də gördün ki, biri yoxlamamış saldı haray,
Dədə, əvvəlkilərə eyləmək olmaz onu tay.
Məni infarkt eləyər, bircə dəfə gəlsə hər ay.
Eylə bil qəsdə durub, lap kişi zəncir gəmirir,
Bilmirəm onda necə döyməliyəm mən dəmiri?

## ƏSLA YARAŞMIR YAŞINA

Yoxdu fikrin görürəm müftə gəlirdən savayı,
Olmasaydı qınayan, çayxanada hətta çayı.
Gündə üç dəfə içərdin, kişi, pulsuz, havayı.
Harda ehsan verilir, sən də qonaqsan aşına,
Belə adət, a kişi, əsla yaraşmır yaşına.

Sanma yoxdur xəbərim, səndə görüblər neçə üz,
Gözləyib mənfəəti, çox demisən əyriyə düz.
Çatıb hərdən dadına saxta gülüş, gülməli söz,
Bağlayıbsan yalanın torbasını yaddaşına,
Belə adət, a kişi, əsla yaraşmır yaşına.

Göz qoyursan, görəsən kim ayağın atdı necə,
Kimə yol tapdı necə, arzusuna çatdı necə.
Bir qalıbdır biləsən kim nə sayaq yatdı gecə,
Baxma yanpörtü nahaq "can" dediyin yoldaşına,
Belə adət, a kişi, əsla yaraşmır yaşına.

Kimliyin bəllisə də, çoxları getmir dərinə,
Yerə girrəm, ölərəm mən, düzü, olsam yerinə.
Xamlayırsan birini, tez keçirirsən girinə,
Sürüyürsən hərifi keyf eyləməkçün maşına,
Belə adət, a kişi, əsla yaraşmır yaşına.

Oturaq əyri, biz ancaq danışaq gəl düzünü,
Nə səbəbdən belə rüsvay eyləyirsən özünü?
Bilirəm turşudacaqsan bu sözümdən üzünü,
Gec deyildir nə qədər, çarə eylə öz başına,
Belə adət, a kişi, əsla yaraşmır yaşına.

## SƏBR EYLƏ, İNDİ GƏLƏR

Fal açıb sən, a kişi, yorma nahaq öz başını,
Gözləmə, gəlməyəcək təcili yardım maşını.

Yardım üçün "nol üç"ə zəng eylədim evdə səhər...
Narahat olmağına, a kişi, dəyməz, – dedilər.
Yola sallıq həkimi lap bu saat, indi gələr.
Söylədim ünvanımı, xəstənin hətta yaşını,
Arxayındım gələcək "təcili yardım" maşını.

Ötdü anlar və saatlar, gün ötüb oldu yarı,
Gəlmədi amma maşın biz yaşayan mülkə sarı.
Gördüm əldən gedəcək evdə yatan xəstə qarı.
Külfətim him elədi oynadaraq göz-qaşını,
Dedi: – Dur, bir də çağır "təcili yardım" maşını.

Zilləyib gözlərini xəstə baxır hey tavana,
Gözləyirdik həkimi, gəlsin əlac etsin ona.
Dözə bilmirdi daha, xəstə yığılmışdı cana.
Gözü dolmuşdu onun, sildi axan göz yaşını,
Dedi bəs harda batıb "təcili yardım" maşını?

Gözləməkdən yorulub nömrəni yığdım təzədən,
Dərdimi ərz eylədim ordakı növbətçiyə mən.
Söylədi: – Getdi maşın, pişvaza çıx, qarşıla sən,
Amma ki, yollamışıq bir balaca nimdaşını,
Gözləyin, indi gələr "təcili yardım" maşını.

Müxtəsər, gözləməyin faydası yoxmuş demə, sən.
Axşam oldu, ümidi üzmədim ancaq yenə mən.
Dedim ünvanımızı səhv edib onlar deyəsən,
Köhnə qonşum dedi ki, yorma, kişi, öz başını,
Belə imdada çatır "təcili yardım" maşını.

## VURARAM GAH BAŞIMA, GAH DİZİMƏ

Qulaq as, söhbətimin məğzini başdan danışım,
Eylədim ad günümü, oldu tamam əlli yaşım.
Gəldi bir-bir, nə qədər işdəki dostum, tanışım,
Baxdım hey töhfələrə, dəydi gül ancaq gözümə,
Batdı xərcim, vururam gah başıma, gah dizimə.

Vardı süfrəmdə, kişi, hər cürə nemət, nə desən,
Ət, balıq, dolma, plov, sübhə qədər bəsdi yesən.
Neçə yol söylədilər: – Bəlkə, özün tost deyəsən?
Nə təbəssüm, nə gülüş qonmadı əsla üzümə,
Batdı xərcim, vururam gah başıma, gah dizimə.

Belə şənlik eyləmək tək mənə qalmışdı bəyəm?
Dəstə güldən dağ olub, gülüstanam, yoxsa nəyəm?
Axtarırdım səni, bu söhbəti xəlvətdə deyəm,
Nə biləydim belə iş dərd olacaqmış özümə,
Batdı xərcim, vururam gah başıma, gah dizimə.

Qaralır gündə qanım, ad günü düşdükcə yada,
Halıma kim yanacaq, kim çatacaq indi dada?
Deyirəm arzularım gör nə sayaq getdi bada.
Çəkmişəm xeyli ziyan, şəkk eyləyirlər sözümə,
Batdı xərcim, vururam gah başıma, gah dizimə.

# VİCVİCƏ DÜŞMÜŞ CANINA

Elə bir elm ocağı olmayıb ömrümdə hələ,
Atmayım gizli lağım, olsa da müşkül məsələ.
Vardı "xam" müştərilər onda, alırdım tez ələ.
İndi yanpörtü baxır çoxları qəsdən üzümə,
Daha yoxdur inanan, ay kişi, vallah, sözümə.

Keçmiş əyyamda evə gəlsə idi "müştərilər",
Beh alırdım ki, inansın daha "qiymət" düzələr.
Kəf gəlirdim çoxuna, eh, başıma gəldi nələr...
Köhnə həmkarlarımın heç biri dəymir gözümə,
Daha yoxdur inanan, ay kişi, vallah, sözümə.

Birisi imtahanı öz gücünə verdi özü,
Eşidib şad xəbəri külfətimin güldü üzü,
Aldığım pulları tez hopp eylədim mən də, düzü,
Zibilim çıxdı üzə, hey vururam mən dizimə,
Daha yoxdur inanan, ay kişi, vallah, sözümə.

"Kəsilib" bir parası, hayla gəlibdir yanıma,
Səhv olubdur deyirəm, and içirəm vicdanıma.
Yuxu getmir gözümə, vicvicə düşmüş canıma,
Kələyim tutmadı baş, həm də iş açdım özümə,
Daha yoxdur inanan, ay kişi, vallah, sözümə.

## VAR GÜMAN

Eyləyir zümzümə hey işdə müdir öz-özünə,
Kabinetdən savayı heç nə görünmür gözünə.
Çoxalıb indi daha "bəli" deyənlər sözünə.
Eynək üstdən baxır hər dostuna, hər yoldaşına,
Var güman, dostlarını tez çəkəcək iş başına.

Fikri yoxdur, deyəsən, işləri salsın yoluna,
Edib adət dolana kimsə onun sağ-soluna.
Təmir etdirdi evin təcili dövlət puluna.
Nə səbəbdən su qatan olmadı əsla aşına,
Var güman, dostlarını tez çəkəcək iş başına.

Aramızda beləsi, doğrusu, vardır hələ də,
Bərk ayaqda sürüşür, quyruğu qalmır tələdə.
Düşür hərdən canına vicvicə də, vəlvələ də.
Düzü, şəkk eyləyirəm son qoyacaq daşbaşına,
Var güman, dostlarını tez çəkəcək iş başına.

Tapıb hərdən girəvə göz qoyuram işdə ona,
Dəyişir gündə kişi, sanki, girir başqa dona.
Arif olsun ki, gərək sözdəki əmmanı qana.
Üstəlik göz də vurur, mat qalıram göz-qaşına,
Var güman, dostlarını tez çəkəcək iş başına.

## YOLA SAL

Küncdə xudmani dükan əsla görünmürdü gözə,
Gəlməmişdi keçən il bircə müfəttiş də bizə.
Qəflətən yoxladılar, zir-zibilim çıxdı üzə,
Müdirim güldü, dedi: – Qorxma, bizə yoxdu zaval,
Get müfəttiş dayını, taksiyə mindir, yola sal.

Tanış oldum, tanıdım mən də müfəttiş dayını,
Olmasın indi, o vaxt tez ayırardım payını.
Elə ki, gəldi, durub hazır edərdim çayını,
Müdirim hey deyinərdi: – Niyə oldun belə kal,
Get müfəttiş dayını, taksiyə mindir, yola sal.

Ona bel bağlayanı yoxlama gəlməzdi bizə,
Gizli mallar daşınanda o, görünməzdi gözə,
Bir dəfə mal gətirən çıxdı onunla üz-üzə,
Müdirim güldü, mənə zərfi uzatdı, dedi: – Al,
Get müfəttiş dayını, taksiyə mindir, yola sal.

Neçə yol yoxladılar, lap üzüağ çıxdı müdir,
Çoxları sandı bizi bəlkə müfəttiş də güdür.
Gəl ki, bilmirdilər əsla kişi çox razı gedir,
Söyləyirdi müdirim: – Görməmisən, ol, bala, lal!
Get müfəttiş dayını, taksiyə mindir, yola sal.

Sən demə, yaxşı bələdmiş fələyin gərdişinə,
O qarışmazdı qəti “zərfi ötürmək” işinə.
Mat qalırdım mən onun xeyli zaman təşvişinə,
Hey deyərdi: – Gedirəm, indi gələr, burdaca qal,
Get müfəttiş dayını, taksiyə mindir, yola sal.

Eşidib bəd xəbəri, mən lap itirdim özümü,
O müfəttiş ilişib, aldı duman-çən gözümü.
Müdirə məhkəmədə ərz eylədim son sözümü:
– Biz işlədik, gedirik, yaxşıca, rahat nəfəs al!
Dur müfəttiş qağamı, bir də məni sən yola sal!

# VƏZİFƏ

Düşür hərdən yadıma köhnə vəzifəm yenə də,
Sanki, yoxmuş o zamanlar qohumum bir dənə də.
İndi bir-bir tapılırlar, yan alırlar mənə də.
Rütbəm artıb, eşidib çıxdı qohumlar da üzə,
Qorxuram korlana işlər, gələm axırda gözə.

Olmayıbdır soruşan halımı illərlə belə,
Yol çəkibdir gözümüz, kaş bizə bir kimsə gələ.
Xeyli vaxtdır qapının zəngi gəlib hətta dilə.
Hey qonaqdır gəlir a... az qalıb arvad da bezə,
Qorxuram korlana işlər, gələm axırda gözə.

Vadar oldum, bunu mən ərz eylədim arvadıma:
Niyə bunlar o zaman çatmadılar bəs dadıma?
İşə bax, indi mənim töhfə alıblar adıma.
Sanki, toydur, axışır zurnaçalanlar da bizə,
Qorxuram korlana işlər, gələm axırda gözə.

Günü-gündən, ay kişi, hörmətim artır, elə bil,
Harda yatmışdı görən bəs bu qohumlar neçə il?
İşimin xətrinə hörmət mənə lazım da deyil.
Möhtac oldum neçə il bircə şirin kəlmə sözə,
Qorxuram korlana işlər, gələm axırda gözə.

Səs salıbdır görürəm hətta vəzifəm şəhərə,
Gedirəm kəndə toya ildə azı əlli kərə.
İstəyir hörmətini göstərə məclisdə hərə.
Az qalıbdır ki, adım orda da dillərdə gəzə,
Qorxuram korlana işlər, gələm axırda gözə.

Dil açıbdır danışır, hətta möhür, seyf açarı:
"Sən qohumsuz keçinib eyləmisən ömrü yarı.
Bil ki, hörmət nəyədir, anla, müdir, indi barı.
Gələcək daldada hey qeybət edənlər də sizə,
Uyma təriflərə ki, gəlməyəsən bir də gözə".

## ARXAYIN GET, DÜZƏLƏR

Sevirəm yüngül işi, gündəlik olsun gəliri,
Dolanıb xeyli bekar, axırı tapdım o yeri.
Ürəyimdən nə keçir, mən başa saldım müdiri,
Utanırdım deyə basmışdı məni, ay kişi, tər,
Arxayın get, – dedi, – sən, ən çoxu bir həftə çəkər.

Ötdü həftə, oraya düşdü yolum bir də yenə,
Qulaq asdı gülərüzlə o müdir mən deyənə,
Anbarın çəkdi adın, sonra da göz vurdu mənə,
Anlayarsan, – dedi, – sən fikrimi, arifsən əgər,
Arxayın get, – dedi, – sən, ən çoxu bir həftə çəkər.

Baş çəkirdim iş üçün ayda azı əlli kərə,
Anladım ki, çoxalıb müştərilər yağlı yerə.
Axtarırlar eləsin, sərfəli olsun müdirə,
Müdir axır ki dedi: – Gözləmisən sən bu qədər,
Arxayın get, – dedi, – sən, ən çoxu bir həftə çəkər.

Getdim axır yanına, lap yığılıb mən də cana,
Bir əmanət, bükülü, xəlvəti çatdırdım ona,
Açdı, baxdı və dedi: – Bir də dolanma bu yana,
Get sabah başla işə, hörmətimə amma dəyər,
Demədi arxayın ol, ən çoxu bir həftə çəkər?

Düzəlib indi işim, yoxdu müdirdən gileyim,
Salıram çoxlarını get-gələ, vardır kələyim.
Hələ vardır nə qədər, ay kişi, arzum, diləyim,
Zəhmətim bəhrə verir, getməyə axırda hədər,
Düşərəm "süd" gölünə burda müdir olsam, əgər.

## ÖZ-ÖZÜMÜ XAR EYLƏDİM

Eşqə düşdüm, canımı qəmlərə düçar eylədim,
El içində, a kişi, öz-özümü xar eylədim!

Bir deyən olmadı ki, uyma onun göz-qaşına,
Eləsin tap ki, yaşı qoy yaxın olsun yaşına,
Açma cəncəl qoca vaxtı təzədən öz başına,
Düzü, mən əhdə xilaf çıxmağıma ar eylədim,
El içində, a kişi, öz-özümü xar eylədim.

Evdə hay-küy qoparır, hər şeyi alt-üst eyləyir,
Söyləyir: – Qonşuya bax, gör necə dublyonka geyir?!
Təptəzə şubası var, al mənə ondan da, – deyir.
Dözmədim dərdimi mən el-obaya car eylədim,
El içində, a kişi, öz-özümü xar eylədim.

Çöldə gördüklərini evdə salır tez yadına,
Telefon zara gəlib, yoxdu çatan imdadına.
Hey gileydir mərəzi qonşuların arvadına,
Bu geniş mənzilimi öz başıma dar eylədim,
El içində, a kişi, öz-özümü xar eylədim.

Fikrini anlamışam, gözləyir o ölməyimi,
Dövlətimdən savayı, bəs bəyənibdir nəyimi?
Belə rəftarı onun əldən alıbdır heyimi,
Qoca vaxtı kimi gör mən özümə yar eylədim,
El içində, a kişi, öz-özümü xar eylədim.

## GÖZDƏN UZAQDIR YERİM

Qəm yemə, oğlum, sənin dağ kimi vardır dədən,
Ehtiyacın olmasın dünyada heç bir nədən.
Düşsə maşın xətrinə, bircə mənə “al” de, sən.
Min bərəkət pivəyə, var gəlirim, daşbaşım,
Gözdən uzaqdır yerim, həm də ki, dincdir başım.

Bir belə dost-aşnadan var gəlirim müftəcə,
Gündüz hələ bir yana, həm də gəlirlər gecə.
Yoxdur elə müştərim içməmiş ordan keçə.
Ad mənim, ancaq, düzü, al-ver edir yoldaşım,
Gözdən uzaqdır yerim, həm də ki, dincdir başım.

Görməmisən, bir dəfə gəl dükana, sən də bax,
Gör necə yer tapmışam, xəlvəti, gözdən uzaq.
Vurmağa hətta gəlir zurnaçalanlar qonaq,
Borca içənlər də var, səhv eyləməz yaddaşım,
Gözdən uzaqdır yerim, həm də ki, dincdir başım.

Sorğu-sual eyləmə, kim verib imkan mənə,
Özgə hara, mən hara, bil ki, qohumdur sənə.
Səs çatıb hardan, necə, gəldi müfəttiş yenə.
Sahmana saldım işi, görmüsən, oğlum, çaşım?
Gözdən uzaqdır yerim, həm də ki, dincdir başım.

Dağ kimi arxam ki var, qonşu dükandar yanır,
Xod ki gedir al-verim, gündə görüb odlanır.
Məndə olan imkanı arif olanlar qanır.
Çoxdu paxıllıq edən, çünki ağırdır “daşım”,
Gözdən uzaqdır yerim, həm də ki, dincdir başım.

Mənfəət hardan gəlir, söylədim, oğlum, bala!
Sən də fərasətli ol, qalma dədəndən dala.
İşdi, ilişsəm əgər, qoyma dükan boş qala.
Başla işə indidən, çünki ötübdür yaşım,
Şübhəliyəm, gec, ya tez ağrıyacaqdır başım.

## SƏN MƏNƏ XƏLVƏTDƏ DE

Varsa mənə göz qoyan, sən mənə xəlvətdə de,
Gör ki, kimin meyli var verməyə rüşvət də, de.
Olsa sənə kəc baxan, gizləmə, əlbəttə, de.
Mən də ki bel bağlayıb, sirrimi açdım sənə,
Kimsə duyuq düşməsin, amma qohumsan mənə.

Söhbət olan yerdə sən yaxşı fikir ver sözə,
İşdə məqam olmasa, sal yolunu gəl bizə.
Gözdən uzaq, arxayın bir oturaq üz-üzə.
Yüz də vuraq sağlığa, yaxşı qızışsın çənə,
Kimsə duyuq düşməsin, amma qohumsan mənə.

Sən quyunu onlara, ay kişi, böhtanla qaz!
Topladığın faktları bir neçə ünvana yaz.
Damğalayaq hər birin, keyfimiz olsun taraz.
Qoyma gəlib fırlana şübhəli kəs dövrənə,
Kimsə duyuq düşməsin, amma qohumsan mənə.

Bir belə şərtim də var, incimə hərdən səni,
Tənqid edib pisləsəm, gözlə bir az həddini.
Sən də danış əksimə, gözdən asaq pərdəni.
Can atacaq çoxları sirrimizi öyrənə,
Kimsə duyuq düşməsin, amma qohumsan mənə.

Şərh eylədim fikrimi, başla bu gündən işə,
Şübhəli kəslər ki var, vur daha bir-bir dişə.
Adət edib hansı gör hansı cürə vərdişə.
Yaxşı səriştən də var tapmağa yol qəlbinə,
Kimsə duyuq düşməsin, amma qohumsan mənə.

## EVLƏNDİM KEÇƏN İL

Qaynatam, zənn eyləyirdim, yekəpər bir dağ idi,
Sənəti axşamacan söhbət idi, lağ-lağ idi.
Vardı xudmani yeri, həm də işi çim yağ idi.
Düşünürdüm olaram ortaq onun daşbaşına,
Baxta bax məndə, kişi çatdı təqaüd yaşına.

Bədnəzərlər görünür qoymadılar işdə qala,
Dəbdəbəylə kişini saldılar axır ki, yola.
Müşkül işdir, belə yer bir də çətin qismət ola.
Yığılardı neçə dost söhbətə hər gün başına,
Baxta bax məndə, kişi çatdı təqaüd yaşına.

Gümanım vardı onun dövrəsinə girlənərəm,
Ev-eşik, “Volqa” maşın, bilmərəm heç qüssə, nə qəm.
Gündə keyf məclisinə eyləyirəm dostları cəm.
Mən bu xülyada ikən, müştəri tapmış maşına,
Baxta bax məndə, kişi çatdı təqaüd yaşına.

Kişi gümrahdı, papaq tikməyə hazırdı cinə,
Gündəlik xərci qoyur yığdığı puldan cibinə.
Getsə ancaq bu sayaq, daş atacaqdır dibinə.
Elə ki seyrə çıxır, sürmə çəkir çal qaşına,
Baxta bax məndə, kişi çatdı təqaüd yaşına.

Bəllidir indi sənə, kimdi məni dərdə salan,
Var gözaltım, dədəsi, ay kişi, ondan da kalan.
Soruşursan nəçidir, gizləmirəm – zurnaçalan.
Sahib ollam hələlik kənddə olan dam-daşına,
Bataram işdi əgər çatsa təqaüd yaşına.

## BƏLKƏ CİBİŞDAN DOLA

El-obada var hələ pullu toyun “xəstəsi”,
Dəvət edirlər toya yoldan ötən hər kəsi.
Külli şabaş toplayır çalğıçılar dəstəsi.
Yeznə, qayın, qaynata rəqs eyləyir qol-qola,
Cəhdi budur onların: bəlkə, cibişdan dola!

Sərfəlidir toy sənə, varsa vəzifən əgər,
Hətta bu cür şənliyə yadlar, uzaqlar gələr.
Müftə qazancın olar lap iki xərcin qədər.
Həm də ki xanəndəni yaxşı salarsan yola,
Zurnaçalan tər tökür: bəlkə, cibişdan dola!

Dəbdəbəli toy ki var, şöhrət üçündür, demə,
Haqqını at, bozbaşı çəkməsə meylin yemə.
Düşsə plov xətrinə, gözlə, qoyublar dəmə.
Sərpayı haqqın alır, amma çətin pul sala,
Ortada çox dövr edir: bəlkə, cibişdan dola!

Azdı məgər, ay bala, toydan alanlar maşın,
Qonşu filankəs ki var, toyla tikib dam-daşın,
Başqa gəlir olmasa, toydu sənin daşbaşın,
Mən görürəm duymusan ağrıyacaqdır başın,
Çox da götür-qoy edib, düşmə sən haldan-hala,
Olma tamam arxayın: bəlkə, cibişdan dola!

## DOST EYLƏMİŞDİM ÖZÜMƏ

Zavmaq idim nə qədər, dostların artırdı sayı,
Aparırdı havayı çoxları qənd ilə çayı.
Gündə bir yerdə idik, yatmağımızdan savayı.
İşsizəm xeyli zaman, heç biri dəymir gözümə,
A kişi, kimləri gör dost eyləmişdim özümə.

Təzə yerdə müdirəm – şayiə yaydım şəhərə,
Çalışır hörmətini göstərə məclisdə hərə.
Şənimə tost deyilir, düşsə güzarım o yerə.
Gen gəzənlər oturub indi gülürlər üzümə,
A kişi, kimləri gör dost eyləmişdim özümə.

Eşidib şad xəbəri, hey axışırlar yanıma,
And içirlər hələ bir gah başıma, gah canıma.
Çoxu tərif də deyir, hətta mənim ünvanıma.
Sürünüb kölgə kimi indi düşüblər izimə,
A kişi, kimləri gör dost eyləmişdim özümə.

Kişinin dostu olar, yaxşı deyiblər atalar,
Bu sayaq dostlarımın eybəcər adətləri var.
İşdi şam olsam əgər, şöləmə onlar da yanar.
Yenə də "bəli" deyir üzdəniraqlar sözümə,
A kişi, kimləri gör dost eyləmişdim özümə.

Anladım niyyətini dostların axırda özüm,
Söylədim üzlərinə, qalmadı bir kəlmə sözüm.
Niyə bəs indiyədək bunları görmürdü gözüm,
Az deyil məndə günah, vurmalıyam öz dizimə,
A kişi, kimləri gör dost eyləmişdim özümə.

## BELƏ GETSƏ...

Güvənib daydayıma məntəqə açdım yenə mən,
Yağı bol, benzini bol, tək özüməm xidmət edən.
Deyirəm asta sənə, olmasın ancaq eşidən.
Pis deyildir hələlik, girləyirəm öz başımı,
Birsayaq saldırıram xırda-xuruş daşbaşımı.

Ordayam sübhə kimi, qopsa boran, yağsa da qar,
Arxayın gəl yanıma, hər cürə benzin tapılar.
Baxma yoxdur talonun, sən kimi çox müştəri var.
Gülərüz müştəriyə oynadıram göz-qaşımı,
Birsayaq saldırıram xırda-xuruş daşbaşımı.

Bəlkə, kaprondu bakın, həcmini hərdən dəyişir?
Görürəm şübhəlisən, dolmadı, yəqin ki, şişir...
Cihazın əqrəbi, neynim, qağa, hərdən ilişir.
Köhnədən müştərisən, sanma zəif yaddaşımı,
Birsayaq saldırıram xırda-xuruş daşbaşımı.

A kişi, insafa gəl, bunca haray salmaq olar?
Niyə tufan qoparıb eyləmisən aləmə car.
Guya arxamda mənim dağ kimi bir daydayı var.
Tanıyırsan axı, sən hətta mənim qardaşımı,
Birsayaq saldırıram xırda-xuruş daşbaşımı.

Belə getsə görürəm, işlərim alt-üst olacaq,
Çən-duman sıxlaşacaq, üstümü birdən alacaq.
Bilmirəm onda mənim qeydimə kimlər qalacaq.
Əl atam onda gərək satmağa öz dam-daşımı,
Xırda, xırda əridəm xırda-xuruş daşbaşımı.

## EYLƏDİ RÜSVAY MƏNİ

(*Tənqid olunmuş ara müğənnisinin dilindən*)

Dərdimi ərz eyləyim, gəl sənə, dost, xəlvəti,
Vermişəm əldən yaman, səhv eyləyib fürsəti.
Sən demə, müxbirlərin yazmaq imiş adəti.
Eylədi rüsvay məni, saldı alovsuz oda,
Mənfəət hardan gəlir, yaxşı bilirmiş o da.

Düşdü yolum toylara, "şən" səsimi yazdılar,
Alverə qurşandılar, yollarını azdılar.
Vardır azarkeşlərim, amma donosbazdılar.
Söylədilər müxbirə, verdilər axır bada,
Mən necə xanəndəyəm, yaxşı bilirmiş o da.

Məntəqə sahibləri, onda günah bilməyin,
Eylədi tənqid bizi, var səbəbi, gülməyin.
Bax deyirəm, siz mənə bir də yaxın gəlməyin,
İndiyəcən salmamış bizləri müxbir yada,
Ağ eylədiz, yazmağa başladı axır o da.

Satdığınız lent ki var, metrəsi gəlmir saya,
Dartıb uzatsaydılar, bəlkə, çatar lap Aya.
Daydayı axtarmayın, tez atılıb ortaya.
Xeyri də yoxdur daha lap dayınız olsa da,
Ortaq olub, pay alıb müftə qazancdan o da.

Müftə gəlir mənbəyi çıxdı əlimdən mənim,
Nəqd eyləmişdim, a dost, keyf eyləyim, şellənim.
Aləmə car eylədi, indi nə cür dillənim?
Yoxdur üzüm dərdimi söyləməyə arvada,
Lağlağı xanəndəyəm, yaxşı bilirmiş o da.

## AXIRI GETDİM GÜDAZA

Daimi məskənim olmuşdu neçə döngə, dalan,
Axışardı ora hey hər cürə import mal alan.
Kəf gələrdim çoxuna, doğrusu, qiymətdə kalan.
Əridərdim nə ki var, şuba, papaq, çəkmə, plaş,
Uymayaydım başıma cəncəl açan alverə kaş.

Döndərib anbara mən qonşuda boş zirzəmini,
Gizli mal saxlamağın yaxşı bilirdim çəmini.
Çox qovub mərdimazar, haqladı axırda məni.
Yatdı bəxtim elə bil, işlərim oldu yenə yaş,
Uymayaydım başıma cəncəl açan alverə kaş.

Bağladı gözlərimi müftə gəlir, bax, bu sayaq,
Elə bildim olacaq daima keyfim belə çağ.
Ah! Nəzarət sinəmə çəkdi mənim gör necə dağ,
Getdim axır güdaza, gəldi yaş üstə neçə yaş,
Uymayaydım başıma cəncəl açan alverə kaş.

Bu cəzadan başımı qurtara bilsəydim əgər,
Yoxdu meylim də daha alverə bir zərrə qədər.
Döndəribdir cücəyə burda məni qüssə, kədər,
Niyə tinlərdə gəzərkən başıma düşmədi daş?
Uymayaydım başıma cəncəl açan alverə kaş.

Möhtəkirlər dəyişib, indi girib başqa dona,
Əvvəl-axır düşəcək yolları hökmən bu yana.
Məndən ibrət götürüb, bəlkə, yatanlar oyana!
Əyri işlər, bəd əməllər olacaq aləmə faş,
Uymayaydım başıma cəncəl açan alverə kaş.

## FERMA TALANDIR, DEMƏ

Anlamışam indi mən, ferma talandır, demə...
Söylədiyim faktlara amma yalandır, demə...

Fermada oldun müdir, gəldi qoyunlar cana,
Sovqat üçün xeylisin gündə batırdın qana.
Arxayın oldum səsi çıxmayacaq bir yana,
Xəlvəti yer seçdiyin gizli dalandır, demə,
Söylədiyim faktlara amma yalandır, demə...

Faş eyləyib sirrini, saldı müfəttiş haray,
Xəstələnib fermada guya qoyunlar bu yay.
Köç eyləyib dünyadan əllisi birdən hər ay.
Gəldi ölənlər dilə, ferma talandır, demə...
Söylədiyim faktlara amma yalandır, demə...

Bəlli olub adətin fermada heyvanlara,
Gəldi qonaq, şübhəsiz, növbə çatır onlara.
Bil ki, əlindən gəlib dağda çobanlar zara.
Müftə kabab xəstəsi gündə kalandır, demə...
Söylədiyim faktlara amma yalandır, demə...

Aldı müfəttiş qağa aktları bir-bir ələ,
Gördü dərin ah çəkib, gəldilər onlar dilə.
Söylədilər: bir keçi olmayıb ölsün hələ.
Hər nə gedib fermadan yadda qalandır, demə...
Söylədiyim faktlara amma yalandır, demə...

Bir də görürsən dönüb oldu qoyunlar quzu,
Yaxşı seçir bunları indi müfəttiş özü.
Hey can atır baş çoban bəlkə itirsin izi.
Kim dəyişib onları rüşvət alandır, demə...
Söylədiyim faktlara amma yalandır, demə...

## HEY YAZIRAM

Yatmıram, hey yazıram, var bu qədər məndə dözüm,
Oxuyub anlamıram şerimi, əfsus ki, özüm.

Gecələr sübhə kimi eyləyirəm cızma-qara,
Bir azardır ki, tutub, lap gəlib arvad da zara.
Yat, deyir, keçdi gecə, sən hara, şeriyyət hara?
Deyirəm, səbr elə bir, sözləri səhmanla düzüm,
Oxuyub anlamıram şerimi, əfsus ki, özüm.

Bəyənən olmasa da, zəhmətimə yanmıram heç,
Guya qafiyə nədir, vəzn nədir, qanmıram heç.
Bəli, şerimdə qəliz söz çox olur, danmıram heç.
Qapılar döyməyə zənn eyləmə ki, yoxdu üzüm,
Oxuyub anlamıram şerimi, əfsus ki, özüm.

Özü təhlil eyləsin, qoy oxuyanlar mənə nə?
Məğzini anlamasın, arif olanlar mənə nə?
Tərif etsin, ya da ki, pisləsin onlar, mənə nə?
Düşəcək dillərə axır neçə sanballı sözüm,
Oxuyub anlamıram şerimi, əfsus ki, özüm.

Yazıram mən də yazanlar kimi bəzən gecələr,
Baxıram, bir də görürsən açılıb oldu səhər.
Görüb arvad da deyir: “Kaş yerə girsin belə ər”.
Çıxır ilham qapımızdan, qalır arvadda gözüm,
Oxuyub anlamıram şerimi, əfsus ki, özüm.

## ALİMENT

Evlənib ayrılasan, olmaya amma aliment,
Sonradan zurnasını çalmaya amma aliment.

Girləyirdim başımı, keyf eyləyirdim, nə danım?
Xeyli asudə idi dərdi-bəladan bu canım.
Gizli sirrim açılıbdır, qaralıb indi qanım.
Evlənib, ayrılasan, olmaya amma aliment,
Sonradan zurnasını çalmaya amma aliment.

Evi abad eylədim, borc eyləyib güclə yenə,
Qız evində cibimi qırxdılar ülgüclə yenə.
Tanrı tuş etdi məni, axırı bir giclə yenə.
Evlənib ayrılasan, olmaya amma aliment,
Sonradan zurnasını çalmaya amma aliment.

Dərdimi ərz eyləyim, olmasın ancaq eşidən,
Görməmişdim ki, qaça evdəki arvad kişidən.
Bu fikirdir hələlik qəlbimi hərdən üşüdən.
Evlənib ayrılasan, olmaya amma aliment,
Sonradan zurnasını çalmaya amma aliment.

Harda söhbət salıram, tez soruşurlar yaşımı,
Bu maaşla necə mən girələyim indi başımı?!
Aliment yıxdı məni, yox bişirən bozbaşımı.
Evlənib ayrılasan, olmaya amma aliment,
Sonradan zurnasını çalmaya amma aliment.

Hara getdimsə, uşaqlar çağırır: hey, bura bax,
Dədəmizsən, bilirik, boş yerə gizlənmə nahaq.
İstəyirsən gözünə lap qara çeşmək belə tax.

Evlənib ayrılasan, olmaya amma aliment,
Sonradan zurnasını çalmaya amma aliment.

Mənə çox söylədilər: olma belə ağlı dayaz,
Daha sən ağ elədin, bəsdi həya eylə bir az.
Baxmadım məsləhətə, daz başıma dəydi qapaz.
Evlənib ayrılasan, olmaya amma aliment,
Sonradan zurnasını çalmaya amma aliment.

## NECƏSƏN?

Hörmətim vardı mənim, sexdə müdirdim o zaman,
Can atardım ucalam, halım olub amma yaman.
Çıxar əldən o yerim, heç eyləməzdim də güman.
Düşünürdüm ötəcək daima ömrüm belə şən,
Daha yoxdur soruşan halımı bir yol – necəsən?

Neçə yol söylədilər, çıxma cızıqdan qırağa,
Fikrimiz var ki, səni işdə çəkək tez qabağa.
Olmusan sən də kalan, başqasını qoyma lağa.
Düşməmişdi saçıma heç o zamanlar belə dən,
Daha yoxdur soruşan halımı bir yol – necəsən?

Qoymayıblar özümü evdə bekar qalmağa heç,
Çağırıblar, gəl özün meylin olan bir işi seç.
Harda məclis qurulub, orda deyiblər başa keç.
Salıram indi yada kefdə keçən günləri mən,
Daha yoxdur soruşan halımı bir yol – necəsən?

Elə zənn eyləməyin tək yemişəm daşbaşımı?
Almışam, paylamışam, girləmişəm öz başımı.
Başlayıb sorğu-sual, çaş salıram öz yaşımı.
Girəsən restorana, lap yıxılınca içəsən,
Daha yoxdur soruşan halımı bir yol – necəsən?

Mənfəətdən ötəri hey əl atardım kəlləyə,
İstəyirdim sürüşüm, son dəfə düşdüm tələyə.
Gündə əl qaldırıram, yalvarıram mən fələyə.
Gəldi ordan da səda: olma fırıldaq daha sən,
İndi ehmalla deyir çoxları hərdən – necəsən?

## ÖZ ƏLİMLƏ

Yazma böhtan dedilər, böhtanın əmması çıxar,
Əvvəl-axır olacaqsan el içində yenə xar.
Bil ki, böhtan yazanı axırı böhtan da yıxar.
Elə bildim bəd ayaqda sürüşüb mən çıxaram,
Nə biləydim evimi mən öz əlimlə yıxaram.

Eylədim xeyli götür-qoy edilən məsləhəti,
Olsa da xeyri mənə məsləhətin hər cəhəti.
Bu da vərdişdi dedim, var hərənin öz sənəti.
Yazıram, kim ilişər, mən də kənardan baxaram,
Nə biləydim evimi mən öz əlimlə yıxaram.

Eyləyirdim gecələr sübhə kimi cızma-qara,
Gəlib arvad da əlimdən daha mənzildə zara.
Deyinir: ay kişi, sən başqasına yaxma qara.
Dinsə arvad, yenə də şimşək olub mən çaxaram,
Nə biləydim evimi mən öz əlimlə yıxaram.

Dəyişib indi zaman, böhtana yoxdur inanan,
Getdi ömrüm də hədər, hey əriyir məndəki can.
Zibilim çıxdı üzə, indi deyirlər mənə yan.
Düşsə imkan, çoxunu yandırıb hərdən yaxaram,
Nə biləydim evimi mən öz əlimlə yıxaram.

Güman etdim yazaram əlli cürə ünvana mən,
Amma, əfsus tapılıb yazdığıma şübhələnən.
Çox deyən oldu ki, yazma, ilişərsən yenə sən.
Düşdüm axır tələyə, olmamış idim belə xam,
Nə biləydim evimi mən öz əlimlə yıxaram.

## ARXALISAN

İşlədibdir deyəsən daydayı şeytan əməli,
Qoy lal olsun bu dilim, yoxsa bu işlərdə əli.
Yüksəlirsən günü-gündən, çəkilirsən irəli.
Olsa, vur-tut savadın dördə qədər ancaq olar,
Amma arxanda sənin dağ kimi bir daydayı var.

Bağda tikdin təzə ev, müftəcə gəlmişdi daşın,
Sənə bir kəs demədi: var gözün üstündə qaşın.
İlişən oldu, sənin ağrımadı əsla başın.
Zənn edirdim ki, nəzarət yolun ordan da salar,
Amma arxanda sənin dağ kimi bir daydayı var.

İştahan var, görürəm ki, kecəsən pivəbara,
Dirçələrsən bu sayaq, lövbərini salsan ora.
Səhv edir kim ki, deyir: pul gələcək burda kara.
Yenə minnətçi düşüb, zəng eləyənlər tapılar,
Çünki arxanda sənin dağ kimi bir daydayı var.

Belə dayday, deyirəm, doğrusu, heç düşməz ələ,
Güvənib sən də ona, mən demədim lap ağ elə,
Onu sən lovğalanıb salmısan axırda dilə.
“Mən mənəm” söyləmisən, eyləmisən aləmə car,
Çünki arxanda sənin, dağ kimi bir daydayı var.

Şübhə yoxdur, bilirəm, dərs verəcəklər dayına,
Arxayındın düzələr, qalmadın heç öz hayına.
Şərik oldun dayının məhkəmədə iş “payına”
Çünki hakim çıxarıb doğru, ədalətli qərar,
Söyləməzsən daha: arxamda mənim daydayı var.

## AY QAĞA

Arxayın oldun düzəlib işlərin,
Yoxdu daha zərrəcə dərdin-sərin.
Gözdən uzaq – isti bucaqdır yerin.
Cəhd eyləmə müştəri aldatmağa,
Yoxsa düşərsən tələyə, ay qağa.

Müştəri onsuz da gəlibdir cana,
Səs-sorağın tez yayılıb hər yana.
İş ki fırıq oldu, girirsən dona.
Qaş-gözünü başlama oynatmağa,
Yoxsa düşərsən tələyə, ay qağa.

Daş-tərəzi eyləyir hey ahu-zar,
Dərdi budur – sən demə, pərsəngi var.
Sən də olubsan elə bil indi kar.
Adət edibsən belə mal satmağa,
Bil ki, düşərsən tələyə, ay qağa.

Az tapılan malları yığdın dala,
Dost-tanışı yaxşı salırsan yola.
Yerdə qalan lap bağıra, hay sala.
Meyl eyləmirsən də xəbər tutmağa,
Bil ki, düşərsən tələyə, ay qağa.

Gündə gedirsən evə zənbil dolu,
Bax, bu səbəbdən də azırsan yolu.
Heç tanımırsan daha sağnan solu.
Baxma şişibsən və dönübsən dağa,
İş belə getsə ilişərsən, qağa.

## DÖNMƏZ GERİ

Onda sanırdım özümü dağ kimi,
İş də gedirdi o zaman yağ kimi.
Korlamışam işləri axmaq kimi.
Yad edirəm indi ötən günləri,
Getdi o çağlar, daha dönməz geri.

Sahmana saldım neçə müşkül işi,
Qoymamışam ağrıya dostun dişi.
Hamı deyərdi, kişisən, ay kişi.
Pay da gələrdi bizə əmlik – diri,
Getdi o çağlar, daha dönməz geri.

Dosta fəda eylədim öz canımı,
Gündə kəsərdi neçəsi yanımı.
İndi bilən yoxdu heç ünvanımı.
Gəlmədi heç üzdən-iraqdan biri,
Getdi o çağlar, daha dönməz geri.

Kölgəmə aldım nə qədər yadları,
Özləri yox, yadda qalıb adları.
Xahişə gəlmişdi öz arvadları.
Bəlkə tapım sərfəli bir iş yeri,
Getdi o çağlar, daha dönməz geri.

Gəl, a vəzifə, sənə qurban olum!
Qurbanın idim, yenə qurban olum!
Rəhm eylə bir də mənə, qurban olum!
Bircə deyəydin səninəm, gəl bəri,
Getdi o çağlar, daha dönməz geri.

## BELƏ OLMAZ

Arxalı dağsan, bələdəm mən sənə,
Harda qohum var, yığılıb dövrənə.
Çoxları yanpörtü baxırlar mənə.
Yoxdu sənin tək də qohumbaz, dədə!
Lap bu ağ oldu, belə olmaz, dədə!

Var çalışanlar sənə yaxsın qara,
Baş götürüm, söylə, gedim mən hara?
Verimsən imkan görürəm onlara.
Kefləri sayəndə olub saz, dədə!
Lap bu ağ oldu, belə olmaz, dədə!

Aləmə nöqsanları car eyləyən,
Söz yayıb, hər gün səni xar eyləyən.
Oldu məni dərdə düçar eyləyən,
Eyb eləməz, töhmətimi yaz, dədə!
Lap bu ağ oldu, belə olmaz, dədə!

Ovçu kimi pusquda tək durmusan,
Anlamışam, yaxşı kələk qurmusan,
Tənqid edib, bağrımı lap yarmısan,
Guya dönüb çolpa olub qaz, dədə!
Lap bu ağ oldu, belə olmaz, dədə!

İclas edib, xamladılar lap səni,
Dövrələyib eylədilər hop səni,
Yıxdılar axırda da tir-tap səni,
Dur ayağa, eyləmə çox naz, dədə!
Bəs deməmişdim belə olmaz, dədə!

## TAPŞIR MƏNİ

Köhnə müdirçin məni boğmuş qəhər,
Girlə, deyərdi başını birtəhər.
Amma təzə yoxlayır hər gün səhər,
İşçiləri lap gətiribdir cana,
Ay dayı, gəl, bir məni tapşır ona.

Şübhəliyəm tək mənə dəymir hələ,
Tez-geci vardır, quracaqdır tələ.
Qorxuram axırda sala əngələ,
Çarə eylə, mən də çıxım bir yana,
Ay dayı, gəl, bir məni tapşır ona.

Zəng eylə bir yol, məni versin yola,
Çax-çux edim, bəlkə, cibişdan dola.
Dost-tanışımdan yenə qaldım dala.
Faydası yoxdur, girirəm hər dona,
Ay dayı, gəl, bir məni tapşır ona.

İş belə getsə olacaqdır çətin,
Bilmədim axır sayını töhmətin.
Qorxuruq hətta eyləyək söhbətin,
Azca qalıbdır bizi bir-bir yona,
Ay dayı, gəl, bir məni tapşır ona.

Bircə pənahım sən idin dünyada,
Sən də məni salmadın əsla yada.
İş dolaşıb, getdi bacoğlun bada,
Səhvimi qandım, dayı, handan-hana,
Keçdi daha, söz demə məndən ona.

## KEYFİMİ MƏN POZMARAM

Baxma ki, koptorqdu mənim iş yerim,
Axşamacan kefdə keçir günlərim.
Yoxdu daha zərrəcə dərdim-sərim.
Məclis olan yerdə mən hökmən varam,
Dünya dağılsın, kefimi pozmaram.

Xam deyiləm, alver edib bişmişəm,
Pul-paradan xeyli qabaq düşmüşəm.
Müftə qonaqlıqda yeyib, şişmişəm.
Özgələrə amma quyu qazmaram,
Dünya dağılsın, kefimi pozmaram.

Görsəm əgər mal çürüyür, batmışam,
Tez xarabın yaxşısına qatmışam.
Tərif edib müştəriyə satmışam.
Üstünə öz qiymətini yazmaram,
Dünya dağılsın, kefimi pozmaram.

Gündə nahardan dönürəm "dübbədüz",
Saymamışam çıxsa müdir üzbəüz.
Çox deyib hərdən mənə ehmallı söz.
Dinməmişəm, qoy elə bilsin karam,
Dünya dağılsın, kefimi pozmaram.

Düşməyəcək bir də bu imkan ələ,
Kimsə qururmuş demə çoxdan tələ.
Canıma düşmüş yenə də vəlvələ.
Çaşbaş olub öz yolumu azmaram,
Sən necə görmüşdün, elə mən varam,
Dünya dağılsın, kefimi pozmaram.

## YOXSA SƏRIŞTƏN, OXUMA
(*Bəzi müğənnilərə*)

Xalqa məxsusdu muğam, mahnı, – deyiblər, – atalar,
Mahir ustadın adı daima yaddaşda qalar.
Oxuyursansa, oxu, onları sən də necə var.
Yoxsa, qondarma özündən, necə gəldi toxuma,
Bacarırsansa oxu, yoxsa səriştən, oxuma!

Olsa zəngulə də yersiz, yenə xoşdur özünə,
Hər nə ifa eyləsən, yaxşı fikir ver sözünə.
Çox da vurmur həlvalik səhvini kimsə üzünə.
Çarə yoxdur, susur o, məcbur olur göz də yuma,
Bacarırsansa oxu, yoxsa səriştən, oxuma!

Atılıb-düşmə və dingildəmə sən boş-boşuna,
Elə zənn eyləmə ki, gül səpəcəklər başına.
Küs özündən, baxanın gəlməsə bunlar xoşuna.
Şəkk edirsən, görürəm, çox narahat olduğuma,
Bacarırsansa oxu, yoxsa səriştən, oxuma!

Sənətin "vurğunu"san, çünki ona var "həvəs"in,
"Zilə" qalxmaq nə gərəkdir, bala, yoxdursa səsin.
Olur hərdən bağırırsan, kəsilincə nəfəsin.
Bu sayaq səs çıxarır, kim ki, batır nəmli quma,
Bacarırsansa oxu, yoxsa səriştən, oxuma!

Zənn edirsən, beləcə, girləyəcəksən başını,
Gözləyirsən, ola toy, tez yığarsan daşbaşını.
Dirçəlib bir balaca, sonra alarsan maşını.
Düşünürkən səni mən, girmisən axşam yuxuma,
Bacarırsansa oxu, yoxsa səriştən, oxuma!

Sənətin zirvəsinə qalxmağı gəl sanma asan,
Bu çətin yolda gərək zəhmətə çox qatlaşasan.
Can atırsan görürəm şöhrətə, məhşurlasan.
Çoxunuz adət edib, toylara lap gündə cuma,
Bacarırsansa oxu, yoxsa səriştən, oxuma!

## BİLİRSƏN

Mal gətirirsən bazara satmağa,
Cəhd eyləyir möhtəkir aldatmağa.
Siftəmi kor eyləmə gəl, ay qağa.
Axşamacan xərcimi saysan əgər,
Sən ki bilirsən, nə deyim, müxtəsər...

Müftəcə olmur ki, bazarkomda yer,
Salma haray, hər nə umur, "dinmə, ver".
Aşkarə alverdi, deyildir bu sirr.
Hay-küyünə burda baxan var məgər?
Sən ki bilirsən, nə deyim, müxtəsər...

Nırx qoyulub, haqq verəsən sən gərək,
Əl salasan ciblərə hərdən gərək.
Çarə qılam öz başıma mən gərək.
Yoxsa boğar burda məni qəm-kədər,
Sən ki bilirsən, nə deyim, müxtəsər...

Daş-tərəziyçin gedirəm minnətə,
Çarə nədir, dözməliyəm zillətə.
Satmalıyam mən də baha qiymətə.
Çoxdu bazarda, ay kişi, dərdi-sər,
Sən ki, bilirsən, nə deyim, müxtəsər...

Yer də ki yoxdur gecələr qalmağa,
Məcbur edirlər demaqoq olmağa.
Başlasam hətta lap haray salmağa,
Faydası yox, heç kəsə etmir əsər,
Sən ki bilirsən, nə deyim, müxtəsər...

Bəlkə bazarkomla düzəlsin aram,
Yalvarıram mən, daha yoxdur çaram.
Düşsə məqam, bir neçəsiynən varam,
Dəng eyləyir çek satan hər gün səhər,
Sən ki bilirsən, nə deyim, müxtəsər...

## DEYƏSƏN

Kefdə keçərdi dayımın hər anı,
Getdi əlindən belə bir imkanı.
Xeyli zamandır qaralıbdır qanı.
Ovqatı təlxdir, üzə vurmur kişi,
Hə, deyəsən bəlkə də yaşdır işi.

Bircə baxışla məni anlardı o,
Olsa günahım, məni danlardı o.
Gəlsə qonaq, tez məni yanlardı o.
Vardı onun, bax, belə bir vərdişi
Hə, deyəsən bəlkə də yaşdır işi.

Arif adamlar tükü tükdən seçir,
Çoxları görcək sovuşub yan keçir.
Hətta salam verməyi ölçüb-biçir.
Döndü qəfildən fələyin gərdişi,
Hə, deyəsən bəlkə də yaşdır işi.

Arxalanırdım ona illər boyu,
Ağlıma gəlməzdi qazan var quyu.
Amma bulandırdı paxıllar suyu.
Yad edir hərdən də olub keçmişi,
Hə, deyəsən bəlkə də yaşdır işi.

Kölgə gəzərdi yeri olsun sərin,
Amma quyu indi dərindir, dərin,
Versə də təhvil hələlik iş yerin.
Sancı verir, ağrıyır hərdən dişi,
Hə, deyəsən bəlkə də yaşdır işi!

Dağ kimi dayday olub alçaq təpə,
Gəl ki, müfəttiş daha yatmır ipə,
Sahilə atmış onu işdən ləpə.
Çox uzadırlar görürəm təftişi,
Hə, deyəsən axırı yaşdır işi.

## NİYƏ GEC ÇƏKDİ

Girləyib öz başını, günlərini sayma, müdir,
“Çıxıram” söhbətini hər çatana yayma, müdir!
Bəsdir, axırda bizi xam yerinə qoyma, müdir.
Dona girmə, tanıyan işdə səni azdı, məgər?
Qırxaram bığlarımı, ərzə verib çıxsan əgər.

Bərkidərsən yerini hiylə ilə sən bu sayaq,
Bilirik, xam deyilik, var hələ arxanda dayaq.
İlişəntək sürüşərkən dalana ta bu bayaq.
Düşər işlər yoluna, amma hələ xeyli çəkər,
Qırxaram bığlarımı, ərzə verib çıxsan əgər.

İndi-indi yığılır işdə qohumlar başına,
Kimə nə, ortaq olubsan çoxunun daşbaşına.
Xəlvəti evdə qonaqsan aşına, bozbaşına.
Acıdilsən, eyləyibsən dilini indi şəkər,
Qırxaram bığlarımı, ərzə verib çıxsan əgər.

Bərkə düşsən, əl atırsan niyə hərdən kələyə,
Güvənirdin özünə, düşməyəcəksən tələyə?
Yalvarırsan, görürəm, indi də hər gün fələyə?
Yatdı bəxtin, elə bil, tərsinə fırlandı təkər,
Qırxaram bığlarımı, ərizə verib çıxsan əgər.

Bəs gedirdin? Nə yubandın, niyə gec çəkdi belə?
O cibişdan dediyin yoxsa yarımçıqdır hələ?
Gümanım var, deyəsən, həll olacaqdır məsələ.
Sənə töhmət də belə kar eyləmir zərrə qədər,
Qırxaram bığlarımı, ərzə verib çıxsan əgər.

Görmədim öz xoşuna bir dəfə işdən çıxasan?!
Udqunursan, görürəm... bəli deyildir bu asan.
Gözləyirsən ilişib axırı bir gün yanasan.
Çatıb artıq o məqam, çox atılıb düşmə hədər
Qırxaram lap bığımı, işdə daha qalsan əgər.

## BAX, BU SAYAQ

Sən məni tərif elə hərdən bir az,
Mən də səni, keyfimiz olsun taraz.
Əyri baxan kəslərə xəndək də qaz.
Böhtan atıb sən yaxa bilsən qara,
Bax, bu sayaq toy tutarıq onlara.

Çərxi-fələk tərsinə hərləndimi,
Tez işə sal sən də mənim fəndimi.
Əl ki, bala, yazmağa öyrəndimi.
Böhtanı yaz, yolla bilirsən hara,
Bax, bu sayaq toy tutarıq onlara.

Bir parası işdə gülürlər üzə,
Amma durublar, görürəm, göz-gözə.
Qulp da qoyurlar dediyim hər sözə.
Tünd eylə rəftarını, gəlsin zara,
Bax, bu sayaq toy tutarıq onlara.

Mən sənə bel bağlamışam, ay kişi,
Zəhmətimi eyləmə gəl zay, kişi.
Dağ kimi arxandadı dayday, kişi.
Gəlməlisən sən də mənimçün kara,
Bax, bu sayaq toy tutarıq onlara.

Cəhd eyləyən olsa məni yıxmağa,
Çarəsi var, başlayaram sıxmağa.
Sən də tələsmə aradan çıxmağa.
Bil səni də çəkməliyəm mən dara,
Sən də qoşuldun deyəsən onlara.

## DƏRK EDƏ BİLSİN

Vurma qulaq ardına sözlərimi, ay bala!
Təhsil alır tayların, sənsə qalırsan dala.
Dəng eyləyirsən məni: “zimbala” al, “zimbala”.
Baxma ki, bir çoxları oğluna almış maşın
Kefdən ayıl, bunları dərk edə bilsin başın!

Bərkə düşəntək dədə tez yetişir dadına,
Bir yoluq “üç” yazdırır ərköyün övladına.
Gündə azı yüz dəfə tapşırır arvadına.
Aləmə car etməsin müftə gələn daşbaşı,
Kefdən ayıl, bunları dərk edə bilsin başın!

İllər ötür, ay bala, sən də dolursan yaşa,
Arzuların ox kimi qoyma toxunsun daşa.
Zəhmətə qatlaş bir az, təhsilini vur başa.
Baxma ki, tək-tük hələ var atan elmin daşın,
Kefdən ayıl, bunları dərk edə bilsin başın!

Ay bala, vardır hələ məskən edən tinləri,
Lovğalanır, guya ki, kefdə keçir günləri.
Amma ki, qanmır, oğul, qaldı həyatdan geri.
Evdə yeyir çünki o, gündə aşın, bozbaşın,
Kefdən ayıl, bunları dərk edə bilsin başın!

Söylədiyim kəslərə, ay bala, qurşanma sən,
Bax, gələcək günlərin qeydinə qal indidən.
Diplomu alsan əgər, şad olar, oğlum, dədəm,
Sözlərimi mən deyim, saxlaya kaş yaddaşın,
Kefdən ayıl, bunları dərk edə bilsin başın!

## SƏN DƏ KEÇƏRSƏN ƏLƏ

Gəl, dolanaq elləri, ay kişi, başdan-başa,
Vərdiş edən varmı gör sən kimi heç daşbaşa?

Alverə qurşanmağın vallah, əbəsdir, utan!
Bir tərəfi alverin daima nəsdir, utan!
İndiyəcən kəsmisən tinləri, bəsdir, utan!
Zənn eyləyirsən oxun bir də toxunmaz daşa?
Görməmişəm sən kimi vərdiş edən daşbaşa.

Kölgədə gizlənmisən, kimsə toxunmur hələ,
Gec-tezi var, axırı sən də keçərsən ələ.
At daşını alverin, sən də bu gündən belə.
Müftə gəlirdən nəsə... az qalıb ağlın çaşa,
Görməmişəm sən kimi vərdiş edən daşbaşa.

Bal kimidir müftə pul, sən də qonumsan ona,
Sərvətə bel bağlayan çıxmayıb heç bir yana.
Yox daha bir müştəri, xamlayasan, aldana.
Ağlı dayazsan hələ, çox da dolubsan yaşa,
Görməmişəm sən kimi vərdiş edən daşbaşa.

Xeyli zamandır sənin kefdə keçir günlərin,
Sanma ki, olmaz daha dünyada dərdin-sərin.
Alveri tərgitmisən, "yer" verəcəklər sərin.
Fikrimi dərk eyləsən, məncə, düşərsən başa,
Görməmişəm sən kimi vərdiş edən daşbaşa.

## TƏZƏ İL

Gözləyirdim yolunun xeyli zamandır, təzə il,
Ümidim tək sənədir, tez gəl, amandır, təzə il!

Şübhə yoxdur, bataram ortaya qoysam olanı,
Birsayaq cəhd eyləyib, doldura bildim planı.
Yola saldım yuxarı, doğru kimi ağ yalanı.
Yalanın keçdiyi yol xeyli dumandır, təzə il,
Qoyma sirrin açıla üstü, amandır, təzə il!

Saxta iş dalğa kimi yırğalayıb lövbərimi,
Qorxu artırdı mənim bir daha dərdi-sərimi.
Köhnə işdən sürüşüb gizli, dəyişdim yerimi.
Ürəyim tir-tir əsir, qorxulu andır, təzə il,
Qoyma sirrin açıla üstü, amandır, təzə il!

Daldada sakit olur, girlə deyillər başını,
Ehtiyatçın geyirəm paltarımın nimdaşını.
Hələlik mən yeyirəm gündə soğanbozbaşını.
Deməsinlər mənə, kaş, rüşvət umandır, təzə il,
Qoyma sirrin açıla üstü, amandır, təzə il!

Nə hesabat verirəmsə azı, çox göstərirəm,
Yeri gəldikdə də hərdən varı çox göstərirəm.
Amma aşkarda yenə nəfsimi tox göstərirəm.
Deməsinlər mənə qoy, halı yamandır, təzə il,
Qoyma sirrin açıla üstü, amandır, təzə il!

Sən gələrsən deyirəm, bəlkə, itər köhnə izim,
Açılar qol-qanadım, yoxsa bükülmüşdü dizim,
Son təvəqqem də budur, yoxdu daha başqa sözüm.
Var ümid, qurtararam, amma gümandır, təzə il,
Mən ölüm, sən bu işi xeyli yubandır, təzə il,
Qoyma sirrin açıla üstü, amandır, təzə il!

## DÜŞMÜRƏM ANCAQ BAŞA

Baxma ki, mən dolmuşam artıq yaşa,
Düşməmişəm bir şeyi ancaq başa;
Bir parası aludədir daşbaşa,
Müftə gələn hər cürə nemət yeyir,
Vicdanı guya ləkəsizdir deyir.

Adət edib özgəyə yaxsın qara,
Həzz alır hər kim ki, düşür bərk dara.
Gəlməyib ömründə özü bir kara,
Bax, bu sayaq ortada baş girləyir,
Vicdanı guya ləkəsizdir deyir.

Görsə ki, artır birinin hörməti,
Hövl eyləyir, tez dəyişir söhbəti,
Ya da deyir: işdə alır rüşvəti,
Amma bu tip heç özünü görməyir,
Vicdanı guya ləkəsizdir deyir.

Keçsə işi işdi birindən əgər,
Gündə gedib əlli cürə dil tökər,
Ta düzəlincə çətin o əl çəkər,
Yüz dəfə görsə, dayanıb baş əyir
Vicdanı guya ləkəsizdir deyir.

Var beləsi, gündə girir bir dona,
İstəsə lap çəkmə tikər şeytana,
İnsanı axır gətirir lap cana
Sərfəli olsa nə desən eyləyir,
Vicdanı guya ləkəsizdir deyir.

## KƏNDƏ MƏKTUB

Dədə, məndən nigaran qalma bu gündən belə sən,
“Kəndə gəl” sözlərini bir də gətirmə dilə sən.
Düşür işlər təzəcə səhmana, bir səbr eylə sən.
Hava nəmdir, hələlik müştərim azdır, dədəcan!
Çıxacaq qış, görəcəksən daha yazdır, dədəcan!

Hər dəfə “qaz” vururam adi suya, qazlı olur,
Amma ki, müştərilər müxtəlif avazlı olur.
Kimisi “çisti” içir, bəzisi də nazlı olur.
Bilmirəm müştəridə heç bu nə nazdır, dədəcan!
Su tükənmir, hey axır, sanki, Arazdır, dədəcan!

Sanma ki, təkcə mənəm alisavadlı su satan,
Su dükanında, dədə, çoxdu bu cür lövbər atan.
Gücü çatmaz qopara – onlara qoşsan da kotan.
Hər kəsin arxası var, əhvalı sazdır, dədəcan!
Bu səbəbdən çoxunun keyfi tarazdır, dədəcan!

Elə ki, bir balaca işləri saldım yoluna,
“Pul” deyib, gündə soğan doğramaram əhvalına.
Baxmaram onda sənin təkcə təqaüd puluna.
Demə ki, söylədiyim köhnə avazdır, dədəcan,
Gün doğur üstümə, vallah, daha yazdır, dədəcan.

## BAMƏZƏ SÖHBƏT YERİ

Harda taparsan kimi, ay kişi, məndən soruş,
Çayxanaya ilboyu gündə gedəndən soruş.
Müşkül işi ordaca sahman edəndən soruş.
İsti bucaqdan biri – çayxanadır, çayxana,
Baməzə söhbət yeri – çayxanadır, çayxana.

Çoxları adət edib lövbəri salsın ora,
Bəzisi baş girləyir, amma gələn var kara.
Çayçıda axtar məni, düşsən əgər sən dara.
Hər cürə minnət yeri – çayxanadır, çayxana,
Baməzə söhbət yeri – çayxanadır, çayxana.

Ordakı söhbətlərə var həvəsim, neyləyim,
Bir para kəslər ki, var, gəl, səni dost eyləyim.
Kim nəyə qulluq edir, sonra sənə söyləyim.
Bolluca qeybət yeri – çayxanadır, çayxana,
Baməzə söhbət yeri – çayxanadır, çayxana.

Sal yolunu, gəl ora, görməli yerdir, kişi!
Baxma çayın rənginə, qiyməti birdir, kişi!
Kimlərə tünd çay gəlir, bax, o da sirdir, kişi!
Cəzb eyləyən müştəri – çayxanadır, çayxana,
Baməzə söhbət yeri – çayxanadır, çayxana.

Yoxlamada qəndlə çay düz çıxıb illər boyu,
Çatmayıb ancaq bir az, ay kişi, şollar suyu;
Zənn eyləmə mən yazıq, çayçıya qazdım quyu.
Müftəcə sərvət yeri – çayxanadır, çayxana,
Baməzə söhbət yeri – çayxanadır, çayxana.

## BİR YERƏ DÜŞDÜK

Daydayımın hörməti varmış demə,
Baxma salıblar onu zildən bəmə.
Söylədi işlər düzəlir, qəm yemə.
Eyb eyləməz oldu bir az səhvimiz,
İşləyərik səbr eylə, bir yerdə biz.

Oldu müdir, durma, dedi, sən də gəl,
Aldı məni kölgəsinə əlbəəl.
Mənfəət olmaz dedi, olsan əfəl.
Amma çalış qoyma ki, qalsın bir iz,
Toplayarıq bolluca sərvət də biz.

Köçdü müdir yazda təzə mənzilə,
Söylədi, oğlum, hələlik səbr eylə.
Sən də köçərsən, düşərik tez dilə.
Qonşu ki olduq, saz olar keyfimiz,
Nərd atarıq hər gecə eyvanda biz.

Olsa xeyir-şər gedirik biz qoşa,
Bax bu səbəbdən də düşüblər başa:
Ev də, eşik də alınıb daşbaşa.
Həm də deyirlər, itidir nəfsimiz,
Qorxuram ancaq ilişək burda biz.

...Bəli, tamah saldı yaman əngələ,
Qurdular axır bizə bir gün tələ,
Barı işi hakim özü tən bölə.
Başqa ümid yoxdu, budur dərdimiz,
Birgə ilişdik, əyilib qəddimiz.
Bir yerə düşdük yenə axırda biz.

## AXTARACAQDIR

Olmayıb heç bir yerə lövbər salan,
Görmədim ancaq onu pulsuz qalan.
İşləyib az, amma yığıbdır kalan.
Gördü ki, əngəl olacaq işləri,
Axtaracaqdır təzə bir iş yeri.

Cəhd eyləyər daima girsin gözə,
Üzdə gülər, "bəli" deyər hər sözə.
Zir-zibili çıxsa da bir gün üzə.
Hər nə desən həsdəyəcəkdir geri,
Axtaracaqdır təzə bir iş yeri.

Falçı gərəkdir oturub fal aça,
Hansı bir əldir götürüb astaca
Bu bədəməl alçağı etmiş uca?
Qovlasalar, daydayılardan biri,
Tez tapacaqdır ona bir iş yeri.

Möcüzədir, tez düzəlir hər işi,
Yağlı yerə meyl eyləyir hey kişi.
Amma ki, salmır yada bir keçmişi.
"Orda" keçibdir nə qədər günləri,
İndi tapıbdır təzə bir iş yeri.

Zəhmətə salmazdı kişi canını,
Kefdə keçirdərdi o hər anını.
İndi qaraldıblar onun qanını.
Daydayısı həbsə düşəndən bəri,
O tapa bilmir təzə bir iş yeri.

## GƏLƏ BİLMİR ÖZÜNƏ

Saldı axırda özün dostunu dildən-dilə sən,
Rahat olmaz ürəyin, qurmasan hər gün tələ sən.
Pilə-pillə ucalırsan belə yolla hələ sən.
Durulub xeyli kefin, dünya görünmür gözünə,
Mat qalıbsan, görürəm, indi də sən öz-özünə.

Təzə işdə axışıb təbrikə yadlar da gəlir,
Bəzisi öz evinə indi səni doğma bilir?
Eləsi var ki, əgər üstünə toz qonsa silir.
Belə kəslər deyəcək "bəli", "baş üstə" sözünə,
Mat qalıbsan, görürəm, indi də sən öz-özünə.

Bu fərasətlə səni kim çəkəcəkdir qabağa,
Bəllidir, gizli deyil, hətta bilir körpə çağa.
Köhnə işdə çox olubdur zibilin, amma, qağa
Kim ki, ordan yanına gəldi, gülürsən üzünə,
Mat qalıbsan, görürəm, indi də sən öz-özünə.

Girir hər gündə, hələ girdə manatlar yuxuna,
Çalışırsan olasan sən də dayaq bir çoxuna.
Gözlə ancaq "xoruzu" verməyələr qoltuğuna.
Onda artıq gec olar, sən də vurarsan dizinə,
Söyləyərlər ki, kişi heç gələ bilmir özünə.

## SƏN DEMİSƏN

İstəyirəm, ay kişi, səndən yazam,
Düşsə məqam lap sənə xəndək qazam,
Sən demisən guya mən arvadbazam,
Üç dəfə evlənmişəm, azdır yenə,
Verməliyəm, bəlkə, hesabat sənə?

Dəxli nədir ki, sənə getdim hara,
Külfət əlimdən gəlir hər gün zara.
Adət edibsən vurasan sən ara,
Boş-boşuna döymə mənimçün çənə,
Verməliyəm, bəlkə, hesabat sənə?

Harda olubsan, kişi, hərdən qonaq,
Eyləmisən qeybətimi çox nahaq,
Uf demərəm, kim sənə bir çəksə dağ,
Yoxdu tayın, bir dənəsən, bir dənə!
Verməliyəm, bəlkə, hesabat sənə?

Fərz eləyək sən də deyirsən düzün,
Bəs o, filankəsləri görmür gözün?
Əlli fırıldaq eyləyirsən özün,
Var soruşan: sən niyə çıxdın tinə?
Verməliyəm, bəlkə, hesabat sənə?

Atmısan öz iş-gücünü bir yana,
Sən məni, vallah, gətiribsən cana,
Gəl, özünü salma nahaqdan qana,
Ağ eyləyirsən, kişi, gündən-günə
Verməliyəm bəlkə hesabat sənə?

## TƏNBƏL KİŞİ

Ortada baş girləmə, tənbəl kişi!
Olma bu yolda bizə əngəl, kişi!
Sən də hünər meydanına gəl, kişi!
Gör necə pambıq vurulubdur taya,
Durma, kişi, tarlaya çıx, tarlaya!

Bəsdi haray saldın “ay qarpız alan”,
Müftə qazancın da olubdur kalan.
Küncdə-bucaqda, daha az qurdalan.
Varsa üzündə azacıq bir həya,
Durma, kişi, tarlaya çıx, tarlaya!

Torpağın ətrin duyasan sən gərək,
Zəhmətə qatlaş ki, bol olsun çörək.
Bir dəfə də tarlada tər tök, görək.
Çayxanada vərdiş edibsən çaya,
Durma, kişi, tarlaya çıx, tarlaya!

İş-gücü var dindirəsən hər kimi,
İndi qadınlar yarışır ər kimi.
Sənsə gəzirsən elə bifər kimi.
Evdə də arvad səni salmır saya,
Durma, kişi, tarlaya çıx, tarlaya!

Tarlada tər tökməmisən bir gilə,
Müftə yeyib kölgədə az mürgülə.
Öz canına bəlkə də heyfin gələ.
Yoxsa şişirsən belə aydan-aya,
Durma, kişi, tarlaya çıx, tarlaya!

## DƏDƏMİN XƏTRİNƏ

İncimişəm, ay bala, səndən, dedi,
Gizli vurursan niyə məndən, dedi.
Əlbir olaq biz də bu gündən, dedi.
Mən dədənəm, sən də oğulsan mənə,
Gəl bazara, düşsə, araq xətrinə.

Çöldə vuraq, evdə anan bilməsin,
"Əlli" də atsan, olacaqdır bəsin.
Evdə gərək çıxmasın əsla səsin.
Bilsə əgər, toy tutacaqdır sənə,
Gəl bazara, düşsə, araq xətrinə.

İlboyu oldum dədəmin yoldaşı,
Uddu araq gündə gələn daşbaşı.
Gündə vurur, bir yol ayılmır başı.
"Yüz" vururam, zorla deyir vur yenə,
Gəl bazara, düşsə, araq xətrinə.

Getdi o çağlar, daha dönməz geri,
Çarpayı olmuş neçə ildir yeri.
İndi də hərdən çağırır: gəl bəri.
Xəlvəti, oğlum, gedib al bir dənə,
Dəyməliyəm mən dədəmin xətrinə.

Söyləyir hərdən: –Tükənib taqətim,
Kar eləmir yalvarışım, minnətim.
Yox, belə getsə, qalaram mən yetim
Siz də deyin bəlkə bu yoldan dönə,
Dəymәyirəm mən dədəmin xətrinə.

## YAXŞI Kİ VARSAN

Hörmətim artıb sənə, vallah, kişi!
Sən ki düzüb-qoşdun o müşkül işi.
Saxladılar bizdə gedən təftişi.
Yoxsa batıb indi gedərdim bada
Yaxşı ki varsan hələ sən dünyada.

Çox da ki biz kəsməmişik duz-çörək,
Dost kimi dar gündə sən oldun kömək
Bəlkə mən oldum sənə bir gün gərək.
Dalğalı ümmanda sən oldun ada,
Yaxşı ki varsan hələ sən dünyada.

İndi dönübdü ürəyim bir dağa,
Mən əvəzin çıxmalıyam, ay qağa!
Sal yolunu bir, mən ölüm, gəl bağa.
Yaxşıları orda salaq biz yada,
Yaxşı ki varsan hələ sən dünyada.

Var hələ də dostu satanlar pula,
Mənfəətindən ölə qalmaz dala.
Onları dünya salacaqdır yola.
Hər nə yığıbdır qalacaq arvada,
Yaxşı ki varsan hələ sən dünyada.

## AH, OLA İCLAS

Bir parası işdə girir lap gözə,
Beş qat olur, gəlsə müdir üz-üzə.
Ağ yalanı bənd eyləyir düz sözə.
Gündə girir, ay kişi, min bir dona,
Ah, ola iclas, nə çəkərdim ona!

Üz ki verirsən, deyir astar da ver,
Bir zəlidir, gəl bu yana sən də gör.
Müftə qonaqlıqda seçir başda yer.
Saçları çaldır, qoyur hərdən xına,
Ah, ola iclas, nə çəkərdim ona!

Başqasını əsla bəyənmir belə,
Adət edib xam adama xox gələ.
Ya da görürsən qurur hərdən tələ.
Vərdiş edibdir sözünü tez dana,
Ah, ola iclas, nə çəkərdim ona!

Oxşadırıq biz onu hərdən dağa,
Keyqulu qanmır ki, qoyublar lağa.
Həm də gülürlər belə bir axmağa.
Hər nə deyirsən, qanır handan-hana,
Ah, ola iclas, nə çəkərdim ona!

Olsa müdir qəmli, çəkir ah o da,
Sanki, batıbdır gəmisi dəryada.
Hər yeri gəz, yox ona tay dünyada.
İşdə bizi lap gətiribdir cana,
Ah, ola iclas, nə çəkərdim ona!

## OLA İMKAN

Bəzən iclasda çıxır kürsüyə bir rüşvət alan,
Sanki, xortdan görünür gözlərinə yerdə qalan.
Döşəyir müftəxora cümlə sözü amma yalan.
Fərqi yoxdu, nə qədər yaxşı da gəlsə bu avaz,
Ola imkan, vurasan böyləsinə yağlı qapaz.

Guya heç sevmədiyi dünyada “rüşvət” sözüdür,
Bəlkə rüşvət dəlisi zalda elə tək özüdür.
Müftə pul can-ciyəri, şək qulağı, çəp gözüdür.
İşdə hər gündə yolur, saysan əgər, bir neçə “qaz”,
Ola imkan, vurasan böyləsinə yağlı qapaz.

Keçəni iş başına qulbeçə tapmış özünə,
İnanır qulbeçənin doğru, yalan, hər sözünə.
Düz işi görsə belə, şəkk eləyir öz gözünə,
Görə öz vicdanını kaş, utana barı bir az,
Ola imkan vurasan böyləsinə yağlı qapaz.

Zənn edir ki, özütək hamı soyur hər çatanı,
Nə sayaq qandırasan, gəl sən oyatma yatanı.
Yoxsa, vallah, dalına bil, sarıyarlar atanı.
Hələ ki, arxası var, kef-damağı olsa da saz,
Ola imkan, vurasan böyləsinə yağlı qapaz.

Danışanda elə bil, sanki, mələkdir bu kişi,
Ya da göylərdə gəzən canlı fələkdir bu kişi.
Amma başdan-ayağa məxfi kələkdir bu kişi.
Olmasa xeyri, edər xırda bir işçün sənə naz,
Ola imkan, vurasan böyləsinə yağlı qapaz.

Açdı bu sirri mənə sadə bir insan, gözü tox,
Hiss edirdim ki, onun dünya malında gözü yox.
Tanıyıb müftəxoru, çünki itiymiş gözü çox.
Söylədi: rüşvət alan antipod haqqında da yaz,
Ola imkan, vurasan bədəmələ yağlı qapaz.

## BU YAN CİBİMDİ, QARDAŞ

Ay kişi, hər kəslə sən tələsmə dost olmağa,
Cəhd edəcək “qaz” kimi gündə səni yolmağa.
Sino gedir bir çoxu cibişdanı dolmağa.
A tövbə fərqi yoxdur, qohumdu, kimdi, qardaş...
Odur ki, dostum mənim bu yan cibimdi, qardaş.

Bir “təpə” dostum dönüb vəzifədə “dağ” oldu,
Bəxtinə bax, əlbəəl iş yeri çim yağ oldu.
Pul-paradan topladı, kef-damağı çağ oldu.
Süd gölünə düşəndə, tək özü çimdi, qardaş,
Odur ki, dostum mənim bu yan cibimdi, qardaş.

Bazarda arsız-arsız mənə tərəf cumdu o,
Gileylənib, üstəlik qonaqlıq da umdu o.
Şot gələndə ortaya, bir gözünü yumdu o.
Anladım bu işarə nə him, nə cimdi, qardaş,
Odur ki, dostum mənim bu yan cibimdi , qardaş.

Sən də çalış, ay kişi, dostu ürəkdən tanı,
Cüvəllağı dostların dostuna yanmaz canı.
Bəzən itin dostluğu heyran edir insanı.
Düşüb adı dillərə: “ağqulaq bimdi”, qardaş...
...Odur ki, dostum mənim bu yan cibimdi, qardaş.

## OLMALIDIR

İnsan doğulan olmalıdır pis, ya da yaxşı,
Hərçənd bəd ayaqda çatır ancaq dada yaxşı.
Əfsus ki, qalır pis, gedir hərdən bada yaxşı.
Cismən çoxusu bənzəsə də insana qardaş,
İnsan odu ki, insana candan yana, qardaş.

Aləmdə günəş varlığının az yaşı yoxdur,
Gəl ki, yerə nur paylamayan bir "daşı" yoxdur.
Dünyada adam var hələ də öz başı yoxdur.
"Başsız" nə qələt eyləsə kaş ki, qana, qardaş,
İnsan odu ki, insana candan yana, qardaş.

Çox da birisi elmi atıb çalğı çalandır,
Guya itirib mənliyini pullu, kalandır,
İnsanlığa heç dəxli də yoxdur, bu yalandır.
Yanlış bu fikirlər gətiribdir cana, qardaş,
İnsan odu ki, insana candan yana, qardaş.
Zahirdə adam var görünür aləmə bir dağ,
Batində paxıllıq gəmirir, qəlbini ancaq.
Süfrəndə çörək kəssə də, lap dadsa da bal, yağ,
İnsanlığı yoxsa çalışır ki, dana, qardaş,
İnsan odu ki, insana candan yana, qardaş.

Dünyada qalır min əməlindən biri, ey dost!
Pis pisdi, ya olsun ölü, yaxud diri, ey dost!
Düşmüş gözünə ağ ləkə qozdan iri, ey dost!
İnsandı niyə bəs qoşulub şeytana, qardaş?
İnsan odu ki, insana candan yana, qardaş.

## VAR BAKIDA

Kəndi çapdın, taladın astaca çıxdın aradan,
Tutmusan el şotuna sən yükünü pul-paradan.
Heç demirsən şəhərə düşdü güzarın haradan.
Dolanırsan hələlik döngələri dar Bakıda,
Düz yolu əyri gedən olsa da az, var Bakıda.

Ötsə illər də sənin zir-zibilin batmayacaq,
Kənddə kölgəndə gəzən arxivinə atmayacaq.
Sən güman etmə səsi ali yerə çatmayacaq.
Bir zaman bəlkə olub, yoxdu daha kar, Bakıda,
Düz yolu əyri gedən olsa da az, var Bakıda.

Yalvarış, qeyri-filan kar eləməz daş ürəyə,
Çox dığırlansa da qoz düşməlidir bir mərəyə.
Zirvədən yumbalanıb sən də düşübsən dərəyə.
Ortaq ol, çoxdu satan alma, ərik, nar, Bakıda,
Düz yolu əyri gedən olsa da az, var Bakıda.

Yenə baxtın gətirib, çıxdı üzə arxa duran,
Səni tənqid edənin işlərini qəsdlə buran.
Gündə məclisdə sənin sağlığına badə vuran.
Alacaq ağuşuna, olmayasan xar, Bakıda,
Düz yolu əyri gedən olsa da az, var Bakıda

Belə kəslər özünü röyada taxtında görür,
Qovulanda günahı hər dəfə baxtında görür.
Daha bilmir ki, zaman hər işi vaxtında görür.
Arxivi qurdalayıb sirri edir car, Bakıda,
Düz yolu əyri gedən olsa da az, var Bakıda.

## ZƏNN EDİRDİM...

Sazlayıb köhlənimi hər yerə çapdım, əmican,
Dolaşıb cümlə-cahanı səni tapdım, əmican.
Olmasaydın üzülən, adicə sapdım, əmican.
Qaynatamsan, yaşadıqca nə qədər dünyada sən,
Zənn edirdim çatacaqsan bəd ayaqda dada sən.

Çoxları valeh olub mənzilimə, gen zalıma,
Olmusan can-ciyərim, çünki yanırsan halıma.
Qınayan olmasa vallahi, alardım dalıma,
Hələ ki, qoymamısan mən əl açım, bir yada, sən,
Zənn edirdim çatacaqsan bəd ayaqda dada sən.

Qarajımda maşını xəlvəti cüt-cüt düzürəm,
Düşmüşəm süd gölünə, çim yağ içində üzürəm.
Kaş görəydin nə sayaq, badəni şəstlə süzürəm.
Şəninə tost deyəcəm, çünki düşübsən yada sən,
Zənn edirdim çatacaqsan bəd ayaqda dada sən.

Belə fürsət, güzəran düşməyəcək bir də ələ,
Çox deyirdin mənə də hər nə bilirsənsə elə,
O paxıllar sənə də qurdular axırda tələ,
Sürüşüb çıxdı çoxu, getməli oldun bada sən,
Zənn edirdim çatacaqsan bəd ayaqda dada sən.

Fələyə mən nə deyim, çarxını fırlatdı dala,
Qorx ki, axırda da yorğan-döşəyə bəlkə sala,
Nə biləydim belə tezliklə düşərsən bu hala,
Çatdıraydın məni kaş hörmətə layiq ada sən,
Zənn edirdim çatacaqsan bəd ayaqda dada sən.

Qalmayıbdır qapı da döyməyim axşam, ya səhər,
Elə ki, söz açıram mən, boğur hər yerdə qəhər.
Həll edərdin çoxunun işlərini başqa təhər,
İndi möhtacsan özün bir balaca imdada sən,
Zənn edirdim çatacaqsan bəd ayaqda dada sən.

## ÇÜRÜYƏN KÖHNƏ DAYAQ

Fələyin sirli cahanda bilən olmaz işini,
Biri kefdən ayılıb, qurdalayınca dişini.
Bir də gördün ki, yıxıb arxası üstə "kişini".
Güvənənlər çox olubdur, yıxılıbdır bu sayaq,
Zamanın hökmünə dözmür çürüyən köhnə dayaq.

Zərbələrdən qoruyur arxa, dayaq çoxlarını,
Alır öz kölgəsinə guya "gözü toxlarını",
İtirib çoxları yığdıqları var-yoxlarını,
İstəyirsənsə əgər şotqaya sal, birgə sayaq,
Zamanın hökmünə dözmür çürüyən köhnə dayaq.

Bircə imzası üçün çoxdu alan öz payını,
Gördüyündən də umur bəlkə ala "göz payını".
Olsa tənqid, ya filan tez götürür söz "payını",
Düşsə fürsət, çıxacaqdır aradan ta bu bayaq,
Zamanın hökmünə dözmür çürüyən köhnə dayaq.

Birinin quyruğu qalmışdı haçandır tələdə,
Çarə yoxdur, dedilər, dərdinə, şeytan gələ də,
Dayağın "qüdrətinə" şəkk eləyirdim hələ də,
Oxudu "İsmi-əzəm", işləri etdi baş-ayaq,
Zamanın hökmünə dözmür çürüyən köhnə dayaq.

Elə kəslər hələ vardır ki, səsi ərşə çatır,
İşdə tufan qoparır, aləmi bir gündə qatır.
Laxlayan tək dayağı, daş kimi bir anda batır,
Şəkk edirsənsə əgər, sözlərimi xırdalayaq,
Zamanın hökmünə dözmür çürüyən köhnə dayaq.

## TƏRİF

Sən niyə yanpörtü baxırsan mənə?
Aqibətim bəlli deyildir sənə?
Arxayın ol, səmti dəyişdim yenə.
Tövbə! Daha tənqidə əl atmaram,
Tərif olan yerdə, oğul, batmaram!

Hörmətim itdi elə tənqid ilə,
Düşdü adım dəftərə, dildən-dilə.
Zorla düzəltdim işimi bir ilə.
Tərifi yüz tənqidə mən satmaram,
Tərif olan yerdə, oğul, batmaram!

Tək deyiləm, çoxdu bu yolla gedən,
Tənqidə yox, tərifə qulluq edən.
Zənn eləmə, çox da əfəldir dədən.
Tərifimi, tənqidimə qatmaram,
Tərif olan yerdə, oğul, batmaram!

Həmkarımı kaş görəsən sən bala,
Heç mıxa vurmur, vurur ancaq nala.
Əl çalınır, zal dağılır az qala,
Düzdü, fərasətdə ona çatmaram,
Tərif olan yerdə, oğul, batmaram!

Olmasa şöhrətdə də heç tay, mənə,
Ömrünü tənqid edə lap pay mənə.
Sübhə qədər çalsa da lay-lay mənə
Xam deyiləm, mürgüləyib, yatmaram,
Tərif olan yerdə, oğul, batmaram!

## ÇIXACAQ EL-OBA NƏHSDƏN...

Diz çöküb yalvarıram mən fələyə, ay pis adam,
Etməsin bircə səni yaxşılara tay, pis adam!
Yoxsa dünya dəyişər, aləm olar zay, pis adam,
Seçmək olmaz o zaman yaxşını pisdən, bu sən öl!
Ölmə, ölsən, çıxacaq el-oba nəhsdən, bu sən öl!

Nə yuvanın quşusan kaş ki, biləydi yaradan,
Seçilirsən, necə ki, ağ seçilir zil qaradan.
Hərgah ev yıxsan əgər, çıxmalı olsan aradan,
Səksənib əsmə, nahaq şübhəli səsdən, bu sən öl!
Ölmə, ölsən, çıxacaq el-oba nəhsdən, bu sən öl!

Güzəranın bu sayaq bir balaca keçməsə xoş,
Ta ki, məşhuri-cahan olmamısan, ay başıboş.
İşdə yaltaqlıq elə, sən nə atıl-düş, nə də coş,
Ya da ol, çoxları tək sən üzü misdən, bu sən öl!
Ölmə, ölsən, çıxacaq el-oba nəhsdən, bu sən öl!

Çəkmək olsa, günahın bəlkə gələr dağdan ağır,
Arsız ol, gündə hırılda, büzüşüb olma fağır,
Üz-gözündən tutalım mərdimazarlıq da yağır,
Dəxli yoxdur, utanıb düşmə həvəsdən, bu sən öl!
Ölmə, ölsən, çıxacaq el-oba nəhsdən, bu sən öl!

Qazdığın gen quyuya lapdan əgər düşsən özün,
Orda nıqqıldama, lap sınsa qıçın, çıxsa gözün.
Sırtıq ol; gopla bir az da, elə ki, bitdi sözün,
Götürül, asta burul tinləri qəsdən, bu sən öl!
Ölmə, ölsən, çıxacaq el-oba nəhsdən, bu sən öl!

Zaman öz sərt üzünü səmtinə çöndərsə əgər,
Uf deməz kimsə səni hər nəyə döndərsə əgər,
Eybi yoxdur, lap elə cənnətə göndərsə əgər,
Edəcək zümzümə, şəksiz çoxu pəsdən, bu sən öl!
Ölmə, ölsən, çıxacaq el-oba nəhsdən, bu sən öl!

Nə ola, can verəsən, gözlərimiz yaşla dola,
Tək səni dəfn eləmək, kaş ki mənə qismət ola.
Salaram zurna, qavalla səni vallahi yola,
Orda kim qarşılasa, qorxma o kəsdən, bu sən öl!
Ölmə, ölsən, çıxacaq el-oba nəhsdən, bu sən öl!

## ZORLA MİNMƏZLƏR ATI

Bəxş ediblər naşıya, ay kişi, köhlən bir atı,
Evdə fəryad eləyir külfəti-biçarə Fatı: –
Sürə bilmirsən əgər boynuna sal sən də çatı.
Oxşadır at səni yəqin qoca saqqallı cinə?
Köhlənin yox günahı, qaytar atı sahibinə.

A kişi, yoxdu səriştən özünü yorma hədər,
Səni qoymur yaxına at, axı heç zərrə qədər.
Şahə qalxır, başa düş, vursa səni, tirtap edər.
İstəmir at belinə xam atılıb zorla minə,
Köhlənin yox günahı, qaytar atı sahibinə.

Zorla minməzlər atı, at buna dözməz a kişi,
Zənn edirsən ki, bu da manqala qoymaqdı şişi?
Yox əzizim, bacaranlar görər ancaq bu işi.
Mat qalıb at özü də, amma dili yoxdu dinə...
Köhlənin yox günahı, qaytar atı sahibinə.

Naşı bir at hərisi keçsə əgər iş başına,
Yıxılıb, yumbalanıb qərq olacaq göz yaşına.
İşdi ölsə, yazacaqlar əməlin başdaşına.
Güclə görməzlər işi, güclə toyuq girməz hinə,
Köhlənin yox günahı, qaytar atı sahibinə.

Fərz elə, at belinə qalxan elə taxta çıxır,
Dayısı varsa əgər, taxta da az vaxta çıxır.
Taxt düşər-düşməz olur, çünki o da baxta çıxır.
Çətin işdir a kişi, gəl bu işə gərmə sinə,
Köhlənin yox günahı, qaytar atı sahibinə.

## ZƏNCİRLƏ...

Dünya işini sahman edən başdı, ağıldı,
Zənn etmə həyat sadəcə əfsanə, nağıldı.
Dövrəndəki pərvanələrin uçdu, dağıldı.
Qalmaz sənə də kölgəli, çardaqlı vəzifə,
Zəncirlə dağın qurşağına bağlı vəzifə.

Yəqin düşünürdün sənə əsla batan olmaz,
İsti aşına gizli soyuq su qatan olmaz.
Heç vaxt səni işdən də çıxardıb atan olmaz.
Düşməz ələ bir də qapısı tağlı vəzifə,
Zəncirlə dağın qurşağına bağlı vəzifə.

Kefdən qayıdırdın keçən il bürkülü yayda,
Müftə gəlirin vardı axı gündə, hər ayda.
Çəksən də peşmançılığın vermədi fayda.
Tapmışdın əcəb süfrəsi qaymaqlı vəzifə –
Zəncirlə dağın qurşağına bağlı vəzifə.

Tüstün göyə qalxır, görürəm, aşna, yanırsan,
Əfsus ki, oda düşdüyünü amma danırsan.
Yəqin cibinə göz dikəni indi anırsan,
Çıxdı əlinizdən daha ortaqlı vəzifə –
Zəncirlə dağın qurşağına bağlı vəzifə.

Əfsus ki, qəfil zəlzələdən dağ da sürüşdü,
Bu güclü təkandan açılıb qurşağı düşdü.
İndi təzə bir arxa gəzirsən, bu nə işdi?
Tapsan, ümidin varmı verə "yağlı" vəzifə?
Zəncirlə dağın qurşağına bağlı vəzifə.

Bəli... zamanın hökmü səni sıxmalı oldu,
Gördü qudurursan, əl atıb yıxmalı oldu.
Vadar elədin, axırına çıxmalı oldu.
Sahib gəzir indi ürəyi "dağlı" vəzifə,
Zəncirlə dağın qurşağına bağlı vəzifə.

## BƏSDİ, TƏQAÜDLƏ YAŞA!

Dən düşüb saqqalına, yaş da ötübdür yarıdan,
Naxələfsən axı sən həm də qulaq, göz sarıdan.
Əlləşirsən nə qədər, arpanı seçmir darıdan.
At işin sən daşını, ömrünü vur evdə başa,
Yeri ver başqasına, bəsdi, təqaüdlə yaşa.

Cavan oğlan, özü də iş bacarandır Pirəli,
Sən macal verməmisən işdə çəkilsin irəli.
Çox heyf, görməmisən, çünki cibindəymiş əli.
Pəl vurubsan, toxunub arzu oxu, sanki, daşa,
Yeri ver başqasına, bəsdi, təqaüdlə yaşa.

Ərz edirsən çatana, guya gözün toxdu sənin,
Tanıyanlarsa deyir xırda-paran çoxdu sənin.
Düşmüsən əyri yola, bir düz işin yoxdu sənin.
İştahan həddin aşır, ay kişi, dolduqca yaşa,
Yeri ver başqasına, bəsdi, təqaüdlə yaşa.

Arxayınsansa əgər, "onlara" bel bağlamısan,
Dolaşanda niyə bəs küncə girib ağlamısan?
Lap müfəttiş qağanın daş ürəyin dağlamısan.
Qocalıbsan yana dur, tut özünü yağlı aşa,
Yeri ver başqasına, bəsdi, təqaüdlə yaşa.

Pulda, sərvətdə hələ bir çoxuna çatmamısan,
Nə əcəb iş yerinin daş-kəsəyin satmamısan?
Sürüşüb çıx aradan sən nə qədər batmamısan.
Dara düşsən gec olar səhvini düşsən də başa,
Yeri ver başqasına, bəsdi, təqaüdlə yaşa.

## NƏ TEZ QUDURDUN,
## AY QAĞA

Cibində oynayır siçan,
Pusquda durmusan, qağa.
Tutmamısan birin hələ,
Nə tez qudurmusan, qağa?

Baxanda qaynayır gözün,
Heyf ki, yoxdu düz sözün.
Bilməmişəm kimsən özün –
Xəbislə cumursan, qağa,
Nə tez qudurmusan, qağa?

Nə vacibdi, satma yalan –
Yalan sözü yoxdu “alan”.
Bir balaca olub kalan.
Toyxana qurmusan, qağa,
Nə tez qudurmusan, qağa?

Son tikəmi böləndə tən,
Güdməmişəm xeyrimi mən.
Məclisimə gələndə sən
Doyunca vurmusan, qağa,
Nə tez qudurmusan, qağa?

Zəmanəyə yoxdu sözüm,
Aldanmışam çünki özüm.
Yaxşı-pisi seçir gözüm –
Demə ki, kormusan, qağa...
Nə tez qudurmusan, qağa?

## GECƏ-GÜNDÜZ DOMİNO

Domino vallah, inan, əsla yaraşmaz yaşına,
Lənət olsun, lap onun hər xalına, hər daşına.
Harda bir üzdəniraq varsa yığırsan başına,
Domino oynadığın yerdə tifağın dağıla,
Başıbatmış, nə zaman bəs gələcəksən ağıla?

Neçə ildir, a kişi, "Ağdam" olubdur çərəzin,
Yıxacaqdır səni vallah bu sağalmaz mərəzin.
Tiksin Allah evini, olmaya vardır qərəzin?
Olasan kaş ki, lül-atəş bütün aləm yığıla,
Başıbatmış, nə zaman bəs gələcəksən ağıla?

Kişi, dünya dağılar, düşsə güzarın bazara?
Adı gəlcək, niyə təcili düşürsən azara?
Mən cəhənnəm, gəlib o evdə tifillər də zara,
Çünki hop eyləmisən hər nə atıblar daxıla,
Başıbatmış, nə zaman bəs gələcəksən ağıla?

Gecə keçmiş yarıdan, ərşə çıxır orda səsin,
Elə bil məşq eləyir ağlı dayaz xorda səsin,
Saxla hər halda sənə lazım olar gorda səsin,
Yalvarım mən fələyə, bəlkə sənə çarə qıla,
Başıbatmış, nə zaman bəs gələcəksən ağıla?

Külfət oldum sənə, bədbəxt elədim öz-özümü,
Neçə yol gündə bərəldim sənə gendən gözümü?
Turşudub üz-gözünü; kəsmə yarımçıq sözümü,
Deyəcəksən yenə də başladı arvad nağıla,
Başıbatmış, nə zaman bəs gələcəksən ağıla?

## YATMAMIŞAM

Xəlvət anbardı yerim, çoxlu gələnlər yanıma,
Çox tamahkar deyiləm, and içirəm vicdanıma.
İlişib bir tanışım, lərzə düşübdür canıma.
Bərkə düşsəm, deyəcəm: qonşuma mal satmamışam,
Bu gecə fikrə gedib, sübhə qədər yatmamışam.

Dalda yerdir, bu yerim, var hələ imkan dolanım,
Gülmə, çatmır ki, desəm bir dənə dumbul çalanım.
Nə danım, gizləmirəm, qayğıma vardır qalanım.
Bu səbəbdən ilişib, indiyəcən batmamışam,
Eşidib bəd xəbəri, sübhə qədər yatmamışam.

Qonşum ifadə verib, malları anbardan alıb,
Girləyirdim başımı, indi məni dərdə salıb.
Eşidən var, hələ ünvanıma çox zurna çalıb.
Artırıb qiymətini yaxşı ki, aldatmamışam,
Bu gecə fikrə gedib, sübhə qədər yatmamışam.

Belə getsə görürəm aləmi qonşum qatacaq,
Dədəmi öz dalıma, bəlkə də vallah çatacaq.
Vardır ardımca deyən də bu tifil tez batacaq.
Gözləməm var, hələlik, rüşvətə əl atmamışam,
Bu gecə fikrə gedib, sübhə qədər yatmamışam.

Batırırdım təzəcə barmağımı mən də bala,
Saldı qonşum başıbatmış məni bir gör nə hala,
Sanki, varmış qərəzi, bircə məni xərcə sala.
Mən "cəhənnəm" özü də bəlkə hələ iş də ala.
Öyrədiblər deyəsən, mən yerinə çatmamışam,
Bu gecə fikrə gedib, sübhə qədər yatmamışam.

## DAĞ OLA KAŞ

Arxamı söykəməyə indi dədəm dağ ola kaş,
İşlərim dübbə taraz, həm də kefim çağ ola kaş.
Yayda sahildə yerim kölgəli bir bağ ola kaş.
Qu tükündən başımın altına yastıq ataram,
Nə qədər sağdı canı, bağda yeyib, mən yataram.

Dədəmi bir balaca tərif edən olsa əgər,
Belə bir güclü təkan milyona, dünyaya dəyər.
Quru təriflə keçən iş başına azdı məgər?
Düşə kaş yağlı yerə, arzuma bəlkə çataram,
Nə qədər sağdı canı, bağda yeyib, mən yataram.

Vurmaram mən əlimi dünyada ağdan qaraya,
Açılar bağlı qapı hörmətə, getsəm haraya.
Kaş ki, bir mərdimazar girməyə ancaq araya.
Olsa yanpörtü baxan, aləmi vallah, qataram,
Nə qədər sağdı canı, bağda yeyib, mən yataram.

Var paxıllar, olacaq düz yolunu işdə azan,
Tapılar böhtanı hərdən sol əliynən də yazan.
Öyrənib bilsəm əgər, gizli quyu varsa qazan.
Taparam çarəsini, dam-daşımı lap sataram,
Nə qədər sağdı canı, bağda yeyib, mən yataram.

Hələ dəryada balıq söhbətidir arzularım,
Gümanım var, durular bəlkə bulanlıq sularım.
Hələlik girlənirəm mən, nə pulum var, nə varım.
Dədəmə arxayınam, yoxsa ki, çoxdan bataram,
Nə qədər sağdı canı, bağda yeyib, mən yataram.

## ALMALISAN

Günlərim kefdə keçir işdə qohum, yadla mənim,
Tutmayır söhbətim heç evdəki arvadla mənim.
Vurur hərdən aramı xəlvəti övladla mənim.
Hökm edir: körpəmizin qayğısına qalmalısan,
İndidən qızcığazın cer-cehizin almalısan.

Deyinir: xar olarıq, almamısan çöp də hələ,
Gün keçir, qız böyüyür, bəlkə bizə elçi gələ?
Deyirəm: bəsdi, ay arvad, məni sən salma ələ.
Göz vurur, gec-tezi var, sən də baba olmalısan,
İndidən qızcığazın cer-cehizin almalısan.

Dönürəm işdən evə kəsdirir hər gün yanımı,
Hər təzə atmacası gündə qaraldır qanımı.
Əzrayıldır elə bil, lap alacaqdır canımı.
Zəng edir: xalça gəlib, anbara zəng çalmalısan,
İndidən qızcığazın cer-cehizin almalısan.

Doldurur qonşu demə, külfətimin boş başını,
Göstəribdir nə ki var evdə olan daş-qaşını.
Almır arvad nəzərə körpəmizin heç yaşını.
Deyir: hər gün daxıla, ay kişi, pul salmalısan,
İndidən qızcığazın cer-cehizin almalısan.

Hələ “tezdir” deyirəm, körpəmizin azdı, yaşı,
Hay salır: bilməmişəm var belə dünyada naşı.
Belə arvad alanın şişməlidir gündə başı,
Dərdi salsan ürəyə, sən saralıb-solmalısan,
Ya da arvad deyəni, çarə nədir, almalısan.

Minirəm cin atına, zəng edir hərdən işimə,
Əmr edir katibəmə: dəstəyi tez ver kişimə,
Canımı toplayıram axırı gücnən dişimə,
Deyirəm: bəli, buyur... bir də görürsən dedi: can!
Get, filan yerdə filan şey var, onu almalısan,
Belə getsə, bilirəm sızmalıdır beynimə qan.

# NİYƏ SUSDUN?

Gördün, iclasda məni, lap ələ saldı çoxusu,
Döşəyib cəmdəyimə, hayfını aldı çoxusu.
Çıxışından müdirin razı da qaldı çoxusu,
Sən müqəvvaya dönüb, almadın heç, sanki, nəfəs,
Niyə susdun, deyilən etmədi təsir sənə bəs?

Kürsüdən söz deməyə, sən məni vadar elədin,
Batinin çıxdı üzə, öz-özünü xar elədin.
Barı sən boynuna al, bir utanıb ar elədin?
Gördün haqsız batıram, çıxmadı səndən yenə səs,
Niyə susdun, deyilən etmədi təsir sənə bəs?

Aldanıb zahirinə, mən elə bildim kişisən,
Düşünürdüm ki, salarsan yoluna hər işi sən.
Demə tərgitməmisən üzdəniraq vərdişi sən.
Gir müdir kölgəsinə, yer tutular, durma, tələs,
Niyə susdun, deyilən etmədi təsir əsnə bəs?

Duz-çörək kəsdiyini barı salaydın yadına,
Kişisən, düz danışaq, çatmamışam heç dadına?
Sən ki gördün gedirəm şəxsi-qərəzlik badına.
Hətta bildin ilişib, bəlkə yerim oldu “qəfəs”,
Niyə susdun, deyilən etmədi təsir sənə bəs?

Dostu sən tək olana, dünyada düşmən nə gərək,
Boş sinən var, orada bəlkə də yoxdur heç ürək.
Harda olsan da səni tutmalıdır duz və çörək.
Dostun ancaq puluna var, bilirəm səndə həvəs,
Niyə susdun, deyilən etmədi təsir sənə bəs?

Vaxt gələr, düşsən əgər sən təzədən bir də dara,
Çıxsa əldən bu yerin, ortada qalsan avara.
Duz-çörək xətrinə mən də gələrəm onda kara.
Baxma olsam da səninlə hələ düşmən kimi pəs,
Niyə susdun, deyilən etmədi təsir sənə bəs?

## MƏN BİLİRƏM

Bəzən insanlığı tək-tək unudanlar tapılır,
Məsləkə, vicdana yad hisslərə tez-tez qapılır.
Qanmır əfsus ki, onun ömrü xəbərsiz çapılır.
Elə qeybətdi qırır sübhi-səhərdən bilirəm,
Sizdə də var beləsi, gizləməyin, mən bilirəm.

Düşsə bir yağlı yerə, dünya görünmür gözünə,
Qınayan olmasa heykəl də qoyar lap özünə.
Şəkk edənlər tapılar bəlkə də şair sözünə.
Güləcəkdir sözümə işdə də hərdən, bilirəm,
Sizdə də var beləsi, gizləməyin, mən bilirəm.

Bu naşı kaş ki, gedib bir məzarıstana baxa,
Gümanım yoxdu dola gözləri, yaxud yaş axa.
Kəf gəlib əzrayıla yüz dəfə qurtarsa yaxa.
Yenə əl çəkməyəcək bəd əməlindən bilirəm,
Sizdə də var beləsi, gizləməyin, mən bilirəm.

Edib adət, sala çaxnaşma, baxıb ləzzət ala,
Ya da hər cür yalanı aləmə tez zurna çala.
Sülənə tinləri, öyrəncəlidir çünki yala.
İşdə vardır tanıyanlar onu gendən bilirəm,
Sizdə də var beləsi, gizləməyin, mən bilirəm.

Əfəlin bəlkə də arxivdə də heç yoxdu tayı,
Elmi var, rütbəsi var, bir qanacaqdan savayı.
Beləsi, ömrünü dünyada keçirdir havayı.
Özü baş tapmayır heç fitnə-felindən bilirəm,
Sizdə də var beləsi, gizləməyin, mən bilirəm.

## YANIRAM MƏN

Bir vaxtı var idi, başıma dövrə vuranlar,
Baxcaq gözucu, mil kimi qarşımda duranlar.
Him-cimlə qanıb mətləbi, məclis də quranlar.
Hərdən ötüşən günləri bir-bir anıram mən,
Heyhat, alışıb indi alovsuz yanıram mən.

Xəlbirlə desəydim daşıyardı suyu onlar,
Bir gündə salardı yola min bir toyu onlar.
Cüzi bir işarəmlə qazardı quyu onlar.
Fitva verib, ev yıxmağı, hərçənd, danıram mən,
Heyhat, alışıb indi alovsuz yanıram mən.

Vardı sağ əlim, pul çıxarardı quru yerdən,
Tərif eləyərdi "kişi" lap kölgəmi hərədən,
Əmrim ki, yazıldı, yoxa çıxdı o da birdən.
Kölgəmdə yatırmış niyə, indi qanıram mən,
Heyhat, alışıb indi alovsuz yanıram mən.

Axırda dedi: "Bizləri az soymamısan sən,
Hər ildə gəzib, bircə kurort qoymamısan sən,
Bəsdir yediyin, yoxsa hələ doymamısan sən?"
Dostun bu dönük çıxmağına odlanıram mən,
Heyhat, alışıb indi alovsuz yanıram mən.

İşsiz gəzirəm, mən, bir ilim oldu bu yazda,
Çarəm nədi, dınqıldadıram hər gecə sazda,
Külfət araq alsın, dözərəm vursa qapaz da,
Çünki bekaram, hamıya yaltaqlanıram mən,
Bir söz verən olsa başına fırlanıram mən,
Düşdükcə yada köhnə vəzifəm, yanıram mən.

## FELƏ UYMA

Qalxmısan pillələri, gözlə dığırlanmayasan,
Qarışıb yaş təzəyə, tüstülənib yanmayasan.
Ola bilməz ki, gözün gördüyünü qanmayasan.
Sən çalış yaxşı tanı həm sağını, həm solunu,
Felə uysan, itirərsən, a kişi, düz yolunu.

Təzə yerdə qadanı gündə alanlar olacaq,
İstəsən axşamacan çırtma çalanlar olacaq.
Hələ işdə nə qədər yağlı yalanlar olacaq.
Ayıq ol, sən də ayır kəlləsi boşdan, dolunu,
Felə uysan, itirərsən, a kişi, düz yolunu.

Yan alıb bir parası kövşənə bağdır deyəcək,
Təpəni tərif edib, ən uca dağdır, deyəcək.
Çoxdan ölmüş dədəsi indi də sağdır, deyəcək.
Sənə tərif edəcək yovşanı, qanqal kolunu,
Felə uysan, itirərsən, a kişi, düz yolunu.

Axı hardan biləsən kimdi gələnlər yanına,
Rentgen olsaydı, baxardın ürəyin al-qanına.
İşdi görsən ki, hopub bədxah əməllər canına.
Tənbeh üçün hərifi çırmayasan əl-qolunu,
Felə uysan, itirərsən, a kişi, düz yolunu.

Yerinə toxtamamış fırlanacaqlar başına,
Çoxu dəyyusdu, inan, baxma cavanlıq yaşına.
Mat qalarsan sən özün him-piminə, göz-qaşına.
Tanıyarsan bu zaman mütrübü, sadiq “qulunu”,
Felə uysan, itirərsən, a kişi, düz yolunu.

## BATDI QAĞAM

Fırlanıb çərxi-fələk gör qağamı saldı hara,
Yağlı yer müşkül idi, dost-tanışı gəldi kara.
Müftə pulnan gecələr lövbərini saldı "Bara",
Elə zənn eylədi ki, düşməyəcək bir də dara.
Gördülər ağ eləyir, gəldilər axırda cana;
İlişib indi qağam, səhvi nədi, bəlkə qana.

Vardı aylıq gəliri, çünki yeri anbar idi,
Vurnuxurdu, başına, sanki, bu dünya dar idi.
Qağamın adətini işdə bilənlər var idi,
Sərfəsiz söhbət olan yerdə qulaqdan "kar" idi.
Oda girsəydi belə, zərrəcə qorxmazdı yana,
İlişib indi qağam, səhvi nədi, bəlkə qana.

Gördü işsiz gəzirəm, kölgəsinə aldı qağam,
Dedi: get keyfini çək, mən hələ dünyada sağam.
Sənə olmaz toxunan, çünki mən arxanda dağam,
Mən də yəqin ki, bu anbarda beş-on gün qonağam,
Belə meydanda oğul var ki, ömürlük dayana?
İlişib indi qağam, səhvi nədi, bəlkə qana.

Kələfi düşdü düyün, istədi çıxsın aradan,
Bu bəla gəldi qəfil, bilmədi ancaq haradan.
İtiribdir başını, heç ağı seçmir qaradan,
Nəyi var sərf eylədi, çıxmadı kar, pul-paradan.
Çarə yoxdur, əl atıb indi də aşkar yalana,
İlişib indi qağam, səhvi nədi, bəlkə qana.

Təzə şor qiymətinə vicdanını satdı qağam,
Yediyi duz-çörəyə gündə haram qatdı qağam.
Gördü möhkəm ilişib, əl-qolunu atdı qağam,
Bu dəfə gölməçədə qeybə çıxıb, batdı qağam.
Etdi rüsvay özünü, kaş əməlindən utana,
Dərs olar, bax, bu dəfə səhvi nədi, bəlkə qana...

## TAPARAM DAYDAYI...

Ərzi-halım belədir: agah olub dərdimi bil,
Bekaram, gözləyirəm, keçməlidir bir neçə il.
Bəlkə ört-basdır ola köhnə paxır, köhnə zibil.
Gərçi bir qurdalayan olmaya kaş keçmişimi,
Taparam daydayı, xahişlə düzəldər işimi.

Bərkə düşsəm, sürüşüb asta çıxırdım aradan,
Tez qoyurdum cibimə topladığım pul-paradan.
Bu dəfə gəldi zaval bilmədim ancaq haradan.
Lap salıblar düyünə, xeyli burublar vişimi
Taparam daydayı, xahişlə düzəldər işimi.

O zamanlar çəkilirdim günü-gündən qabağa,
Dost-tanış şəstlə deyərdi mənə hər yerdə: qağa.
Büzüşüb baxma ki, mən dönmüşəm artıq yumağa.
Zorla olsa, yenə də dartıram ancaq leşimi,
Taparam daydayı, xahişlə düzəldər işimi.

Dedilər: sən tamahından tora saldın başını,
Gördüm artıq batıram, satmalı oldum maşını.
Üstəlik sərf elədim külfətimin daş-qaşını.
Tapmıram çöp də daha qurdalamaqçın dişimi,
Var güman: daydayı, xahişlə düzəldər işimi.

Cib də boşdur, olanı vermişəm artıq küləyə,
Girləyirdim başımı, axırı düşdüm tələyə.
Diz çöküb yalvarıram hər səhər-axşam fələyə.
Yağlı yer tapsa dayım, tez dəyişərdim peşəmi,
Amma yoxdur daha xahişlə düzəldən işimi.

## YOLLAR

(*Taksi sürücüsünün dilindən*)

Təmir edirlər yolu hər ay, kişi,
Faydası yoxdur "yamağın", ay kişi.
Biz nə qədər eyləyək ah-vay, kişi?
Bəs niyə düşmür yolumuz sahmana?
Bax, bu işə çünki gərək can yana.

Yolda çuxurlar çoxalır, neyləyək,
Dərdimizi indi kimə söyləyək?
Bir yenilik bəlkə icad eyləyək.
Olsa çuxur yolda, maşın hoppana,
Bax, bu işə çünki gərək can yana.

Yırğalanır bir də görürsən maşın,
Tutmalıdır sərnişin hökmən başın.
Dəysə başı, oynadaraq göz-qaşın.
Kimdi günahkar, qanır handan-hana,
Bax, bu işə çünki gərək can yana.

Kaş ki, yanımda ola təmirçilər,
Yırğalanıb "həzz ala" təmirçilər.
Bəlkə baxarlar yola təmirçilər.
Amma çətin səhvini onlar qana,
Bax, bu işə çünki gərək can yana.

Yolda keçir günlərimiz, anımız,
Yol düzələ, rahat ola canımız.
Həm də qaralmaz bu sən öl, qanımız.
Yoxsa haray salmalıyıq hər yana,
Bax, bu işə çünki gərək can yana.

Kimsə eşitmir "səsini" yolların,
Fəryadını, naləsini yolların.
Təmir üçün ən pisini yolların.
Bəs görəsən kim girəcək meydana,
Bax, bu işə çünki gərək can yana.

## NƏ OLA, ŞEİRİ ATA...

Baxma, alimdi özü, dərk eləmir yazdığını,
Şerə aludə olub, düz yolunu azdığını.
Unudur hörmətinə məxfi quyu qazdığını.
Hər nə röyada görür, tez köçürür ağ kağıza,
Nə ola, şeri ata, elmi işindən o yaza.

Sözü mirvari kimi düzməyə vardır həvəsi,
Yazdığı lağlağının sonra çıxır amma səsi.
Almır əsla vecinə, tək qonorardır tələsi.
Qafiyə xətrinə bəzən də dönür sərçə-qaza,
Nə ola, şeri ata, elmi işindən o yaza.

Mən ölüm, alimə bax, bir peşə tapmır özünə,
Harda bir xırdaca nöqsan görünürsə gözünə.
İstəyir nəzmə çəkə, ilhamı baxmır sözünə.
Sönük ilham da qoyubdur özünü, sanki, naza,
Nə ola, şeri ata, elmi işindən o yaza.

Təzə bir cızma-qara şerini zornan bitirib,
Hara imkanı olub, tez ora xəlvət ötürüb.
Heç hənanın yeridir, indi təxəllüs götürüb.
Qızışıb qoşma yazır, həsr eləyir telli saza,
Nə ola, şeri ata, elmi işindən o yaza.

Dayanıb astanada, çox qapını gündə döyür,
Heç utanmır, özünü aşkara hər yerdə öyür.
Daha bilmir oxuyan şerini, qəlbində söyür.
Belə getsə, verər alimliyi vallah, güdaza,
Nə ola, şeri ata, elmi işindən o yaza.

## BATARAM

Təzə mənzil alırıq, bölgüdə qanundu sözüm,
Beş otaq zəbt elədim, xəlvəti əvvəlcə özüm.
Bu səbəbdən də bir az kölgəlidir işdə gözüm.
Tələsik köçməliyəm, lap qarışar yoxsa ara,
Bataram, köhnə müdirtək tez atarlar bayıra.

Müdirəm, mən də məgər, növbə, filan güdməliyəm?!
Axı bilmir çoxusu, mən də şefin "sağ əliyəm".
Almasam hamı deyər, ya əfələm, ya dəliyəm.
Olsa bir qurdalayan, gəlməsə dostlar da kara,
Bataram, köhnə müdirtək tez atarlar bayıra.

Bilirəm, bir demaqoq həmxana var zirzəmidə,
Keçirib indiyəcən əlli bahar zirzəmidə.
Vuracaq ömrü başa, ölsə də dar zirzəmidə.
Çünki xəlvətcə yazır, bilmirəm ancaq ki, hara,
Bataram, köhnə müdirtək tez atarlar bayıra.

Bir sözümlə atılar lilli gölün lap dibinə,
Gəl ki, qıymır bu hərif, bir dənə dərman həbinə.
Ölə, salmaz əlini, dünya dağılsa cibinə.
Qorxuram ki, gətirə şefləri yazmaqla zara,
Bataram, köhnə müdirtək tez atarlar bayıra.

Gəldi hardan bu müfəttiş, kəsib indi yanımı,
Dilxoram, yoxlamalar gündə qaraldır qanımı.
Keçərəm pul-paradan, qurtara bilsəm canımı,
Sancıb ancaq dalağım, arxayın olsam da vara,
Batmışam, köhnə müdirtək atacaqlar bayıra.

## YIXDI AXIR MÜDİRİ...

Çatmışam mən bu yaşa, olmamışam mərdimazar,
Müdirim gözgörəsi, işdə açıb, sanki, bazar.
Başqası olsa əgər, tab eləməz, gündə yazar.
Şefimə bərk toxunub, ad gününə getməməyim,
Xoşuna gəlmədi heç, şəstlə "baş üstə" deməyim.

Eşidib işdə müdir, bircə "baş üstə" sözümü,
Söylədi: – Sən də bu cür pərdələyirsən gözümü.
Anladım mətləbini, karlığa vurdum özümü.
İstəyirmiş bu hərif, beşqat olum, mən baş əyim,
Yıxacaq, yıxsa onu, şəstlə "baş üstə" deməyim.

Çəkdim iclasda ona, lap necə var, xar eylədim,
Müdirin daz başına, dünyanı mən dar eylədim.
Susmadım, öz sözümü hər dəfə təkrar eylədim.
Niyə də susmalıyam, kimsədən əskikdi nəyim?
Yıxacaq, yıxsa onu, şəstlə "baş üstə" deməyim.

Çox da gəlmir xoşuna, atmalıyam vərdişimi?
Göz qoyur qəsdlə mənə, anlamışam öz işimi.
Çatdıran var müdirə, qurdalasam lap dişimi.
Dayağım olmasa da, haqq sözüm olmuş köməyim,
Yıxacaq, yıxsa onu, şəstlə "baş üstə" deməyim.

Çatdırıblar nə sayaq mənzilinə bilməyib o,
Yalvarır əzrayıla, heç özünə gəlməyib o.
Olub infarkt deyəsən, amma hələ ölməyib o,
Gümanım düz çıxacaq, baş tutacaqdır bu səyim,
Yıxdı axır müdiri, şəstlə "baş üstə" deməyim.

## GƏTİRİN "CƏFTƏ SUYU"

Qulağı səsdə qalıb müftə gəlir xəstəsinin,
Açılıb zir-zibili, çıxdı üzə dəstəsinin.
Dəyişib gör necə ahəngi onun zil səsinin.
Eşidib bəd xəbəri, saldı müdir işdə haray, –
Gətirin "cəftə suyu", öldüm aman, vay, dədə, vay!

Yata bilmir gecələr, qorxu alıbdır canını,
Dalbadal yoxlamalar, çünki qaraldır qanını.
Sübh-səhər qulbeçələr işdə kəsirlər yanını.
Doluxur, asta deyir katibəyə, dəmləmə çay,
Gətirin "cəftə suyu", öldüm aman, vay, dədə, vay!

Hərdən iclasda aşır həddini, bilmir sözünü,
Həm də tənqidçiyə hiddətlə bərəldir gözünü.
Əməlindən söz açanda, itirir lap özünü.
Tər basır, dad eləyir, zəhmətim oldu necə zay;
Gətirin "cəftə suyu", öldüm aman, vay, dədə, vay!

Kövrəlib, indi düşüb gördüyü işlər yadına,
Çünki var qorxusu getsin, o tamahın badına.
Belə bir bədəməlin, kim çatacaqdır dadına.
Söyləyir külfətinə, köçmə bağa, sən də bu yay,
Gətirin "cəftə suyu", öldüm aman, vay, dədə, vay!

Baxma, imkanı olub, müftə cibişdanı dolub,
İlişib, cib boşalıb, çox dəyişib, rəngi solub.
Tanıya bilmədim heç, lap büzüşüb, qozbel olub.
Tutdu birdən ürəyin, bircə dəfə söylədi: Ay,
Gətirin "cəftə suyu", öldüm aman, vay, dədə, vay!

# AY DƏDƏ, EVLƏNMİRƏM

Yalvarıram mən sənə, ay dədə, tərifləmə,
Cahi-cəlalın mənə, ay dədə, tərifləmə.
Olsa da lap bir dənə, ay dədə, tərifləmə.
Görmə tədarük toya, mən belə evlənmirəm,
Dəyməsin heç xətrinə, mən hələ evlənmirəm.

Bəsdi, haray salmısan, aləmə car etmisən,
Tay-tuşumun yanında sən məni xar etmisən.
İndi xəbər tutmuşam, elçiliyə getmisən,
Hər kimə kart vermisən, zəng elə, evlənmirəm,
Dəyməsin heç xətrinə, mən hələ evlənmirəm.

İstəmirəm, lap o qız, olsa da ay parçası,
Mənzili doldursa da, mebeli, pay, parçası.
Olsa da top-top malı laykaya tay, parçası.
Salma mənim canıma vəlvələ, evlənmirəm,
Dəyməsin heç xətrinə, mən hələ evlənmirəm.

Ortaya bu söhbəti gündə salırsan, niyə?
Sən bu sayaq qayğıma guya qalırsan, niyə?
Sevmədiyim bir qızı zorla alırsan, niyə?
Salma mənim başımı əngələ, evlənmirəm,
Dəyməsin heç xətrinə, mən hələ evlənmirəm.

Arxa gəzirsən yəqin, sən özünə, ay dədə,
Gəl özünü, həm məni eyləmə rüsvay, dədə.
İstəmirəm mən olam çoxlarına tay, dədə.
Uymamışam, uymaram mən felə, evlənmirəm,
Dəyməsin heç xətrinə, mən hələ evlənmirəm.

## EY HƏYAT ALVERÇİLƏRİ...

(*İşdən qovulmuş müstəntiqin dilindən*)

Demirəm lövbərimi bənd eləmişdim hara mən,
Karlı müstəntiq idim, həm də gəlirdim kara mən.
Çox güvəndim özümə, axırı düşdüm dara mən.
Həkk olub yaddaşıma, bir qadının yaşlı əri,
Söylədi: rəhmə gəlin, ey həyat alverçiləri.

Öyrənib xəlvəti bildim yoxudur bir pənahı,
Güclə qoydum yazığın boynuna bir çox günahı.
Ərşə çıxmışdısa da naləsi, fəryadı, ahı.
Hey bururdum işini gizlicə, gəldikcə yeri,
Söylədi: rəhmə gəlin, ey həyat alverçiləri.

Arxası olmayana, kim gələcəkdir köməyə,
Vermədim əsla macal dərdini hətta deməyə.
Haqq-nahaq zorla ötürdüm işini məhkəməyə.
Gördü haqsızlığımı, qövr elədi dərdi-səri,
Söylədi: rəhmə gəlin, ey həyat alverçiləri.

Mən də dünyanı onun çal başına dar elədim,
Milçəyi fil eləyib, aləmə tez car elədim.
Xırda işdən ötəri zorla günahkar elədim.
Zillətə saldım onu, keçdi zaman, döndü geri,
Söylədi: rəhmə gəlin, ey həyat alverçiləri.

İnsanın taleyinə var hələ biganə qalan,
Günahı olmayanı, düz adamı həbsə alan.
Haqq tutunca yerini, ömrə düşür, amma talan,
Yolda gördüm qocanı, köks ötürüb, gəldi bəri,
Söylədi: rəhmə gəlin, ey həyat alverçiləri.

İndi vicdan əzabı qamçılayır hər anımı,
Bekaram, köhnə fikirlər salıb əldən canımı.
Olmayıb məndə ədalət, bu qaraldır qanımı.
Taqətim qalmayıb heç, bir sümüyəm, bir də dəri,
Sizi lənətləyirəm, ey həyat alverçiləri.

## DEYİL

Yaşa torpağı sanı, oxşamısan lap atana,
Zatına, şəkk edərəm, yersiz əyilsən çatana.
Dayaq ol mərd adama, bir də ki, haqsız batana.
Kişilik sözdə elə xalqını anmaqda deyil,
Kişilik arxasızın halına yanmaqdadı, bil!

Gəlmisənsə karına arxasızın zərrə qədər,
Azalıbdırsa onun ay kişi, qəlbində kədər.
Deməli, sürməmisən ömrü bu dünyada hədər.
Kişilik yan cibinin qeydinə qalmaqda deyil,
Kişilik arxasızın halına yanmaqdadı, bil!

Hörmətin artar, əgər sadə aparsan özünü,
Haqqı gör, qoyma sənin pərdələsinlər gözünü.
Dodaq altında demə, şax üzə söylə sözünü.
Kişilik dalda gülüb, zurnanı çalmaqda deyil,
Kişilik arxasızın halına yanmaqdadı, bil!

Yurdunun, el-obanın karına sən gəlməlisən,
Zəhmətə arxalanıb, göylərə yüksəlməlisən.
Qonşunun, dost-tanışın dərdi nədir bilməlisən.
Kişilik yağlı yerə lövbəri salmaqda deyil,
Kişilik arxasızın halına yanmaqdadı, bil!

Sən bu dünyada çalış heç vədə alçalmayasan,
Şöhrətin kölgəsinə əsla meyil salmayasan.
Bu vəzifə-filanın qayğısına qalmayasan.
Kişilik haqlıların haqqını danmaqda deyil,
Kişilik arxasızın halına yanmaqdadı, bil!

## DƏDƏMƏ!

Dədə, məlumdu sənə dolmuşam artıq yaşa mən,
Neçə illər oxuyub təhsili vurdum başa mən.
Vurğunam Kür çayına, torpağa, dilsiz daşa mən.
Uzanır, sanki, gecə, tez açıla kaş ki, səhər,
Dönürəm kəndimizə, sən salamat qal, a şəhər.

Qayıdıb kəndə, dədə, körpələrə dərs deyərəm,
Yurdumun torpağına, hər daşına baş əyərəm.
Bəhrəli çöllərimin bol çörəyindən yeyərəm.
Daha dözmür ürəyim, çünki boğur gündə qəhər,
Dönürəm kəndimizə, sən salamat qal, a şəhər.

Əfsus olsun ki, dədə, çoxları diplom alacaq,
Geriyə dönməyəcək, lövbəri burda salacaq.
Kəndinin, el-obanın gözləri yolda qalacaq.
Yığmayıbdır anası bəlkə qalıb bağda bəhər,
Dönürəm kəndimizə, sən salamat qal, a şəhər.

Unudub sevgilisin, yolda azanlar da olur,
Heç düşünmür ki, onu gözləyənin rəngi solur.
Getsə bir toy-nişana gözləri də bəlkə dolur.
Qovrulan bir ürəyi kim ovudar, de, nə təhər?
Dönürəm kəndimizə, sən salamat qal, a şəhər.

Bənd olur bir qadına, baxmayır əsla yaşına,
Gözü görmür çəkilib hər nə desən göz-qaşına.
Şahidəm bir çoxunun əngəl açıblar başına.
Maşını vardı çıxıb indi əlindən o kəhər,
Dönürəm kəndimizə, sən salamat qal, a şəhər.

Yox, dədə, dönməliyəm mən, iki dünya bir ola,
Qalmaram lap pul axıb ciblərimə müftə dola.
Yazıram məktubumu, düşməliyəm indi yola,
Udaram kənd havası, olsa da, vallahi zəhər...
Dönürəm kəndimizə, sən salamat qal, a şəhər.

## BAĞLANDI BAZAR

Dayday gedir işdən, çoxusu işdə büzüşmüş,
Var-gəl eləyir, kürkünə, sanki, birə düşmüş.
Yəqin kişi xalis ya "qızılmış", ya "gümüşmüş".
Dönmüşdü kələ, ortada bu müftə yeyənlər,
Qəmgindi yaman, özlərini şəstlə öyənlər.

Taleləri döndü yenə, ulduzları batdı,
Hərçənd neçəsi arzusuna, kamına çatdı.
Dümbəkləri çox şişsə də, tez köpləri yatdı,
Susdu, qudurub, zil qaraya "ağdı" – deyənlər,
Qəmgindi yaman, özlərini şəstlə öyənlər.

Bir cüt qatırın arpasını tən bölə bilmir,
Gəl ki, "elə" mən, "mən" deyir, heç cür yola gəlmir.
Sırtıqmaçadı, tutduğu yerdən də əkilmir.
Batdı, mizə yumruqlarını işdə döyənlər,
Qəmgindi yaman, özlərini şəstlə öyənlər.

Yüz yol dedilər, haqq sözünü tərsinə yazma,
Ehmallı dolan, düz yolunu ay kişi, azma.
Vallah, düşəcəksən sən özün, gəl quyu qazma.
Gördü necə bir-bir sürüşürlər, baş əyənlər,
Qəmgindi yaman, özlərini şəstlə öyənlər.

Bağlandı bazar, katibə meydanda qalıb tək,
Dəllal qağanın indi qonub ağzına milçək.
Rəssam ola, lap yalvararam rəsmini gəl, çək.
Kimlərdi tanı, müftə pula layka geyənlər,
Qəmgindi yaman, özlərini şəstlə öyənlər.

## ELƏ BU BƏSDİ MƏNİMÇÜN

Sayəmdə neçə dost-tanışın keyfi olub saz,
Hər halda təmənnam da olub, amma ki, çox az.
Hərgah biri mərfətli olubsa əgər az-maz.
Dünyaya dəyib mebelinin dəsti mənimçün,
Vicdan təmiz olsa, elə bu bəsdi mənimçün.

Əfsus ki, inam azdı hələ, çünki yalan var,
Xahiş nədi ki, etməyə əl muzdu alan var.
Can-başla mənim qayğıma hər yerdə qalan var.
Cüzi iş üçün Səbzalı qoç kəsdi mənimçün,
Vicdan təmiz olsa, elə bu bəsdi mənimçün.

Az-çox tanıyan var, bütövəm çünki sözümdə,
Dünya malı heç zərrə qədər yoxdu gözümdə.
Məclisdə bir anbardara mat qaldım özüm də.
Sovqatda deyil iş, kişi lap əsdi mənimçün,
Vicdan təmiz olsa, elə bu bəsdi mənimçün.

Yağlı yerə bir lüt əfəli saldım axır ki,
Gördüm dolaşır, nazirə zəng çaldım axır ki.
Zorla maşının bəxş elədi, aldım axır ki.
Fərqi nədi, ya dostdu, ya hər kəsdi mənimçün,
Vicdan təmiz olsa, elə bu bəsdi mənimçün.

Böhtançıya hətta belə xeyrim dəyib ancaq,
Düşmə gümana daşbaşını tək yeyib ancaq.
Bəlkə dədəmin ruhuna rəhmət deyib ancaq.
Kaş ki, dolana olmaya bir qəsdi mənimçün,
Vicdan təmiz olsa, elə bu bəsdi mənimçün.

Oldumsa dayaq çoxlarına, hətta batanda,
Düşdüm dara, heç olmadı bir dada çatan da.
Son məhkəməni yad elədim orda yatanda,
Hakim səsi çoxdankı tanış səsdi mənimçün,
Dərs oldu mənə, bax, elə bu bəsdi mənimçün.

## MƏNƏ NƏ

Müftə daşbaş yeyəcək, kim şişəcəkdir mənə nə,
Tənqidin atəşinə kim düşəcəkdir, mənə nə.
Qovrulub kül olacaq, ya bişəcəkdir, mənə nə.
Zənn edirlər ki, koram, bəlkə qulaqdan da karam,
Demaqoq olmamışam, amma bu tiplərlə varam.

Görürəm kəmsavadı işdə çəkirlər qabağa,
Tapşıranlar hələ var məsul işi balqabağa.
Oxşayır sir-sifəti girdə xəmirsiz tabağa.
Guya ki, bir tikəni əsla yeməz, olsa haram,
Demaqoq olmamışam, amma bu tiplərlə varam.

Mənə çox istədilər bəzi şeyi qandıralar,
Dinmirəm, lap naşını dahi də adlandıralar.
Nə işim var ki, dinəm öz dədəmi yandıralar.
Bataram birdəfəlik mən, nə pulum var, nə param,
Demaqoq olmamışam, amma bu tiplərlə varam.

Kürsüdən vədəbazın hap-gopuna mat qalıram,
Mən də hərdən qoşulub çoxlarına, əl çalıram.
Gülürəm bir arada, guya ki, lap həzz alıram.
Başlayır sızlamağa hər dəfə qəlbimdə yaram,
Demaqoq olmamışam, amma bu tiplərlə varam.

Güdürəm, düşsə məqam, söyləməyə çoxlu sözüm,
Liberallıq edirəm mən hələlik qəsdlə özüm.
Dözürəm gördüyümə, kəlləmə lap çıxsa gözüm.
Olmayıb indiyəcən boş hədə-qorxuyla aram,
Demaqoq olmamışam, amma bu tiplərlə varam.

## YUMMARAM MƏN GÖZÜMÜ

Ey fələk, zay eylədin sən neçə illik səyimi,
Tapşırıbsan yenə bir nadana son taleyimi.
Özü bir dəmdəməki, amma bəyənmir nəyimi.
İşimi qurdalasa göstərəcəm sərt üzümü,
Lənət olsun dədəmə, nöqsana yumsam gözümü.

Rast gələr sizlərə də çox belə nadan sayağı,
Sanki, göylərdə uçur, heç yerə dəymir ayağı.
Olsa dağdan da yekə arxası, yaxud dayağı.
Dəxli yoxdur, deyəcəm şax üzünə haqq sözümü,
Lənət olsun dədəmə, nöqsana yumsam gözümü.

Dərdimi ərz elədim, zənn elədim bəlkə qanar,
Vicdanı varsa əgər, halıma yəqin ki, yanar.
İstədim "hörmət" edəm, amma ki, qorxdum dadanar.
Etmədim yaxşı ki, alçaltmış olardım özümü,
Lənət olsun dədəmə, nöqsana yumsam gözümü.

Çıxarır hövsələdən, yazmağa vadar eyləyir,
Çoxu ancaq qələmi tutmağa da ar eləyir.
Elə zənn eyləməyin tənqid ona kar eləyir.
Yazmışam bircə dəfə qamçılayır lap izimi,
Lənət olsun dədəmə, nöqsana yumsam gözümü.

Toplamışdı başına bir para dost-aşnasını,
Basdıra bilmədilər heç üzə çıxmış pasını.
Çoxu saqqal da qoyub saxlayır artıq yasını.
Öyünərdi bu hərif: – "Qatlayan olmaz dizimi",
Lənət olsun dədəmə, nöqsana yumsam gözümü.

## BURA ALƏMDİ, DƏDƏ!

Dədə, aləm dəyişib, indi qiyamətdi şəhər,
Elə bil möcüzədir, tez açılır burda səhər.
Zənn edirdim boğacaq bəlkə də qürbətdə qəhər.
Amma ki, kaş görəsən, qonşu da həmdəmdi, dədə!
Dönmərəm kəndə daha, lap bura aləmdi, dədə!

Kaş ki, mərkəzdə mənim mənzil alaydın adıma,
Qalmasan qayğıma sən, kim çatacaqdır dadıma.
Salıram kənddə keçən günləri bir-bir yadıma.
Ötən hər bir günümün xatirəsi qəmdi, dədə!
Dönmərəm kəndə daha, lap bura aləmdi, dədə!

Hərə tapmış çəmini, var işi , xudmani yeri,
Çıxır axşam şəhərə, qeybə çıxır dərdi-səri.
Heç rəva bilmə, dədə, bir də dönüm kəndə – geri.
Burda xoşdur havalar, orda hava nəmdi, dədə!
Dönmərəm kəndə daha, lap bura aləmdi, dədə!

Sən dədəmsən, axı bir qayğıma qalsan nə olar?
Mən ki çox şey demirəm, bir maşın alsan nə olar?
Ayda cib xərcliyimi tez yola salsan nə olar?
Çünki hər gün başıma dost-tanışım cəmdi, dədə!
Dönmərəm kəndə daha, lap bura aləmdi, dədə!

Var gözaltım da hələ, kənddə qız axtarma hədər,
Gəlməsən eyb eləməz, elçiliyə qonşu gedər.
Xərcini çəksən əgər, vallahi lap toy da edər.
Demə oğlun gic olub, ya da bir az dəmdi, dədə!
Dönmərəm kəndə daha, lap bura aləmdi, dədə!

Mənzilim olsa da dar, yaxşıca məclis qurulub,
Yazıram məktubu çünki yenə keyfim durulub.
Dədə, var bir qonağım zümzüməmə bərk vurulub.
Çox heyf, amma səsim çoxlarıtək bəmdi, dədə!
Dönmərəm kəndə daha, lap bura aləmdi, dədə!

## FƏRQİ VARMI

Soruşursan yerimi-yurdumu, odsuz yanıram,
Çünki duzsuz sualın məğzini aydın qanıram.
Haralı olduğumu, zənn eləyirsən danıram.
Danıb, öz mənliyimi mən nə üçün satmalıyam,
Dözmək olmaz, bu işin axırına çatmalıyam.

Yerlibazlar görəsən hansı daş altında, yatıb?
"Haralı" kəlməsini ortalığa qəsdən atıb.
Yerli-dibli bu sözü tullamağın vaxtı çatıb.
Kimsə bir zurna çalırsa, onu züy tutmalıyam?
Dözmək olmaz, bu işin axırına çatmalıyam.

Çəkə bilməz tərəzi, dağdan ağırdır bu sual,
Elə zənn eyləmə ki, sadə, fağırdır bu sual.
Yeri gəlsə ürəyi hətta ağrıdır bu sual.
Çiynimə yükləmisən, mən nə sayaq atmalıyam?
Dözmək olmaz, bu işin axırına çatmalıyam.

Fərqi varmı Bakılı, ya da ki, Şirvanlı olum?
Axı qan qardaşınam, lap elə Tehranlı olum.
İstəməzsənmi məgər, mən də adlı-sanlı olum?
Pənahım olmasa, kölgəndə girib yatmalıyam?
Dözmək olmaz, bu işin axırına çatmalıyam.

Şəki olsun, ya Quba, hər yerin öz ləhcəsi var,
Çox nahaq lağ eyləyib, eyləmisən aləmə car.
Bu qəbahətdi məgər, dünya olubdur sənə dar?
Bəlkə öz ləhcəmə bir azca şəkər qatmalıyam?
Dözmək olmaz, bu işin axırına çatmalıyam.

Görəsən mətləbimi anlamağın çoxmu çəkər?
Babamız, əcdadımız eyni deyildirmi məgər?
Bir də kəndə, şəhərə məmləkəti bölsən əgər.
Ya səni yıxmalıyam, ya da özüm batmalıyam,
Dözmək olmaz, bu işin axırına çatmalıyam.

## CAN ATANLAR

Ey dost, nə olan şeydi vəzifə, xəbərim var,
Səssiz dil açan neydi vəzifə, xəbərim var.
Şərbətdi, qızıl meydi vəzifə, xəbərim var.
Çoxdur belə işçün aranı hətta qatanlar,
Kimlərdi soruşma, elə yerçün can atanlar.

Vardırsa ucalmaq həvəsi, olsa da lap dağ,
Bir vaxtı görürsən ki, olub modalı yaltaq.
Beşqat əyilər lap, təki olsun yeri çim yağ.
Birdir, ikidir, məsləki, vicdanı satanlar?
Kimlərdi soruşma, elə yerçün can atanlar.

Müşkül işi sahman eləmək gəlsə əlindən,
Düşməzsən onun toyda, nə də yasda dilindən.
Hökmən tutacaq ya ətəyindən, ya belindən.
Azdırmı bu gün arzuya bu yolla çatanlar?
Kimlərdi soruşma, elə yerçün can atanlar.

Məclisdə əgər rastına gəlsə təzə dostu,
Dost şəninə həsr eyləyəcəkdir neçə tostu.
Hərdən də giley eyləyəcək, kaş ola postu.
Öyrəncəlidir kölgədə illərlə yatanlar,
Kimlərdi soruşma, elə yerçün can atanlar.

Əfsus hələ çoxdur belə yolla ucalanlar,
Alimliyi də arxa tapıb, zorla alanlar.
Tufan qoparıb sonra da afsayda qalanlar.
Üz vurma, sən öl, mən deməzəm kimdi batanlar,
Kimlərdi soruşma, elə yerçün can atanlar.

## AY İŞIQ!

*(Böhtançının dilindən)*

Təzə bir cızma-qara qondarıram mən bu gecə,
Düşmüsən əsməcəyə sən niyə qəsdən bu gecə?
Bataram birdəfəlik, sönsən əgər sən bu gecə.
Baxma nursan, nə qanırsan nədi böhtan, ay işıq,
Mən ölüm, sönmə bu gün sübhə qədər yan, ay işıq.

Yenə tufana düşüb dalğalı ümmanda gəmim,
Zorla fakt toplamışam ilhama gəlmir qələmim.
Barı sən dadıma çat, bəlkə azalsın bu qəmim.
Başa düş, anla mənim mətləbimi, qan, ay işıq,
Mən ölüm, sönmə bu gün sübhə qədər yan, ay işıq.

Dədəm ölsəydi, bu cür, bəlkə qaralmazdı qanım,
Sən sönərsən çıxar əldən neçə mənalı anım.
Demərəm uf, çıxa kaş ağ varaq üstündə canım.
Axı hardan biləsən yanğılıdır can, ay işıq,
Mən ölüm, sönmə bu gün sübhə qədər yan, ay işıq.

İşdi görsəm birinin hörməti var, ad-sanı var,
Həm də at çapmağa məndən də geniş meydanı var.
Yazıram sərvəti gizlətməyə damda, banı var.
İndi bildin necə qiymətlidi hər an, ay işıq?
Mən ölüm, sönmə bu gün sübhə qədər yan, ay işıq.

Seçirəm mən hədəfin rütbəlisin, lap irisin,
Qatıram böhtanıma həm ölüsün, həm dirisin.
Durulur kef-damağım, çünki yıxanda birisin.
Yazıram hər nə gəlir, bilmirəm heç mən, ay işıq,
Mən ölüm, sönmə bu gün sübhə qədər yan, ay işıq.

Bir təvəqqem budu ki, yazdığıma yum gözünü,
Məni gözdən salaraq əngələ salma, özünü.
Sirrimi car eləmə, varsa danış öz sözünü.
Şahid olsan da mənə, gördüyünü dan, ay işıq,
Mən ölüm, sönmə bu gün sübhə qədər yan, ay işıq.

## BAŞ GÖTÜRÜB...

Yalvarıram Allaha axşam-səhər,
Bəxtim açılsa olaram bəxtəvər.
Yaxşıdı vallah bu aləmdən zəhər.
Gəlmişəm arvadın əlindən zara,
Baş götürüb indi qaçım mən hara?

Gülməlidir, baxma dolubdur yaşa,
Meylini salmış təzədən daş-qaşa.
"Yox" sözünü heç cürə düşmür başa.
Az qalır hərdən məni çəksin dara,
Baş götürüb indi qaçım mən hara?

Gündə deyir: "Ay başıboş, anlamaz",
Bir quru diplomla qazan qaynamaz.
Müftə qazancın gərək olsun bir az.
Sərfəli bir yağlı yer axtar, ara,
Baş götürüb indi qaçım mən hara?

Hökm eləyir: "Qonşuya bax, bir utan
Arvadına layka alıb şorsatan.
Bərdə-bəzəkdə ona olmaz çatan.
Gündə geyir əlli cürə zər-xara",
Baş götürüb indi qaçım mən hara?

Tutması tutdu səsi qalxır zilə,
Lərzə salır sübhə kimi mənzilə.
Qonşular axırda gəlirlər dilə.
Tənə, filan da yenə gəlmir kara,
Baş götürüb indi qaçım mən hara?

Bax belə arvad adamı çərlədər,
Evdə məni az qala boğsun qəhər.
Kaş ki, vuram ömrü başa birtəhər.
Xeyli zamandır günüm olmuş qara,
Baş götürüb indi qaçım mən hara?

## GÖZLƏYİRDİM YOLUNU

Dayanıb astanada gözləyirəm hey yolunu,
Təzə il, gəl, bəzəyim yollarının sağ-solunu.
Mən ölüm, dadıma çat, çırmala bir əl-qolunu.
Elə fərz et, ölüyəm, ver mənə can, ay təzə il,
Çıxarım çul-çuxamı bəlkə sudan, ay təzə il.

Güvənirdim dayıma kefdə keçirdi hər anım,
Yıxdılar dağ kişini, azca qalıb mən də yanım.
Gümanım bir sənədir, gəl, sənə qurban bu canım.
Batıram, qoyma batım, halıma yan, ay təzə il,
Çıxarım çul-çuxamı bəlkə sudan, ay təzə il.

Neçə illər, bu sən öl, daşbaşım olmuş nə qədər,
Bilməmişdim hələ mən heç nə olan şeydi kədər.
Nə biləydim gedəcək zəhmətim axırda hədər.
Olmasın kaş ki, nə şöhrət, nə də şan, ay təzə il,
Çıxarım çul-çuxamı bəlkə sudan, ay təzə il.

Bu nəzarət də salıb kürkümə çoxdandı birə,
Verməmişdim hələ can, indiyəcən, zorba şirə.
Girləyirdim başımı, keçmişəm axırda girə.
Sən ki arifsən özün, dərdimi qan, ay təzə il,
Çıxarım çul-çuxamı bəlkə sudan, ay təzə il.

Tamahımdan qudurub cəncələ saldım başımı,
Sənə çox yalvarıram, bir nəzərə al yaşımı.
İstəyirsənsə satım vallahi, lap dam-daşımı.
Yatmağa qoyma məni orda bir an, ay təzə il,
Çıxarım çul-çuxamı bəlkə sudan, ay təzə il.

## GƏRDİŞİ DÖVRAN BELƏ QALMAZ

Bağda gecə-gündüz elə manqal qalayırsan.
Dünya dağılar, boş günü məclisçün ayırsan?!
Lövbər salıb orda, özünü işdə sayırsan.
Bəxtin gətirib, var dayağın, kef-damağın saz;
Hərçənd a kişi, gərdişi-dövran belə qalmaz.

İclasda elə şəstlə durub kürsüyə çıxma!
Barı günahı özgəsinin boynuna yıxma!
Sözsüz çoxu ləbbeyk deyəcək, qəlbini sıxma!
Yıxsan, sürüsən bəlkə yenə azdı, hələ az!
Hərçənd a kişi, gərdişi-dövran belə qalmaz.

Dövrəndəki yaltaqlara bel bağlamısan sən,
Zənbillə salıblar elə bil onları göydən.
Bir gün gedəcəksən güdaza, arxayınam mən.
Sən düz adama qaz quyunu, eyb eləməz, qaz!
Hərçənd a kişi, gərdişi-dövran belə qalmaz.

Yumdun gözünü pul-para ardınca gedəndə,
Bir vaxtı bu taxtdan düşəcəksən axı sən də.
Baxdın çəpəki, işlərini tənqid edəndə.
Fürsətdi düşüb, durma daha əmrimi get yaz!
Hərçənd a kişi, gərdişi-dövran belə qalmaz.

Dünya malını yığmağa çox bərk girişibsən,
Tapdın çəmini, qaynamamış çünki bişibsən. Göz
dəyməsin, artıq kökəlib, xeyli şişibsən.
Boydan qısalıb, oxşamısan çəlləyə, az-maz.
Hərçənd a kişi, gərdişi-dövran belə qalmaz.

Şəksiz, ilişən olmayıb heç durduğu yerdə,
Gördünmü bu dövran səni saldı necə dərdə?!
Qaytarmaq ola, kaş ki, ötən günləri bir də!
Gecdir, büzüşüb, cismin olub, sanki, yoluq qaz,
Bəs mən demədim: gərdişi-dövran belə qalmaz?!

## ALÇALMA, AMANDIR!

Cismindəki mənlikdi sənin sadə vüqarın,
Əfsanədir onsuz da qağa, dövləti-varın.
Saxla onu, vardırsa əgər namusun, arın.
Ey dost, bu həyatın yolu çox vaxtı dumandır,
Dünyada nə dərdin ola alçalma, amandır!

Namərdin önündə özünü sən yerə vurma,
Düşsən dara da cəhd elə sən boynunu burma.
Ömrün təməlin sərvətin üstündə də qurma,
Ey dost, axı sərvət nə şərəfdir, nə də şandır,
Dünyada nə dərdin ola alçalma, amandır!

Mənlik gərək olsun sənin hər qətrə qanında,
Yoxdursa əgər, fərz elə ki, yoxdu canın da.
Daim o gərəkdir sənə ömrün hər anında,
Ey dost, ola bilsin, elə mənlik özü candır,
Dünyada nə dərdin ola alçalma, amandır!

Mənlik ayaq altında qalıb tapdana bilməz,
Hərdən də olur tərsinə heç kəs dana bilməz.
Əfsus ki, bu sirdir, bunu nadan qana bilməz.
Ey dost, sən özün qandığını nadana qandır,
Dünyada nə dərdin ola alçalma, amandır!

Mənlik səni qoymaz əyilib baş əyəsən sən,
Hər nakişiyə “ bəli”, “baş üstə” deyəsən sən.
Bir süfrədə duzla çörəyi bir yeyəsən sən...
Ey dost, başa düş, yersiz əyilmək, nə yamandır,
Dünyada nə dərdin ola alçalma, amandır!

## BATDI MÜDİR

Təzə yerdə bu müdir baxmadı heç sağ-soluna,
Dona girmiş gədələr girdilər hər gün qoluna.
Yox, dığırlatmadılar xırda kötüklər yoluna.
Çoxusu gözlədi ki, bəlkə ipə yatdı müdir,
Atdılar lilli gölə, əl-qol atıb batdı müdir.

Yığılıb dövrəsinə, tərifə əl atdı çoxu,
And-amanla müdiri hər dəfə aldatdı çoxu.
Cibi sahmana salıb arzusuna çatdı çoxu.
Gördü işlər dolaşır, tərsinə fırlatdı müdir,
Atdılar lilli gölə, əl-qol atıb batdı müdir.

Müdirin “dostlarının” xəlvəti bir oldu sözü,
Yoxlama gəldi ora tək ilişən oldu özü.
Guya qəmdən şefini boğdu qəhər, doldu gözü.
Çoxu zənn eylədi ki, öz şefini “satdı” müdir,
Atdılar lilli gölə, əl-qol atıb batdı müdir.

Günahı olmasa da çarəsi yoxmu işinin,
Xoruzun qoltuğuna verdilər axır kişinin.
Baisin güldü gözü, ağrısı kəsdi dişinin.
Qurğunu düşdü başa, aləmi lap qatdı müdir,
Atdılar lilli gölə, əl-qol atıb batdı müdir.

Oxucu! İş başına keçsən əgər sən ayıq ol!
Sənədi yoxlamamış çəkmə sən icrasına qol.
Çox dalandan keçəcək üz tutuban getdiyi yol.
Olacaq işdə deyən, al, bu da sovqatdı müdir,
Dara düşsən deyəcək: – Bəli, yenə batdı müdir.

## LƏZZƏTİ VARDIR HƏLƏ

Düşdü xoda atdığım bir para vərdişlərim,
Manqala öyrəncəli oldu kabab şişlərim.
Ölməyə vaxtım hanı, var nə qədər işlərim.
Gəlsə evə əzrayıl üz vuraram: səbr elə,
Dünyada kef çəkməyin ləzzəti vardır hələ.

Ömürdən ötən günüm, sanki, cibimdən gedir,
Rütbə alandan bəri bilmirəm heç qəm nədir.
Bir parası ay kişi, ömrü boyu kefdədir.
Kim yıxılır, kim durur eyninə almır belə,
Dünyada kef çəkməyin ləzzəti vardır hələ.

İclasa getsəm əgər mürgüləyib yatmışam,
Aləmi-röyada mən tənqidə əl atmışam.
Haqsız olan kəsləri bir-birinə qatmışam.
Dargöz olanlar mənə işdə qurublar tələ,
Dünyada kef çəkməyin ləzzəti vardır hələ.

Arxalılar büdrəməz, varsa dirək, ay kişi,
Toplayacaq pul-para olsa zirək, ay kişi!
Şəkk eləyirsən əgər mərcə girək, ay kişi.
Sən deyən əyyam deyil, başqa zamandır, lələ!
Dünyada kef çəkməyin ləzzəti vardır hələ.

Baxma çoxu alnının əsla axıtmır tərin,
Amma yeri fırladar tapsa yerin mehvərin.
Hər gecə məclis qurur, bağda ki, lap sərsərin.
Cəhd eləyir mötəbər kəsləri alsın ələ,
Dünyada kef çəkməyin ləzzəti vardır hələ.

## ATMALIYAM DAŞ

Vay-vay nə yaman tərifə vurğundu bu “ dostun”,
Dinsən, çıxacaq işdə əlindən təzə postun.
Məclisdə hərif qandı ki, uydurmadı tostun.
Salmış səni hər yerdə gözümçıxdıya, qardaş,
Ölsəm də onun bostanına atmalıyam daş.

Əsrin bu yaşında başıboşlar hələ vardır,
Gen-bol kabinet də belə nadanlara dardır.
Tənqidi eşitmir, elə bil zırrama kardır.
Bir gün görəcək işləri vallahi, olub yaş,
Ölsəm də onun bostanına atmalıyam daş.

Təriflə şişir qoltuğu amma ki, nə fayda,
İclas çağırır baxma ki, on beş dəfə ayda.
Hərçənd yarada bilməyib heç işdə də qayda.
Sanballı bir iş görməyə lazımdı ağıl, baş,
Ölsəm də onun bostanına atmalıyam daş.

Adət eyləyib taxmağa yay, qış, qara çeşmək,
Görmürsə sizi, onda baxır bəs hara çeşmək?..
İstər gözünü gizlədə, gəlmir kara çeşmək.
Guya ki, bilən yoxdu alır xəlvəti daşbaş,
Ölsəm də onun bostanına atmalıyam daş.

Zorla onu, vallah, sizə ürcah edən oldu,
Yəqin ki, kiminsə belə işdə cibi doldu.
Təriflə giribdir kola, bilmir necə koldu.
Koldan çıxa bilmir, olub artıq özü çaşbaş,
Ölsəm də onun bostanına atmalıyam daş.

Baxma hələlik arxası vardır, kefi sazdır,
Əfsus belə bir rütbəlinin ağlı dayazdır.
Yoxdur toxunan çünki hələ “staji” azdır.
Gec-tez hərifin zir-zibili olmalıdır faş,
Ölsəm də onun bostanına atmalıyam daş.

## KEYFİM LAP OLUR SAZ

Tale mənə yar olmadı qalxım, ucalım mən,
Qaldım gicələk – lövbərimi harda salım mən.
Gəldim bu qərara barı elmi ad alım, mən.
Şəklənmə, bu işdə çıxarım olsa da az-maz,
Alim ki, deyirlər mənə, keyfim lap olur saz.

Hərçənd bunu mən lovğalıq üçün demirəm, bil,
Elmi işimi yazmağım heç çəkmədi bir il.
Arxamda əgər durmasa, vallahi, nəhəng fil.
Tirtap səriləm, kimsə məni heç yada salmaz,
Alim ki, deyirlər mənə, keyfim lap olur saz.

Elmin toxumu yoxdu ki, beynimdə əkəm mən,
Varlıq da deyil, rəsmini bir anda çəkəm mən.
Yanpörtü baxırsan elə bil guya təkəm mən.
Bəlkə belə yolla ad alan əsla tapılmaz?
Alim ki, deyirlər mənə, keyfim lap olur saz.

Dost qayğısı hərçənd hələlik azdı mənimçün,
Doktorluq işin bəlkə özü yazdı mənimçün.
Əfsus ki, paxıllar da quyu qazdı mənimçün.
Gəl ki, nə yazıblarsa batıbdır, üzə çıxmaz,
Alim ki, deyirlər mənə, keyfim lap olur saz.

Artıb maaşım üçqat olub bir neçə aydır,
Amma yenə evdə, a kişi, hər gecə vaydır.
Arvad deyinir: "Qonşu Cəbiş heç sənə taydır?
Doktordu kişi, sən də çalış elmi əsər yaz,
Alim ki, deyirlər mənə, keyfim lap olur saz.

Dostum bunu da yazsa əgər, dadıma çatsa,
Yaxud da işin hazırı varsa, mənə satsa.
Olmaz vecimə, vallahi, dünya belə batsa.
Arvad da susar, dincələrəm mən də ki bir az,
Alim ki, deyirlər mənə, keyfim lap olur saz.

## SƏS SALMA, A VİCDAN!

Vicdan elə bir möcüzədir ki, səsi vardır,
Hər kəs ki eşitmir bu səsi sanma ki kardır.
Biganədi, dünyagörüşü olsa da, dardır.
Ordan doğan əllaməliyi ömrünə qəsdir,
Vicdanı haray salsa da duymaz bu nə səsdir.

Yoxdursa müqəddəs bu səsin ruhu canında,
Əfsanə, yalan gəzdirər hər yerdə yanında.
Vicdanı susar söhbətin haqsızlıq anında.
Daşdan nəsə ummaq özü vallahi, əbəsdir,
Vicdanı haray salsa da duymaz bu nə səsdir.

Baxma çoxusu zorbadı, gendən görünür dağ,
Yatmır cilova, nəfsi, yeri olsa da çim yağ.
Çirkin əməlin baisi vicdanıdır ancaq.
Gəlməz yola əsla, kişi, tərs oğludu, tərsdir,
Vicdanı haray salsa da duymaz bu nə səsdir.

Vicdan səsini çoxları çox vaxtı danırlar,
Tutduqları işdən od alıb gizli yanırlar.
Baş dəydi ki, əlhəd daşına səhvi qanırlar.
Yanmaqla düzəlmirsə də, hərçənd bu da dərsdir,
Vicdanı haray salsa da duymaz bu nə səsdir.

Zahirdə girir maskaya guya gözü toxdur,
Hərçənd belə kəslərdə də insaflısı çoxdur.
Heyhat! Anadangəlmə xəbisdə o da yoxdur.
Güdmək cibinin xeyrini pulgirdə həvəsdir,
Vicdanı haray salsa da duymaz bu nə səsdir.

Vicdanın itirmiş, can atır pusquda dursun,
Öyrəncəlidir, adət edibdir tələ qursun.
Fürsət gəzər hər an təmizə bir ləkə vursun.
Vursan qapazı, yalvara bəlkə daha bəsdir,
Vicdanı haray salsa da duymaz bu nə səsdir...

## TOPLADIĞIM BƏSDİ, KİŞİ

Köhnə işdə pulu pul, pay da düşərdi hərəyə,
Məni qurban elədi bir satıcım bir çörəyə.
Zirvədən yumbalayıb saldılar axır dərəyə.
Şefimiz tutdu xəbər, xeyli düşüb, əsdi kişi,
Başımı girləyirəm, topladığım bəsdi, kişi.

Vardı dostum, arabir mən də gəlirdim karına,
Öz işimdən savayı ortaq idim anbarına.
Dalbadal dəydi ziyan bolluca dövlət-varına.
Üzülüşdüm, nə edim, gördüm elə nəhsdi kişi,
Başımı girləyirəm, topladığım bəsdi kişi.

Tamahım yıxdı məni, əngəl açıblar başıma,
Qorxudan bel bükülüb, dən düşüb artıq qaşıma.
Cibi güdmək həvəsi indi yaraşmaz yaşıma.
Qapının zəngi də lap səksəkəli səsdi, kişi,
Başımı girləyirəm, topladığım bəsdi, kişi.

Bu sən öl, and içərəm, indi gözüm toxdu mənim,
Çox səfehlər düşünür dost-tanışım yoxdu mənim.
Keçmişəm iş başına, əl tutanım çoxdu mənim.
Demərəm arxa duran yaddı, ya hər kəsdi, kişi,
Başımı girləyirəm, topladığım bəsdi, kişi.

Gələcək yeznəmizin qayğısına qalmalıyam,
Bağı var, mənzili var, bircə maşın almalıyam.
Çalışıb diplom alıb, yağlı yerə salmalıyam.
Mənə yanpörtü baxır, bir balaca pəsdi, kişi,
Başımı girləyirəm, topladığım bəsdi, kişi.

Belə xudmani yeri zorla keçirtdim girimə,
Tirdəyəm, gül balalar gündə gəlirlər tirimə.
Yığdığım bəs eləyər həm ölümə, həm dirimə.
Bir kəsin yoxdu daha bir qərəzi, qəsdi, kişi,
Başımı girləyirəm, topladığım bəsdi, kişi.

## SİZ DƏ GƏLƏRSİZ ZAVALA

A paxıllar, nə gözəl yerdə məkan salmısınız,
Tapılar heç inanan gündə bekar qalmısınız?
Çoxunun taleyini burda satıb, almısınız.
Ev yıxırsız ki, batar barmağınız bəlkə bala,
Səbr edin, gec-tezi var, siz də gələrsiz zavala.

Nə yuvanın quşusuz, gizləsəniz də özünüz,
Dəxli yoxdur mənə heç, çünki yalandır sözünüz.
Çoxunuz alim olub, bəs bunu görmür gözünüz.
Ay əfəllər, çalışın qalmayın heç yerdə dala,
Səbr edin, gec-tezi var, siz də gələrsiz zavala.

Böhtanın pərgarısız, siz buna öyrəncəlisiz,
Birinin “noxtasısız”, başqasının “sağ əlisiz”.
Zahirən insan olub, batininizdə zəlisiz.
Salmısız, ay zəlilər, çoxlarını gör nə hala,
Səbr edin, gec-tezi var, siz də gələrsiz zavala.

Sizlərin olsa əgər, çəpgözü, ya əyriqaşı,
Eyni şeydir: təzəyin həm qurusu, həm də yaşı.
“Sayənizdə” çoxunun ağrıyır hər yerdə başı.
Vurmusuz siz çəkici gah mıxa, gah da ki, nala,
Səbr edin, gec-tezi var, siz də gələrsiz zavala.

Tələ qurmaqda keçir, mən əminəm hər anınız,
Şeytanın həmkarısız, əsla durulmaz qanınız.
Qurd didir qəlbinizi, amma ki, çıxmır canınız.
Kaş savab iş tez ola, hamı baxa, ləzzət ala,
Səbr edin, gec-tazi var, siz də gələrsiz zavala.

## ZURNANI GET DOSTUNA ÇAL

Yenə kölgəm deyəsən əyri görünmüş gözünə,
Nə qədər qondarasan kimsə inanmaz sözünə.
Kişi, güldürmə nahaq aləmi gəl sən özünə.
Mən düzəm, düzlərə dünya dağıla, yoxdu zaval,
Yaxşı şeydirsə əgər, zurnanı get dostuna çal.

Can atırsan badalaq qurmağa hərdən mənə sən,
Kölgəmin əyriliyin qamçılayırsan yenə sən.
Hələ baş əyməmişəm, əyməyəcəm də sənə mən.
Düşmüsən qəm gölünə, batmalısan, qeydinə qal,
Yaxşı şeydirsə əgər, zurnanı get dostuna çal.

Sən çapırsan kor atı çoxlarıtək köndələnə,
Əyilirsən neçə yol, hər dəfə dibdən gələnə.
Xam xəyalındı sənin düşməyəcəm mən tələnə.
Bələdəm batininə, sən ya düşüksən, ya da kal,
Yaxşı şeydirsə əgər, zurnanı get dostuna çal.

Belini bağlamısan çox da ki, möhkəm dayağa,
Laxlasa, vay halına, düşməlisən əl-ayağa.
Dara düşsən girəcəksən neçə rəngə, boyağa.
Görəcəm mən o günü, çünki olubdur belə hal,
Yaxşı şeydirsə əgər, zurnanı get dostuna çal.

Sən hələ görməmisən sərtliyini daş-qayanın,
Görürəm kölgəsinə lövbər atıbsan tayanın.
Başına kül ələnə, kaş səni alim sayanın.
Sən özün kimliyini, zatını məndən xəbər al,
Yaxşı şeydirsə əgər, zurnanı get dostuna çal.

Cəhdim ancaq budu ki, işdə ədalətli olum,
Tutmuşam düz yolumu, olmayıb heç əyri yolum.
Gücə qalsa hələ ki, güclüdü hər halda qolum.
Sən ki öyrəncəlisən dur məni də tez yola sal,
Yaxşı şeydirsə əgər, zurnanı get dostuna çal.

## HARDA GÖRSƏN...

Tanıyırsan, ay oğul, sən də qulaqdan şeşəni,
Hər qığılcım od olub yandıra bilməz meşəni.
Nə ola, mərdimazar tərgitə naqis peşəni.
Söhbət etsən, qulağın şəkləyəcək bir parası,
İlanın qorxuludur həm ağı, həm də qarası.

Büzüşüb fikrə gedər zənn eləyərsən ki, yatıb,
Nə sayaq bəs gileyin ünvanına göydə çatıb?..
Sən demə şəlpə qulaq aləmi bir anda qatıb.
Bu qəliz xəstəliyin dünyada yoxdur çarası,
İlanın qorxuludur həm ağı, həm də qarası.

Harda görsən beləsin toxta, ayaq saxla, dayan,
Maya qoy, söhbətə tut, batmayacaq bil ki, mayan.
Öyrənərsən nə ki var, çünki odur "müjdə" yayan.
Dədəsindən danışar olmasa hərgah arası,
İlanın qorxuludur həm ağı, həm də qarası.

"Kişinin" torbası var yağlı yalan toplamağa,
Tutsa gopdan yükünü başlayacaq goplamağa.
Tərgidər adətini bəlkə qoyan olsa lağa.
Söyləsən gopdu sözün, sanki, sızıldar yarası,
İlanın qorxuludur həm ağı, həm də qarası.

Belə söz gəzdirənin xeyri də yoxdur cibinə,
Gəl ki, bir söz eşidə çatdıracaq sahibinə.
Atasan zırramanı lilli gölün lap dibinə.
Bu qəbildən olanın, söylə, adamdır harası?!
İlanın qorxuludur həm ağı, həm də qarası.

## BAZARDA

Çax-çuxdadı, alverdədi qonşum neçə ildir,
Görsən tanıyarsan, beli donqar, üzü çildir.
Gəlmişdi dəyə bir ayaqüstü evə bildir,
Tüğyan eləyir, müftə qazancı, pulu vardır,
Doldurmağa cib, sərfəli yer varsa bazardır.

Piştaxtası var ayrıca xudmani bazarda,
Getsən görəcəksən, ola lap şaxta da, qar da,
Yay-qış əridir alma, ərik, şaftalı, nar da,
Qonşumda hərislik pula çoxdankı azardır,
Doldurmağa cib, sərfəli yer varsa bazardır.

Keyfi-damağı çağ oturur çay qabağında,
Meyvə yetişir, sanki, "bazar" adlı bağında.
Qarpız bitirir balqabağın hətta tağında.
Bir kimsə deyəmməz, "kişinin" meydanı dardır,
Doldurmağa cib, sərfəli yer varsa bazardır.

Yoxdur yerinin qiyməti, alver də ki çim yağ,
Çapsın, talasın, xətrinə yoxdur dəyən ancaq,
Əfsus ki, bazarkom da görür lap eləyib ağ,
Dinmir, niyə dinsin özü çünki havadardır,
Doldurmağa cib, sərfəli yer varsa bazardır.

Öyrəncəlidi yaxşını pis meyvəyə qatsın,
Hər gün də töküb istədiyi qiymətə satsın.
Bar-bar bağıran müştəriyə kim əl uzatsın?!
Bir yerdə ki, biçarə bazarkom özü "kardır",
Doldurmağa cib, sərfəli yer varsa bazardır.

Qozbel düzələr yaxşı deyiblər axı, gorda,
Getdim bazara görmədim hərçənd onu orda.
Bir dostu dedi: əl-qol atır, ordadı, "torda",
Gördüm büzüşüb, sanki, canından da bezardır,
Doldurmağa cib, sərfəli yer varsa bazardır.

## KAŞ BİZDƏ OLAYDI

Cansız daşa baxdım, dedi: "Yəqin elə sən də,
Təhsil alıb heç getməmisən bir dəfə kəndə.
Baxma ki, daşam çox yanıram halına mən də...".
...Dilsiz bu daşın qeyrəti kaş bizdə olaydı,
Kənddən ötəri gözlərimiz yaşla dolaydı.

Daş daşdısa da tənəsi bir yükdü belimdə,
Söz tutdu məni hətta topuq vurdu dilim də.
Yanmış siqaret tüstülənib qaldı əlimdə.
Dilsiz bu daşın "qeyrəti" kaş bizdə olaydı,
Kənddən ötəri gözlərimiz yaşla dolaydı.

Daşda belə bir nisgilə mat qaldım özüm də,
Yandım anamın halına yaş dondu gözümdə.
Daş haqlıdı düz çıxmamışam çünki sözümdə.
Dilsiz bu daşın "qeyrəti" kaş bizdə olaydı,
Kənddən ötəri gözlərimiz yaşla dolaydı.

Kövrəldi bu anda elə bil "daş" ürəyim də,
Toplandı gözümdən süzülən yaş ürəyimdə.
Yer tapdı ömürlük özünə daş ürəyimdə.
Dilsiz bu daşın "qeyrəti" kaş bizdə olaydı,
Kənddən ötəri gözlərimiz yaşla dolaydı.

Övlad olur övlad, anaya qəlbi yananda,
Torpaq və ana borcunu hər yerdə qananda.
Pərvaz elədi kəndə ürək, sanki, bir anda.
Dilsiz bu daşın "qeyrəti" kaş bizdə olaydı,
Kənddən ötəri gözlərimiz yaşla dolaydı.

## PAH ATONNAN...

Pah atonnan, a kişi, sən daşürəksən nə yaman!
Bu qədər şöhrətə vurğun tapılarmış, ay aman!
Adı, zor işlədib aldın buna şahiddi zaman;
Bu zorun var qəmi də, onda baxarsan dadına,
Bilmək olmaz kimi ellər salacaqdır yadına.

Dumana sövq elədin zirvəyə qalxan kişini,
Nə biləydi, axı xəlvətdə görürsən işini.
Qara qəlbin təzədən verdi büruzə işini.
Bu paxıllıq işinin sən də gedərsən badına,
Bilmək olmaz kimi ellər salacaqdır yadına.

Yumşalıb daş ürəyin bəs niyə kövrəlmədi, heç?
Əməlindən utanıb, insafa bir gəlmədi heç?
Qərəzin bir ox olub qəlbini nöş dəlmədi heç?
Şöhrətin sanma çatar ömrü boyu imdadına,
Bilmək olmaz kimi ellər salacaqdır yadına.

Sanma hər vaxtı adın aləmə hay-küy salacaq,
Büllur ilhamı olan kölgədə adsız qalacaq.
Xam xəyalındı sənin, bir gün o da ad alacaq.
Yaraşır ad bəşərin əsl kişi övladına,
Bilmək olmaz kimi ellər salacaqdır yadına.

Kükrəyən xan Arazım arxalanıb Kür qoluna,
Aləmə nur çiləyir, şölə də salmır yoluna.
Arabir boylanır o gül qoxulu sağ, soluna.
Görür hər yerdə təzə nəğmə qoşublar adına,
Bilmək olmaz kimi ellər salacaqdır yadına.

## GƏL QONAQ OL SƏN BU GECƏ

Məclisim var, a qohum, gəl qonaq ol sən bu gecə,
Gələcək can-ciyərim bir neçə yerdən bu gecə.
Şəninə tost deyəcəm sübhə qədər mən bu gecə.
Gizləmə, var xəbərim, getməlisən çox qabağa,
Möhtacıq biz də belə arxalı, köklü dayağa.

Tanı, bir vaxtı olar çoxları vallah, gərəyin,
Toplasan öz başına işdə darıxmaz ürəyin.
Olar hər yerdə sənin ay kişi, arxan, dirəyin.
Gəl, görərsən nə sayaq şəstlə dururlar ayağa,
Möhtacıq biz də belə arxalı, köklü dayağa.

Desən orda yıxıl öl, and içərəm bəlkə ölər,
Bərkə düşsən çoxusu karına hər yerdə gələr.
Hətta çax-çux eləsə müftə qazancın da bölər.
Sən də imkan yaradarsan ona hər halda qağa,
Möhtacıq biz də belə arxalı, köklü dayağa.

Zahirən baxsan əgər boy-buxunu dağ görünər,
Xeyri olsa çoxusu hətta diz üstə sürünər.
Bilsə, keyfin durular, ağ kəfən olsa, bürünər.
Təki sən həzz alasan, qurşanasan kef-damağa,
Möhtacıq biz də belə arxalı, köklü dayağa.

Bəsdi saldın əlini indiyəcən boş cibinə,
Çıraq ol, amma ki, sən şöləni sal öz dibinə.
Fikrimi ərz elədim sübhi səhər mən bibinə.
“Afərin” Söylədi o, lap ürəyi döndü dağa,
Möhtacıq biz də belə arxalı, köklü dayağa.

Belə fürsət, mən ölüm düşməyəcək bir də ələ,
Xərcinə baxma, qohum, işlərini sahman elə.
Bu paxıllar sənə də qurmayalar kaş ki, tələ.
Əmrini al, yığışaq təbrikə sahildə bağa,
Möhtacıq biz də belə arxalı, köklü dayağa.

## ƏL ÇALMA YALANDAN

İclasda çıxıb kürsüyə tərs-tərs məni süzmə,
Hap-gopla, olub-olmayanı yan-yana düzmə.
Tənqid olunubsansa, nahaq ağzını büzmə.
Yerdən atılıb-düşmə, haray salma yalandan,
Zəhmət çəkib, heç sən mənə əl çalma yalandan.

Haqsız səni tənqid eyləsəm, inci sözümdən,
Boş vədə verib, pərdə, filan asma gözümdən.
Vadar eləyirsən çıxıram mən də özümdən.
Bəsdir, çıxışa, hər dəfə söz alma yalandan,
Zəhmət çəkib, heç sən mənə əl çalma yalandan.

Yerdən danışıb, atmacalar atma, ayıbdır,
Hay-küy qoparıb sən aranı qatma, ayıbdır.
Dalda oturub, mürgüləyib, yatma, ayıbdır.
Bəzən də xəyal aləminə dalma yalandan,
Zəhmət çəkib, heç sən mənə əl çalma yalandan.

Əfsus ki, mənim məruzəmi anlamadın sən,
Hərçənd açıq-aşkar səni rüsvay elədim mən.
Qalxdı ayağa zaldakılar, söylədi: – Əhsən!
Sənsə ayaq üstə quruyub qalma yalandan,
Zəhmət çəkib, heç sən mənə əl çalma yalandan.

Dağ yıxmağa qadirdi cibi müftə dolanlar,
Qoymaz yıxıla bir-birini əlbir olanlar.
Əfsus, çox olubdur, ilişib, rəngi solanlar.
Hirslənmə, nə də çal bığını yolma yalandan,
Zəhmət çəkib, heç sən mənə əl çalma yalandan.

Arxanda duran dərsini hökmən alacaqdır,
Şəksiz səni də əngələ bir gün salacaqdır.
Bəlkə gələn iclasda yerin boş qalacaqdır.
Kövrəlmə hələ, sil gözünü, dolma yalandan,
Zəhmət çəkib, heç sən mənə əl çalma yalandan.

## ARXALI DAĞLAR ADAMI

Hirslənib bir tifilə işdə yarıtmaz, demisən,
Günahı olmayana, hətta “yoluq qaz”, demisən.
Hünərin varsa əgər, lap yuxarı yaz, demisən.
Elə zənn eyləmə ki, gözdən uzaqdır adamı,
Sözü hər yerdə keçən arxalı dağdır adamı.

Tutalım yoxdur elə dünyada heç bircə kəsi,
Salmısan gündə gözümçıxdıya çıxmır nəfəsi.
Hələlik dözsə də, bir gün çıxacaq amma səsi.
Yatmayıbdır, eşidər, çünki oyaqdır adamı,
Sözü hər yerdə keçən arxalı dağdır adamı.

Nə ola, keçmişini yad eləyib, bir anasan,
Arxası olmayanın halına az-maz yanasan.
Səhvini indiyəcən qanmamısansa, qanasan.
Axı hardan biləsən bir də ki sağdır adamı,
Sözü hər yerdə keçən arxalı dağdır adamı.

Çıxmısan çox ütüdən, görmüsən ancaq işini,
Yenə kefdən qayıdıb, qurdalayırsan dişini.
Belə getməz, yığacaqlar sənin axır vişini.
Tifilin, zənn eyləmə körpə uşaqdır adamı,
Sözü hər yerdə keçən arxalı dağdır adamı.

Güvənirsən kiməsə, şəstlə çapırsan atını,
Gətirirlər hələlik aylığını, sovqatını.
Tapılar təlx eyləyən, bil ki, sənin ovqatını.
Düşünürsən ki, yəqin şəlpəqulaqdır adamı,
Sözü hər yerdə keçən arxalı dağdır adamı.

Dolaşıb indi işin, aqibətin anlamısan,
Düşmüsən əl-ayağa işləri sahmanlamısan.
Dadına bəlkə çata, sən tifili yanlamısan.
Bilmisən çünki onun arxa-dayaqdır adamı,
Sözü hər yerdə keçən arxalı dağdır adamı.

## GÖZLƏYİRƏM MƏN

Xudmani yerim vardı, bilirdin özün harda,
Benzinlə dolandım neçə illərlə mən orda.
Bəxtim, nə bilim, mürgüləyirmiş bu baharda,
Hər gün yenə bozbaş yerinə qəm yeyirəm mən,
İşlər olacaqdır nə sayaq, gözləyirəm mən.

Artdıqca gəlir, qan da coşurdu damarımda,
Keyfim kökələndə, dilə gəlmişdi tarım da.
Əfsus, karıma gəlmədi, dar gündə varım da.
İndi hara getsəm, əyilib baş əyirəm mən,
İşlər olacaqdır nə sayaq, gözləyirəm mən.

Hərçənd, təzə nağd müştərilər gündə olurdu,
Çeksiz də satırdım arada, cib də dolurdu.
Hərdən də müfəttiş "tükümü" xeyli yolurdu.
Səhvim çox olubdur, özümü hey söyürəm mən,
İşlər olacaqdır nə sayaq, gözləyirəm mən.

Hardan tapacam mən elə yer ki, ola çim yağ,
Düşdüm tələyə öz tamahımdan yenə ancaq.
Getdi təzə "06", hələ sahildə olan bağ.
Çarəm nədi, nimdaş nə varımdır, geyirəm mən,
İşlər olacaqdır nə sayaq, gözləyirəm mən.

Dostum çox olub, indi verən yoxdu təsəlli,
Qəmdən vururam, neyləməli, gündə yüz əlli.
Artıq batıram, çünki olubdur mənə bəlli.
Tənha girib evdə başıma hey döyürəm mən,
İşlər olacaqdır nə sayaq, gözləyirəm mən.

## ÇƏKMİRƏM

Getsəm əgər bir yerə borc almağa,
Var sifətim yüz dəfə yalvarmağa.
Can çəkirəm amma ki, qaytarmağa.
Eyləmişəm mən belə adət, kişi!
Çəkmirəm heç zərrə xəcalət, kişi!

Haqqa dağaldan geri mən qalmaram,
Zənn eləmə verdiyimi almaram.
Borcumu ölsəm də yada salmaram.
Eyləmişəm mən belə adət, kişi!
Çəkmirəm heç zərrə xəcalət, kişi!

Müşkül işi çox yoluna salmışam,
Verməsə rüşvət nigaran qalmışam.
Zorla tutub borc adına almışam.
Eyləmişəm mən belə adət, kişi!
Çəkmirəm heç zərrə xəcalət, kişi!

Borcum olan kəslərə versəm də əl,
Söhbətinə qoymuram ancaq məhəl.
Cəhd edirəm tez sürüşüm, əlbəəl.
Eyləmişəm mən belə adət, kişi!
Çəkmirəm heç zərrə xəcalət, kişi!

Gəlməyə pul sahibi kaş yanıma,
Eyb eləməz söysə də ünvanıma.
Qoy dua etsin hələlik canıma.
Eyləmişəm mən belə adət, kişi!
Çəkmirəm heç zərrə xəcalət, kişi!

## UZAQ EYLƏ

Ya rəbb, məni sən mərdimazardan uzaq eylə,
Kölgəndə dolannam, canımı sappasağ eylə.

Bir vaxtı müdirdim, baxıram indi kənardan,
Gəldi bu bəla bilmədim, ancaq mənə hardan.
Çat dadıma, ya rəbb, məni qurtar yenə dardan.
Arxanca sürünnəm, üzümü evdə ağ eylə,
Ya rəbb, məni sən mərdimazardan uzaq eylə.

Dayday dayaq idi, dolanırdım neçə ildir,
Arxamda durardı, çıxıb işdən o da bildir.
Az-maz büzüşübdür, yeri gəlsə yenə fildir.
Dirçəlt yenə də gəl onu, arxamda dağ eylə,
Ya rəbb, məni sən mərdimazardan uzaq eylə.

Yəqin eşidərsən nədi rüşvət, nədi daşbaş,
Vardır elə kəslər ki, hərisdir yığa daş-qaş.
Hərdən də salırsan sən özün onları çaşbaş.
Rüşvətxoru axtar ona hər yerdə lağ eylə,
Ya rəbb, məni sən mərdimazardan uzaq eylə.

Şahidsən özün ki, sənə çox yalvarıram hey...
Rüşvət verən olsam, düzələr bəlkə də hər şey.
Sən müftə düzəltsən, deyərəm mən sənə: ləbbey.
Arzum budur, ancaq kefimi gündə çağ eylə,
Ya rəbb, məni sən mərdimazardan uzaq eylə.

Min yol ağız açdım, işimə olmadı fayda,
Nə toyda mənim dadıma çatdın, nə də vayda.
Sən keyfə baxırsan, demə, ulduzlu sarayda.
"Cənnətdə" yerim var, oranı barı bağ eylə,
Ya rəbb, məni sən mərdimazardan uzaq eylə.

## ORDADI ANCAQ, DƏDƏ

Diplomu aldım, bekaram mən hələ,
Növbə sənindir daha bundan belə.
Dost-tanışa tez-tələsik zəng elə.
Köşkə düzəltsin məni zavmaq, dədə,
Müftə gəlir ordadı ancaq, dədə.

Sən ki bilirsən, dədə, mən baytaram,
Gəl ki, bu işlə düzü, yoxdur aram.
Amma ticarətlə ürəkdən varam.
Çünki ticarətdədi ət-yağ dədə,
Müftə gəlir ordadı ancaq, dədə.

İndi, dədə, sən deyən əyyam deyil,
Sərfəli yer xırda dükanlardı, bil.
Çox demirəm, qurdalanım bircə il.
"Volqa" alım, rəngi də dümağ, dədə,
Müftə gəlir burdadı ancaq, dədə.

"Şef" ki, qohumdur yerə düşməz sözün,
Qoymaram heç kölgəli olsun gözün.
Mən verərəm haqqını, çatdır özün.
Pay da gedər çolpa, düyü, yağ, dədə,
Müftə gəlir burdadı ancaq, dədə.

Sən piləyib sonra içərdin suyu,
Qayğıma qaldın neçə illər boyu.
Öz tamahım qazdı mənimçün quyu.
Çıxdı əlimdən ev-eşik, bağ, dədə,
Çarə qalıbdır sənə ancaq, dədə.

Arxayın oldum, dədə, vallah sənə,
Zənn eləyirdim dəyən olmaz mənə.
Bəxtim açılmışdı bəd atdım yenə.
Çəkdi müfəttiş sinəmə dağ, dədə,
Var ümidim tək sənə ancaq, dədə.

## NEYLƏSİN?

İşdi, düşərsə əngələ, "fəqir-füqəra" neyləsin?
Daydayı yoxsa, eyləyə dərdinə çarə, neyləsin?
Eyləməsin giley-güzar, bəs günü qarə, neyləsin?
Şübhəyə salmısan məni, yaman gülürsən, ay dadaş!
Anbara çoxdu müştəri, yəqin bilirsən, ay dadaş.

Gəlsə müfəttiş anbara, beş-altı gün qalar gedər,
Şəkk eləyirsən işləri öz yoluna salar gedər?
Yazar-pozar, pozar-yazar, öz payını alar gedər!
Şübhəyə salmısan məni, yaman gülürsən, ay dadaş,
Anbara çoxdu müştəri, yəqin bilirsən, ay dadaş.

Müşkül işin düzəlməsə, filankəsi gör, incimə,
Hər nə desə, "baş üstə" de, məbləğini ver, incimə.
Arxayın ol, səninkidir istədiyin yer, incimə.
Şübhəyə salmısan məni, yaman gülürsən, ay dadaş,
Anbara çoxdu müştəri, yəqin bilirsən, ay dadaş.

Xətrinə dəyməsin, deyim sən də düşübsən əngələ,
Bəlli deyil bəyəm ki, ha... kimdi sənə quran tələ?
Sən nə sayaq sürüşmüsən, mən üzə vurmuram hələ.
Şübhəyə salmısan məni, yaman gülürsən, ay dadaş,
Anbara çoxdu müştəri, yəqin bilirsən, ay dadaş.

Düşübdür indi dillərə, gəzir bu antipod sözü,
Çoxları işlədir bunu, olsa da antipod özü.
Sanma ki, heç nə bilmirik, görür səni elin gözü?
Şübhəyə salmısan məni, yaman gülürsən, ay dadaş,
Axırı yoxdur anbarın yəqin bilirsən, ay dadaş.

## BU HƏRİF

Haqq danışdım, xoşuna gəlmədi, baxmır üzümə,
Bir təpindim balaca, işdə də dəymir gözümə.
Dəyməsin xətrinə bal qatmalıyammış sözümə.
Eşidin, indi deyim mən nə günah eyləmişəm,
Səhvini olduğu tək şax üzünə söyləmişəm.

İşgüzartək özünü cəhd eləyir göstərə o,
Soxur hərdən başını girmədiyi hər yerə o.
Bir də tutmaz elə iş and da içib min kərə o.
Görmüşəm ağ eləyir, mən də görün neyləmişəm,
Səhvini olduğu tək şax üzünə söyləmişəm.

Bu səbəbdən də mənimlə, demə, vardır qərəzi,
Gecələr, mən bilirəm böhtan olubdur çərəzi.
Nə sağaldar görəsən ondakı çirkin mərəzi?
Olub hərdən də onu yolda tutub əyləmişəm,
Səhvini olduğu tək şax üzünə söyləmişəm.

Başı boşdur, nə nəsihət, nə öyüd kar eləyir,
Sıxıram guya onu, gündə ahu-zar eləyir.
Açılanda iç üzü öz-özünü xar eləyir.
“Kişi ol” söyləmişəm, döyməmişəm, söyməmişəm,
Səhvini olduğu tək şax üzünə söyləmişəm.

Bilirəm, daldada hay-küy salacaqdır bu hərif,
Dəfini, zurnasını hey çalacaqdır bu hərif.
Hələ azdır, “payını” çox alacaqdır bu hərif.
Elə zənn eyləməsin, hər yetənə küyləmişəm,
Səhvini olduğu tək şax üzünə söyləmişəm.

## NƏ BİLƏYDİM DƏRD OLACAQ

Baxışı, hər gülüşü, sanki, bir oxdur paxılın,
Çünki qəlbində qara niyyəti çoxdur paxılın.
Qonşuluqda biri var, heç tayı yoxdur paxılın.
Peşman oldum ki, dedim: sən də, kişi, eyləmə ağ,
Nə biləydim ki, sözüm qonşuya bir dərd olacaq.

Pah atonnan, kişinin, sanki, daş atdım bağına,
Baxdı tərs-tərs üzümə, çəkdi tumar tez bığına.
Dedi: son qoymamısan sən hələ də lağlağına?
Bir uzun nitq elədi, sən kişidə bir üzə bax,
Nə biləydim ki, sözüm qonşuya bir dərd olacaq.

Bağda gördüm gül əkir, bir dən "al, ək" demədi,
İstədim də siqaret, dinmədi, "al, ək" demədi.
Təzə paltarda görüb hətta "mübarək" demədi.
Düşünürdü: bilirəm "geyməyəsən sən onu sağ",
Nə biləydim ki, sözüm qonşuya bir dərd olacaq.

Söhbət etdim bunu mən qonşuların bir çoxuna,
Səni qoymaz dedilər, dünya dağılsın, yaxına.
Söymüsən zənn elə ki, sən kişinin var-yoxuna.
İndi bildim başına, sanki, uçubdur uca dağ,
Nə biləydim ki, sözüm qonşuya bir dərd olacaq.

Hələ vardır beləsi, üzdə gülürlər üzünə,
Tapıb hər halda hələ isti bucaq da özünə,
Çəp baxan yerdə onun şiş bata kaş ki, gözünə.
Düşəcək qəm gölünə görsə sənin keyfini çağ,
Nə biləydim ki, sözüm qonşuya bir dərd olacaq.

# AXIR Kİ DÜZƏLDİ

Düşmüşdü işim tilsimə bir xeyli zamandı,
Gördüm batıram, işlərim onsuz da yamandı.
Yalvarmadım ancaq; mənə rəhm eylə, amandı.
Him-cim elədim, bəlkə bu “dostum” kara gəldi,
Güldü üzümə, zənn elədim iş də düzəldi.

Qoymur yaxına heç məni zalım, yanıram mən,
Olsam nə qədər key, yenə az-maz qanıram mən.
Öyrəncəliyəm, verdiyimi tez danıram mən.
Hörmət eləmək adəti hər yerdə gözəldi,
Güldü üzümə, zənn elədim iş də düzəldi.

Vurdum çox işarə ona, mən fürsət olanda –
Gəlləm görüşə məhlədəki köhnə dalanda.
Od tutdu: “Məni görmüsən heç rüşvət alanda?”
Gördüm bu hərif almayıb ömründə, əfəldi,
Güldü üzümə, zənn elədim iş də düzəldi.

Saldım əlimi yan cibimə çıxdı özündən,
Əngəl olacaq anladım eyhamlı sözündən.
Şimşək kimi od parladı, od yağdı gözümdən.
Kəskin baxışı ox kimi lap bağrımı dəldi,
Güldü üzümə, zənn elədim iş də düzəldi.

Vardır aramızda hələ çox zatı qırıqlar,
Ömründə utanmaz, eləməz zərrə qədər ar.
Hər sadə bir işçün də təmənnası olan var.
Sandım bu müdir də ola bilsin bədəməldi,
Hərçənd bu işim adicə xahişlə düzəldi.

## BU TƏRİF

İclas qabağı bir hərifin vədəsin aldım,
Verdim ona fitva, işimi sahmana saldım.
Təriflədi hədsiz məni, çox razı da qaldım.
Yüksəlməyə sürət verən imkandı bu tərif,
Ruhum təzələndi, mənə dərmandı bu tərif.

Hərgah məni bir kimsə hədəftək nişan alsa,
Bağrım yarılar, lap ölərəm, dillərə salsa.
Tabutda da hərçənd məni tərif edən olsa.
Billahi dirilləm, deyərəm candı bu tərif,
Ruhum ölə bilməz, mənə dərmandı bu tərif.

Zənnimcə, bu cür xəstəliyə çox düşən olmaz,
Olsa necə "xəstə" yenə hərçənd ki, mən olmaz.
Tək-tük tapılarsa, mənə ancaq ki, tən olmaz.
Cismimdəki dövran edən al-qandı bu tərif,
Ruhum ölə bilməz, mənə dərmandı bu tərif.

Qalsam yuxusuz zirvədə mən qarlı dağ üstdə,
Yaxud dura bilsəm havada bir dayaq üstdə.
Tərif edən olsa yataram lap ayaq üstdə.
Sannam, mənə röyada da ad-sandı bu tərif,
Gün görməyə, dincəlməyə dərmandı bu tərif.

Tərifdə olan qüdrətə, həm hikmətə bir bax,
Təriflə gedirdim irəli, iş də ki, çim yağ.
Tərif də yıxarmış adamı kəlləmayallaq.
Əfsus ötəri, nəşəli, bir andı bu tərif,
Ölsəm deməərəm ki, mənə dərmandı bu tərif.

## DÜŞDÜN DARA

...Bəli, durulmuş daha keyfin, müdir,
Çünki dolubdur axı seyfin, müdir.
Bəs özünə gəlmədi heyfin, müdir?
Hər nə verirlərsə atırsan ora,
Axırı bir gün düşəcəksən dara.

Sərvətin artdıqca gözün doymayır,
Pul həvəsi çünki rahat qoymayır.
Sanma qonum-qonşu bunu duymayır.
Arxayın olma gələcəklər kara,
Axırı bir gün düşəcəksən dara.

Əngələ düşsən də müdir, yüz kərə,
Meyl eləyirsən yenə çim yağ yerə.
Gec-tezi var, bağlanacaq bənd-bərə.
Çoxları gəlmiş lap əlindən zara,
Axırı bir gün düşəcəksən dara.

Şükr eləyirsən ili vurdun başa,
Pul-paranı sərf elədin daş-qaşa.
Bil ki, nəzarət oxu getmir boşa.
Alsa nişan, bərk vuracaqdır yara,
Axırı bir gün düşəcəksən dara.

Şəkk elədin biz deyənə, ay müdir,
Kefdə olurdun elə qış, yay, müdir.
Yoxdu sənə indi verən hay, müdir.
Yolladılar gör səni hardan hara,
Öz əməlindən yenə düşdün dara.

## ANTİPODLARIN SÖHBƏTİ

*M.Ə.Sabirin şerinə nəzirə*

Möhtəkir:
İşlədib min bir kələk, çox müştəri aldatmışam.
Vədəbaz:
Yalanı doğru libasda kürsüdən çox satmışam.
Aravuran:
Güdmüşəm, fürsət düşüb, tez aranı mən qatmışam.
Böhtançı:
Eyləyib cızma-qara, çoxlarına şər atmışam.
Ərköyün:
Dədəmin kölgəsinə lövbər salıb mən yatmışam.
Ara müğənnisi:
Toyda kefli nadanı "segah" deyib, ağlatmışam.
Yaltaq:
Sürünüb kölgə kimi arzuma axır çatmışam.
Süründürməçi:
Ərizə ümman qədər, vallah içində batmışam.
Əyyaş:
Tində badə dostumu meymun kimi oynatmışam.
Arsız:
Yerli-yersiz gülmüşəm, ömrü bu cür uzatmışam.
Müfəttiş:
Xeyri olmayıb məgər, çox anbarı bağlatmışam.
Rüşvətxor:
Haqq verən görsəm yatıb, dümsükləyib oyatmışam.

## BAŞQASININ XƏTRİNƏ
(*Dələduz sürücünün dilindən*)

Əl elədi saxlayım avtomüfəttiş qağa,
Amma məhəl qoymadım, asta buruldum sağa.
Fikrimi tez anladı, başladı fit çalmağa.
Saxlamayım, neyləyim, başqa əlacım nədi?!
Bir balaca danladı, sonra gələrsən, dedi.

Düşdü güzarım ora gördü müfəttiş məni,
Bildi dəyişdirmişəm lap təzəcə nömrəni.
Xəlvətə çəkdim, dedim: – Yaxşı ki, tapdım səni,
Yoxsa xəcalətdəyəm, – əllərini yellədi,
Get hələ fırlan bir az, sonra gələrsən, dedi.

Mən də o gündən bəri fırlanıram arxayın,
Kimsə mənə söylədi: – Cəhd elə gözdən yayın,
Gördü müfəttiş dedi: heç gözə dəymir dayın?
Bəli, dedim, – daydayı indi təzə işdədi,
Gördü qımışdım bir az, – aşna, gülürsən, – dedi.

Sən demə, səhv eyləyib başqasının xətrinə,
Yolda müfəttiş qağa hörmət edirmiş mənə.
Cəhd elədim görməsin amma görüşdük yenə,
Üz-gözünü turşudub, gözlərini zillədi:
Sən mənə kəf gəlmisən, yaxşı ilişdin, dedi.

Yol nişanın pozmağım saldı yenə əngələ,
Lap canımı dərd alıb, imtahanım var hələ.
Anlamışam indi mən yaxşı qurublar tələ,
Son dəfə çəkdim bilet, dil-dodağım titrədi,
Güldü müfəttiş mənə, –sən ki əsirsən, – dedi.

## GUR KEÇƏCƏKDİR TOYUM

(*Rüşvətxorun dilindən*)

Salmamışam zəhmətə indiyəcən canımı,
Rüşvət özü tez tapıb xəlvəti ünvanımı.
Kimsə deyib, satmışam guya ki, vicdanımı.
Rüşvəti alsam da mən, başqasına vermişəm,
Müşkül işi sahmana salmaq olubdur peşəm.

Dəbdi maşın alveri, ağ eləyənlər də var,
İldə birin satmasa, müftə gəlirdən qalar.
Alveri baş tutmasa, bəlkə də lap dərd alar.
Eyləmişəm məsləhət, mənfəəti güdmüşəm,
Müşkül işi sahmana salmaq olubdur peşəm.

Çox can atanlar olub rütbəyə yüksəlməyə,
Lap dəridən çıxmışam, iş başa gəlsin deyə.
Anlamışam fikrini, xal vurub hərdən nəyə.
Arif olanlar qanar, yüz qapını döymüşəm,
Müşkül işi sahmana salmaq olubdur peşəm.

Söhbət açıb qonşumuz elmi işindən mənə,
Yoxdu səriştəm dedi: bəllidi çoxdan sənə.
Mən də düzüb-qoşmuşam, daşbaşım olmuş yenə.
Yazsa da bambaşqası, "zəhməti" mən çəkmişəm,
Müşkül işi sahmana salmaq olubdur peşəm.

Dadıma yoxdur çatan, çünki dərindir quyum,
Çırpınıram çıxmağa, amma ki, çatmır boyum,
Məhkəmədə mən bilən gur keçəcəkdir "toyum",
Küncdə özümçün "rahat" yatmağa yer seçmişəm,
Çoxları bilmirdi heç, var necə murdar peşəm,
Zənn eləməzdim bura mən də qəfildən düşəm.

## ÇARƏ YOXDUR, DÖZÜRƏM...

Quruyub mat qalıram külfətin adətlərinə,
"Qoca kaftar, öləsən" evdə deyən var ərinə?
Uduram hər nə deyir, getmirəm ancaq dərinə.
Çıxarır hövsələdən, dırmaşıram lap göyə mən,
Çarə yoxdur, dözürəm bir belə həngaməyə mən.

Qoca vaxtında hələ pudraya vardır həvəsi,
Bağırır pudrasını salsa əlindən nəvəsi.
Qaçıram mətbəxə tez, var bilirəm un kisəsi.
Batırıb üst-başımı, oxşayıram gör nəyə mən?
Çarə yoxdur, dözürəm bir belə həngaməyə mən.

Qoyub həsrət uşağı sürməyə bənzər qələmə,
Deyirəm, bəsdir ay arvad, bu nədir ağ eləmə.
Danışırsan da deyir: zurnanı saxla, püfləmə.
Məni infarkt edəcək, ağlı dayazdır deyə mən,
Çarə yoxdur, dözürəm bir belə həngaməyə mən.

Gah da at quyruğunu öz saçına bənd eləyir,
Görürəm qonşu gülür, arxada rişxənd eləyir.
Evimin söhbətini indi bütün kənd eləyir.
Qaralır gündə qanım bascaq ayaq xanəyə mən,
Çarə yoxdur, dözürəm bir belə həngaməyə mən.

Güzgü zinhara gəlib, gündə baxır əlli kərə,
Başı batsın deyirəm kim ki, səni verdi ərə.
Süfrəmin nemətini döndərib arvad zəhərə.
Kaş yazaydım nə ki, var, yolladığım naməyə mən,
Çarə yoxdur, dözürəm bir belə həngaməyə mən.

## YERLİSİ KARA GƏLİB

Axtarırdı bədəməl lövbərini harda sala,
Xeyli çim yağda üzüb sonra tamah saldı bala.
Çox şişib boynuyoğun, indi düşüb gör nə hala.
Yaltadır ildə yeri, yaxşı seçibdir yeri də,
Piylənib bir balaca çarə gəzir ki, əridə.

Yerlisi kara gəlib tez çəkilibdir qabağa,
Dəyişib sir-sifəti, sanki, dönübdür tabağa.
Bu azar möcüzədir, oxşarı vardır dabağa.
Sallanıb dil-dodağı, dartılıb üzdə dəri də,
Piylənib bir balaca çarə gəzir ki, əridə.

İştahı həddin aşıb, ət yerinə pul da "yeyir",
Nə ətir, dad gəzəsən, var a kişi, pul da deyir.
Şax gəzən çox adamı sən demə pulsuzluq əyir.
"Kişi" hədsiz kökəlib heç ata bilmir zəri də,
Piylənib bir balaca çarə gəzir ki, əridə.

Arxayındır hələlik olmayacaqdır toxunan,
Arası sazdı əzəldən azınan yox, çoxunan.
Öyünür, guya kişi tez sayılır var-yoxunan.
Olmayır zərrə qədər dünyada heç dərd-səri də,
Piylənib bir balaca çarə gəzir ki, əridə.

Zənn edir "yağlı" bu yer lap yazılıbdır adına,
Qoz içində balaca qurdu da salsın yadına;
Çox yeyib, şişsə əgər çatmayacaqlar dadına.
Girdiyi xırda deşikdən çıxa bilməz geri də,
Piylənib bir balaca çarə gəzir ki, əridə.

# CƏNNƏTƏ DÖNMÜŞ ELİMİZ

Bəşər övladı əgər xalqına yandırmasa can,
Nəsib olmazdı bu gün millətə şöhrət, nə də şan.
Sən dərindən düşünüb, sözlərimin məğzini qan.
Girləyib öz başını yoxdu desən dəxli mənə,
Haram olsun, su, çörək, hər cürə nemət də sənə!

Sevməyən millətini zəhmətə salmaz özünü,
Bu yolun yolçusu var, şax üzə söylər sözünü.
Çalışır ağ eyləsin millətin ancaq üzünü.
Görüb aşkar bunu sən söyləyəsən hərgah "mənə nə?"
Haram olsun, su, çörək, hər cürə nemət də sənə!

Sən ki şahidsən onun çəkdiyi hər zəhmətinə,
Belə can yandıranın milləti düşməz çətinə.
Olsa hər cür, nə çətinlik, gərir hər yerdə sinə
Bu ki xalqın adıdır, anlamadın yoxsa yenə?
Haram olsun, su, çörək, hər cürə nemət də sənə!

Danışan xalqın adından tanınar, tez ucalar,
Ötsə illər də, onun şöhrəti dillərdə qalar.
Belə bir qəhrəmanın indi daha, ay kişi, var.
Adı düşmüş elimin şanlı zəfər nəğməsinə,
Odu şöhrət gətirən, xalqına, öz ölkəsinə!

Bax, Azərbaycana bir, cənnətə dönmüş elimiz,
Başqa dillərlə bərabər, yazılır öz dilimiz.
Kişi, millət sevənin bilməliyik qədrini biz.
Uzun illər yaşasın, səs verək hər an səsinə,
Odu şöhrət gətirən, xalqına, öz ölkəsinə!

## BU, HƏYATDIR, BALA

"Xəzri"sənsə dəyişib səmtini, olma "Gilavar",
Baxma sən rütbəsinə, haqsıza çıxma havadar.
Arxalan haqq sözünə, olmayasan axırı xar.
Heç nəyin xətri üçün sən aranı qatma, bala!
Cəhd elə öz-özünü heç vədə alçatma, bala!

Baş əyib hörmətini nadana göstərsən əgər,
Elə borcundu sanar, axmaq adam azdı məgər?
Çox əyərsən başını, orda hələ turp da əkər.
İki dünya bir ola, vicdanını satma, bala!
Cəhd elə öz-özünü heç vədə alçatma, bala!

Demə hər yerdə "baş üstə" yetənin boş sözünə,
Alçalıb düşmə ayaq altına, iş tap özünə.
Yeri gəlsə, kişitək bax ölümün düz gözünə.
Mərdi-mərdanə yıxıl, minnətə əl atma, bala!
Cəhd elə öz-özünü heç vədə alçatma, bala!

Eləsi var, ay oğul, girləyir ancaq başını,
Yüz fırıldaq eləyir, ildə dəyişsin maşını.
Güdür hər yerdə, hər an öz cibini, daşbaşını.
Eləsi olsa ağac kölgə sala, yatma bala!
Cəhd elə öz-özünü heç vədə alçatma, bala!

Sən bələd olmamısan sirli həyatın dadına,
Qoyma ömründə sənin bir ləkə düşsün adına.
Bir zaman sözlərimi bəlkə salarsan yadına.
Ol ədalətli, oğul, min günaha batma, bala!
Cəhd elə öz-özünü heç vədə alçatma, bala!

## HƏR YERDƏ NƏZARƏT

Ərşə çıxıb indi yuxusu rüşvət alanın,
Əlmuzdu alıb işləri sahmana salanın.
Halı dəyişib, gözdən iraq, küncdə qalanın.
Çünki bu qərar canlarına vicvicə salmış,
Hər yerdə nəzarət başının üstünü almış.

Dəllal qağanın da bazarı yatdı qəfildən,
Nəfsi onu da qəm gölünə atdı qəfildən.
Bir çoxları vaxtsız bu sayaq batdı qəfildən.
Çox da hələlik bir parası kölgədə qalmış,
Hər yerdə nəzarət başının üstünü almış.

İndi başına çarə gəzir müftə yeyənlər,
Rüşvət puluna ildə təzə "layka" geyənlər.
Cib xətrinə çox vaxt qaraya ağdı deyənlər
Sanki, büzüşüblər, çoxunun rəngi saralmış,
Hər yerdə nəzarət başının üstünü almış.

Dağ boyda müdir yanğılı ah çəkdi dərindən,
Söz saldı dözə bilmədiyi dərdi-sərindən.
Tərpətməlidirlər görünür " yağlı yer"indən
Yəqin qəzəbindən bu tipin qanı qaralmış,
Hər yerdə nəzarət başının üstünü almış.

Şəksiz, bu qərar bir çoxunu dərdə salıbdır,
Yoxdur daha müftə gəliri, fikrə dalıbdır.
İnfarkt olacaq, gec-tezi var, azca qalıbdır.
Var-gəl eləyir, hövsələsi xeyli daralmış,
Hər yerdə nəzarət başının üstünü almış.

Yer var ki, alaq otları dərin kök atıbdır,
Baxma ki, sərin kölgə tapıb, orda yatıbdır.
Bir-bir çıxarıb tullamağın vaxtı çatıbdır.
İndi çoxunun ahı-vayı ərşə ucalmış,
Hər yerdə nəzarət başının üstünü almış.

## LƏKƏ

Kaş ki, hər cür ləkələr ay kişi, paltarda ola,
Geydiyin ən bahalı modalı şalvarda ola.
İstəyən çarə tapar dəysə gözə harda ola.
Gətirir amma xələl tərtəmiz ad-sana ləkə;
Nə ola, zərrə qədər düşməyə vicdana ləkə.

İnsanın öz-özünə düşmənidir bəd əməli,
Yolu azdıqca dönür nəfsi olur, sanki, zəli.
Gicişir pul sarıdan gah sağ əli, gah sol əli.
Rüşvətə meyli salır şöhrətə, həm şana ləkə,
Nə ola, zərrə qədər düşməyə vicdana ləkə.

Adına düşsə ləkə, eyninə almırsa ürək,
Vicdanın lal olacaq, heç vədə dillənməyəcək.
Silmək üçün ləkəni çarə gəzib, dərdini çək.
Yoxsa gec-tez yayılar cismində hər yana ləkə,
Nə ola, zərrə qədər düşməyə vicdana ləkə.

Axı vicdan yuyulan parça deyil ki, yuyasan
Getməz heç bir ləkəsi min cürə rəngə boyasan.
Sən bu dünyada çalış bir ləkəsiz ad qoyasan.
Törədir hər nə desən, hopsa əgər cana ləkə,
Nə ola, zərrə qədər düşməyə vicdana ləkə.

Olsa vicdanda ləkə, insaf, ədalət yox olur,
İnsanın əyriliyə meyli də artır, çox olur.
Bədxah işlər ürəyə sancı verən bir ox olur.
Damarın boşsa əgər, qorx ki, keçə qana ləkə,
Nə ola, zərrə qədər düşməyə vicdana ləkə.

Hələ var bəziləri vicdanı hisdən qaradır,
Mənliyi, can-ciyəri topladığı pul-paradır,
Özünə, yerlisinə “yağlı” şərait yaradır.
Başa düşmürmü məgər damğadı insana ləkə?
Nə ola, zərrə qədər düşməyə vicdana ləkə.

## ARAĞIN VƏSİYYƏTİ

Eşidib ölməyimi dost-tanışım cəm olacaq,
Gözlərində çoxunun qüssə, kədər, qəm olacaq.
O yetim, can-ciyərim keyləşəcək, "dəm" olacaq.
Deyəcək: – Qoymur əcəl arzuma çatmağa məni,
Naxələf kaş ki, gələ verməyə torpağa məni.

Ölməyim bircə ona şəksiz ağır dərd olacaq,
Salıb hərdən yadına göydə buludtək dolacaq.
Vuracaqdır başına, tükləri bir-bir yolacaq.
Qorxuram amma cüvəllağı qoya lağa məni,
Naxələf kaş ki, gələ verməyə torpağa məni.

Bələd olmuşdu deyə, bir neçə ildir dadıma,
Bu ki, "...ceyran südüdür" şəstlə deyərdi adıma
Salıram tirtap olan günlərini mən yadıma.
Yayda kef məclisinə çox aparıb bağa məni,
Naxələf kaş ki, gələ verməyə torpağa məni.

Qışda sahil bağına dostum aparmışdı bizi,
Qayığa birgə minib seyr eləyirdik dənizi.
Dalğalar aldı məni, oldu ağappaq bənizi.
Atılıb buzlu suya, qoymadı batmağa məni,
Naxələf kaş ki, gələ verməyə torpağa məni.

Yazdıra başdaşıma: "Ey əzizim, dostum araq,
Məni yıxdın, sürüdün, yoxdu daha postum, araq.
Arxayın yat, səni də məhv elədi tostum, araq.
Vadar etdin varımı, mülkümü satmağa məni,
Naxələf kaş ki, gələ verməyə torpağa məni.

## BÖHTANÇI

Yazıb əl boyda kağız, saxta qol atdım axırı,
Qara yaxdım müdirə, arzuma çatdım, axırı.
Yola saldım, yuxarı aləmi qatdım, axırı.
Tökülüb gəldi neçə yoxlayıcı kəndimizə,
Pır-pır əsdi ürəyim: düşməyələr kaş ki, izə.

Başladı sorğu-sual, növbə gəlib çatdı mənə,
Dedilər: bic; bu yazı, söylə, tanışdırmı sənə?
Kaş o anda görəsən çaq-çaq olur, sanki, çənə
Atalar doğru deyib təkcə zaval yoxdu düzə,
Pır-pır əsdi ürəyim: düşməyələr kaş ki, izə.

Baxdım öz xəttimə yanpörtü, bərəltdim gözümü,
Titrədi dil-dodağım birdən itirdim özümü.
Sanki, dibdən gələnin lap tükənibmiş dözümü.
Dedi: aşna, deyəsən haqq çıxacaq indi üzə,
Pır-pır əsdi ürəyim: düşməyələr kaş ki, izə

Məni tər basdı, ilahi, nə günə düşmüş o gün,
Yer gəzirdim özümə, sirrim açılmışdı bütün.
İstəyirdim ki, deyəm əfv edin, üstündən ötün.
Dedi gəl, yazdığını indi açıq söylə bizə,
Pır-pır əsdi ürəyim: düşməyələr kaş ki, izə.

## DİLLƏNMƏ

Dümsükləmə qalxa, yatan olsa, nə işin var,
Əl tutma nə badə, batan olsa, nə işin var.
Gördüm demə, lap şər atan olsa, nə işin var.
Dünyada ağıllı elə sənsən, daha yoxdur?
Dillənmə, dinərsən, bu işin cəncəli çoxdur.

Haqsızlıq olan yerdə “kar ol”, üstünü vurma,
Haqlı olana cəhd elə heç arxa da durma.
Şahidlik edib, öz-özünə sən tələ qurma.
Cəncəl işə heç vaxtı qarışma, farağat dur,
Dillənmə, dinərsən, bu işin cəncəli çoxdur.

Böhtan, ya filan olsa yazan, dinmə, danışma,
Doğru yolunu olsa azan, dinmə, danışma.
Məxfi quyu da olsa qazan, dinmə, danışma.
Dözmürsən əgər, öz qulağından yapışıb bur,
Dillənmə, dinərsən, bu işin cəncəli çoxdur.

Bədxah da ilişsə, əməlin sən yada salma,
Sənsiz də bilən var, sən onun qeydinə qalma.
Aləm qarışa, hər nə ola eyninə alma.
Yan keç, nə dodaq büz, nə də ki bir sözə pəl vur
Dillənmə, dinərsən, bu işin cəncəli çoxdur.

Hərgah deyən olsa biri dəllaldı, kalandı,
Müşkül işi sahman eləyən, rüşvət alandı.
Girmə araya, lap deyən olsa bu yalandı.
Bəlkə şər atırlar kişiyə – gözləri toxdur,
Dillənmə, dinərsən, bu işin cəncəli çoxdur.

Oğlum, dolaşıq işlərə baş qoşma amandı,
Saxla dilini, çünki zaman başqa zamandı.
Əks halda görərsən ki, halın xeyli yamandı.
Sən də necə yol tutmalısan indi plan qur,
Dillənmə, dinərsən, bu işin cəncəli çoxdur.

## ŞƏKK ELƏMƏ

Bu sən öl, şəkk eləmə, dərsin alanlar düzəlir,
Görür, əngəldi işi, kölgə salanlar düzəlir.
Hətta tənqid hədəfi, küncdə qalanlar düzəlir.
Bu qəbildən olana qurmalıyıq biz də tələ,
Düzələr, keçsə əgər bir çoxu vaxtında ələ.

Nöqsana göz yumanın zorla açıblar gözünü,
Daha susmur, durub iclasda deyir öz sözünü.
Yeri gəldikcə o, tənqid edir hərdən özünü.
Belə getsə, düşəcək sahmana hər cür məsələ
Düzələr, keçsə əgər bir çoxu vaxtında ələ.

Əyrinin, müftəxorun göylərə qalxsa harayı,
İşdə baş girləyən heç kəs maaş almaz havayı.
Çarə var hər bir işə bircə ölümdən savayı.
Kaş tipin fəryadına qoymayasan kimsə gələ,
Düzələr, keçsə əgər bir çoxu vaxtında ələ

Keçsə bir iş başına, tez quduranlar yenə var
Haqqa biganələrə arxa duranlar yenə var.
Dara düşsə, yuxarı zəng də vuranlar yenə var
Kaş çəkib ortalığa dərs verələr bədəmələ,
Düzələr, keçsə əgər bir çoxu vaxtında ələ

Gizli böhtan yazanın aşkar ediblər izini,
Çoxuna "biz" batırıb, amma tapıblar bizini.
Nə qədər şax yerisə, qatlayacaqlar dizini.
Halı lap pisləşəcək vallahi, bundan da belə;
Düzələr, keçsə əgər bir çoxu vaxtında ələ

"Əl açıq" bir müdirin şahidi oldum, o günü,
Paylayır el malını, amma ki, verməz çöpünü.
Piylənib, qarnı şişibdir, alacaqlar köpünü.
Aramızda nə qədər var bu alaqlardan hələ,
Düzələr, keçsə əgər bir çoxu vaxtında ələ.

# İŞ DÜZƏLTMƏZ A KİŞİ

"Bəxtə" bel bağlama ki, bəlkə yatıbdır oyana,
Lənət olsun düz işə "əmma" tapıb, qulp qoyana.
Gözlə rast gəlməyəsən hər dələduz cib soyana.
Yalvarırsan neçə cür dəllala, yox dada çatan,
İş düzəltməz a kişi, rüşvətə vicdanı satan.

Dəxi gəlmir kara heç yerdə nə arxa, nə dayaq,
Düzəlir öz-özünə, müftəcə işlər bu sayaq.
Dəllalın nırxı ilə sən ata bilməzsən ayaq.
İlişib gör nə qədər əskinaz üstündə yatan,
İş düzəltməz a kişi, rüşvətə vicdanı satan.

"Dayı"nın kölgəsinə qəsdlə girən azdı məgər?
Dayısı düşsə dara ah-vay edib, nalə çəkər.
Ağlayarsan çoxunun aqibətin görsən əgər.
Özünü zənn eləmə sən hələ dəryada batan,
İş düzəltməz a kişi, rüşvətə vicdanı satan.

Hansı kəs düşsə dara çarəsi yəqin tapılar,
Düzələr hər bir işi, çünki açıqdır qapılar.
Dəllalın bəxti yatar, bəlkə də bağrı çapılar.
Yaxşı ki, keyliyini görmədi rəhmətlik atan,
İş düzəltməz a kişi, rüşvətə vicdanı satan.

Qınama hər yetəni, söyləmə ki, sərt üzü var.
Düşmə təşvişə nahaq, insanın əyri-düzü var.
Sən itirmə inamı, hər gecənin gündüzü var.
Bil ki, xeyrin güdənə olmasa hər gün daş atan,
İş düzəltməz a kişi, rüşvətə vicdanı satan.

## BU FİLANKƏSDİ, FİLANKƏS

Bəzən özümüz baxmırıq, az da yaşı olsa,
Tərif edirik, harda gəlir, lap naşı olsa.
Layiqdi buna guya ki, bircə başı olsa.
Aləm eşidir, quş qanadında yayılır səs,
Hər yerdə deyirlər: gələn oğlandı filankəs!

Təriflə şişir, gündə görürsən kefi sazdır,
Tufan qoparır, müftə qazanc görsə ki, azdır.
Axtarsan əgər, kəlləsi boş, ağlı dayazdır,
Kimdən nə alıb əngəli heç çıxmayacaq bəs?
Hər yerdə deyirlər: gələn oğlandı filankəs!

Hürkür bu hərif indi bizim hər sözümüzdən,
Axırda yəqin pay umacaq lap özümüzdən.
Nəfsin boğa bilmir, düşüb artıq gözümüzdən.
Qırx gün çəkir, ancaq, batır hər bir quduran kəs.
Hər yerdə deyirlər: gələn oğlandı filankəs!

Dəllallıq edir, kim inanar ki, özü almır,
Dünya dağıla kef-damağından geri qalmır.
Dostun-tanışın üstünə bir kölgə də salmır.
Tutmurdu panama, dəyişib, indi qoyur fəs,
Hər yerdə deyirlər: gələn oğlandı filankəs!

Təri̇fləyirik hər belə "şöhrət-şanı" biz də,
Çoxdur qazananlar bu sayaq "ad-sanı" bizdə,
Gəl ki, deməyə haqq sözü cürət hanı bizdə!
Dinsək, deyəcəklər: yenə qəsdən danışır nəhs,
Zırpı demaqoq bax, o filankəsdi, filankəs!

## ARVADAĞA

A kişi, bir parası mamlı-matan arvad alır,
Bəxtəvər, kölgə görüb, lövbərini orda salır.
Almır əsla vecinə, kim nə sayaq zurna çalır.
Maşını, mülkü də var, yayda köçür küllü bağa,
Malının, ovsarının sahibidir arvadağa.

Arvadın xortu çıxıb, gizlədir ancaq yaşını,
Utanıb ar eləmir, dik tutur arsız başını.
Dəxli yoxdur, təki o ildə dəyişsin maşını
Xoşlamır zil qaranı, meyli qonub rəngi ağa,
Malının, ovsarının sahibidir arvadağa.

Geyir andatra papaq, rəngi qara layka plaş,
Oxşaya bəlkə başa böylə papaqda elə baş.
İşdi ondan pulu çox versə biri toyda şabaş,
Səpəcək pullarını gah o sola, gah da sağa,
Malının, ovsarının sahibidir arvadağa.

Elə bil nağd eləyib düşməyəcəkdir çətinə,
“Dayağı” – arvadıdır, əhsən onun qeyrətinə!
Səbəb olmuş əməli dost-tanışın heyrətinə.
Tanıyır bəlkə onu məhlədə hər körpə-çağa
Malının, ovsarının sahibidir arvadağa.

Arvadın kölgəsinə harda salan var özünü,
Eşidir şəkk qulağı, çox danışırlar sözünü.
Gəl ki, dinmir, nə də ki, zərrəcə döymür gözünü.
Utanar bəlkə bir az, qoysalar hər yerdə lağa,
Malının, ovsarının sahibidir arvadağa.

## BU DA BELƏ DOST

Dostumun şakəridir, sanki, görüb öz balasın,
Basacaq bağrına lap az qalacaq ki, yalasın.
Deyəcək, ömrümü kaş ömrünə Allah calasın.
Zənn edirsən ki, onun dünyada heç yoxdu tayı,
Gəl ki, dil pəhləvanı bir işi görmür havayı.

Gündə axşam, ya səhər zəng eyləyib yad eyləyər,
Soruşar əhvalını, dost-tanışı şad eyləyər.
Dəvət etsən evinə, vaxta görə dad eyləyər.
Düşünürsən ki, itirməz bu kişi, haqqı-sayı,
Gəl ki, dil pəhləvanı bir işi görmür havayı.

Zahirən alicənab, mehriban insandı özü,
Deyəsən, mən biləni bir balaca toxdu gözü.
Başlasa söhbətinə, zırpı kitablıqdı sözü.
Gülərüzlə deyəcək: qulluğun olsa bu dayı...
Gəl ki, dil pəhləvanı bir işi görmür havayı.

Bələd oldum bu tipin həm bəminə, həm zilinə,
Lağım atsan sən əgər bircə dəfə batilinə.
Görəcəksən ürəyi bənzəmir əsla dilinə.
Orda var hər nə desən müftə qazancdan savayı,
Gəl ki, dil pəhləvanı bir işi görmür havayı.

Ərk edib bircə dəfə iş yerinə basdım ayaq,
Orda gördüm ki, bu cür əbləhə, əbləhdi dayaq.
Beləsiylə, a kişi, dostluq edim mən nə sayaq?
Desə dərd, düzələr, çatmalıdır amma payı,
Çünki, dil pəhləvanı bir işi görmür havayı.

## CİBİMİZ MÜFTƏ DOLAR

Baş mühasib gəzirəm öz adını zorla yaza...
Söz deyəndə özünü qoymaya bəzən də naza.
Ödənər hər çıxarım çolpanı döndərsə qaza.
Fermaya bax bu sayaq gündə canı yansa əgər,
Cibimiz müftə dolar, him-cimimi qansa əgər.

Başına and içərəm onluğu yüzlük eləsə,
İşimiz aləm olar, astarı üzlük eləsə.
Hər hesabatda bu cür astaca "düzlük" eləsə.
Siftədən xeyrimizin haqq-hesabın ansa əgər,
Cibimiz müftə dolar, him-cimimi qansa əgər.

Var səriştəm, mən ölüm, öyrədərəm lap ayını,
Oturub şotka çəkər, gündə alar öz payını.
Beləsindən biri var, axtarıram öz tayını.
Dəymərəm qəlbinə, heç xeyrimə, aldansa əgər,
Cibimiz müftə dolar, him-cimimi qansa əgər.

Çəkmərəm zərrəcə qəm, olsa mühasib "sağ" əlim,
Nə fırıldaq eləsəm, gizli qalar hər əməlim.
Deyərəm dostları yığ məclisinə mən də gəlim.
O da mən tək müdiri can-ciyəri sansa əgər,
Cibimiz müftə dolar, him-cimimi qansa əgər.

Başı varsa, arabir zəndlə baxa sağ-soluna,
Can deyən dostu belə girsə də hər gün qoluna.
Lal ola, ağzın açıb qoymaya allah yoluna.
Saxlasa sirrimizi, bərk də belə, dansa əgər.
Cibimiz müftə dolar, him-cimimi qansa əgər.

## KAŞ GÖRƏYDİ SABİR

Sabir ustad o zaman saf-çürük etmiş nə ki var,
Mollanın iç üzünü şəstlə çəkib aləmə car.
Müftəxor, mərsiyəxan etməyib ar, olsa da xar.
Salıb əşarına çox qəmlərə bais yalanı,
O mirasdan bu günə xırda-xuruşdur qalanı.

Cütçünün zəhmətini görməyə bilməzdi gözü,
Zülmə qatlaşdığını gözlə görüb çünki özü.
Yönəlib bəylə, xana ox kimi hər kinli sözü.
Qoyub hərdən də lağa, dəllalı, rüşvət alanı,
O mirasdan bu günə xırda-xuruşdur qalanı.

"Hophop" imzası çatıb bir neçə illər dadına,
Neçə təhqirlə dolu namə gəlirmiş adına.
Millətin yatdığını zorla salarmış yadına.
Səsləyərmiş, bir ayıl, sən də oxutdur balanı.
O mirasdan bu günə xırda-xuruşdur qalanı.

Ömrünü sərf elədi, bəlkə bu millət oyana,
Günəşin al şəfəqi qırmızı rəngə boyana.
Key görüb millətini, az qala qəmdən o, yana.
Duymadı çoxları bu el yoluna nur salanı,
O mirasdan bu günə xırda-xuruşdur qalanı.

...Kaş görəydi bu günü indi böyük şairimiz,
Ölkənin bayrağına baş əyirik hər birimiz.
Əfsus olsun hələ də göz yumuruq çox şeyə biz,
Saf-çürük etməmişik biz hələ cibdən kalanı
O mirasdan bu günə xırda-xuruşdur qalanı.

## ƏFSUS Kİ

Manqaldakı şiş ərz eləyir süfrə adından,
Müftə kababın çoxları doymazdı dadından.
İndi çıxarıb dost da bu ünvanı yadından.
Ev sahibi işdən çıxanı bəlkə bir ildir,
Əfsus ki, onun heç adı da yadda deyildir.

Mənzildə yer olmazdı kişi işdə olanda,
Hərçənd sevinərdi hələ dəhliz də dolanda.
Aləm qarışardı azacıq rəngi solanda.
Məclis danışardı bu kişi cüssəli fildir,
Əfsus ki, onun heç adı da yadda deyildir.

Olmuşdu dayı, başlarına kölgə salardı,
Haqsız tora düşsəydi biri, fikrə dalardı,
Yüz yol, kimə lazımdı özü zəng də çalardı.
Çatmış dadına bir çoxunun lap elə bildir.
Əfsus ki, onun heç adı da yadda deyildir.

Allaha şükür, sahibimin gözləri toxdur,
İndi danışır ki, paxıl, əclaf hələ çoxdur.
Vardır birisi, sırtığın əsla tayı yoxdur.
Tinlərdə görənlər tanıyar, üz-gözü çildir,
Əfsus ki, onun heç adı da yadda deyildir.

Dövran belədir varsa vəzifən baş əyirlər,
Süfrəndəki dadsız şoru bəh-bəhlə yeyirlər.
İşdən çıxana, dalda əzazildi, deyirlər.
Gəl ki, ona bir kəs deyə bilməz acı dildir,
Əfsus ki, onun heç adı da yadda deyildir.

İndi başa düşdüm mən özüm hansı zamandır,
Cib dostu, qarın dostu bəladan da yamandır.
Hifz et beləsindən sən özün, Allah, amandır.
Artıq sınadı çünki kişi, dostları bir-bir,
Əfsus ki, onun heç adı da yadda deyildir.

## OLMALISAN

Düşünüb sübhə qədər, yorma, a dostum, başını,
Müftə iş müşkül olur lap tökəsən göz yaşını.
Səni süzdükcə müdir oynadacaq göz-qaşını.
Dağıdıb şübhəsini yaltağa tay olmalısan,
Ya da sakit lal axan adicə çay olmalısan.

Cibi öyrəncəlidir, tez sala bilsən əlini,
Dirçələr şişsə cibi, şəstlə dikəldər belini.
Yelləsən pulla əgər göydə udar lap yelini.
Sən sərinlik gətirən bürküsüz ay olmalısan,
Ya da sakit lal axan adicə çay olmalısan.

Sən gərək arif olub göydə sözü qapmalısan,
Əlbəəl köhlənini köndələnə çapmalısan.
Yerin altında belə olsa "o şey" tapmalısan
Üşüsə, qışda donub, yaz nədi, yay olmalısan,
Ya da sakit lal axan adicə çay olmalısan.

İki dünya bir ola, get-gələ hökmən salacaq,
Guya boş yer gəzir, o, əlli yerə zəng çalacaq.
Çəkinib etmə belə, hər nə aparsan alacaq.
İçi pay-puşla dolu bir yekə tay olmalısan,
Ya da sakit lal axan adicə çay olmalısan.

Düşsə hərgah yoluna, işləri sahman eləsən,
Yağlı yer versə, gərək karına hər vaxt gələsən.
Atalar yaxşı deyib: işləri korlar tələsən.
"Sağ əli" olsan əgər, yan cibə pay olmalısan,
Ya da sakit lal axan adicə çay olmalısan.

## YARAŞIR

Köhnə yerimdən çıxarıb atdılar,
Qulaqlayıb yazanlara qatdılar.
Bir parası xeyli gedib yatdılar.
Ah, nə ola, mən geri dönsəm yenə,
Çox yaraşır çünki müdirlik mənə.

İndi fikirdən saralıb-solmuşam,
Qəhərlənib bulud kimi dolmuşam.
Mən də axı rütbədə çox olmuşam.
Volqa maşın məndə olub bir dənə,
Çox yaraşır çünki müdirlik mənə.

Çeşməyin ən yaxşısını taxmışam,
İşçilərə pəncərədən baxmışam.
Kürsülərdə şimşək olub çaxmışam.
Hap-gop olan yerdə yorulmaz çənə,
Çox yaraşır çünki müdirlik mənə.

Yığdığımı tək yemişəm guya mən,
Dalda filan söz demişəm guya mən.
Söz də yayıblar qəmişəm guya mən.
İndi ümidim qalıb ancaq sənə,
Çox yaraşır çünki müdirlik mənə.

Səhvim olub, bilməmişəm əfv elə,
Topladığımdan qalıb az-maz hələ.
Bəsti salıbsan bu qədər get-gələ.
Al məni dayday , təzədən kölgənə,
Çox yaraşır çünki müdirlik mənə.

## HƏMYERLİLƏR

Çoxalıb yerlipərəst, məndə də artıb bu həvəs,
Yerlinin bir səsinə verməliyəm yüz dəfə səs.
Görürəm arxa olub, bir-birinə bir neçə kəs.
Bəd ayaqda hərənin var çatanı imdadına
Yerlilər yerlisinin çatmalıdırlar dadına.

Yerlibaz olduğuma şübhələnən yoxdu hələ,
Yerlimə gənc baxana qurmalıyam mən də tələ.
Çəkəcəm hər əzabın ay kişi, bundan da belə.
Qoymaram dünya qopa, bir ləkə düşsün adına,
Yerlilər yerlisinin çatmalıdırlar dadına.

Çox da yanpörtü baxır bir parası işdə mənə,
Olsa imkanı yəqin lap batırar şişdə mənə.
Çox olub arxalanan, doğrusu, keçmişdə mənə.
İlişən olsa əgər getsə kiminsə badına,
Yerlilər yerlisinin çatmalıdırlar dadına.

İndi öz yerlisinin qayğısına çoxdu qalan,
Sərfəli yağlı yerə zor gücünə çoxdu salan.
Babalın mən yumuram, haqqını da çoxdu alan.
Var, elə zatıqırıq yerlini salmır yadına...
Yerlilər yerlisinin çatmalıdırlar dadına.

Yerlibaz lövbər atıb sən də bilirsən harada,
Can atır yerlisinə məxfi şərait yarada.
Arxası zorba olan bəllidi düşmür dara da.
Hay verənlər tapılır yerlilərin lap yadına...
Yerlilər yerlisinin çatmalıdırlar dadına.

## YOLA SAL

Bu ticarətdi, bala, çırmalayıb əl-qolunu,
Sahmana sal dükanın arxa tərəfdən yolunu.
Qarışıq salma amandır, cibi boşnan, dolunu.
Kalan olsa, alacaq, yatsa əgər köNlünə mal,
Gör əlüstü işini, müştərini tez yola sal.

Dükana gəldi, ərit, saxlama "iMportnı" malı,
İlişib doğma əmin indi də çox pisdi halı.
Büzüşübdür, bu işin çünki fəlakətdi dalı.
Bədnəzərçün qapına, ay bala, vurdur təzə nal.
Gör əlüstü işini, müştərini tez yola sal.

Bu ticarət elə dəryadı, tapınca çəmini,
Naşı olsan karıxarsan, batırarsan gəmini.
Gör salıblar nə kökə xırdaca aktnan əmini.
Dükanın qorxusunu, ay bala, məndən xəbər al,
Gör əlüstü işini, müştərini tez yola sal.

Qoyma gözdən uzağa zil qara çeşmək taxanı,
Dükanı seyr edəni, qiymətə çəp-çəp baxanı.
Ya müfəttişdi, ya da... gözlə tanıtma yaxanı
Qəmiş olsa, qulaq as, anla, nədir vurduğu xal,
Gör əlüstü işini, müştərini tez yola sal.

Elə ki, gəldi müfəttiş, bala, qazdan ayıq ol!
Getməz aləm yığıla aktına çəkdirməsə qol.
Çalışıb tapmalısan yan cibinə xəlvəti yol.
Bəd ayaqda dayının mənzilinin zəngini çal,
Gör əlüstü işini, müştərini tez yola sal.

Bir sözüm gəlmədi xoş köhnə şlyapa qoyana,
Məni oxşatdı kişi, gözgörəsi cib soyana.
Çox çalışdım ötürüm bəlkə özümdən oyana.
Hələ də iş dolaşıb məndə də yoxdur daha hal,
Gör əlüstü işini, müştərini tez yola sal.

## ƏYRİLƏRİ DÜZ GÖRÜRƏM

Taxıram çeşməyimi əyriləri düz görürəm,
Yaltağın bəxti kəsib, onda da bir üz görürəm.
Planın faizi də əllidisə, yüz görürəm.
Çeşməyim itsə əgər, aləmi dərhal qataram,
Ona bel bağlamışam, yoxsa ki, vallah, bataram.

Xəbis həm qəlbiqara, həm də ki, gözdən itidir,
Baxıram surətinə, sanki, mələk surətidir.
Əsəbi ram eləmək, çeşməyimin xidmətidir.
Mənə milyon verələr, heç onu gör bir sataram?!
Ona bel bağlamışam, yoxsa ki, vallah, bataram.

İşdə cəhd eyləyirəm, çeşməyimi gündə taxam,
Olana, olmayana hər dəfə çeşməklə baxam.
Düz-düz görsəm əgər mən, qalar əllərdə yaxam.
Olmasa çünki belə, çeşməyi çoxdan ataram,
Ona bel bağlamışam, yoxsa ki, vallah, bataram.

Sanma ki, təkcə mənəm, çoxdu bu cür yolla gedən,
Daş-kəsəkdirsə sağı, yan keçərək, solla gedən.
İlişən, bağlı yerə saxtaca bir qolla gedən.
Arzuma mən də bu çeşməklə, yəqin ki, çataram,
Ona bel bağlamışam, yoxsa ki, vallah, bataram.

Burda baş girləməyin çarəsi vallahi budur,
Çünki arxamda dəniz, önümdə palçıqlı sudur.
Geri dönsəm: bataram, dalğa da insanı udur.
Sirrimi açmasalar, hər gecə rahat yataram,
Çeşməyimdir gümanım, yoxsa ki, vallah, bataram.

## OLMAYA KAŞ MƏRDİMAZAR

Pah atonnan, yaza-yaz görməmişəm mən bu sayaq,
Tanımır it yiyəsin, hər şey olubdur baş-ayaq.
Aramızda, biri var, iclasa gəlmişdi bayaq.
Sanki, vulkandı susub, püskürəcək gec-tezi var,
Demaqoq haqqı yazar, olmaya kaş mərdimazar.

“Başının” olmağına şəkk edirəm, doğrusu, mən.
Başı vardırsa əgər, ağlı niyə yoxdur görən?
Durub iclasda deyir: bölməliyik hər şeyi tən.
Qondarır hər nə gəlirsə, eYləyir aləmə car,
Demaqoq haqqı yazar, olmaya kaş mərdimazar.

Olanı yazsa da, ancaq nə yazır, bir qulaq as:
Niyə anbarda qalıb qulpu qırıq bir neçə tas.
Nə bilim, öldü filankəs, niyə bəs olmadı yas...
Bu onun yazdığıdır, söz də ki, etmir ona kar,
Demaqoq haqqı yazar, olmaya kaş mərdimazar.

Olur imzalı kağız əsli müfəttiş xörəyi,
Əlinə keçdi, cumur xəstə də olsa ürəyi.
O qədər qurdalanır, ta ki, çıxınca “çörəyi”.
Yayda gəlsə, uzadır hətta yağınca yerə qar,
Demaqoq haqqı yazar, olmaya kaş mərdimazar.

Görürəm yoxdu adam aşkara gərsin sinəsin,
Ya oturtsun yerinə, ya da ki, ovsun çənəsin
Hərənin bir zibili var ki, çıxartmır da səsin.
Harayı ərşə çıxar olsa bir azca yeri dar,
Demaqoq haqqı yazar, olmaya kaş mərdimazar.

Arxası var hələlik tullamaq olmur ki çölə,
Ya bata öz-özünə, işdi əgər düşsə gölə.
Ya da infarkt ola ki, bəlkə elə lapdan ölə.
Əməlindən utanıb, zərrə qədər eyləmir ar,
Demaqoq haqqı yazar, olmaya kaş mərdimazar.

## YAZDIM ÖZ-ÖZÜMDƏN

Saldım axırı lövbərimi fermaya mən də
Gəlmirdi başa müftəcə qoydum maya mən də.
Bildim yazacaqlar düşəcəm ah-vaya mən də.
Tapdım çəmini, bilmədilər heç təlaşım var,
Qondarmalar uydurmağa hərçənd ki, başım var.

Yazdım öz-özümdən, gəlin ha... ferma talandır,
Ferma müdiri, yəni ki, mən, rüşvət alandır.
İclasda müfəttiş dedi: "Böhtandı, yalandır.
İndi deyən olmur gözümün üstə qaşım var,
Qondarmalar uydurmağa hərçənd ki, başım var.

Müftə kefin, axır ki, sonu qəmdi-kədərdi,
Müşkül bir işin fikrini çəkmək də hədərdi.
Onsuz da bu dünya beləcə gəldi-gedərdi.
Yayda kababım, qışda da hər gündə xaşım var,
Qondarmalar uydurmağa hərçənd ki, başım var.

Xudmani bu yerdə başımı girləyirəm mən,
Aləmdi, sən öl, dağdakı yaylaqda duman, çən.
Hərdən yolunu sal, oranı görməmisən sən.
Gəl, gör necə manqal sayağı yasdı daşım var,
Qondarmalar uydurmağa hərçənd ki, başım var.

Hər halda yazan var, quzular sayda qoyundur,
Gəl ki, soruşan yoxdu bu nə sirli oyundur.
Vallah, desələr yoxlama başlansa "toyundur".
Keçmiş ola, mən xam deyiləm, xeyli yaşım var,
Qondarmalar uydurmağa hərçənd ki, başım var.

Uydurma yazım, bax, beləcə dadıma çatdı,
Yoxlandı, yalan çıxdı, o səs-küy də ki yatdı.
İndi inanıblar mənə, keyfim də babatdı.
Müftə gəlirim, həm də ki, az-maz maaşım var,
Qondarmalar uydurmağa hərçənd ki, başım var.

## GÜZGÜDƏ

Nə baxırsan üzümə, bircə məni gördü gözün?
Müftə pul eşqinə heç düşməmisən guya özün.
Bəli, aldım, sənə nə? Var mənə bir başqa sözün?
Dəxli yoxdur, nəçiyəm, işləyirəm ya harada,
Dağı oynatmaq olar, zəlzələ var pul-parada.

Gördün o yalvaranı? Axşamacan lap mələsin
Almaram, qurğusu vardı, başa düşdüm tələsin.
Çəkmədim əmrinə qol, hər nə bilir, qoy eləsin.
Pul olan yerdə, eşit, ağdı, mənimçün qara da,
Dağı oynatmaq olar, zəlzələ var pul-parada.

Ad qoyubsan mənə də zəng səsinə tir-tir əsən,
"Gözləri pərdələyib, başları pambıqla kəsən".
Sənə nə, neyləyirəm, kontrol-zadsan, ya nəsən?
İstəyirsən batırım müftə qazancı arada?
Dağı oynatmaq olar, zəlzələ var pul-parada.

Haqq verəndə görəsən kaş, hərə bir zurna çalır,
Cibimə girməmiş heç, "kimsə" gəlib haqqın alır.
Hələ var bir parası üstəlik hay-küy də salır.
Gəl ki, düşsəm dara mən, çoxları gəlməz kara da,
Dağı oynatmaq olar, zəlzələ var pul-parada.

Gah müfəttiş də gəlir, hər nə deyir, söz demirəm,
Döşəyir cəmdəyimə, guya daşam, ya dəmirəm.
Daha bilmir ki, gələn, yığdığımı tək yemirəm.
Çıxmışam çox ütüdən düşmüşəm hərdən dara da,
Dağı oynatmaq olar, zəlzələ var pul-parada.

Başqa yerdə necədir? Orda da var rüşvət alan?
Büzmə çox ağzını sən, bir də ki, uydurma yalan.
Görmüsən, hardasa var, bəlkə də məndən də kalan.
Geyinir gündə "kişi" əlli cürə zər-xara da,
Dağı oynatmaq olar, zəlzələ var pul-parada.

## BAŞA DÜŞ

Tarixin sərt üzünü görməmisən sən, ay oğul!
Görmüşəm xoş gününü, dəhşətini mən, ay oğul!
Arxalan zəhmətinə, ömrü keçir şən, ay oğul!
Axı dövrün tələbi başqadır indi, başa düş!
Dünyanın qayğıları yüz nədi, mindi, başa düş!

Toplayır dargöz olan hər cürə daş-qaş, sarı da,
Qismət olmur, qırılır ömrü də hərdən yarıda.
Ya da bir işdi düşür, dadına çatmır varı da.
Çıxa bilmir quyudan, çünki dərindi, başa düş!
Dünyanın qayğıları yüz nədi, mindi, başa düş!

Eləsi var, ay oğul, boynunu hər yerdə burur,
Yalvarır, minnət edir, hər cürə qulluqda durur.
Düşcəyin "yağlı" yerə başqasına qurğu qurur.
Quduranlar qovulur, yerləri tindi, başa düş!
Dünyanın qayğıları yüz nədi, mindi, başa düş!

Düşmənin mərdi dəyər bir para dostun yüzünə,
Hər işi çünki görür fitnə-fəsadsız düzünə.
Varsa keçmiş qələti, aşkara vurma üzünə.
Deməsin qoy ürəyin dopdolu kindi, başa düş!
Dünyanın qayğıları yüz nədi, mindi, başa düş!

Sirli aləmdi həyat, mürgüləmə, yatma, oğul!
Ömrü mərdanə yaşa, şöhrətə can atma, oğul!
Dara düşsən də belə, mənliyini satma, oğul!
Üzünü ağ eləyən düz əməlindi, başa düş!
Dünyanın qayğıları yüz nədi, mindi, başa düş!

## MƏN DƏ VARAM

Hardasan, ay “demaqoq”, gəl dolanım, qoy, başına,
Təkcə sənsən su qatan haqqı dananın aşına.
Qocasan, ya da cavan, baxmaram əsla yaşına.
Basaram bağrıma mən arzuma, vallah, çataram,
Antipodlarla, sən öl, axıracan mən də varam.

Mən ölüm gəl bu yana, bir görüşək, söhbət edək,
Danışaq, dilbir olaq, iclasa bir yerdə gedək.
Əyrinin, saxtakarın tüklərini birgə didək.
Döşəsən cəmdəyinə, arxayın ol, züy tutaram,
Antipodlarla, sən öl, axıracan mən də varam.

Qoyma tərif eləsin, maska taxanlar özünü,
Lovğanın, boşboğazın, vədəbazın kəs sözünü.
Baxma heç kimliyinə çox da bərəldir gözünü.
Tənbeh etsən beləsin, mən gecə rahat yataram,
Antipodlarla, sən öl, axıracan mən də varam.

Şübhəsiz incidəcək işdə səni bir parası,
Kinli, çəp-çəp baxacaq, olmayacaqdır arası.
Çünki gördükdə səni sızlayacaqdır yarası.
Xəstəsən, bu mən ölüm, zənn elə lapdan bataram,
Antipodlarla, sən öl, axıracan mən də varam.

Haqq işin düzlüyünü, məğzini, mənasını mən,
Qandırınca çoxuna düşdü qara saçlara dən.
Düzə qulluq eləyən bircə qalıbsa – o da sən.
Sənə olsa toxunan, aləmi vallah, qataram,
Antipodlarla, sən öl, axıracan mən də varam.

Arxalan haqq sözünə, top sənə batmaz – onu bil,
Səni tərpətməyə heç fil gücü çatmaz – onu bil.
Dost-tanışlar səni dar gündə də atmaz – onu bil.
Bəd ayaqda bilirəm onda nəyə əl ataram,
Antipodlarla, sən öl, axıracan mən də varam.

## DƏLLAL YIĞNAĞI

Pəh-pəh, gülür üzlər, demə məclis qurulubdur,
Burdan neçə ünvanlara zənglər vurulubdur.
Sahildə bu bağda yenə keflər durulubdur.
Büllur qədəhin təsiri etmiş çoxunu lal,
Kimdir bu bağın sahibi?.. Bir adicə dəllal.

Manqal qurulub, ölməyə məhkumdu qoyunlar,
Bilmir bu yazıqlar vurulur burda boyunlar.
Məclisdə gedir kartla yenə pullu oyunlar.
Hər kəs çalışır kartını artırmağa bir xal,
Kimdir bu bağın sahibi?.. Bir adicə dəllal.

Səncə, kim olar lövbərini burda salanlar?
Hər işdə cibişdanı güdən rüşvət alanlar.
İclasda çıxıb kürsüyə boş zurnaçalanlar.
Ağzı sulanır hər birin harda görür yal,
Kimdir bu bağın sahibi?.. Bir adicə dəllal.

Dəllalsız həmən rütbəlilər bəlkə batardı,
Yan cibdə siçanlar gəzişib şıllaq atardı.
Dar gündə hərif mülkünü yəqin ki, satardı.
İndi, işə bax ki, bağırır: – Tarçı, muğam çal!
Kimdir bu bağın sahibi?.. Bir adicə dəllal.

Dəllaldı görən hər bir işi gizli dalanda,
Hərçənd ayırır öz payını rüşvət alanda.
Şeflər sürüşür, külbaş özü darda qalanda.
Gördüm evinin astanasında təzə bir nal,
Kimdir bu bağın sahibi?.. Bir adicə dəllal.

Vicdanı satanlar yığılıb əlbir olublar,
Yəqin yenə maymaqları boş vədlə yolublar.
Dünyada bu tiplər yəqin acgöz doğulublar.
Almış əlinə onları bir ağlı dayaz kal,
Kimdir bu bağın sahibi?.. Bir adicə dəllal.

## VURMUŞAM ÇOX ÜRƏYƏ

Ürəyim qəmlə dolu xatirələr məhbəsidir,
Cismimə lərzə salan ordakı haqqın səsidir.
Heç nə ummur ürəyim, bircə ədalət bəsidir,
Çıxmışam çox havadar işdəki haqsızlara mən,
Vurmuşam çox ürəyə, qəlbə sağalmaz yara, mən.

Var səriştəm, a kişi, şeytanı cindən ayıram,
Qul olub nəfsimə mən haqlını haqsız sayıram,
Bu sağalmaz azarı dostlara qəsdən yayıram,
Olub onlar dayağım, düşmüşəm hərçənd hara mən,
Vurmuşam çox ürəyə, qəlbə sağalmaz yara, mən.

Hörmətim yüz qat olub işdə mənə baş əyənə,
Tutmuşam toy, azacıq xətrimə hərdən dəyənə.
Demaqoqdur demişəm, şax üzümə söz deyənə,
İşlədib fitnə-fəsad, yaxmışam axır qara mən,
Vurmuşam çox ürəyə, qəlbə sağalmaz yara, mən.

Haqq mənə olsa qənim, uf demərəm, var günahım,
Əfv edən az tapılar lap günəşə çatsa ahım,
Arxayındım ki, nə var, pul-paratək var pənahım,
Çıxmışam çox ütüdən, düşməmişəm heç dara mən,
Vurmuşam çox ürəyə, qəlbə sağalmaz yara, mən.

Zənn edirdim ki, nə var, dünya durunca duraram,
Yeri gəlsə, tələni əzrayıla lap quraram.
Kələyim tutmasa baş, yalvararam, göz vuraram,
Boyun ollam, nə desə, darda da gəlləm kara mən,
Vurmuşam çox ürəyə, qəlbə sağalmaz yara, mən.

Harda imiş bu ağıl indi gəlibdir başıma,
Bilirəm bəd əməlim, həkk olacaq başdaşıma,
Atmışam adətimi, çünki yaraşmır yaşıma,
Bədxah işdən qaçıram, gəlmişəm artıq zara mən,
Vurmuşam qəlbə daha bir də sağalmaz yara, mən.

## AY KİŞİ BƏSDİR

Şad olma, a qafil, yıxılanlar duracaqdır,
Tarix özü haqsızlara damğa vuracaqdır,
Şəksiz sənə də haqq özü qurğu quracaqdır.
Aləm eşidəndə biləcəkdir bu nə səsdir
Əl çək əməlindən yola gəl, ay "kişi", bəsdir.

Yıxdın sürüdün bir çoxunu məqsədə çatdın,
Künclərdə qalan dostlarını işdə ucaltdın.
Yağlı yeri cibdən kalana aşkara satdın,
Pulgirdə bu adət anadangəlmə həvəsdir,
Əl çək əməlindən yola gəl, ay "kişi", bəsdir.

Zənn etmə görən yoxdu kimi qəsdlə sıxırsan,
Vermirsə əgər aylığı, axırda yıxırsan.
Ar eyləməyib kürsüyə də şəstlə çıxırsan,
Əyri, düzü tənqid eyləyirsə, bu əbəsdir,
Əl çək əməlindən yola gəl, ay "kişi", bəsdir.

Yoxdur belə qəmdən "ürəyi dağlı" idarə,
Olmuş sənə bir sağmal inək, "yağlı" idarə.
Keşkə,qala sənsiz qapısı bağlı idarə,
Bir yol ilişibsən,elə bildik sənə dərsdir,
Əl çək əməlindən yola gəl, ay "kişi", bəsdir.

## KAŞ Kİ...

Köşküm olanda dolanırdın, lələ,
Qurdular axırda özümcün tələ.
Ağlı olan quyruğu verməz ələ,
Arzum olub, bircə çıxaydım yaya
Kaş ki, bu "alver" özümü yıxmaya.

Çox qapılar döyməli oldum özüm,
Var birisi, amma "su içmir" gözüm.
Gözlə deyir, məndə hanı, var dözüm?
Sən demə möhtacdı "kağızdan" paya,
Kaş ki, bu "alver" özümü yıxmaya.

Son qoyulub bizdə bu gündən aha,
Baxma ki, işlər düzəlibdir daha,
Amma ki, astarı üzündən baha.
Cani-cəhənnəm, zibili çıxmaya,
Kaş ki, bu "alver" özümü yıxmaya.

Təşvişim artıb, dəyişibdir halım,
Çünki çıxıbdır aradan dəllalım,
Tapmayıram, verdiyimi mən alım,
Qorxuram axırda da batsın maya,
Kaş ki, bu "alver" özümü yıxmaya.

## SƏN VƏ KÖLGƏN

“Canlı” bu kölgən sürünər dalınca,
Yağlı yerə əmrini sən alınca.
Gözləyəcək lövbərini salınca.
Fırlanacaq dövrənə hər gün, lələ,
Gözlə sənə qurmaya kölgən tələ.

Harda sən olsan, olacaq yanında
Lap gecələr qışda buz eyvanında.
Gündə durar şəstlə xoruz banında.
Cəhd eləyər karına hər an gələ,
Gözlə sənə qurmaya kölgən tələ.

Heç deməmişdən cəm olur “kölgələr”,
Sahibinə həmdəm olur “kölgələr”.
Sanma ağıldan kəm olur “kölgələr”,
Girlənəcək ki, səni alsın ələ,
Gözlə sənə qurmaya kölgən tələ.

Yaltağı düşməz ələ, ondan həzər,
Məqsədinə çatmağa fürsət gəzər.
Məclisin olsa, durub oynar, süzər,
Çoxlu şəbeh göstərəcəkdir hələ,
Gözlə sənə qurmaya kölgən tələ.

Şayiə yaysan: çıxarıblar səni,
Bir daha görməzsən o gün kölgəni.
Olmasa düz, lap qınayarsan məni
“Kölgələri”sən tanı bundan belə,
Gözlə sənə qurmaya kölgən tələ.

## BAZAR

Əntiqə bazardır bu bazar heç tayı yoxdur,
Mer-meyvəsi əla, görürəm heç zayı yoxdur.
Əfsus ki, bu alverçilərin heç sayı yoxdur.
Piştaxtaları zəbt eyləyib boynuyoğunlar,
Kəndçi sata bilmir malını, hardadı, yer var?!

Vallah, bu bazarkom dayıya xeyli sözüm var.
Hər bir işinin şahidiyəm "altı" gözüm var.
Ancaq hələlik göz qoyuram məndə dözüm var.
Əlbirdi bazarkomla yəqin meyvə satanlar,
Kəndçi sata bilmir malını, hardadı, yer var?!

Sahibdi bazar adlı gözəl yurda bazarkom,
Bölmüş özü piştaxtaları burda bazarkom
Tapşırsa da hərçənd qoyunu qurda bazarkom.
Bir gün gələcək ki, yaxasından tutacaqlar,
Kəndçi sata bilmir malını, hardadı, yer var?!

Ölsəm, deməzəm mən bu bazarkom gözü toxdur,
Çünki bilirəm yan cibinin ortağı çoxdur.
Zənn eyləməyin daydayısı, arxası yoxdur.
Vardır bazarın üstünə də kölgə salanlar,
Kəndçi sata bilmir malını, hardadı, yer var?!

Almış bu qədər möhtəkiri kölgəyə, qardaş
Çatmır hünəri kimsə ona söz deyə, qardaş.
Arifsən, özün anla toxundum, nəyə, qardaş.
Yəqin ki, gəlir öz payını gündə alanlar,
Kəndçi sata bilmir malını, hardadı, yer var?!

Xudmani bazar olsa da, ancaq ki, nə fayda...
Keşkə o nəzarət yarada burda da qayda.
İllah ki, bu həngamə olur, ay kişi, yayda.
Ortaqdı bazarkomla şərait yaradanlar,
Kəndçi sata bilmir malını, hardadı, yer var?!

## SÖYLƏ

Söylə, niyə gendən dolanırsan yenə, ey dost?
Olmazdı yaxın bəlkə də məndən sənə, ey dost,
Biganəliyin bərk toxunubdur mənə, ey dost,
Minnətlə salam vermə mənə, zorla, yalandan,
Hədsiz dəyişibsən, lələ, rütbən ucalandan.

Bir vaxtı bir idi cibimiz, pul-paramız da,
Hərçənd bir olubdur ağımız da, qaramız da.
Sərhəd yaradıb indi vəzifən aramızda.
Hiss eyləmişəm əmrini xəlvətcə alandan,
Hədsiz dəyişibsən, lələ, rütbən ucalandan.

Dostluqda dönüklük, qanana əsli kədərdir,
Kimdən soruşum dostluğun ömrü nə qədərdir?
Keçmişdə çörək kəsdiyimiz bəlkə hədərdir?!
Döndərməz adam tez üzünü darda qalandan,
Hədsiz dəyişibsən, lələ, rütbən ucalandan,

Olmaz elə kəs ki, düşünə pisdi vəzifə,
Məncə, sovuşan bir ötəri hisdi vəzifə.
Çox vaxtı dönük çıxmağa baisdi vəzifə,
Şəkk etsən əgər evdə soruş yaşlı xalandan,
Hədsiz dəyişibsən, lələ, rütbən ucalandan.

Dünyada vəzifə kimə sadiq qalıb, heyhat!
Dövran özü çox atlını atdan salıb, heyhat!
Hakimliyi bir anda əlindən alıb, heyhat!
Sürətlə keçənlər çox olub döngə-dalandan,
Hədsiz dəyişibsən, lələ, rütbən ucalandan.

Şahın da işin bir qaraçı həll edib hərdən,
Əfsanə deyil bu, bunu dərk etsən əgər sən.
Dövran dolanar, karına gəlləm o zaman mən.
Məndən çox uzaqsan yerini orda salandan,
Hədsiz dəyişibsən, lələ, rütbən ucalandan.

## BAŞLA İŞƏ

Sənə ərknən deyirəm, olma əfəl, ay başıboş,
Yaltağın hər əməli gəlməlidir rəisə xoş.
Sənə kütsən desə də, sən nə atıl-düş, nə də coş.
Köhnə yaltaqları tap, fəndini öyrən hələlik,
Ucalarsan bu sayaq cəhd eləsən, sən hələlik.

Necə "hörmət" qazanıb, bilsən əgər qonşu Talıb,
Çünki öyrəncəlidir, hətta təxəllüs də alıb.
Peşəkar yaltaq olan gör necə birdən ucalıb!
Olma fərsiz, pay apar sən şefə hərdən hələlik,
Ucalarsan bu sayaq cəhd eləsən, sən hələlik.

Bacarırsan hər işi, neyləyəsən yoxdu dayın,
Gözə girməkdə sənin tək-tük olar bəlkə tayın.
Sən girişsən bu işə, olsa da lap şorpa payın.
Tək yemə, şeflə onu süfrədə böl, tən, hələlik,
Ucalarsan bu sayaq cəhd eləsən, sən hələlik...

Yadına sal, Məmişə kimdi çıxan arxa-dayaq,
Kəmsavad, ağlı dayaz... ancaq ucalmış bu sayaq.
Bir qalıb şeflə yata, ay kişi, vallah, baş-ayaq.
Şefinin mənzilinə yol tapa bilsən, hələlik,
Ucalarsan bu sayaq cəhd eləsən, sən hələlik...

Əlini bir çöpə də qoyma vura bağda, kişi,
Sırtıq olsan daha tez öyrənəcəksən, bu işi.
Ovxala gözlərini manqala qoyduqca şişi.
Şef sənə göz qoyacaq bəlkə də gendən, hələlik,
Ucalarsan bu sayaq cəhd eləsən, sən hələlik...

Gəlmisən məsləhətə, istəməsəm heç deməram,
Özgə olsan, çəkinib mən bu yolu seç deməram.
Sərfəli işdi deyə, mən sənə vaz gec, deməram.
Qoy durulsun kefimiz, bir oxu pəsdən, hələlik,
Ucalarsan bu sayaq cəhd eləsən, sən hələlik...

## QANMALIDIR

Şerim oxdur, hədəfə dəysə sağalmaz yarası,
Əksini orda görür, qeyzə gəlir bir parası.
Mənə yanpörtü baxır, bəllidi yoxdur arası,
Kaş biləydim o tipin od tutub ancaq harası.
Hələ ki, tüstülənir, gec-tezi var, yanmalıdır,
Səhvini arif olan dərk eyləyib, qanmalıdır.

Gözünə pərdə asıb varlığımı çünki danır,
Səpmişəm çoxlu bibər, dadsa əgər ağzı yanır.
Hara daş tullayıram, görməsə də amma qanır,
Özlüyündə məni də nöqsana biganə sanır.
Şübhəsiz, haqsız olan, haqlıları danmalıdır,
Səhvini arif olan dərk eyləyib, qanmalıdır.

Hədə-qorxuyla məni qorxuda bilməz "dağ" ola,
Kefi kök, lövbərini saldığı yer "çim" yağ ola.
Eynimə almıram heç daydayısı lap sağ ola,
İşi üzdən qaradır, astarı bəlkə ağ ola.
İlişən günlərini, yad eyləyib, anmalıdır,
Səhvini arif olan dərk eyləyib, qanmalıdır.

Oturub bağda xəyal aləminə varmağı var,
Kabinetdə qızışıb bağrımızı yarmağı var.
Hay salıb, üstümüzə silkələnən barmağı var,
Pulu cibdən çıxaran möcüzəli qarmağı var.
Bu hərif qazdan ayıq olsa da aldanmalıdır,
Səhvini arif olan dərk eyləyib, qanmalıdır.

Bədəməl zatıqırıq "güzgüdə" görmür özünü,
Eybini görsə də qəsdən yumur ancaq gözünü.
Qeyzini vurmur üzə, şax deyə bilmir sözünü,
Məni görcək arabir turşudur hərçənd üzünü.
Eybi yoxdur, oxuyub şerimi odlanmalıdır,
Səhvini arif olan dərk eyləyib, qanmalıdır.

## HAQQIN VAR Kİ...

Heyhat! Fələyin çarxına lənət, yenə döndü,
Düşmüşdü işıq bəxtimə, az-maz, o da söndü.
Namərddə olan üz, ya padoşdu, ya da göndü.
Qatdı aranı, qoymadı bir kama çatım mən,
Haqqım var o mərcanquluya bir daş atım mən?

Düşmüşdü işim sahmana, pəl vurdu o dəyyus,
Saldı məni gözdən, puçumu burdu, o dəyyus.
Mat qaldım özüm də: nə kələk qurdu o, dəyyus.
Yəqin ki, təmənnası olan var, – nə satım mən?
Haqqım var o mərcanquluya bir daş atım mən?

Cibdən kalanı iş başına qoydular, artıq
Söz yox ki, soyundurmadılar, “soydular”, artıq
Müftə kababından da yeyib, doydular artıq.
Çarəm bir odur, aləmi hər yerdə qatım mən,
Haqqım var o mərcanquluya bir daş atım mən?

Mərcanqulu vardır nə qədər, batmalıyıq biz,
Bir yerdə on illərlə qalıb yatmalıyıq biz.
Hər arzuya tənqidlə yəqin çatmalıyıq biz.
Vallah, bu fikirlər gecə qoymur ki, yatım mən,
Haqqım var o mərcanquluya bir daş atım mən?

Bəli... dayım olsaydı bu dünyada, nə dərdim...
Şəksiz o zaman mən də bilərdim nə edərdim.
Dayday yedəyində, hara getsəydi gedərdim.
Qoymazdı bu cür dərdə, qəmə gündə batım mən,
Haqqım var o mərcanquluya bir daş atım mən?

## AY KEF OLAR HA...

Axtarıram kaş elə bir yer ola,
Girlənəsən, müftə cibişdan dola.
Hər nə iş olsa, verərəm mən yola.
Qalmayıb heç girmədiyim bircə kol,
Kef elərəm: olsam əgər kontrol.

İlişmişəm, çox ütüdən çıxmışam,
Olsa günahım, gözümü sıxmışam.
Özgəsinin boynuna tez yıxmışam.
Tapmalıyam bir nəfərə mən də yol,
Kef elərəm: olsam əgər kontrol.

Bəsdi mənə bircə bazar, ay lələ,
Müftə gəlir orda da var, ay lələ.
Daydayım etməz məni xar, ay lələ.
Şad olaram əmrimə çəkdirsə qol,
Kef elərəm: olsam əgər kontrol.

Orda gərək sübhi-səhərdən duram,
Boş cibimi axşamacan dolduram.
Gündə özümçün yenə məclis quram.
Hər şey olar ay dayı, süfrəmdə bol,
Kef elərəm: olsam əgər kontrol.

Kontrol olsam dəyən olmaz mənə,
Ay dayı, xeyrim dəyər ancaq sənə.
Çıxsa nə qənbərqulu hərgah yenə.
Sal yoluna, sən də mənim arxam ol,
Kef elərəm: olsam əgər kontrol.

## İNANIR HƏR ÇATANA

Dünyanın möcüzəli işləri çoxdur, a kişi,
Var müdir, fərz elə ki, heç tayı yoxdur, a kişi.
Zahirən alicənab, gözləri toxdur, a kişi.
Hər şərait yaradıb: katibəsi, var maşını...
İşdə laqqırtı vurur, girləyir ancaq başını.

Arxasında dayanan dövləti, malı, puludur,
"Kişi" pul xəstəsidir, müftə qazancın quludur.
Fikri də, mətləbi də özgə başın məhsuludur.
Alıb öz kölgəsinə hətta özündən naşını,
İşdə laqqırtı vurur, girləyir ancaq başını.

Desələr: yoxdu başı; əsla yalandı, – başı var,
Başa bənzər güdünün həm gözü var, həm qaşı var.
Ağlı pərsəng aparır, baxma ki, xeyli yaşı var.
Yaltağın doğru sanır him-cimini, göz-qaşını,
İşdə laqqırtı vurur, girləyir ancaq başını.

Harda bir şəlpəqulaq var gətirirlər yanına,
Xeyli tərif eyləyib, and da içirlər canına.
Daha bilmir bu kəsin nəfsi hopubdur qanına.
Düşsə bir "yağlı" yerə, lap satacaqdır daşını,
İşdə laqqırtı vurur, girləyir ancaq başını.

Fərsizin öz tamahı bəlkə də azdır, görürəm,
Fitnəkar sağdışına qışda da yazdır, görürəm.
Çünki dəllalıq edir, keyfi də sazdır, görürəm.
Yoxlama gəlsə müdir tökməlidir göz yaşını,
Hələ laqqırtı vurur, girləyib ancaq başını.

## HƏLƏ Kİ, ARXASI VAR

Aləmə düşdü səda: huri-mələkdir dadaşım,
Gözütoxluqda bu gün bəlkə də təkdir, dadaşım.
Demə üzdə belədir, dalda kələkdir, dadaşım.
Baxasan, şəkk qulağı külqabıdan da iridir,
Pah atonnan, ürəyi sən demə şeytan piridir.

Tanış olsan, görəcəksən kişidə var "qanacaq",
Düşəcək əl-ayağa, halına guya yanacaq.
Keçməmiş həftə belə, vədini şəksiz danacaq.
Çox müəllifləri öz yağlı diliylə kiridir,
Pah atonnan, ürəyi sən demə şeytan piridir.

Qohumu-əqrəbası, bəllidi ki, kimdir, onun,
Yekəsi qalsın hələ, xırdası hakimdir, onun.
Sözünün-söhbətinin cövhəri him-cimdir, onun
Bələd oldum ki, gözə kül üfürəndən biridir,
Pah atonnan, ürəyi sən demə şeytan piridir.

Sürüdüm can-ciyərin qulluğuna əlli kərə,
Əfsus olsun ki, onun xahişini vurdu yerə
Var təmənnası yəqin, heç yaramır xeyrə-şərə.
Kimsəsizçün "ölüdür", arxalılarçün diridir,
Pah atonnan, ürəyi sən demə şeytan piridir.

Hələ ki, arxası var, ağrıdan olmaz başını,
Qapısında dayanıb lap tökəsən göz yaşını.
Yumşalan zad deyil o, çünki güdür daşbaşını.
Özgənin qayğısı yox, qəlbini pul dərdi didir,
Pah atonnan, ürəyi sən demə şeytan piridir.

## A TİFİL

Hardasan, bir üzə çıx, ay müdirə söz daşıyan,
Haqqa haqsızlıq edən, peysərini hey qaşıyan.
Yaltağın lap özüsən, indi alış ay naşı, yan!
Bu sayaq çox müdirə qulluq edibsən neçə il,
Sənə dəyyus desələr, səhv eləməzlər onu bil!

Seçmisən sən bu yolu, amma yaraşmır yaşına,
İndi ki, sən beləsən kəlağayı bağla başına,
Saçını xeyli uzat, sürmə də çək göz-qaşına,
Üzünü pudralasan, bəlkə görünməz sarı çil,
Sənə dəyyus desələr, səhv eləməzlər onu bil!

Girləməkçün başını yaxşı tapıbsan çəmini,
Xeyrin olsa deyirəm bəlkə yıxarsan əmini.
İşdir ölsən, çəkən olmaz sənin hərçənd qəmini.
İndidən ağla özün, göz yaşını xəlvəti sil,
Sənə dəyyus desələr, səhv eləməzlər onu bil!

Kişilikdən danışıb, sən bu sözü salma yada,
Dünyada çox kişi var, vurma ləkə sən bu ada.
Qulağın şəkdi, sözü, sanki, qapırsan havada.
Çatdırırsan müdirə: milçək olur bir yekə fil.
Sənə dəyyus desələr, səhv eləməzlər onu bil!

Bələdəm batilinə: sən nə atıl-düş, nə də coş,
Öyüdüm boş yerədir, gəlməyəcəkdir sənə xoş.
Mən səninçün deyirəm, anla məni, ay başı boş.
Olacaq öz qənimin əvvəl-axır səndə ki, dil,
Sənə dəyyus desələr, səhv eləməzlər onu bil!

## QALIB

Bir harın, dəmdəməki müftə yeyib, döndü filə,
Pulla şişdikcə cibi bəmdən aşıb keçdi zilə.
Hərif əndazəsini gözləmədi, düşdü dilə.
Büzüşüb sir-sifəti, nə heyi, nə halı qalıb,
Top dağıtmaz evinin qupquru boş zalı qalıb.

"Köhnə" yerdən sürüşüb, asta çıxıbdır aradan,
Orda yəqin varımış məxfi şərait yaradan.
Təzə işdə gəliri vardı, bilirdik haradan.
Baxasan dam-daşına, orda qırıq valı qalıb,
Top dağıtmaz evinin qupquru boş zalı qalıb.

Güvənirdi varına, arxasının "dağ" adına,
Bərkə düşmüş neçə yol, daydayı çatmış dadına.
İlişən günlərini salmadı ancaq yadına.
İndi boş mənzilinin astanada nalı qalıb,
Top dağıtmaz evinin qupquru boş zalı qalıb.

Hərlənirdi, kiməsə bir dəfə quyruq bulasın,
Zorla bəxş etdi ona saxladığı ov tulasın.
İstəyirdi arabir ortada meydan sulasın.
Tökdülər dəymişini, xırda-xuruş kalı qalıb,
Topdağıtmaz evinin qupquru boş zalı qalıb.

Dağılıb dost-tanışı tənha qalıbdır, bu "kişi",
Qoyanı yoxdu daha manqalına bağda şişi.
Canına qorxu düşüb, çünki fırıqdır lap işi.
Get-gəli çox çəkəcək, əngəl işin dalı qalıb,
Top dağıtmaz evinin qupquru boş zalı qalıb.

## AY LƏLƏ

Arxayın ol, iş düzələr, deyənlər,
Zəng eləyib, müftə kabab yeyənlər.
Xeyri üçün yüz dəfə baş əyənlər.
Ortada quyruq bulayır, ay lələ!
İstəsə meydan sulayır, ay lələ!

Daydayının kölgəsində yatanlar,
Ağlı dayaz, rütbəyə can atanlar.
Utanmayıb yağlı yalan satanlar
Qazan altda od qalayır, ay lələ!
İstəsə meydan sulayır, ay lələ!

Özlərini yağlı yerə salanlar,
Pul-paradan, cibişdanı kalanlar.
Müftə pula "Volqa", filan alanlar.
El malını lap talayır, ay lələ!
İstəsə meydan sulayır, ay lələ!

Baxma dəyişmiş çoxusu donların,
Astarı üzdən görünür onların.
Görməliyik aqibətin – sonların.
Acgözü qurdtək ulayır, ay lələ!
İstəsə meydan sulayır, ay lələ!

Zaman sıxıb antipodun belindən,
Var-yoxunu alıb tamam əlindən.
Ah-vay edir qabarlaşan dilindən
İndi axı qab yalayır, ay lələ!
Kim dedi: meydan sulayır, ay lələ!

## BİR NAŞI

Arxa çıxırsan kimə gör, ay müdir,
Yoxdu tamahda bu tipə tay, müdir.
Oğru bir itdən də umur pay, müdir.
Zərrə qədər çıxmayır işdən başı,
Aləmi qatmış yekəpər bir naşı.

Köhnə işindən çıxarıb atmısan,
Dadına hərçənd təzədən çatmısan.
Guya deyirlər bu yeri satmısan.
Qoymayıb heç burda daş üstə daşı,
Aləmi qatmış yekəpər bir naşı.

Tapşırıb indi qoyunu qurda sən,
Qovğa salıbsan araya burda sən.
Baş çəkəsən bəlkə həmən yurda sən
Ordakı kəslər axıdır göz yaşı,
Aləmi qatmış yekəpər bir naşı.

Gopdu bütün söylədiyi hər sözü,
Rüşvət alıb min kərə, vallah, özü.
Milyonu vardır, yenə doymur gözü.
Gəl ki deyəndə çatılır sol qaşı.
Aləmi qatmış yekəpər bir naşı.

İşdə müavinlə də getmir yola,
Cəhd eləyir öz cibi ancaq dola.
Köhnə işində soxulubmuş kola.
Orda axırmış cibinə daşbaşı,
Aləmi qatmış yekəpər bir naşı.

Kor atını köndələnə çapsa da,
Pul-paradan öz payını qapsa da.
Düşsə dara, arxa dayaq tapsa da.
Çatmayacaq dadına heç qardaşı,
Aləmi qatmış yekəpər bir naşı.

## OLACAQDIR NƏLƏR

Ağlı dayazlar yığılıb bir yerə,
Çarə gəzirlər bir işə yüz kərə.
Dərk eləyir mətləbi bir cür hərə.
Həllini tapmır hələ ki, kəllələr,
Gəl ki, bilən yox, olacaqdır nələr.

Çoxdan ötüb əlli yaşı onların,
Var hələ yüksək maaşı onların,
Çıxmasa işdən də başı onların,
Olsa bir imkan çoxusu yüksələr
Gəl ki, bilən yox, olacaqdır nələr.

Xeyri də yoxdur neçə il qalsalar,
Fəxri adın lap yüzünü alsalar.
Amma ki, dar gündə haray salsalar,
Səslərinə arxa çıxanlar gələr,
Gəl ki, bilən yox, olacaqdır nələr.

İşdə götür-qoy eləyib ilboyu,
İşgüzara dalda qazıblar quyu.
Özlərinə kim tutacaq bəs toyu?
İşçilər hərçənd hələlik səbr elər,
Gəl ki, bilən yox, olacaqdır nələr.

Bəsdi daha müftə maaş aldılar,
Boş-boşuna xəyallara daldılar,
Bir çoxuna yaxşı qələm çaldılar,
Yerdə qalanlar bunu yəqin bilər,
Gəl ki, bilən yox, olacaqdır nələr.

## DÜNYA DAR OLUB

Batıram fırtınalı dalğalı dəryada bu gün,
Nə qədər çırpınıram yoxdu çatan dada bu gün.
Salıram hökmüm olan günlərimi yada bu gün.
Gizlənib can-ciyərim, ya da qulaqdan kar olub,
Bu səbəbdən başıma, ay kişi, dünya dar olub.

Harda kimlər nə edir, kor deyiləm mən görürəm,
Tək məni qoymadılar köhləni dördnalla sürəm
Bir əlacım var, o da ulduza xəlvətdə hürəm.
İndi mən boyda kişi, sən işə bax ki, xar olub,
Bu səbəbdən başıma, ay kişi, dünya dar olub.

Qonşumuz kəmsavadı hörmətə çəkdim irəli,
Danmıram sol cibimə ayda girərdi bir əli.
O deyil, sanki, dünən tində duran lüt Pirəli.
Tanımır indi məni... bambılı anbardar olub,
Bu səbəbdən başıma, ay kişi, dünya dar olub.

Dostuma arxa durub mən oda atdım özümü,
Soydu, çapdı, taladı, ilboyu yumdum gözümü.
İndi yoxdur eşidən xahişimi, bir sözümü.
Səs çatıbdır mənə ki guya əlimdən zar olub,
Bu səbəbdən başıma, ay kişi, dünya dar olub.

Axı sayəmdə mənim keçdi Məmiş iş başına,
İşini qurdalayıb lap su qatıblar aşına.
Ortaq idim, nə danım, aylığına, daşbaşına.
Gizli bu alverimiz aləmə indi car olub,
Bu səbəbdən başıma, ay kişi, dünya dar olub.

Dost yolunda neçə yol az qala çıxmışdı canım,
Çoxusu çıxdı dönük, laxtalanıb, sanki, qanım.
Elə bil ki, yuxudur kefdə keçən hər bir anım.
Baxma ki, indi lütəm, məndə də dövlət-var olub,
Bu səbəbdən başıma, ay kişi, dünya dar olub.

## HƏDƏ

Cəddim qənim olsun mənə hərgah yalanım var,
Keçdim bu yerə, burda bir aləm planım var.
Qorxum da ki, yox, qayğıma çünki qalanım var.
Yoxdur xəbəri zərbəni hardan vuracam mən,
Vallah, müdirin sirrin açıb qovduracam mən.

Zənn eyləməsin müftə gəlib mən bura çıxdım
Dəllal pul alanda əlini yüz dəfə sıxdım.
Burda müdiri bəlkə də ehmallıca yıxdım.
Bilmir hələ dalda necə qurğu quracam mən,
Vallah, müdirin sirrin açıb qovduracam mən.

İş vaxtı içir, bir utanıb əsla ar etmir,
Lül-qəmbər olanda ona söz-sov da kar etmir.
Bir kimsə nədənsə bunu heç yerdə car etmir –
Susmaq nədi, hətta üzünə şax duracam mən,
Vallah, müdirin sirrin açıb qovduracam mən.

Vardır xəbərim haqqını hər ayda alandı,
Aldı, kabinetdə oturub çırtma çalandı.
Yoxdur toxunan, hər işi sahmana salandı.
Gəldikcə yeri, işləri dalda buracam mən,
Vallah, müdirin sirrin açıb qovduracam mən.

Bilmir ki, hələ daş qayaya rast gələn anda,
Aləm qarışır, lap qaralır qırmızı qan da.
Yatmaz gecələr, gəzsə əgər vicvicə canda.
Uydurma yazıb bağrını hərdən yaracam mən,
Vallah, müdirin sirrin açıb qovduracam mən.

Xudmanicə yerdə hələ lövbər atıram ha!
Dostum, aranı astaca-məxfi qatıram ha!
Fikrim budu ancaq onu gec-tez batıram ha!
Burda qəliz iş çoxdu, gərək bir iş açam mən,
Vallah, müdirin sirrin açıb qovduracam mən.

## MƏN ÖLÜM

Təzə bu katibə lap mamlı-matandır, mən ölüm!
Bu mələk, zülfi-siyah qəlbə yatandır, mən ölüm!
Nazxanım, nazlı sənəm... işvə satandır, mən ölüm!
Yerişi, həm duruşu, həm baxışı canlar alır,
Şübhəsiz, müşkül işi katibə sahmana salır.

Gəlsə dibdən bir adam, naz ilə qalxır ayağa,
Qonağı şəstlə süzür gözucu başdan-ayağa.
Bağlıdır çünki beli zorba görünməz dayağa.
Gəlsə bir yoxlama-zad, sanma müdir fikrə dalır,
Şübhəsiz, müşkül işi katibə sahmana salır.

Yanlasan katibəni, hər nə iş olsa düzələr,
Baxşeyiş çoxlarının karına bu yerdə gələr.
Belə getsə biləcəksən olacaq burda nələr...
Pay gələn vaxtı, müdir zənn eləmə gendə qalır,
Şübhəsiz, müşkül işi katibə sahmana salır.

Aparıb məxməri çay, kəsdirəcəkdir yanını.
Müdirin işdə əgər olsa qaraldan qanını.
Baxışıyla şefinin az qalır alsın canını.
Hərdən evdən arada xəlvəti zənglər də çalır,
Şübhəsiz, müşkül işi katibə sahmana salır.

İnciyən katibələr güzgüdə baxsın özünə,
Bəlkə öz bəd əməli orda görünsün gözünə.
Müdir hərçənd inanır al yanağın hər sözünə
Görməsə gündə əgər, bəlkə də ruhən qocalır,
Şübhəsiz, müşkül işi katibə sahmana salır.

# NƏ BİLƏYDİM BELƏSƏN

Dünya qopmaz ki, desən: sən mənə can, mən də sənə,
Hayan ol, sən mənə hər yerdə, hər an, mən də sənə;
Nə qalıb ömrümüzə, sən mənə yan, mən də sənə;
Salma arvad, təzədən daxmamıza vəlvələ sən,
Daş düşəydi o günə! Mən nə biləydim beləsən?!

Bulaşıq, qab yığılıb düz yarım aydan bu yana.
Ortaya saldığın o son dəfə vaydan bu yana
Əslinə qalsa əgər, ad günü maydan bu yana
Qoca arvaddı anam, insafa barı gələsən
Daş düşəydi o günə! Mən nə biləydim beləsən?!

Ürəyimdən keçəni, kaş ki, bir anlıq duyasan,
Çırmayıb əl-qolunu, qab-qacağı sən yuyasan.
Hələlik istəmirəm "yağlı" qapazdan uyasan.
Şil olar yoxsa əlin, mətbəxi sahman eləsən?
Daş düşəydi o günə! Mən nə biləydim beləsən?!

Zəhrimar güzgü səni valeh edibmi özünə?
Başıbatmış, nə qalıb çəkməyəsən qaş-gözünə?
Barı hərdən qulaq as qaynananın haqq sözünə.
Salmısan bir qarını qonşuda dildən-dilə sən,
Daş düşəydi o günə! Mən nə biləydim beləsən?!

Bəsdi yığdın boğaza, təngə gətirdin, bir utan,
Qalmışam gör nə günə, lağ eləyir mərci satan.
Kaş gəlib bircə görə mətbəxini quşbaz atan;
Eşidə həm də necə bəmdən aşırsan zilə sən,
Daş düşəydi o günə! Mən nə biləydim beləsən?!

## DÜŞMƏLİDİR

Nə gəzir, söylə, görüm, göydə xəyalın, a kişi?
Olmayıb indiyəcən heç belə halın, a kişi?
Qoyulubdur, deyəsən, hərraca malın, a kişi?
Oxşadırdın özünü göydəki huri-mələyə,
Çıxmısan çox ütüdən axırı düşdün tələyə.

Çoxları görsə belə dəryada əl-qol atanı,
Çox zaman olmayır heç dadına vallah, çatanı.
Rütbəsi yoxsa əgər, kimdi çıxardan batanı.
Yoxdu çarən, a kişi, indi də yalvar fələyə,
Çıxmısan çox ütüdən axırı düşdün tələyə.

Zənn edirdin ki, vəzifən yazılıbdır adına,
Baxmısan bir çoxu tək müftə qazancın dadına.
Yaltada kefdə keçən günləri salsan yadına.
Bu gözəl xatirələr, qorx səni infarkt eyləyə,
Çıxmısan çox ütüdən axırı düşdün tələyə.

Baxmısan keyfə bu cür, ay kişi, illər uzunu
Bəsləyiblər elə bil əldə bir əmlik quzunu.
Söndürən oldu, nəhayət, kişi, bəxt ulduzunu –
Fayda verməz nə qədər indi əl atsan kələyə,
Çıxmısan çox ütüdən axırı düşdün tələyə.

## KÖÇÜRÜR YAZDIĞINI...

Yenə bu qonşumuzun cuşa gəlibdir mərəzi,
Gecələr cızma-qara yazmaq olubdur çərəzi.
Böhtana aludədir, olmamış olmaz qərəzi.
Köçürür yazdığının xırda uşaqlar üzünü,
Dinc oturmur qələmi, ölsə də yazmaz düzünü.

İtiribdir beləsi dünyada namusu, arı,
Düşünə kaş ki, bir az övladı haqqında barı.
Çünki artıq özünün ömrü olub bəlkə yarı.
Böhtanın gündə yazır hər gecə, vallah yüzünü
Dinc oturmur qələmi, ölsə də yazmaz düzünü.

Uşaq olsun, ya böyük, çoxdu həyatda mətini,
Böhtana sövq eləmək bir dəfədir ən çətini.
İstəmirsə köçürə şər yazının surətini.
Dədəsi qeyzə gəlir, kinlə bərəldir gözünü,
Dinc oturmur qələmi, ölsə də yazmaz düzünü.

Hələ var məxfi yazan dinsiz, imansız dədələr,
Öyrədir övladını pis yola qansız dədələr.
Demə varmış hələ də bunca amansız dədələr.
Qeyrəti yoxdu axı, aşkara yazsın sözünü,
Dinc oturmur qələmi, ölsə də yazmaz düzünü.

Köçürür xırda uşaq antipodun yazdığını,
Anlamır çünki tifil düz yolunu azdığını.
Hardasa bir fağıra dalda quyu qazdığını.
Bilə bilmir dədəsi rüsvay edibdir özünü:
Dinc oturmur qələmi, ölsə də yazmaz düzünü.

Xırda övladını da gör özünə tay eyləyir,
Utanıb ar eləmir, gənci də rüsvay eyləyir.
İndi hərçənd ilişib, ağlayır, ah-vay eyləyir.
Daha bir gün uşağın görməyəcəkdir üzünü,
Dinc oturmur qələmi, ölsə də yazmaz düzünü.

## ƏZRAYIL RÜŞVƏT ALMIR

Zamanın dərdi böyük, fikrinə aləm qapılıb,
Sənin hərçənd, bilirəm, mən niyə bağrın çapılıb.
Ölməmiş çünki sənin mülkünə sahib tapılıb.
Fikrin artıb, gecələr ərşə çəkibdir yuxunu,
Ölmə; ölsən, böləcəklər, evini, var-yoxunu.

Xəstəsən, var qohumun, amma ki, yanmaz halına,
Baxdırar hardasa bir falçı görən tək falına.
Göz dikib çünki sənin meydan olan gen zalına.
Tanıyırsan qohumun həm acını, həm toxunu,
Ölmə; ölsən, böləcəklər, evini, var-yoxunu.

Bir sütül qızcığazı zövcə edibsən özünə,
Gündə min rəngli boya, sürmə çəkir qaş-gözünə.
Sənə can yandıranın baxmadın əsla sözünə.
Qoca vaxtında səni cəlb elədi boy-buxunu,
Ölmə; ölsən, böləcəklər, evini, var-yoxunu.

Müşkül işdir qatasan əzrayılın sən başını,
Rüşvət almır ki, ona sən verəsən daş-qaşını.
Əsla əl çəkməyəcək, lap tökəsən göz yaşını.
O sənintək bu həyatdan aparıbdır çoxunu.
Ölmə; ölsən, böləcəklər, evini, var-yoxunu.

Taqətin yoxdu daha almanı hətta soyasan,
Pul gəzirsən elə hey, seyfinə hər gün qoyasan.
Qara vicdan – qaradır min cürə rəngə boyasan.
Başa düş, gizləmişəm mən yayı, atdım oxunu,
Ölmə; ölsən, böləcəklər, evini, var-yoxunu.

## MƏN DEMƏDİM

Arxayın ol, var hələ postum mənim,
Gəl bu gecə məclisə, dostum mənim!
Sən də eşit: var necə tostum mənim!
Rütbəli şəxsi ala bilsək ələ,
Keyfə baxardıq daha bundan belə.

Ol sağ əlim, sahman edək işləri,
Arxalıyıq batmayacaq dişləri.
Durma, tələs, manqala qoy şişləri
Məclisə kaş köklü dayaqlar gələ,
Keyfə baxardıq daha bundan belə.

İşdə əgər olsa gələn xahişə,
Sən boyun ol, kimsə düzəldər işə.
Şübhələnib, qoyma düşə təşvişə.
Salmasan hərgah məni sən əngələ,
Keyfə baxardıq daha bundan belə.

Ortada fırlan, gələni yanla sən
Mətləbini bax üzünə, anla sən
Aldığını böl, kişi, vicdanla sən
Kaş ki, ola səndə fərasət, lələ,
Keyfə baxardıq daha bundan belə.

Bil yaraşıqdır igidə ehtiyat,
Büdrəməsin, cəhd elə altında at
Yoxsa düşərsən tələyə hər saat:
Hər kəsə bir cür qura bilsək tələ,
Keyfə baxardıq daha bundan belə.

Mən demədim öz kefini çağ elə
Aşkara meydan sulayıb ağ elə
Sonra iliş, dərdi mənə dağ elə?!
İndi düşübdür canıma vəlvələ,
Kim çatacaq dadıma bundan belə?!

# OLMAYAN İŞ BAŞ VERİB

Gözlərin aydın olsun: olmayan iş baş verib,
İndi tapılmaz deyən: "Şahqulu daşbaş verib..."
Ya da ki, rüşvət kimi rəisə daş-qaş verib
Əksinə, heç bilmədim arzuma çatdım necə,
Möcüzədir bəlkə bu, iş düzəlib müftəcə.

İndiyəcən çarəmi qohumlardan ummuşam,
Olsa mənə dil verən tez yanına cummuşam.
Lax ki, çıxıb vədələr, hər şeyə göz yummuşam.
Fərqi də yoxdur bunun gündüz olub, ya gecə;
Möcüzədir bəlkə bu, iş düzəlib müftəcə.

Doğru çıxıbdır yalan, çaşbaş olub qalmışam,
Müftə-müsəlləh bu gün əmrimi mən almışam.
Gözdən iraq dostlara acıqca zəng çalmışam.
Kaş ki, bu əbləhlərin işləri məndən keçə,
Möcüzədir bəlkə bu, iş düzəlib müftəcə.

Taleyimin ulduzu parlaq olubdur daha,
Evdə də birdəfəlik son qoyulubdur aha
Zənn eləyirdim bu iş lap başa gəlsin baha
Çünki əzab çəkmişəm, getmədi hərçənd heçə,
Möcüzədir bəlkə bu, iş düzəlib müftəcə.

Kimlərə yalvarmadım... Kimlərə baş əymədim...
Yüz qapıda yüz dəfə dərdimi aşkar dedim.
Tirtap olub az qala yolda özümdən gedim.
İndi gərək gözlərim yaxşını pisdən seçə,
Möcüzədir bəlkə bu, iş düzəlib müftəcə.

Yaxşı ki, var dünyada yaxşı adamlar hələ,
Yan cibini güdməyən amma çox azdır, lələ!
Düşdü işim sahmana, gəl məni təbrik elə.
Gəl görüşək, dərdləşək, həm də kəsim bir beçə
Möcüzədir bəlkə bu, iş düzəlib müftəcə.

## GƏRƏK OLSUN

Rəhmətlik Sabir!..
İnsan olanın işdə marağı gərək olsun,
Müftə kababı, müftə arağı gərək olsun.
Əlbəttə ki, puldan da "yarağı" gərək olsun.
Yoxdursa əgər, lütdü hələ, lüt də qalandır,
Hər kəs ki, döyür öz döşünə, bil ki, kalandır.

Bəzən birinin hap-gopu bir dəstəyə xoşdur.
Zənn etmə bu cür lovğaların cibləri boşdur.
Hap-gop edəcək, etməlidir, çünki naxoşdur.
Axtarsan əgər bəlkə elə rüşvət alandır,
Hər kəs ki, döyür öz döşünə, bil ki, kalandır.

Vardır elə kəslər hələlik kefləri sazdır,
Doymur gözü, guya nə yığıbdır, hələ azdır.
Düşsə dara, hərçənd, nə gözəl yolmalı "qazdır?!"
Qaz yolmağa bir xəlvəti yer varsa dalandır,
Hər kəs ki, döyür öz döşünə, bil ki, kalandır.

Dünyada soruşmaz nəyə möhtacdı qohumlar,
Yaxud da elə toxdu, ya da acdı qohumlar.
Amma yan alar bilsə əgər "tacdı" qohumlar.
Baş tutmasa hərgah kələyi, qovğa salandır.
Hər kəs ki, döyür öz döşünə, bil ki, kalandır.

Hərdən beləsi bərk ilişir "peşkəş" alanda,
Dayday gəzir hər yerdə dayaq darda qalanda.
Yoxdur belə vaxtı yadına hətta salan da.
Çünki özü vecsiz, yaramaz çuldu, palandır,
Hər kəs ki, döyür öz döşünə, bil ki, kalandır.

## UÇDU GÜVƏNDİYİM DAĞLAR

Mən də güvənib yerlimə çox arxalanırdım,
Xudmani güzəran keçirirdim, dolanırdım.
Hərçənd hələlik yerlimi hər yerdə danırdım.
Öldü, məni bu ölməyi çəkdi dara, vallah!
Qaldım avara, heç nə də gəlmir kara, vallah!

Kefdən heç ayılmırdı başım, iş də var idi,
Bağda neçə manqal, neçə cür şiş də var idi.
Pörtmüş kababı çeynəməyə diş də var idi.
İndi dişim heç bəlkə də batmaz qara, vallah!
Qaldım avara, heç nə də gəlmir kara, vallah!

Dərdim çoxalıb, çünki dədəm də tora düşdü,
Şaqqıldadı, sındı beli, sanki, zora düşdü.
Düşdüm üzüqoylu, axı arxam "ora" düşdü.
Yorğan-döşək olmuşdu yerim bir ara, vallah!
Qaldım avara, heç nə də gəlmir kara, vallah!

Şəkk eyləməyin hər kəs əgər düşsə bu hala,
İstər o bərabər ola lap Rüstəmi-zala.
Biçarə qalıb, dalmalıdır gündə xəyala.
Yoxsulluq əlindən daha gəldim zara, vallah!
Qaldım avara, heç nə də gəlmir kara, vallah!

Dünyanın işi bəlkə də mənalı nağıldı,
Əfsus ki, başa düşməmişəm arxa-ağıldı!
Dövrəmdə gəzən müftə yeyənlər də dağıldı.
Səs çıxmadı heç getdilər onlar hara, vallah!
Qaldım avara, heç nə də gəlmir kara, vallah!

## RAST GƏLƏ DAŞ QAYAYA

Saxlayın hörmətini barı hələ sağ kişinin,
İşdə təmkinli olan, daim üzü ağ kişinin.
Qədrini bilmədiniz siz ürəyi dağ kişinin.
Təzə hardansa gəlib aləmi gör qatdı necə,
Dünyada arzusuna, bildi özü, çatdı necə.

Bu əzazil, adamın izləyir hər bir işini,
Həddi yoxdur birisi qurdalasın da dişini.
Görsə rüsvay eləyir həm qadını, həm kişini.
Gördünüz bir neçəsin tez çıxarıb; atdı necə?
Dünyada arzusuna, bildi özü, çatdı necə.

Sizi axırda soyub eyləyəcək ətcəbala,
Cəhd edin geyməyə bir şalvarınız barı qala.
Gözləyin boynunuza lap çatı da bəlkə sala.
Gördünüz çoxlarının işdə köpü yatdı necə?
Dünyada arzusuna, bildi özü, çatdı necə.

Hərifin hər "oyunun" şahmata bənzətmək olar,
"Udsa" bir çoxlarını bəlkə cibişdanı dolar.
Vay o gündən uduza, bəllidi ki, rəngi solar.
Rast gələr daş-qayaya, onda görər "matdı" necə,
Dünyada arzusuna, bildi özü, çatdı necə.

Dostuna, yerlisinə gündə açıqdır qapılar,
Etsə him-cim gələnə, vallahi dağlar çapılar
Səbr edin bir balaca, əbləhə əncam tapılar
Görərik onda özü əl-qol atıb batdı necə,
Dünyada arzusuna, bildi özü, çatdı necə.

## HƏR YETƏNƏ QURMA TƏLƏ

Dünən gəlib, bu gün haray salmısan,
Bəmdə gəziş, çıxma zilə, “əmoğlu”.
İndi ki, sən öz hayına qalmısan,
Hər yetənə qurma tələ, “əmoğlu”.

Yüz dalanı bir nəfəsə keçmisən,
“Yağlı” yeri bəyənmisən, seçmisən.
Sən müdiri yıxmağa and içmisən.
Düşməyəcək fürsət ələ, “əmoğlu”,
Hər yetənə qurma tələ, “əmoğlu”.

Köhnə yeri sən talayıb-çapmısan,
Pul-paradan cib dolusu qapmısan.
Çox da işin sən çəmini tapmısan.
Olmayacaq amma elə, “əmoğlu”,
Hər yetənə qurma tələ, “əmoğlu”.

Çoxlarını sən gətiribsən zara,
Nəfsini boğ, yoxsa düşərsən dara.
Arxa-dayaq hər dəfə gəlməz kara.
Köhnə müdir batdı belə “əmoğlu”,
Hər yetənə qurma tələ, “əmoğlu”.

Kölgə salırsan “batana” indidən,
Ciblərinə əl atana indidən.
“Xox” da gəlirsən çatana indidən.
Xox deməyin tezdi hələ “əmoğlu”,
Hər yetənə qurma tələ, “əmoğlu”.

Düz yolunu cəhd elə çaşma, kişi!
“Qaynamamış” əlüstü daşma kişi!
Cırtqoz olub həddini aşma, kişi!
Toxta bir az, uyma felə “əmoğlu”
Hər yetənə qurma tələ, “əmoğlu”.

## HƏR CİBDƏ PAYIM VARDI

Güldüm çoxuna, indi gəlib başıma, hərçənd,
Qan təzyiqi düz gəlməyir heç yaşıma, hərçənd.
Artır günü-gündən, su qatır aşıma, hərçənd.
Yorğan-döşəyə düşməyimi çoxdu bilənlər,
Umsam da çoxundan yanıma yoxdu gələnlər.

Vurdum arağı mən başıboş, bu hala düşdüm,
Yağmurlu hava yolda da varmış çala, düşdüm.
Saysan nə qədər müftə gəlirdən dala düşdüm.
Mənsiz bölüşüb, orda mənə çoxdu gülənlər,
Umsam da çoxundan yanıma yoxdu gələnlər.

Hərçənd bu işin baisi ancaq özüm oldum,
Düşdüm başa, seyrək tükümü hər gecə yoldum.
Kövrəldim o gün qəmli buludlar kimi doldum.
Af-uf edənin göz yaşını çoxdu silənlər,
Umsam da çoxundan yanıma yoxdu gələnlər.

Dostluq nə imiş indiyəcən qanmamışam mən,
İllərlə yatan dostuma heç yanmamışam mən.
Bir an belə qəlbimdə onu anmamışam mən.
Zənglərlə mənim bağrımı lap çoxdu dələnlər,
Umsam da çoxundan yanıma yoxdu gələnlər.

Baxtım gətirə, kaş tutalar bir də əlimdən.
Yəqin ki, daha əl çəkərəm bəd əməlimdən.
Vallahi, əcəl bərk yapışıb indi belimdən.
Burda keçirib günlərini çoxdu ölənlər,
Umsam da çoxundan yanıma yoxdu gələnlər.

Tənha yetiməm mən, nə əmim var, nə dayım var,
Bir vaxtı bilirdim neçə ciblərdə payım var.
Axtar bu cəmiyyətdə mənim harda tayım var?..
Can verməmiş heç var-yoxumu çoxdu bölənlər
Umsam da çoxundan yanıma yoxdu gələnlər.

## SEYFƏ QOYULMUŞ VİCDAN

Haqq qazandırdın o gün haqsıza, mat qaldım özüm,
Heyrətimdən, bərəlib kəlləmə çıxmışdı gözüm.
Gəzirəm indi səni, çünki sənə çoxdu sözüm.
Hakimin hökmü gərək cümlə ədalətli ola,
Çalışır bir parası, təkcə cibişdanı dola.

Haqsızın arxası var, sən də yıxıldın o yana,
Yaxşı düşmüşdü oda, qoymadın ancaq o yana.
Bais oldun ki, sənə məndə də nifrət oyana.
Niyə əl atmalıdır haqlı olan əyri yola?
Çalışır bir parası, təkcə cibişdanı dola.

Razı saldın deyəsən minnətə xəlvət gələni,
Çıxdı haqsız aradan, haqlıya qurdun tələni.
"Dərisi" xətrinə yəqin ki, buxardın "dələni".
O da bu fürsəti görcək sürüşüb girdi kola.
Çalışır bir parası, təkcə cibişdanı dola.

Vicdanın seyfə girib, bəlkə də çıxmaz o çölə,
Bağlayıb, sən açarın tullamısan çünki gölə.
Bu səbəbdən də olubsan pula hər yerdə kölə.
Müftə qol atmamısan haqq işi bənddirsə qola,
Çalışır bir parası, təkcə cibişdanı dola.

Kaş ki, vicdanla çəkə hər günahı daş-tərəzi,
Bir də hakim olanın olmaya heç vaxt qərəzi.
Əfsus olsun ki, çoxunda hələ var pul mərəzi.
Nə ola bərk ilişə, tir-tir əsə, rəngi sola,
Düşə gözdən uzağa, "orda" cibişdanı dola.

## AY CAN, AY CAN

Bəxtəvərin bəxti var, qayğısına qaldılar,
Fitnə-fəsad işlədib, əlüstü zəng çaldılar.
Çəkmədi bir həftə də, yağlı yerə saldılar.
Düzəldi müşkül işlər müftəcə ay can, ay can!
Kefdi bizim qonşuda hər gecə ay can, ay can!

Yaxşı bilirmiş, demə, müftə gəlir harda var,
İlboyu süfrəsində alma da var, nar da var.
Məclisə rövnəq verən kaman da var, tar da var.
Yoldan ötən istəmir yan keçə ay can, ay can!
Kefdi bizim qonşuda hər gecə ay can, ay can!

İtən-batan dostları indi çıxıblar üzə,
Bircə günün içində sayca çatıblar yüzə.
Cəhd eyləyir çoxları dosta özü mey süzə.
Qulluq edir süfrəyə qulbeçə, ay can, ay can!
Kefdi bizim qonşuda hər gecə ay can, ay can!

Mətləbini çoxları açmayıb hərçənd, lələ
Kölgəsinə girməyə yoxdu bir imkan hələ.
Dövrəsinə fırlanır könlünü alsın ələ.
Var gümanı yağlı bir yer seçə, ay can, ay can!
"Kefdi" bizim qonşuda hər gecə ay can, ay can!

...İndi bekardır yenə tində durub mırt vurur,
Şəkk qulağı səsdədi, sübhi-səhərdən durur.
Bir arağın xətrinə yüz tələ birdən qurur.
Badə curu var hələ bir neçə, ay can, ay can!
Kefdi bizim qonşuda hər gecə ay can, ay can!

## PUL BAŞDI...

Dünyanın işi əsginas üstündə qurulmuş,
Müflis olanın taxtı da vaxtsız uçurulmuş.
Keçmişdə axan lilli sular pulla durulmuş.
Əfsus hələ də pul hərisi cüzi qalıbdır,
Hərçənd ilişən dərsini, yəqin ki, alıbdır.

Göstər pulu, dağlar yerisin – şəkk edən olmaz,
Yalvar nə qədər, minnətə müftə gedən olmaz.
Pul – başdı, ağıldı: axı başsız bədən olmaz!
Sərvət yığanın halına bax fikrə dalıbdır,
Hərçənd ilişən dərsini, yəqin ki, alıbdır.

Arxın suyu axmırsa, pul atsan – axacaqdır,
Bu səhnəyə Ay nurlu səmadan baxacaqdır.
Pul xətrinə toqquşmada şimşək çaxacaqdır.
Sanma Ay, özü göylərə müftə ucalıbdır,
Hərçənd ilişən dərsini, yəqin ki, alıbdır.

Görsən ki, əgər azca qalıbdır qopa tufan,
Göstər pulu, vallah, səni tutmaz topa tufan.
Pulgirdi, görəsən inanıbdır gopa tufan.
Tufan da pul meylini hər yerdə salıbdır,
Hərçənd ilişən dərsini, yəqin ki, alıbdır.

...Bəli, bu pulun möcüzəsi çoxdu cahanda,
Nəfsi itilərçün tayı heç yoxdu cahanda.
Zəhmətkeşin ancaq ki, gözü toxdu cahanda.
Hər yerdə külüngün kişi zəhmətlə çalıbdır,
Hərçənd ilişən dərsini, yəqin ki, alıbdır.

## ÇAQQAL "ANDATRA" QOYURSA

Hələlik köhlənimi ay lələ, hər gün çapıram,
Pərdələnmiş tipi mən saldığı izdən tapıram.
Şerimin mövzusunu dildən, ağızdan qapıram.
Nə qədər ki, bədəməl var bu cəmiyyətdə hələ,
Qələmi qoymayacam mən yerə, vallahi, lələ!

Əşi, çaqqal kef edir, qulluq edir öz canına,
Ləkə düşmür görürəm zərrə qədər ad-sanına.
Tənqid ancaq yönəlir qurd yazığın ünvanına.
Qurmayıblar nə qədər çaqqala hər yerdə tələ,
Qələmi qoymayacam mən yerə, vallahi, lələ!

Çoxu heyrətlə baxır qurda, təzə olsa donu,
Çaqqal "andatra" qoyur, amma görən yoxdu onu.
Belə getməz, bu işin olmalıdır, çünki sonu.
Cibini güdsə əgər ilboyu, bundan da belə,
Qələmi qoymayacam mən yerə, vallahi, lələ!

Gətiribdir onu guya zara qurdun tamahı,
Salacaq, bəlkə də bir gün dara, qurdun tamahı,
Var özündə, demir heç yüz qara qurdun tamahı,
Öyrədirsə cürünü, sən də ziyankarlıq elə,
Qələmi qoymayacam mən yerə, vallahi, lələ!

Yel səsindən üşənən bilməyir heç qorxu nədir,
Qudurub, bir işə bax ki, sürüyə həmlə edir.
Neçə həmkarı hələ çaqqalın ardınca gedir,
Keçməyibdir nə qədər, ay lələ, çaqqallar ələ,
Qələmi qoymayacam mən yerə, vallahi, lələ!

## VAXT GƏLƏR ONDA...

Özünə yer elədin, indi qalır dost-tanışın,
Görürük lövbərini harda salır dost-tanışın.
Əlbəəl yağlı yerə əmrin alır dost-tanışın.
Hələlik örtülüdür, dammayacaqdır damınız,
Vaxt gələr, selləmə, “hoptum” ilişərsiz hamınız.

Əl-ələ vermisiniz, meydanınız gendi daha,
Tapmısız gözdən uzaq sərfəli, xudmani kaha.
Xeyri çox, dərdi də yox, son qoyulub orda aha.
Var görən, meylə dolur müftəcə büllur camınız,
Vaxt gələr, selləmə, “hoptum” ilişərsiz hamınız.

Oynayırsız hələlik, vedrədə şef hər nə çalır,
Bəllidir çoxlarına arxa duran haqqın alır.
Kola girmiş dəvənin quyruğu ki, çöldə qalır.
Dara düşmüşdü yaman işdə ki, dargöz zamınız,
Vaxt gələr, selləmə, “hoptum” ilişərsiz hamınız.

Qu sanıb tüklərini yolduğunuz “qazdı” hələ,
Kef çəkir ortağınız, kef-damağı “sazdı” hələ.
Baxma ki, dərsin alıb, təsiri çox azdı hələ.
Hər işin pərgarısız, yox aranızda xamınız,
Vaxt gələr, selləmə, “hoptum” ilişərsiz hamınız.

Belə yer düşməz ələ, zəbt eləmişdiz o yeri,
Fələyin gərdişini haqq özü fırlatdı geri.
Çoxunuz fikrə dalıb, başdan aşıb dərdi-səri.
Qaldı əfsus ki, yarımçıq necə arzu-kamınız,
Demədim selləmə, “hoptum” ilişərsiz hamınız?!

## İNSAN ÜRƏYİ DAŞ OLA BİLMƏZ

Ey dost, görüşəndə deməyə xeyli sözüm var,
Dolmuş bu sinəm, dərdi görən, çünki gözüm var.
Sancır ürəyim, amma hələ məndə dözüm var.
Anla sözümün məğzi nədir, seç daşı zərdən,
Əl tut yıxılan kəslərə, qaldır onu yerdən.

Hardan biləsən qəm yaşıdır gözdən axan yaş
Müşküldü qəmin çarəsi, sındırma nahaq baş.
İnsan ürəyi daş ola bilməz axı, qardaş;
Yansın ürəyin, yaş tökənin fikrini öyrən,
Əl tut yıxılan kəslərə, qaldır onu yerdən.

Biganələrin cümləsi pulbazdı, a qardaş,
Pulbazdı deyə kef-damağı sazdı, a qardaş.
Fəryad edənə qəlbi yanan azdı, a qardaş;
Görsən batanı bircə təvəqqem budu səndən:
Əl tut yıxılan kəslərə, qaldır onu yerdən.

Biçarə gəlib boynubükük dursa kənarda,
Möhtac da ola, amma susar qalsa da darda.
Ah çöksə, ahından əriyər dağdakı qar da;
Əfsus ki, eşitmir çoxusu, barı eşit sən,
Əl tut yıxılan kəslərə, qaldır onu yerdən.

İnsan gərək öz borcunu qansın bu həyatda,
Millət qəmini öz qəmi sansın bu həyatda.
Möhtac olanın halına yansın bu həyatda;
Əfsus ki, bunun fərqinə varmır çoxu bəzən,
Əl tut yıxılan kəslərə, qaldır onu yerdən.

Yanmırsa ürək, gözdən axı yaş axa bilməz,
Haqqın gözünə əyri olan dik baxa bilməz.
Göylərdə bulud olmasa, şimşək çaxa bilməz;
Bəzən bu təbiət də tökür göz yaşı hərdən,
Əl tut yıxılan kəslərə, qaldır onu yerdən.

## KİM SƏNİ YAD ETMƏLİDİR

Keçməyin iş başına çıxdı boşa, oldu yalan,
Yarısı işdə gülüb, indi gülür yerdə qalan.
Düşüb ardınca gəzir lağlağıçı, vedrə çalan.
A yetim, boşdu cibin, kimdi sənə arxa duran,
Sən ucalsan da əgər, tez tapılar zərbə vuran.

Hələ sən qanmamısan kim çəkilir tez irəli,
Görmədin bəs nə sayaq oldu müdir küt Pirəli?
Şefinin yan cibinə ayda girir tək bir əli.
Pəl vuran oldu sənə, and içərəm olsa Quran,
Sən ucalsan da əgər, tez tapılar zərbə vuran.

Otuz il işləmisən kimsə salıbdır yadına?
Çox da ki düşməyib heç bir ləkə hətta adına.
Yalvar öz bəxtinə sən bəlkə o çatsın dadına.
Nə fərasət, nə filan arxa deyil, sən bunu qan,
Sən ucalsan da əgər, tez tapılar zərbə vuran.

A yetim, seçməmisən sən hələ ağdan qaranı,
Bacarıb açmamısan işdə müdirnən aranı.
Ürəyindən keçirirsən bilirəm mən haranı,
Ya da ki, yanla özün ya dayını, ya əmini.
Ölməyibdir nə qədər kinli, paxıl, qurğu quran,
Sən ucalsan da əgər, tez tapılar zərbə vuran.

## ÖZÜNDƏN DÜZƏLƏ

Görürəm qəm yük olub, hətta əyibdir belini,
Az qalıbsan batasan, kimsə uzatmır əlini.
Tapmasan işdə əgər zalımın hərgah dilini.
Nə gileylən, nə də ki müftəxora minnət elə,
Haqq olan yerdə gərək, iş öz-özündən düzələ.

Arxayın olma ki, çox vaxtı girirsən qoluna,
Canı yansa işini göydə salar öz yoluna.
Sənsə boş ciblə, nahaq keçmə onun sağ-soluna
Var təmənnası yəqin, boş yerə yalvarma, lələ,
Haqq olan yerdə gərək, iş öz-özündən düzələ.

Dayanıb astanada, boynunu bur, varmı baxan?
Var qalstuk gətirən, tez-tələsik orda taxan.
Tax nəyin var sinənə qalsın açıq amma yaxan.
İnsafı olmasa da bəlkə çaşıb rəhmə gələ
Haqq olan yerdə gərək, iş öz-özündən düzələ.

Hər işin dəllalı var, görməmisən? Azdı məgər?
Yan alıb zırpısına, dil tapa bilsəydin əgər.
Bircə göz qırpımına hər işə əncam o çəkər.
Yenə müşkül olacaq, bitməyəcəkdir məsələ,
Haqq olan yerdə gərək, iş öz-özündən düzələ.

Səni həmdəm bilirəm xeyli zamandır özümə,
Hələlik dözməlisən, çarə qalıbdır dözümə.
Saxla ar-namusunu şəkk eləmə sən sözümə.
Düşmə ruhdan düzələr, getməyəcək çünki belə,
Haqq olan yerdə gərək, iş öz-özündən düzələ.

## MƏN QARANLIQ DALANAM

Allaha şükr edirəm, daydayı tapdım özümə,
Məni əfsunlamısan, dünya görünmür gözümə.
Sən olan yerdə mənim qulp qoyan olmaz sözümə;
Çox əfəl sanma məni, atlını atdan salanam,
Peşəmə gülmə nahaq, çox da ki dümbək çalanam.

Sanma dünyanın işin anlamayan bir çağayam,
Ya da ki asta gedən mən də çanaqsız bağayam –
Yox canım, harda olam, orda özümçün ağayam;
Kölgəni üstümə çək, fərz elə ki, öz balanam.
Peşəmə gülmə nahaq, çox da ki dümbək çalanam.

Əli düzlükdə, qağa, oxşaram huri mələyə,
Çıxmışam çox ütüdən, düşməmişəm heç tələyə.
İşə gəlmirsə xələl əl atıram tez kələyə;
Baş çıxarmaz hər adam, çünki qaranlıq dalanam.
Peşəmə gülmə nahaq, çox da ki, dümbək çalanam.

Var səriştəm, bilirəm dünyada hər cür oyunu,
Qağa, dul baldızının sən mənə tapşır toyunu.
Mat qalarsan haradan mən necə aldım qoyunu;
Mənə can yandıranın qeydinə beşqat qalanam,
Peşəmə gülmə nahaq, çox da ki dümbək çalanam.

Olsa yanpörtü baxan, qulbeçənə him-cim elə,
Tuşlasan barmağını, axşama hazırdı tələ –
Düşsə, vallahi, çətin bir də bizim səmtə gələ;
Bacaran var bu işi, sanma sözümdə yalanam,
Peşəmə gülmə nahaq, çox da ki dümbək çalanam.

Hələ tuş olmamışam döngədə haqqın oxuna,
Çünki fərq qoymamışam müftə pulun az-çoxuna
Sən də olsan dayağım, kim ürək eylər toxuna?
Başın haqqı, verələr bircə qəpik də alanam.
Peşəmə gülmə nahaq, çox da ki dümbək çalanam.

Arxalansam sənə mən, köndələnə at çaparam,
Könlünə hər nə düşər, yer deşiyindən taparam.
"Aldı verdim" də olar, mən də bir az-maz qaparam.
Fağıram, indi lütəm, bir də görərsən kalanam;
Peşəmə gülmə nahaq, çox da ki dümbək çalanam.

## BATMA Kİ, MƏN BATARAM

Göstərim gəl sənə mən kim yıxılıb, kimdi duran,
Dolanır öz kefi kök, əlbir olub qurğu quran.
Bax, odur haqq adama yağlı qapaz, zərbə vuran.
İstəyirsənsə əgər, mən təzə faktlar da sayım,
Sən deyirsən mənə nə, qoy mən özümün yaşayım.

Baxıram qonşumuza növcavanın az yaşı var,
Maşını, ev-eşiyi, gündə də ki, daşbaşı var.
Elə zənn eyləmə ki, "kəlləsi" var, ya "başı" var.
Nə deyirsən, bunu mən çayçıda, məclisdə yayım?
Sən deyirsən mənə nə, qoy mən özümün yaşayım.

Uzağa getmirəm heç, arxalanırsan varına,
Sən özün kef eləyib, qulluq edirsən qarına.
Öz dayın düşdü dara, gəlmədin ancaq karına.
Belə hallarda, sən öl, bəlkə mənim yoxdu tayım,
Sən deyirsən mənə nə, qoy mən özümün yaşayım.

Məsələ, bax, budu ki, sən də deyirsən "Mənə nə?"
Dərd budur ki, mənə də çoxlu deyənlər sənə nə.
Bəli...batsın gəmi qoy, üzdə qalan yelkənə nə...
Yanıram, amma mənim kimsəyə çatmır harayım,
Sən deyirsən mənə nə, qoy mən özümün yaşayım.

Belə biganəliyin sən daşını atmalısan,
Dünyada dərdlilərin imdadına çatmalısan.
Yanmasan millət üçün əvvəl-axır batmalısan.
Sən ilişsən, onu bil, olmalıdır orda "payım",
Demə bundan belə sən: qoy mən özümün yaşayım.

## DƏYMƏ BU AXŞAM DAYINA

Keçən il yayda qalırdım gecə mehmanxanada,
Aktı sahmana salırdım gecə mehmanxanada.
Xırda xərclik də alırdım gecə mehmanxanada.
Gördü bir taxtabiti, qalma, – dedi, –pul hayına,
Qaş-göz etdim dayınam, dəymə bu axşam dayına.

Dedi: çaxnaşma salıb yaxşı soyubsan şəhəri,
Yuxu getmir gözünə, indi güdürsən səhəri.
Çıxasan tez aradan, cibdə də aktın bəhəri.
Qudurubsan necə gör, bal da salırsan çayına,
Qaş-göz etdim dayınam, dəymə bu axşam dayına.

Gözünü zilləmisən, sanki, hərissən qanıma,
Görmüsən aldığımı lərzə düşübdür canıma.
Demə, varmış qərəzin, gündə gəlirsən yanıma.
Dedi: söylə nə düşür müftə gəlirdən payına?
Qaş-göz etdim dayınam, dəymə bu axşam dayına.

Açmasan sirrimi, hər yerdə səni yad elərəm,
Yola gəlsən, nə ki var, son manatın tən bölərəm;
Hay-haray salsan əgər, işdi ilişsəm ölərəm.
Dedi: dostun da çalışdı belə gözdən yayına...
Qaş-göz etdim dayınam, dəymə bu axşam dayına.

Axı, mən tək yemirəm, var cibimə ortaq olan,
Olur hərdən də məni "qaz kimi" vallahi, yolan.
Xatakar olma, ala, müftə pula sən də dolan.
Dedi: toy tutdum o gün burda sənin bir tayına,
Qaş-göz etdim dayınam, dəymə bu axşam dayına.

Gördüm axırda gedib küncdə düzəldir yerini,
Düşsə fürsət, çəkəcək üstümə öz ləşkərini.
Karıxıb üz-gözümün pulla silirdim tərini.
Dedi: yalvar fələyə, bəxtini hər halda sına,
Qaş-göz etdim dayınam, dəymə bu axşam dayına.

Müxtəsər, çəkmədi əl, yatmadım heç bircə gilə,
Aləmi yığdı ora, lap qızışıb çıxdı zilə.
Dil çıxartdım: adam ol, öz dayını salma dilə.
Dedi: sən müftəxorun kaş oturaydım vayına,
Qayıda bilsən əgər, nəql eləyərsən dayına.

## TƏZƏ VƏZİFƏ YUYULURDU

Bəh, bəh yenə məclis qurulub, kefdi bu axşam,
Sandım günəşin parçasıdır evdə yanan şam.
Büllur yerinə burda düzülmüşdü gümüş cam.
Cingilti səsindən ayılar xorna çəkəndə,
Oldum elə məclisdə dünən, bir gecə mən də.

Orda “yuyulurdu” təzə bir “yağlı” vəzifə
Tufan qoparan zəng səsinə bağlı vəzifə.
Varmış demə cib kəsməyə ortaqlı vəzifə.
Hardan biləsən, görməmisən heç vədə sən də,
Oldum elə məclisdə dünən, bir gecə mən də.

Gəlmişdi ora “mey ölüsü” – müftə vuranlar
Mey xətrinə lap kəlləsi üstündə duranlar.
Üzdə “kişi”, astarda tələ, qurğu quranlar.
Vardı hələ meydan sulayan da, öyünən də,
Oldum elə məclisdə dünən, bir gecə mən də.

Yaltaq çox içib, döndü şirə, çıxdı özündən,
Tost söylədi, baş açmadılar amma sözündən.
Tirləndi yerə, içdiyi də gəldi gözündən.
Görcək belə bir aləmi oldu sürüşən də,
Oldum elə məclisdə dünən, bir gecə mən də.

Ev sahibi qalxıb camını ovcuna aldı,
Əmrin yazılı surətini badəyə saldı.
Son tostu dedi, zurnaçı bir vağzalı çaldı.
Məclis dağılanda bu işə oldu gülən də,
Oldum elə məclisdə dünən, bir gecə mən də.

## HANI O KÖHNƏ YERİM

Bekaram, can-ciyərim dadıma çatmır hələlik,
Gümanım bir yerə var, könlümə yatmır hələlik.
Orda çax-çux eləmək ağlıma batmır hələlik
Gəzirəm mən elə iş layiqi olsun adıma,
Yanıram, köhnə yerim indi düşəndə yadıma.

Neçə rəngdə telefon, sussa da, gəlmişdi zara,
Zəng edirdim dükana, anbara, lazımsa hara.
Söyləyərdi çoxusu, kaş ki, gəlim mən də kara.
Vardı lap şuba verən töhfə kimi arvadıma,
Yanıram, köhnə yerim indi düşəndə yadıma.

Üzümə şax dedilər: sən daha ağ eyləmisən,
Girləyib öz başını, keyfini çağ eyləmisən.
Sən şişirdib olanı, bir yekə dağ eyləmisən.
Mən cəhənnəm bu dəfə, çoxları getdi badıma,
Yanıram, köhnə yerim indi düşəndə yadıma.

Külfət af-uf eləyir, lap qaralır evdə qanım,
Müftə məclis gəzirəm, dərddən üzülmüş bu canım.
İlboyu sübhə kimi kefdə keçərdi hər anım.
Badə dostum çox idi, çatmadılar imdadıma,
Yanıram, köhnə yerim indi düşəndə yadıma.

Ümidim bircə qalıb göydəki Allah-kərimə,
Dözərəm hətta saman təpsə də vallah dərimə.
Yalvarıb, diz çökərəm qaytara bilsə yerimə.
Qoymur ancaq ki, məhəl bir bu qədər fəryadıma
Döndəribdir üzünü çatmayacaqdır dadıma,
Yanıram, köhnə yerim indi düşəndə yadıma.

## “LAYKA” GEYƏNLƏR

Məclis qurulub başdakı yer boş qalıb indi,
Təşrif gətirənlər nə danışdı, nə də dindi.
Gözlərdə kədərdən oxunur dərdləri mindi:
Çünki qovulub başçıları “yağlı” işindən
Gendən bu sükut səhnəsini seyr elədim mən.

Köçmüşdü cibişdanı gündən qət təzə yurda,
Tapşırmaq olarmı sürünü yırtıcı qurda?
Matəmdi bu gün, sanki, batıblar yasa burda.
Bunlar da yeyirmiş “qoyunun” “dadlı” leşindən,
Gendən bu sükut səhnəsini seyr elədim mən.

Vaxtdır deyəsən, alma yanaqlar daha solsun.
İndi düşünürlər nə edək, bəs necə olsun?
Gəl ki, yenə əl-haydadılar cibləri dolsun.
Söz saldı müdirlə birisi son görüşündən,
Gendən bu sükut səhnəsini seyr elədim mən.

Ərz etdi ki: Gördüm qapını bağladı dostum.
Baxdı mənə, lal-mat oturub ağladı dostum.
Kövrəldim özüm, qəlbimi lap dağladı dostum.
Pisdir halı duydum işinin mən gedişindən
Gendən bu sükut səhnəsini seyr elədim mən.

“Başsız” qalıb indi bu qədər müftə yeyənlər,
Rüşvət puluna “layka” və “andatra” geyənlər.
Hər yerdə də keçmiş müdirə “tacdı” deyənlər
Safdır qapıçı antipodun əlli beşindən
Gendən bu sükut səhnəsini seyr elədim mən.

## DÜŞMƏYİBDİR DEYƏSƏN

Baxıram tüllaba, gör, bir, necə meydan sulayır,
Özü haqqında quraşdırma fikirlər də yayır.
Guya sanballı adamlar onu öz dostu sayır.
Görəsən bəs nə sayaq hörmətə minmiş avara?
Düşməyibdir, deyəsən, heç bu fırıldaqçı dara.

Neçə təhsil ocağı, sanki, onun iş yeridir,
Çoxu bilmir ki, o da, yüz dələduzdan biridir.
Başı cırtdan başıdır, amma qulaqdan iridir.
Şəkk qulaqdır, qulağı səsdə olur, getsə hara,
Düşməyibdir, deyəsən, heç bu fırıldaqçı dara.

Vay o gündən toruna saldığı kəs maymaq ola,
Xam olan "müştərini" tez gətirir, çünki yola.
Kələyi versə bəhər, bəlkə cibişdanı dola.
İşdi baş tutmasa iş, söykəyəcəklər divara,
Düşməyibdir, deyəsən, heç bu fırıldaqçı dara.

Var güman cib ki, dolub gözləri bəlkə tox olub
İmtahan dövrü bu il, çünki qazancı çox olub.
Çox "qulaq" kəsdi hərif, qeybə çıxıbdır, yox olub.
Axtaran yoxdu, hələ kefdədi, sakitdi ara,
Düşməyibdir, deyəsən, heç bu fırıldaqçı dara.

İş açıblar, xəbəri yoxdu, yatıbdır bu hərif,
Dolaşıbdır kələfi, indi batıbdır bu hərif.
Müftə pulnan nə alıbdırsa, satıbdır bu hərif.
Deyəsən bərk ilişib, gəlməyəcək heç nə kara,
Beləsi əl-qol açar, düşməsə yəqin ki, dara.

## RÜŞVƏT SAYAĞI

Başını yırğaladı, guya şərikdir sözümə,
Demə, boş sözlə mənim pərdə asırmış gözümə.
Dükana girdim o gün çəkmə alırdım özümə.
Gördü ah çəkdi, dedim bəlkə yalındır ayağı,
Hər nə versən alacaq, olmasa rüşvət sayağı.

Elə dil tökdü, dedim lap bu kişi əjdahadır,
Güman etdim sözünün qiyməti ləldən bahadır.
Sən demə toqqasının altı böyük bir kahadır.
Quzunu hopp eləsə, zərrəcə çıxmaz sorağı,
Hər nə versən alacaq, olmasa rüşvət sayağı.

Sənə öz mətləbini astaca qandırmaq üçün,
Yerini təklif edər, qəsdlə utandırmaq üçün.
And içər öz canına, hətta inandırmaq üçün.
Goplayar çoxları tək, hardasa vardır dayağı,
Hər nə versən alacaq, olmasa rüşvət sayağı.

Getdim hərçənd yanına dik ayağa durdu kişi,
Yola düşdük bağına, manqalı tez qurdu kişi.
Azı yüz dəfə mənim sağlığıma vurdu kişi.
Görəsən kaş ki, özün, vallahi, cənnətdi bağı,
Hər nə versən alacaq, olmasa rüşvət sayağı.

Öyrəniblər bu hərif köhnə zaman çayçı olub,
Görürəm nəfsi dönüb, sanki, iti qayçı olub.
Müftə pul görsə ayırmır qaradan əsla ağı,
Hər nə versən alacaq, olmasa rüşvət sayağı.

Belə getsə, hələ çox cibləri bir-bir soyacaq,
Kaş zəmanət verə ki, gözləri bir gün doyacaq.
Kimsə tezliklə onun adətinə son qoyacaq.
Bazarı bağlanacaq, sallanacaq qaş-qabağı,
Hər nə versən alacaq, olmasa rüşvət sayağı.

## İKİ DÜNYA BİR OLA

Arifəm, çatdı mənə, sən niyə kəsdin sözünü,
Qara lövhəmdə, yəqin, sən də görübsən özünü.
Karıxıbsan, bu səbəbdən də döyürsən gözünü.
Harda olsan, başını hər necə soxsan da kola,
Eybini açmalıyam, lap iki dünya bir ola!

Gizləsən keçmişini, çıxmasa da sirrin üzə,
Acısın dadmalısan, hətta yaşın çatsa yüzə.
Haqq yerin tutmalıdır, bircə zaval yoxdu düzə.
Qanmasan mətləbimi, getsən əgər əyri yola,
Eybini açmalıyam, lap iki dünya bir ola!

Keçmisən iş başına zəhmin olub dağdan ağır,
Düşə bilmir yanına neyləsin aciz, ya fağır?
Yoxdu bir əl tutanı, pul-para göydənmi yağır?!
Güdsən hərgah cibini, cəhd eləsən müftə dola,
Eybini açmalıyam, lap iki dünya bir ola!

Çox basıb-bağlamısan, bircə qalıb yol kəsəsən,
Canına qorxu düşüb, yəqin edibsən nəsə sən.
Qapını olsa döyən, dik atılırsan səsə sən.
Orda hazırdı yerin, bənddi bir imzaya, qola,
Eybini açmalıyam, lap iki dünya bir ola!

Gəzirəm əldə qələm, sirli bir aləmdi cahan,
Taparam olsa da, lap daş, qaya altında kahan.
Çünki zəhmətlə ömür sürməmisən sən ki bir an.
Hələ gözdən yayınıb, tində burulsan da sola,
Eybini açmalıyam, lap iki dünya bir ola!

Bəd əməldən çoxunun ağrıyıb hər yerdə başı,
Başa düş, birdəfəlik tök ətəyindən bu daşı.
Tənqidin pərgarıyam, çox da məni sanma naşı.
Salaram dil-ağıza, qorx hələ rəngin də sola,
Eybini açmalıyam, lap iki dünya bir ola!

## AXTARIR DAYDAYI Kİ...

Düşdü dəbdən təzə “məşhuri-cahan”, dəbdə olan,
Gözü hər süfrədə ki, yüzcə qram həbdə olan.
Olmayıb indiyəcən guya belə təbdə olan.
Söndü “atəşli” ocaq, qalmayıb heç pul-para da,
Axtarır daydayı ki, çax-çuxa imkan yarada.

Özgənin bostanına xəlvəti daş atdı özü,
Badalaq gəldi çörək kəsdiyinə, batdı özü,
Düşdü yorğan-döşəyə xeyli zaman yatdı özü,
İndi sərsəmdi, o, sanki, basır hərdən qara da;
Axtarır daydayı ki çax-çuxa imkan yarada.

Çuğlayan üz-gözünü aşkara dərd-qəmdi yenə
İşi əngəldi, yəqin gözləri də nəmdi yenə.
Deme, külbaş çox içib, qəhərlənir, dəmdi yenə.
Sala bilmir yadına, hətta içibdir harada.
Axtarır daydayı ki çax-çuxa imkan yarada.

Gəmirir qəlbini qurd, çünki düşüb işdə dara,
Yoxdu əlborcu verən, boş qayıdır getsə hara.
Axı ömründə özü gəlməyib heç vaxtı kara.
Elə bil qeybə çıxır, heç gözə dəymir arada,
Axtarır daydayı ki, çax-çuxa imkan yarada.

Nə biləydi təzə şef sındıracaq qol-qanadın,
Əsla bir yaxşılığa çəkməyəcək işdə adın.
Unudub indi tifil müftə kababın da dadın.
Çünki yoxdur aparan lap ayaqüstü bara da,
Axtarır daydayı ki, çax-çuxa imkan yarada.

## ALIŞIB-YANMA, ÜRƏK

Alışıb-yanma, ürək, tab eylə hər dərdi-sərə,
Girləyir öz başını burda görürsən ki, hərə
Doldurur ciblərini görsə ki, xəlvətdi dərə.
İstəyirsən bağırım, xeyri nədir, var eşidən?..
Qovrulursan, bilirəm, sanma günahkar məni sən.

Demişəm fikrimi mən, sən də məni dinləmisən,
Yığıb üst-üstə mənim dərdimi sən cinləmisən.
Yükün artdıqca bu yükdən sıxılıb inləmisən.
Dözmüsən, qan yerinə, sən də kədər-qəm yemisən,
Qovrulursan, bilirəm, sanma günahkar məni sən.

Səni həmkar bilirəm, ay ürəyim, anla məni!
Ölərəm, saxlamasan dərd qarışıq qanla məni.
Dərdimin anbarısan, eyb eyləməz danla məni.
Yuxu getmir gözünə, xeyli keçibdir gecədən,
Qovrulursan, bilirəm, sanma günahkar məni sən.

Çox dığırlatdı kötük mərdimazar düz yoluma,
Düzdü xəlvət necə yaltaqlarını sağ, soluma.
İmkan olsaydı, o zəncir də vurardı qoluma.
Əfsus olsun ki, bu, baş tutmadı sən şahidsən,
Qovrulursan, bilirəm, sanma günahkar məni sən.

Anlayırsan məni sən olmusan ancaq dili lal,
Eybi yoxdur, sənə kaş salmaya fikrim təzə xal.
Nə qaranlıqdı sənə, xəlvəti məndən xəbər al.
Səni incitməyə bildin nədi vadar eyləyən?!
Qovrulursan, bilirəm, sanma günahkar məni sən.

## QORXURAM İNFARKT OLARAM MƏN

Olsam da müavin müdirə, imkanım azdır,
Çoxdur gileyim, baxma ki, keyfim hələ sazdır.
Xəlvətcə sayım faktları, tez bir kəsə yazdır.
Göndər hara gəldi, sən özün yaxşı bilirsən,
Səbrim tükənib, qorxuram infarkt olaram mən.

Vardırsa səriştən, get, otur evdə quraşdır,
Tərif eylə hərdən müdiri, aləmi çaşdır.
Cəhd eylə inansınlar: onun işləri yaşdır.
Çəksən nə çətinlik gecələr gəl bizə hərdən,
Səbrim tükənib, qorxuram infarkt olaram mən.

Zənnimcə, bu yolla qara yaxmaq da asandır,
Əlbir tələ qursaq: onu yıxmaq da asandır.
Həm də aradan astaca çıxmaq da asandır.
Zamin dururam, yaxşı bələdsən ki, əzəldən,
Səbrim tükənib, qorxuram infarkt olaram mən.

Tərpən, daha durma, sözümə tez əməl eylə,
Ondan hara yazsan, mənə ünvanını söylə.
Çaxnaşma düşəntək deyərəm: sən daha neylə.
Olsa təzə fikrin, mənə tez zəng eyləyərsən,
Səbrim tükənib, qorxuram infarkt olaram mən.

Bir vaxtı onun hörməti qalmışdı yanımda,
Məclisdə deyərdim: ona qurbandı canım da.
Yazmaq həvəsim var, nə edim, çünki qanım da –
Dostumsan əgər, xətrim üçün yazmalısan sən,
Səbrim tükənib, qorxuram infarkt olaram mən.

İşlər ki düzəldi, kefimiz çağ olacaqdır,
Sözsüz, yerin orda yenə çimyağ olacaqdır.
Arxanda mənimtək yekə bir dağ olacaqdır.
Açdım sənə öz sirrimi, çünki sağ əlimsən,
Səbrim tükənib, qorxuram infarkt olaram mən.

## GETDİM BADINA

Can-başla çalışdım neçə illər öz işimdə,
Ardımca deyən də yox idi bir söz işimdə.
Etdi məni bir zatıqırıq üz-göz işimdə.
Qatdı aranı, tez çəkilib durdu kənarda,
Fitvaya uyub qalmışam indi daha darda.

Saldı toruna bizləri min dillə o, bir-bir,
Uydurdu yalan, guya bilirmiş nə qədər sirr.
Böhtan, qara yaxmaqda tökürdü bizə tədbir.
Kaş ki, onu rüsvay eyləyəydim elə orda,
Fitvaya uyub qalmışam indi daha darda.

Könlündə var imiş müdir olsun özü ancaq,
Onsuz da kalandır, yenə doymur gözü, ancaq.
“Aldım, belə verdim”, budu söhbət-sözü, ancaq.
Saxlardı məni söhbətə çovğunda və qarda,
Fitvaya uyub qalmışam indi daha darda.

Qurğu qurana hamı bələd olduğu halda,
Gizlətdi cidanı neçə illərlə çuvalda.
Böhtan da yazırdı, bilirəm, xəlvəti, dalda.
Rüsvay olacaq, gec-tezi var, işləsə harda,
Fitvaya uyub qalmışam indi daha darda.

Əbləh, qoca vaxtımda məni gör necə yıxdı,
Hərçənd ki, bilirdik işi onsuz da fırıqdı.
Tapdım ki təsəlli, öz işindən o da çıxdı.
İşdən qovulubdur, sülənir indi bazarda,
Fitvaya uyub qalmışam indi daha darda.

Şəksiz, dona girmişdi, ya “şeytandı”, ya “cindi”,
Mənası da yoxdur, başımı sındırım indi.
Gendən görürəm, lap büzüşüb, məskəni tindi,
Getdim badına başqasıtək mən də axırda,
Düşdü zibilə orda qalan xeyli fağır da,
Fitvaya uyub qalmışam indi daha darda.

## HAY-KÜY SALAN OĞLAN

Yersiz danışıb aləmə hay-küy salan oğlan,
Yer var, ora öz əmrini guya alan oğlan.
Çəkdinmi xəcalət, sözün oldu yalan oğlan.
Arxı hələ tullan, baxarıq sən necə “cansan”,
Lənət deyərəm cəmdəyinə, səhvini dansan.

Dəryada balıq söhbətini etmə, a fərsiz,
Fitvaya uyub hap-gopa çox getmə, a fərsiz.
Hər yerdə alaqtək cücərib, bitmə, a fərsiz.
Bir gün “yolacaqlar” alışıb onda yanansan,
Lənət deyərəm cəmdəyinə, səhvini dansan.

Şərtin bu olub, iş başına keçsən əgər sən,
Köhnə müdirin dostların ordan əkəcəksən.
Arzu toxumun bitməyəcəkdir – hara əksən
Çünki tanıyan var, özünü “dahi” də sansan,
Lənət deyərəm cəmdəyinə, səhvini dansan.

Keçsəydi işin, sən müdirə dost da deyirdin,
Düşsə yeri, birlikdə çörək-duz da yeyirdin.
Şübhəm dil açıb: düz işini dalda əyirdin.
Bəlkə düzələrsən sözümün məğzini qansan,
Lənət deyərəm cəmdəyinə, səhvini dansan.

Kaş ki, müdirin bunları əvvəlcə biləydi,
Anlardı yəqin son yara hardan, necə dəydi.
Hərçənd sənin hər davranışın qurğu-tələydi
Olmazdı ki, ömründə özün bir yol utansan?
Lənət deyərəm cəmdəyinə, səhvini dansan.

## ÇƏNƏ

Yolumu qəsdlə özüm gündə klubdan salıram,
Kürsüdə məşq eyləyən daz Cəbişə mat qalıram.
Yelləyir əl-qolunu, mən də gülüb, əl çalıram.
Dinləyən bircə mənəm, bir də onun qız nəvəsi,
Pah atonnan, nə yaman hap-gopa varmış həvəsi.

Yığılırlar çaparaq colma-cocuqlar başına,
Gülüşürlər arabir him-ciminə, göz-qaşına.
Hay düşür, səs yayılır el-obanın dam-daşına.
Heç yorulmur, bu düşük, daşdı-dəmirdi çənəsi?..
Pah atonnan, nə yaman hap-gopa varmış həvəsi.

Çağıran olmasa da getməlidir iclasa o
Çıxış etmirsə, batır bir neçə günlük yasa o
Yoxdu bir həmdəmi də hirsini bəlkə basa o.
Başı boş bambılının, sanki, ölübdür dəvəsi,
Pah atonnan, nə yaman hap-gopa varmış həvəsi.

Atır hərdən də ki, imanına bumbuz arağı,
"Şir" olur dəmdəki kürsüyə artır marağı.
Yollanır toplanışa, torbada gopdur yarağı.
Düşsə fürsət danışır ta kəsilincə nəfəsi,
Pah atonnan, nə yaman hap-gopa varmış həvəsi.

"Bərəkallah!" desələr silkələyir baş-gözünü;
Əl atır tərifə öz dostunu, yaxud özünü.
Zalım oğlu özü də anlamır heç çox sözünü.
Çənə öyrəncəlidi: gurlayır iclasda səsi,
Pah atonnan, nə yaman hap-gopa varmış həvəsi.

Gözə girməklə bu cür hər dəfə hay-küy qoparır,
Gah o dağdan danışır, gah da ki, dəryaya varır.
Müxtəsər, zırramadı, boş-boşuna baş aparır.
Məncə, çatmır Cəbişin ya çatısı, ya zivəsi,
Pah atonnan, nə yaman hap-gopa varmış həvəsi.

## BAŞQA CÜRƏ CANDI KAZIM

Var bizim qonşu Kazım, heç kəs inanmır sözünə,
Qara çeşmək də taxır kölgədə hətta gözünə.
Dilə tutdum nə sayaq “Volqa” alıbdır özünə.
Baxdı, göz vurdu mənə, məqsədimi qandı, Kazım.
Dedi: lap əsli mənə sərfəli dövrandı, – Kazım.

Dəyişib iş yerimi ildə, – dedi əlli kərə,
Axtarırdım ki, salım lövbərimi yağlı yerə.
Tapmışam, burda alır öz payını ayda hərə.
Gördü abrın alacam, tez sözünü dandı, Kazım,
Dedi: lap əsli mənə sərfəli dövrandı, – Kazım.

Uzun illər Kazımı, sanki, yox imiş tanıyan,
İndi söhbətdə deyir əllisi birdən ona “can”.
Atdı bir gün mənə söz: “Yatma daha sən də oyan!”
Bələdəm keçmişinə, başqa cürə candı, Kazım,
Dedi: lap əsli mənə sərfəli dövrandı, – Kazım.

Bir də tutdum ki xəbər, qonşu düşübdür tələyə,
Yalvarır molla kimi hər səhər-axşam fələyə.
Olub əvvəl, əl atarmış ilişəntək kələyə.
Bu dəfə amma özü, yaxşıca aldandı Kazım,
Demir heç indi mənə: “Sərfəli dövrandı”, Kazım.

Düşüb evdən uzağa, yoxdu çatan dadına da,
Çıxdı əldən nəyi var, qalmadı övladına da.
Can deyənlər unudub, yoxdu salan yadına da.
İlişib, vurmamış od, öz-özünə “yandı”, Kazım,
Bəli, hər şey dəyişir, bax belə dövrandı, Kazım!

## YOXDU EVDƏ DƏDƏM

Dədəm işdən qayıdıb; evdə özü olsa əgər,
Təzə adət tapıb o, kim ona zəng çalsa əgər.
Danır öz varlığını, işdi xəbər alsa əgər.
Göz vurur, mən də deyim, yoxdu, əmi, evdə dədəm,
Götürüb dəstəyi mən çaş qalıram ki, nə edəm?!

Oturub evdə kişi, kim soruşub, “yox” demişəm,
Gəlmişəm hətta cana, çünki yalan çox demişəm.
Olub hərdən karıxıb, yox yerinə xox demişəm.
Öyrədib göz-qulaq ol, mən də gərək zəngi güdəm,
Olsa bir zəng eyləyən onda deyim, yoxdu dədəm.

Döyür hərdən qapını qonşu Səməndər, bağırır,
Od alıb bəlkə evi, bir kömək üçün çağırır.
Belə anda dədəmin dişləri ancaq ağarır.
Özü açmır qapını... İstəmirəm mən də gedəm,
Açmamış hay salıram: yoxdu, əmi, yoxdu dədəm!

Nəsə bir əngəli var, anlamışam mən də bunu,
Sanki, “batmış gəmisi” qərq eyləyib fikrə onu.
Dözərəm hər çətinə, yaxşı ola kaş ki, sonu.
Dayanıb astanada zəngi basıb kəlləsi dəm,
Dədəmə mən deyirəm: yoxdu, əmi, evdə dədəm.

Açılıb sirri, demə, borca düşübdür nə qədər,
Nə sayaq indi deyim, ay dədə, gizlənmə hədər.
Yalvarım qoy anama, bəlkə anam çarə edər.
Yuxuda gündə deyir: – Mən batıram, çünki, bədəm,
Belə getsə olacaq lap dəli-divanə dədəm.

## YUXUMA BİR DƏ GİRƏ

Bu ilin son gecəsi qurdaladım yaddaşımı,
Saldım əvvəlcə tamam sayğaca öz daşbaşımı.
Əngəl işlər də olub, ağrıdır hərdən başımı.
Açılıb bir neçəsi... gizli qalıbdır neçəsi,
Yuxuma girməyə onlar bu ilin son gecəsi.

Sağ əliydim müdirin: xoş güzəranım var idi,
Bərk ayaqda yenə arxamda duranım var idi.
Hara lazımdır, ora zəng də vuranım var idi.
Çox gedərdim evinə, oylağım idi küçəsi,
Yuxuma girməyə onlar bu ilin son gecəsi.

"Zərf" apardım evinə, gördü məni, güldü üzü,
Fərəhindən müdirin, sanki, bir an doldu gözü.
Çağırıb süfrəsinə, tost da dedi hətta özü.
Mənə ləzzət eyləyib evdə düzəlmiş cecəsi,
Yuxuma girməyə onlar bu ilin son gecəsi.

Çəkilirdim irəli, sədd nə idi, bilməz idim,
İştah artırdı pula, hədd nə idi, bilməz idim.
O zaman dərd nə idi, bəd nə idi, bilməz idim.
Bəzəyirdi plovu çil toyuğun ağ beçəsi,
Yuxuma bir də girə kaş bu ilin son gecəsi.

Elə zənn eyləməyin mən də yolumdan azanam,
Ya da bir başqası tək xəlvəti böhtan yazanam.
Yox, canım, hörmət edirdim ona, hörmət qazanam.
İlişib indi müdir, gəlməyir "ordan" da səsi,
Yuxuma girməsin, ey kaş, bu ilin son gecəsi.

...Yuxu getmir gözümə, səsdədir hər an qulağım,
Çözülür iş deyəsən, sancdı bu axşam dalağım.
Əsirəm, qorxuya bax, lap təpiyib dil-dodağım
Bəlkə "qıl körpüsünü" bir zaman oldum keçəsi,
Yadıma düşdü hamı, ah, bu ilin son gecəsi.

## FÜRSƏT OLANDA

Tüğyan edirdin, a kişi, bir zaman,
Göydə qapırdın kökəni, ay aman!
Halın olub xeyli yamandan, yaman.
Çıxdı əlindən elə imkan, kişi,
Tüstülənib indi alış yan, kişi.

Saldılar axır səni zildən-bəmə,
Katibə yoxdur, çayı qoysun dəmə.
Keyləşib axırda olubsan səmə,
Heç səni salmaz saya xortdan, kişi,
Tüstülənib indi alış yan, kişi.

Ömr eyləyib baxma yaşa dolmusan,
Fitnədə məşhuri-cahan olmusan.
Bəd əməlindən saralıb-solmusan,
Torba sümüksən, əriyib can, kişi,
Tüstülənib indi alış yan, kişi.

Yaxşılığı zərrə qədər qanmadın,
Dost-tanışın halına bir yanmadın.
Sən qudurub heç bu günü anmadın,
Yoxdu daha səndə o ad-san, kişi,
Tüstülənib indi alış, yan, kişi.

Aldı səni kölgəsinə, işlədin.
Bal verənin barmağını dişlədin.
Fürsət olanda arada kişnədin,
Gözlərini tutdu sənin qan, kişi,
Tüstülənib indi alış, yan, kişi.

## MÜFTƏ YEYİB, MÜFTƏ İÇİB

Üzdəniraqlar hərifi tez seçir,
Xərcə salır, cənginə hər kim keçir.
Baş düzəlincən, key oluncan içir.
Müftə içib ağlı kəsəndən bəri,
Var pulu, ancaq tikilib cibləri.

Dostunu təriflə göyə qaldırır,
Toy pulunu, bax, bu sayaq saldırır.
Xərcə salır, çəkmə-filan aldırır.
Kassaya getmir, çəkilir tez geri,
Var pulu, ancaq tikilib cibləri.

Astaca him-cim eyləyir dostuna,
Lap məni saqqal gətiribdir cana.
Ustanı "gör", bəsdi bir üçlük ona.
Sən də mənim can-ciyərimdən biri,
Var pulu, ancaq tikilib cibləri.

Olsa qonaqlıq, yeri lap başdadır,
Həddin aşır, baxma dədəm yaşdadır.
Çünki ağıl yaşda deyil, başdadır.
Pul adı gəlsə, dəyişər tez yeri,
Var pulu, ancaq tikilib cibləri.

Bunca xəsis görməmişəm mən hələ,
Vay halına çöldə sənə rast gələ!
Söyləyəcək: bağ belə, bostan belə...
Amma ki, pul versə, əsər əlləri,
Var pulu, ancaq tikilib cibləri.

## BU ZATIQIRIQ

Bədxahın, fitnəkarın məclisi arəstədi, bax!
Bədəməldir çoxusu, cümləsi bir dəstədi, bax!
Orda qeybət qıranın bir parası xəstədi, bax!
Qızışıblar yenə də düşməlidir dava-dalaş,
Məclisin sahibi lap zatıqırıqdır, ay dadaş!

Çağırıb mənzilinə; oynamağa nərdi də var,
Gülərüz olsa da çox yanğılı bir dərdi də var.
Yığılan tay-tuşunun mərdi də, namərdi də var.
Seçilir fitnə salan – dolma burundur, sarı qaş,
Məclisin sahibi lap zatıqırıqdır, ay dadaş!

Döşəyir bir dələduz guya biri yayda onun,
Tapdayıb sol ayağın qəsdlə tramvayda onun.
Günahın bəlkə yumaz dağdan axan çay da onun...
Barışıblar təzəcə, çünki yeyib müftəcə aş,
Məclisin sahibi lap zatıqırıqdır, ay dadaş!

Qeybət ancaq fikrin dildəki ifadəsidir,
Ya da bədxah ürəyin ərşə çıxan cır səsidir.
Dalda qeybət qırana bircə qapaz vur, bəsidir.
Özünü sən nə itir, əsla bu anda nə da çaş,
Məclisin sahibi lap zatıqırıqdır, ay dadaş!

Nə bilim fitnəsi var, yoxsa uyardım felinə?!
Ayaq açdım hara gör, bir gədənin mənzilinə.
Bələd oldum: xəbisin qəlbi sızırmış dilinə.
Nə ola, düşməyə heç bir də güzarım bura kaş,
Məclisin sahibi lap zatıqırıqdır, ay dadaş!

Dalda qeybət qıranın məsləki min rəngə çalır,
Orda-burda danışır, ortaya həngamə salır.
Düşcəyin “dartma-yaxam”, gendə durub ləzzət alır.
Kələyi çıxsa boşa, sanki, düşür başına daş,
Məclisin sahibi lap zatıqırıqdır, ay dadaş!

## KİŞİ ÇAYDAN XAR OLMAZ

El içində özünü gör necə rüsvay eylədin,
Tiyan altında yatan hər yetənə tay eylədin.
Yerə vurdun, atanın zəhmətini zay eylədin.
Baxma ki, söhbət edir çoxları dar çayxanada,
Olmayıb məxməri çaydan kişi xar çayxanada.

Qurşanırsan boğazı yaşlamağa, yağlamağa,
Başlayırsan bəbətək nalə çəkib ağlamağa.
Çarəsi bircə qalır əl-qolunu bağlamağa.
Amma, gəl gör hərənin öz yeri var çayxanada,
Olmayıb məxməri çaydan kişi xar çayxanada.

Keflənib sübhi-səhər olsa gələnlər bu yana,
Gətirir müştərini hər dəfə vallahi, cana.
Çayçı qaş-göz eyləyir, bəlkə bir azca utana.
Eşidir səs-küyünü, az qala, kar çayxanada,
Olmayıb məxməri çaydan kişi xar çayxanada.

"Oxuyub" yan cibini olsa kəsənlər yanını,
Tərif et çayxananı, bax, bu, qaraldar qanını.
Baxma donquldasa da, qurtara bilsən canını.
Zənn edərsən ki, çalır dost sənə tar çayxanada,
Olmayıb məxməri çaydan kişi xar çayxanada.

Badə düşkünləri meyçün axıdır göz yaşını,
Dili söz tutmasa da, tərpədir ancaq başını.
Sən də atsaydın əgər badə-filanın daşını.
Mən edərdim bu işi aləmə car, çayxanada,
Olmayıb məxməri çaydan kişi xar çayxanada.

Sözümün müxtəsəri, məğzi nədir anla görüm,
Əməlindən utanıb öz-özünü danla, görüm.
Ya da lül-atəş olub çil beçətək banla görüm.
Bizə nə, var yerimiz olsa da qar, çayxanada,
Olmayıb məxməri çaydan kişi xar çayxanada.

## VƏZİFƏDƏN BƏRK YAPIŞ

Bərk yapış, qoyma qaçar yağlı vəzifən, a kişi,
Sirli bir zəng səsinə bağlı vəzifən, a kişi.
Tab gətirmir "ürəyi" dağlı vəzifən, a kişi.
Hələlik yoxdu dəyən, çox güvənirsən özünə,
Əhli-kefsən, görünür, dünya görünmür gözünə.

Sal işə adətini – gah mıxa vur, gah da nala,
Çünki əyyam belədi, sən də çalış qalma dala.
Başını girlə, səni salmayalar köhnə hala.
Yoxsa gec-tez düşəcək agah olanlar izinə,
Əhli-kefsən, görünür, dünya görünmür gözünə.

Boş-bekardın nə qədər, lap səni boğmuşdu kədər,
Yol tapınca bu yerə sən qapı döydün nə qədər.
Durmağın astanada getmədi hər halda hədər.
Keçmisən iş başına, barı, əməl et sözünə,
Əhli-kefsən, görünür, dünya görünmür gözünə.

Təftiş olsa, təzə yerdə günahın azdı məgər?!
Bu sən öl, arxivi çox qurdalayan olsa, əgər.
Günahın daş yerinə bir təpəni bəlkə çəkər.
Sən batarsan ki, yəqin işləsən hərgah düzünə,
Əhli-kefsən, görünür, dünya görünmür gözünə.

Tamaha qalsa əgər, bəlkə, tayın az tapılar,
Balaca cəhd eyləsən, yolmağa bir "qaz" tapılar.
Çətin ancaq sənə tay, indi kefi saz tapılar.
Başa düş, çoxdu vuranlar bu əməldən dizinə,
Əhli-kefsən, görünür, dünya görünmür gözünə.

Elə bilmə bu vəzifə yazılıbdır adına,
Barı bir ibrət elə, keçmişini sal yadına.
Kəllən haqqı, bu dəfə çatmayacaqlar dadına.
Tanıyan çoxdu səni, masqa da taxsan üzünə,
Əhli-kefsən, görünür, dünya görünmür gözünə.

## GETSƏ BELƏ

Aləm olar sədrimiz salsa bizi yadına,
Yoxdu çatan bizlərin, vallahi, imdadına.
Tamarzıyıq nə vaxtdır, yağlı yemin dadına.
Xeyli azalmış bu qış hətta güləş payımız
Getsə belə, ay sədr, lap azalar sayımız.

Tövlə soyuq olsa da, biz dözürük birtəhər,
Axur da bomboş qalıb, yem gəzirik hər səhər.
Çulğalayıb dərd bizi, az qala, boğsun qəhər.
Giley-güzarnan keçib qışdakı hər ayımız,
Getsə belə, ay sədr, lap azalar sayımız.

Olsa da qış fəslinin qayğıların anlayan,
Yem işini olmayıb amma ki, sahmanlayan
Olmayacaq bəlkə də sizləri heç danlayan.
Bir dəriyik – bir sümük, yoxdu bizim tayımız,
Getsə belə, ay sədr, lap azalar sayımız.

Gözdən uzaq düşmüşük, barı bir hərdən dəyin,
Fermadakı nöqsana kimdi günahkar, deyin?
Süd planı dolmasa, bizdə günah görməyin.
Halımızı kaş görə nəzarətçi dayımız,
Getsə belə, ay sədr, lap azalar sayımız.

Dərdimizi yüz dəfə ərz eyləyiblər sizə,
Hər yana səs düşməmiş çarə qılın siz bizə.
İndi tədarük görün, çıxsa əgər qar dizə.
Ərşə çıxar naləmiz, bəlkə də, ah-vayımız,
Getsə belə, ay sədr, lap azalar sayımız.

## VİCDAN ALVERÇİLƏRİ

Haqq sözü söyləməyi çox da asan sanma, kişi,
Desən üstündə dayan, hər nə ola, danma, kişi.
Qulp qoyanlar olacaq, heç alışıb-yanma, kişi,
Çünki çoxdur, dəyişən indi adı, sanı pula,
Var satanlar hələ də, ay kişi, vicdanı pula.

Bəşər övladı axı dünyada bir cür doğulur,
Ərsəyə yetdi ya kasıb, ya da ki, dövlətli olur.
Varlı kefdə, kasıbın taleyi qəmdə boğulur,
Neyləsin, çünki satırlar şərəfi-şanı pula,
Var satanlar hələ də, ay kişi, vicdanı pula.

Tutmusan bir çoxutək bəlkə də fikrində nələr,
Demə vacibdi maşın, bir quru can da bəs elər.
Güzəranın xoş olar, karına hər yerdə gələr,
Baxma qurban eyləyir bir parası canı pula,
Var satanlar hələ də, ay kişi, vicdanı pula.

Sən çalış, tər tökərək, rütbəyə zəhmətlə ucal,
Hansı əndazədə olsan sən həmən ölçüdə qal,
Baxma üstdən-aşağı, dost-tanışı bir yada sal
Əfsus olsun ki, verən var hələ meydanı pula.
Var satanlar hələ də, ay kişi, vicdanı pula.

Qoydu getdi neçəsi topla dağılmaz zalını,
Bəlkə heç bəlli deyil kimdi yeyənlər malını,
Vurdurub bir parası astanaya at nalını
Həris imiş çoxunun, sən demə, al-qanı pula,
Var satanlar hələ də ay kişi, vicdanı pula.

Fikrə dalma, bilirəm, mən ürəyindən keçəni,
Puldu gündüz eyləyən varlıya zülmət gecəni,
Heyf, azdır tanıyan yaxşını pisdən seçəni,
Sorma möhtac eyləyən bəs nədir insanı pula,
Var satanlar hələ də, ay kişi, vicdanı pula.

## PUL Kİ VAR

Söylə, bağlı qapını şəstlə sənə kimdir açan?
Sirli bir möcüzədir, olmaya "sim-sim"dir açan?
Deyəsən anlamısan: xəlvəti him-cimdir açan,
Bir işarənlə yəqin pul hərisi cuşa gəlir,
Pulu göstərsən əgər pulgirə, hər şey düzəlir.

Fikrini arif olan düşməyə bilməz ki, başa,
Cibini qurdalasan, az qalacaq ağlı çaşa.
Başa düşdüm niyə dəymir oxun heç yerdə daşa,
Ox bata bilmədiyi daş-divarı pul ki dəlir,
Pulu göstərsən əgər pulgirə, hər şey düzəlir.

Sənə düşmən kəsilən rüşvət alandırsa, əgər,
Bilsə ki, cib dolacaq naz-qozu bir xeyli çəkər,
Çox da düşməndi sənə, ağzı-zadı yoxdu məgər?
Xeyri olsa, üzünə düşsə tüpürcək də silir,
Pulu göstərsən əgər pulgirə, hər şey düzəlir.

Yüz cür alim-filanın bir yerə yığsan cəmini,
Fayda verməz bir işin tapmasan hərgah çəmini,
Pulu salsan, çıxarar dəryada batmış gəmini,
Puldakı qüdrəti lap keyqulu, nadan da bilir,
Pulu göstərsən əgər pulgirə, hər şey düzəlir.

Keçmişə xas bu miras dargöz olanlar da qalıb,
Güdüb ancaq cibini lövbərini harda salıb,
Lap yeyib şişsə belə, dərsini hər halda alıb,
Bağlayıb gözlərini çoxlarının müftə gəlir,
Pulu göstərsən əgər pulgirə, hər şey düzəlir.

## KİŞİ SÖZ VERSƏ ƏGƏR...

Sözü vicdan sayanın dünyada olmaz yalanı,
Tanıyan varmı görən ağ yalanı dəb salanı?
Öz sözündən dönənin kaş ki, olaydı palanı.
Tanınaydı beləsi ömrü boyu getsə hara,
Müftə gəlməz, a kişi, cib güdən ömründə kara.

Kişi söz verdi, gərək öz sözün üstündə dura,
Dura bilmirsə əgə, öz dilinə damğa vura.
Məşhurundan biri var, göstərərəm gəlsə bura.
Beləsi azdı məgər, çoxdu bu tipdə avara,
Müftə gəlməz, a kişi, cib güdən ömründə kara.

Sözü hər yerdə bütöv, milyon içində yüz olar,
Düşünürsən kişinin hər sözü yəqin düz olar.
Məəttələm nakişidə bunca da saysız üz olar?
Bir xeyirxah iş üçün cəhd eyləməz qəlbi qara,
Müftə gəlməz, a kişi, cib güdən ömründə kara.

Xeyrini çoxdu güdən, bircəsi kaş ki, tapıla,
Verdiyi öz sözünün fikrinə hər gün qapıla.
Söz yetincə yerinə, qəlbi külüngsüz çapıla.
Beləsi olsa əgər, hökmən olar qəlbi yara,
Müftə gəlməz, a kişi, cib güdən ömründə kara.

Yaxşılıq bəllidi ki, getməyib heç vaxtı hədər,
Sözü düz, qəlbi təmiz var aramızda nə qədər.
Söz yalan çıxsa əgər, dolmalıdır qəlbə kədər.
Bir bəladır bu yalan, hamı gəlib bəlkə zara,
Müftə gəlməz, a kişi, cib güdən ömründə kara.

## HAQLI SANANDA ÖZÜNÜ

Qalmışam mat niyə hey əlsiz-ayaqsız döyülür?!
Əksər iclasda elə arxa-dayaqsız döyülür.
Mən deyəndə bu kişi, hər dəfə haqsız döyülür.
Turşudur bir parası gözgörəsi üz-gözünü,
Yanıram haqsız olan, haqlı sananda özünü.

Var deyənlər mənə: sus, haqlı çəkilsə dara da,
Dözməsən, yum gözünü, lap elə, olsan harada.
Torlu gözlərdə, demə, ağ görünürmüş qara da.
Haqsızın hay-harayı üstələyir haqq sözünü,
Yanıram haqsız olan, haqlı sananda özünü.

Sus deyən kimdi axı? – Rəisə gendən baş əyən,
Ona dəllallıq edən, müftə pula "layka" geyən.
Özütək müftəxora, "gözləri çox toxdu" deyən,
Gözü ki, kölgəlidir, söyləyə bilmir düzünü,
Yanıram haqsız olan, haqlı sananda özünü.

Düşünürlər ki, nə var, çox şeyi mən qanmıram heç,
Demaqoqdur desə də kimsə mənə – yanmıram heç.
Görsəm haqsızlıq olur yazmalıyam – danmıram heç.
Salmışam səksəkəyə bəlkə də vallah, yüzünü,
Yanıram haqsız olan, haqlı sananda özünü.

Elə haqsızlıq olur, dünyada sığmır ağıla,
Oxşadırlar belə bir söhbəti hərdən nağıla.
Haq tutur öz yerini, aləmi dünya dağıla.
Haqsıza hamı gərək göstərə öz sərt üzünü,
Yanıram haqsız olan, haqlı sananda özünü.

## BUNLARI MƏN BİLİRƏM

Güvənib arxasına həddin aşanlar hələ var,
Şorpatək qaynamamış bəzi daşanlar hələ var.
Qudurub pul gücünə, ağlı çaşanlar hələ var.
İlişəndə tapılır əlli yerə zəng çalanı,
Bunları mən deyirəm, bəllidi yerdə qalanı.

Hələ var bir parası, olsa da bir xeyli yaşı,
Gəl ki, bir növcavanın ağlına möhtacdı başı.
İşdə meydan sulayır haqlıya, haqsız bu naşı,
Yığıb öz dövrəsinə dəmkeşi, dümbək çalanı,
Bunları mən deyirəm, bəllidi yerdə qalanı.

Unudubdur, deyəsən, burnu nə vaxtı ovulub,
Guya heç yoxdu bilən son dəfə hardan qovulub.
"Kişi" buyruq quludur, lap elə yaltaq doğulub.
Eyləyibdir "su yolu" işdəki ensiz dalanı,
Bunları mən deyirəm, bəllidi yerdə qalanı.
İşdə bir çoxlarının xirtdəyə yığmış canını,
Demaqoq sandığının gündə qaraldır qanını.
Boş oturmur bu "kişi" iş gününün bir anını.
Fikri-zikri budu ki, dolmalıdır cib planı,
Bunları mən deyirəm, bəllidi yerdə qalanı.

Dinmirəm mən hələlik, bostanıma atsa da daş,
Bilirəm gec-tezi var: olmalıdır işləri yaş.
Yoxlama gəlsə əgər, ağrıyacaq bir neçə baş.
Dada çatmaz bu dəfə heç birinin ağ yalanı,
Bunları mən deyirəm, bəllidi yerdə qalanı.

## BİLSƏYDİ NƏYİM VAR

Xudmani yerim vardı mənim, iş də ki, çim yağ,
Bilmişdi müfəttiş gəzirəm kef-damağım çağ.
Çəkdi sinəmə, sanki, çalın-çarpazı bir dağ
İndi təzədən tapdı məni, çünki qəmişdi,
Gördü bu dəfə yoxlaması sərfəsiz işdi.

Mən görməmişəm heç belə müftə pula mail
Yəqin düşünüb burda olar əhdinə nail.
Təklif eylədim xırda-para, olmadı qail.
Tərif eylədim keçmişini qoltuğu şişdi,
Gördü bu dəfə yoxlaması sərfəsiz işdi.

Eyhamla mənim bostanıma xeyli daş atdı,
Hərdən də qızışdı, bağırıb aləmi qatdı.
Hərçənd o da heç vermədi fayda, fısı yatdı.
Olmuşdu deyənlər bu müfəttiş iti dişdi,
Gördü bu dəfə yoxlaması sərfəsiz işdi.

Sanki, bu müfəttiş dönüb oldu qaraquş, ley,
Dərhal şığıdı anbara, gəl tapmadı bir şey.
Axşam eylədim bir balaca xəlvəti "ley-pey"
Vurdu arağı, süfrəyə dördəlli girişdi,
Gördü bu dəfə yoxlaması sərfəsiz işdi.

Heç saymadı boynunda onun haqqı-sayım var,
Qarnında kababım, neçə çaynik də çayım var.
Yazdı nə ki var, amma ki, bilmirdi dayım var.
Bir həftə nə yazmışdısa, bir zənglə dəyişdi,
Gördü bu dəfə yoxlaması sərfəsiz işdi.

Bir həftə yeyib-içdiyini şotkaya saldım,
Axırda tutub zorla bütün xərcimi aldım.
Saldım yola, ardınca hələ vedrə də çaldım.
Çünki o dalımca mənə "əclafdı" demişdi,
Gördü bu dəfə yoxlaması sərfəsiz işdi.

## GÖRDÜ YALANDIR

Gəldi müfəttiş bizə bir gün, qağa,
Başladı hər bir sənədə baxmağa.
Cəhd eylədi hətta qara yaxmağa.
Bəlkə dolan saxta plandır – dedi...
Yoxladı düz faktı, “yalandır” dedi.

Sərf eylədi boş yerə çox vaxtını,
Yoxladı bir-bir yazılan faktını.
Tapmadı bir şey, qınadı baxtını.
Əngəl işin bəlkə kalandır, – dedi,
Yoxladı düz faktı, “yalandır”, dedi.

Söylədi kimdirsə şikayət yazıb,
Guya müdir doğru yolundan azıb.
Çoxlarına xəlvəti xəndək qazıb.
Ortaya cəncəl də salandır, – dedi,
Yoxladı düz faktı, – “yalandır”, – dedi.

Kimsə yazıb: heç kəsi saymır müdir,
Mat qalırıq, qorxusu yoxdur, nədir.
Gözgörəsi aşkara söhbət gedir.
Həm də yaman rüşvət alandır – dedi,
Yoxladı düz faktı, – “yalandır”, dedi.

Böhtanı yazmışdım özümdən özüm,
İndi yığılmış daha yoldan gözüm.
Şübhə oyatmışdı mənim hər sözüm.
Guya idarəmdə talandır – dedi,
“Hər nə yazıblarsa, yalandır”, dedi.

## İLHAM QUŞ OLA...

“Odlu şerin” ki, sönüb eyləyəcəkmiş səni xar,
Elə zənn eyləyirəm ummayacaqsan qonorar.

Eyləyib cızma-qara üstünə yazdın adını,
Oxuyan anlamadı “şerinin” hərçənd dadını.
Uşağa dəxli nədir, danlama öz övladını.
Əfv edərsən ki, desəm, yoxdu, “şeir” tək adı var,
Sən güdürsən: cibinə müftəcə dolsun qonorar.

Boş cəfəngiyatını bir balaca xırdalasan,
Anlayarsan bu həyatdan neçə arşın dalasan.
Səni olmaz qınamaq, sən təbi hardan alasan.
Gözləyirsən ki, gəlib çiyninə ilham da qonar,
Sən güdürsən: cibinə müftəcə dolsun qonorar.

Gecə-gündüz yazıya vaxt itirirsən havayı,
Axtarırsan çap üçün hardasa sanballı dayı.
Şeirini kim bəyənər? Bircə özündən savayı.
Tez təxəllüs də tapıb eyləmisən aləmə car,
Sən güdürsən: cibinə müftəcə dolsun qonorar.

“Xəstəlikdən” sağalıb başqa sənət tap özünə,
Uyma təriflərə çox, var kül atanlar gözünə;
Çox inanma yetənin tərifinə, hər sözünə.
Eşidirsən məni sən, yoxsa olubsan yenə kar?
Sən güdürsən: cibinə müftəcə dolsun qonorar.

Gördüm heyvanxanada körpə, dəcəl bir ayını.
Çımxıran olsa əgər, tez götürür söz payını.
Sən də yəqin ki, götürdün hələlik öz payını.
Axıdıb bəlkə xəcalət təri sən eylədin ar,
Gümanım var ki, daha xətrinə düşməz qonorar.

## HÖRMƏTLƏ SƏNİ YAD EDİRƏM MƏN

Şair, səni hörmətlə hər an yad edirəm mən
Yurdundakı bağ-bağçanı abad edirəm mən.
Hər cür dələduz, görsəm əgər, dad edirəm mən.
Keçmişdə alaqlar ki, olub, indi də vardır,
Hərçənd bu tüfeyli yenə tənqidə düçardır.

Arxivdə mirastək ilişib bir çoxu qalmış,
Künclərdə, bucaqlarda özüyçün yuva salmış.
Gizlənsə də illərlə, axır, dərsini almış.
Aşkar nə desən də, susacaq, sanma ki, kardır,
Hərçənd bu tüfeyli yenə tənqidə düçardır.

"Zəhmətlə" tikib bağda imarət – bu, yalandır,
İllərlə "sökür" iş yerini, sanki, talandır.
Hər il dəyişir "Volqa"nı, yəqin ki, kalandır.
Tez-tez danışır, ki, niyə meydan belə dardır?!
Hərçənd bu tüfeyli yenə tənqidə düçardır.

Üzdə çalışar, guya səni bir işə qoysun
Fikrində tutar ki, nə sayaq bəs səni soysun.
Boşdursa cibişdanı, çətin gözləri doysun.
Rüşvət həvəsi çünki canında bir azardır,
Hərçənd bu tüfeyli yenə tənqidə düçardır.

Dövründə, a Sabir, çoxunun sərvəti yoxmuş,
Möhnətdə keçib günləri, ancaq gözü toxmuş.
Sözsüz bədəməllər o zamanlar daha çoxmuş.
Tək-tük qalanından düzü, tarix də bezardır,
Hərçənd bu tüfeyli yenə tənqidə düçardır.

## UĞUR OLSUN YOLUNA

*Respublikanın əməkdar artisti,*
*dostum Yaşar Nuriyevə*

Gülüşün ustasısan, zirvəyədir şanlı yolun,
Bərkiyib qol-qanadın, uçmağa qadirdi qolun.
Doğurur incə gülüş səhnədə lap ciddi rolun.
Təzə, mənalı gülüşsə yeni bir fəxri ad al,
Uğur olsun yoluna, sən qanad açdıqca ucal!

Fəxrimizsən, a Yaşar! Ömrünə sirdaşdı gülüş,
Sənətin sehrinə bax, gözdən axan yaşdı gülüş.
Səhnədən antipoda tulladığın daşdı – gülüş.
Baxma çox gülməyinə, eybini hərdən yada sal!
Uğur olsun yoluna, sən qanad açdıqca ucal!

Gülüş insan canına yağ kimi dərhal yayılır,
Ovqatı təlx olanın ruhuna məlhəm sayılır.
Obrazın oynadığın tip səni görcək ayılır.
Şübhə yoxdur ki, düşür qəlbinə şəksiz təzə xal,
Uğur olsun yoluna, sən qanad açdıqca ucal!

Çox zaman əbləhə qaş-gözlə deyirsən sözünü,
Səni röyada görən tiplər açır tez gözünü.
Şəkk edirsənsə əgər, göstər uzaqdan özünü.
Görəcəksən nə sayaq oldu bir anlıq dili lal,
Uğur olsun yoluna, sən qanad açdıqca ucal!

İnsan öz gözlərinə hökm edə bilməz ki, Yaşar!
Gəl ki, gözlər yaşarıb-səhnədədir çünki Yaşar!
Gülüşü bəxş eləyən usta ürəklərdə yaşar.
Sadə qəlbinlə ömürlük necə varsan, elə qal!
Uğur olsun yoluna, sən qanad açdıqca ucal!

## BU CAHANDA

İnsan yaşayır dünyada min arzu, diləklə,
Hər gün yaradır möcüzələr şanlı əməklə.
Vardır hələ də ömr eləyən məxfi kələklə;
Əfsus ki, düşünmür ilişər bəlkə bir anda,
Zəhmətdi hər insanı ucaldan bu cahanda.

Alim, ya da fəhlə, nə yaratsa, qalacaqdır,
Şəksiz, günü-gündən ucalıb ad alacaqdır.
Tarixdə bu insan əməyi iz salacaqdır;
Müftə qazanılmır o şərəf, şöhrət, o şan da,
Zəhmətdi hər insanı ucaldan bu cahanda.

"Yağlı yer"ə meyl eyləyənin məqsədi vardır,
Yoxdursa qazancı, ona dünya belə dardır.
Tənqid də kar etmir, elə bil zırrama kardır;
Bir zərrəcə qeyrət gərək olsun axı, canda...
Zəhmətdi hər insanı ucaldan bu cahanda.

Xudmani tapıb "kölgədə" yer, yoxmu yatanlar?
Cib xətrinə vicdanını hər yerdə satanlar...
Müşkül işi sahmana salıb "dada çatanlar".
Bilsin ki, haramdır canının taqəti – qan da,
Zəhmətdi hər insanı ucaldan bu cahanda.

Zəhmətkeş olan fəhlə, əkinçi – gözü toxmuş,
Müftə gəlirin xəstəsi ancaq elə çoxmuş...
Axtar, hanı onlar?.. elə bil adları yoxmuş;
Tarixdə qalıb adları – bəy də, elə xan da,
Zəhmətdi hər insanı ucaldan bu cahanda.

## HEYRANAM YÜKSƏLİŞƏ

Heyranam, indi diyarımdakı bu yüksəlişə,
Əhsən o kəslərə, can yandırır hər yerdə işə!
Var alaqlar da, ayaqlarda gəzir ki, ilişə –
Girləyir öz başını, var qərəzi çünki hələ,
Yığasan zənbilə bir-bir, atasan lilli gölə.

Gətirir müjdə bizə hər ilimiz, hər ayımız,
Çoxalır ildən ilə pambığımız, həm çayımız.
Ölkəmiz çaldı zəfər, orda da vardır payımız. –
Döndərən var hələ də xırdaca nöqsanı filə,
Yığasan zənbilə bir-bir, atasan lilli gölə.

Son on illər elmin şanlı zəfərlər ilidir,
Yaradan bolluğu da xalqımızın öz əlidir.
Xor baxanlar əməyə, şübhəsiz, ancaq zəlidir;
Dəyməyib çünki onun zərrə qədər xeyri elə,
Yığasan zənbilə bir-bir, atasan lilli gölə.

Şöhrətin zirvəsini fəth eləmək vaxtı çatıb,
El üzüm məhsulunu dövlətə milyonla satıb.
Bir para dəymədüşər kölgədə rahatca yatıb;
Oyadan olmasa, bəlkə yata bundan belə,
Yığasan zənbilə bir-bir, atasan lilli gölə.

Görməyən yüksəlişi, antivətəndaşdı, yəqin,
Gözü kordur, dili laldır, ürəyi daşdı yəqin.
Gizlənir, çıxmır üzə, vallah işi yaşdı yəqin...
Beləsi batmalıdır, çarəsi yoxdur, lap ölə!
Yığasan zənbilə bir-bir, atasan lilli gölə.

## BAX
(*Zəhmətə xor baxanlara*)

Mat qalıbsan görürəm, sən yenə el şənliyinə,
Şöhrəti ərşə çıxan, alnıaçıq ellərə bax!

Duruxubsan bu qədər ağ qızılın sərvətinə,
Gözünü döymə nahaq, bəhrəsi bol çöllərə bax!

Şəkk edirsən deyəsən, ellərimin qüdrətinə,
Dağı-dağ üstə qoyan, çöldə qızıl əllərə bax!

Hələ ömründə özün əkməmisən bircə ağac,
Seyrə çıx, aç gözünü, gülşənə bax, güllərə bax!

Bir düşün, neyləmisən? – ömrü veribsən güdaza,
Elə şöhrət gətirən, aylara bax, illərə bax!

Əməyilə ucalan qəhrəmana büzmə dodaq,
Şəninə nəğmə qoşan, vəsf eləyən dillərə bax!

Ay əfəl, qeyrətə gəl, zəhmətə yad olma belə,
Barı, Hindistana get, yükdaşıyan fillərə bax!

## HƏR ÜZ VAR

Dostum təzə bir yerdə eşitdim ki, müdirdir,
Getdim yanına, yerdə ki, aləmdi... nə yerdi?!
Gördüm dələduzlar yığılıb, sirləri birdir;
Fürsət gəzir ancaq cibini doldura onlar, –
İblis kimidir hər biri, onlarda hər üz var.

Saldım yenə mən söhbəti, hərçənd özü yoxdur,
Vicdanına salmaz ləkə çünki gözü toxdur.
Yaltaqlıq edən hər kəsə, hər bir sözü oxdur.
Xəlvətdə qururlar tələni üzdəniraqlar,
İblis kimidir hər biri, onlarda hər üz var.

Vicdan sözünün məğzini hətta belə qanmır,
Rüşvət də alır, ev də yıxır, qorxmur, utanmır.
Sən bir üzə bax, bilsə də öz eybini danmır;
Məclisdə də onlardı coşub lovğalananlar,
İblis kimidir hər biri, onlarda hər üz var.

İllərlə dərin kök salıb onlar bu məkanda.
Zalımlara kar eyləməyir zərbə, təkan da.
Gəl ki, sürüşürlər aradan qorxulu anda;
Çox vaxt da müdirlər sayılır işdə günahkar,
İblis kimidir hər biri, onlarda hər üz var.

Çaxnaşma salan vardı ora xeyli zamandır,
İşdən qovulubdur, hərifin halı yamandır.
İşdir, qayıdırsa yerinə, Allah amandır!..
Böhtan yazacaqdır yenə də hər yerə murdar,
İblis kimidir hər biri, onlarda hər üz var.

Bir gün dedi: vicdanımı ya satmalıyam mən,
Ya da süpürüb "zir-zibili" atmalıyam mən.
Baş tutmasa... təmtəkcə özüm batmalıyam mən.
Çıxsam, təzə gəlsə, eşidib hər şeyi anlar;
Anlar ki, bu yerdə nə qədər üzdəniraq var.

## QOYMA GƏLSİN

Ey dost, bu müfəttişdi, amandı, qoyma gəlsin,
Tər basdı, işim xeyli yamandı, qoyma gəlsin.

Hay-küy qoparıb çıxmalıdır əvvəl özündən,
Qaçmaz bilirəm xırdaca nöqsan da gözündən.
Yalvar, geri qaytar, başa sal, çıxsa sözündən, –
Naz-qoz eləsə, qorxma, umandı... Qoyma gəlsin,
Ey dost, bu müfəttişdi, amandı, qoyma gəlsin.

Pərgarsan özün, tez dilə tut, səndə ki dil var...
Dil tapsan əgər, açmayacaq hər nə zibil var.
Təftiş eləyib getdiyi vallah bir il var.
Bilsə "zibil"im var, o, cumandı, qoyma gəlsin.
Ey dost, bu müfəttişdi, amandı, qoyma gəlsin.

Gördümsə müfəttiş, dolaşır hətta dilim də,
Getdi keçən il, xeyli pulum vardı əlimdə...
Əfsus ki, bu an şaqq eləyib sındı belim də;
Nöqsana hərif göz də yumandı, qoyma gəlsin,
Ey dost, bu müfəttişdi, amandı, qoyma gəlsin.

## YANIRSAN HƏLƏ DƏ

Bədəməl bir kəsə mən istəmərəm tay-tuş olum,
Çünki vardır mənim öz məsləkim, öz doğru yolum.
Hələ dəryanı üzüb keçməyə qadirdi qolum;
Sənsə bir gölməçədə qurdalanırsan hələ də,
Özünü köhnə vəzifəndə sanırsan hələ də.

Belə getsən ay əfəl, puç olacaqdır axırın,
Yatdı bəxtin, kəsilib müftə araqnan, çaxırın –
Çünki artıq açılıbdır, üzə çıxmış paxırın.
Bu səbəbdən alışıb gizli yanırsan hələ də,
Özünü köhnə vəzifəndə sanırsan hələ də.

Dona girsən də, lələ, tez bələd oldum sənə mən,
Qəbula düşmək üçün növbə tutursan yenə sən, –
Qapıdan qovsalar, girməlisən pəncərədən;
Səndə üz var, gücünə çox inanırsan hələ də,
Özünü köhnə vəzifəndə sanırsan hələ də.

Xam gəzirsən yenə də lövbərini tində salıb,
Deyəsən, müftə kababın iyi burnunda qalıb.
Borc alıb verməmisən, hey deyinir usta Talıb, –
Yolda görcək burulursan, utanırsan hələ də,
Özünü köhnə vəzifəndə sanırsan hələ də.

Kəsmir ağlım, tapılar heç sənə tay mərdimazar,
Gözləyən var – öləsən, qəbrini lap müftə qazar;
Həm də kim olduğunu başdaşına zərlə yazar –
Neçə ev yıxdığını çünki danırsan hələ də,
Özünü köhnə vəzifəndə sanırsan hələ də.

## GETSƏM HARA MƏN

Təzə yerdə hələlik asta qurdalanmalıyam,
Olmasın şübhələnən, dostumu da danmalıyam, –
Nə sayaq olsa yenə, halına mən yanmalıyam, –
Çünki dostum çatacaq dadıma, düşsəm dara mən,
Kölgəmə çəkməliyəm onları, getsəm hara mən.

Düşsə fürsət, birinə müftəcə mənzil verərəm,
İş üçün gəlsə biri "Yağlı yer"ə dil verərəm;
İşdir, ölsə dədəsi, öz şotuma il verərəm;
Olmayıb indiyəcən, gəlməyim heç bir kara mən,
Kölgəmə çəkməliyəm onları, getsəm hara mən.

Onlar heç, dostu başımdan çalışıb vaz eləyəm?
İstərəm, imkan olan yerdə kefin saz eləyəm.
Nə olan şeydi maşın, istəsə atkaz eləyəm;
Verərəm, baxmaram heç işdə qarışsa ara mən,
Kölgəmə çəkməliyəm onları, getsəm hara mən.

Əşi, dostbazlıq olubdur elə keçmişdə hələ,
Bilmirəm, indi niyə bəs düşüb hər yerdə dilə?
İşdə hərgah demaqoq düşsə duyuq, çıxsa zilə –
Səsini kəsmək üçün yaxdırıram tez qara mən,
Kölgəmə çəkməliyəm onları, getsəm hara mən.

Durub iclasda mənə söylədi "dostbaz" birisi,
Elə toy tutdum ona, az qala çıxsın dərisi, –
Çatmadı dadına heç, nə ölüsü, nə dirisi,
Maya qoydum bu işə bir balaca pul-para mən,
Kölgəmə çəkməliyəm dostumu, getsəm hara mən.

Əli düz, qəlbi təmiz dost hələ çoxdur, a kişi.
Biri var, zənn elədim, gözləri toxdur, a kişi.
Demə, bu cibkəsənin heç tayı yoxdur, a kişi...
Taladı, soydu məni, gəldim axırda zara mən,
Kölgəmə çəkməliyəm dostumu, getsəm hara mən.

## ZƏNN EDİRƏM

Zənn edirəm düzü mən, bəlkə müəlkdir bu kişi,
Gözü tox, qəlbi təmiz, dünyada təkdir bu kişi.
Demə, başdan-ayağa məxfi kələkdir bu kişi, –
Nə deyirsən qımışır, tərpədir hərdən başını,
Hiss edirsən ki, güdür xeyrini, öz daşbaşını.

Cüzi işdən ötəri getsən əgər sən yanına,
Arxayın eyləyəcək, and içəcək vicdanına.
Nə həvəsdir, demirəm, işləyib ancaq qanına;
Salacaq çək-çevirə, oynadacaq göz-qaşını,
Hiss edirsən ki, güdür xeyrini, öz daşbaşını.

Hara getsə, aparır alicənabtək özünü,
İşlədir tutya kimi yerli-yerində sözünü.
Gəl ki, bir çoxlarının pərdələməkçün gözünü, –
Göstərir hər çatana paltarının nimdaşını,
Hiss edirsən ki, güdür xeyrini, öz daşbaşını.

Baxıram, mat qalıram... bunca kələkbazlıq olar?..
Keçsə bir xam girinə, çolpa kimi tezcə yolar.
Belə yolla, “kişinin” gündə cibişdanı dollar.
Müftə pulçün, yeri gəlsə, axıdar göz yaşını,
Hiss edirsən ki, güdür xeyrini, öz daşbaşını.

Bədəməl, adət edib, gör necə alçaq peşəyə,
Fələyin çarxı dönə, işlərini kaş ki, əyə!
Vura infarkt, ola tirtap, düşə yorğan-döşəyə, –
Biz də asudə gedib nuş eləyək bozbaşını,
Hiss edirsən ki, güdür xeyrini, öz daşbaşını.

## QURBAN OLLAM

Daydayım oldu müdir, saqqala yaxdım xına mən,
Qurban ollam dayımın "Volqa"sının çarxına mən.

Yığılıb qarğa kimi müftə yeyənlər başına,
Müntəzirdir çoxusu, him-ciminə, göz qaşına,
Başlasın öz işinə, xırda-xuruş daşbaşına;
Bələdəm müftəxorun lili axan arxına mən,
Qurban ollam dayımın "Volqa"sının çarxına mən.

Sən heyif, görməmisən, yaşda elə taydı bizə,
Yolunu sal bu yana, gör necə daydaydı bizə...
Ödəməkçün çıxarın, nırx qoyub on aydı bizə;
Yoxdu heç dəbbələyən, göz qoyuram nırxına mən,
Qurban ollam dayımın "Volqa"sının çarxına mən.

Dayımın kölgəsinin ölçüsü yoxdur deyəsən.
Orda gündən qorunan təşnəli çoxdur deyəsən.
Adamın Allahı var, gözləri toxdur deyəsən, –
Öldü, əfsus ki, dayım... Pul yığıram qırxına mən,
Qurban ollam dayımın "Volqa"sının çarxına mən.

## MOLLA ƏMİ

*"Molla Nəsrəddin" jurnalına ithaf*

Şöhrətin, molla əmi, indi gəzir dildə sənin,
Yaşını qeyd edirik tarixi bir ildə sənin.
İşdi, tək-tük hədəfin varsa Muğan, Mildə sənin.
Xələfin "Kirpi" düşür harda görürsə izinə;
Təntiyibdir necə gör... yer tapa bilmir özünə.

Müftəxor, rüşvət alan yaxşı tanışdır sənə də,
Nə sayaq ərz eləyim, qalmayıb heç bir dənə də?!
Vədəbaz onda necə, indi də vardır yenə də;
İnanan yoxdu daha, amma onun hər sözünə,
Təntiyibdir necə gör... yer tapa bilmir özünə.

Saxtakar, mərdimazar, mola əmi, çox azalıb,
Gəl ki, böhtançı hələ xəlvəti künclərdə qalıb, –
Düzəlib bir parası, öz "payını" çünki alıb;
Utanır, indi taxır zil qara çeşmək gözünə.
Təntiyibdir necə gör... yer tapa bilmir özünə.

Var alaqlar, dolaşır işdə hələ əl-ayağa,
Söykəyib arxasını bir çoxu möhkəm dayağa.
Gizlədir sir-sifətin, əl atır hərdən boyağa;
Dəxli yoxdur, tanınır, rəng belə çəksə üzünə,
Təntiyibdir necə gör... yer tapa bilmir özünə.

Mola Nəsrəddin əmi, bir dələduz qalmayacaq,
Yer tapıb gözdən uzaq lövbərini salmayacaq.
Arxayın olmasın heç, öz payını almayacaq;
Əməlindən ilişib çoxdu vuranlar dizinə,
Təntiyibdir necə gör... yer tapa bilmir özünə.

## AÇIQ SÖHBƏT

Oxudum şerini mən, sevgi, məhəbbət doludur,
Yazdığın lirika da şeriyyətin bir qoludur.
Keçdiyim yollara bax, şanlı zəfərlər yoludur, –
Fəhləyəm, var inamım əllərimin qüdrətinə,
Barı, bu qüdrəti yaz, mövzu deyildirmi sənə?

Gülmə, şair, nə olar, fikir elə bir öz-özünə,
Möhtacıq bəlkə sənin adicə şair sözünə.
Yaradıb, qurduğumuz yoxsa görünmür gözünə?
Sal nəzər bir gözucu daşyonanın zəhmətinə,
Barı, bu zəhməti yaz, mövzu deyidirmi sənə?

Nə qədər şerini həsr eyləmisən dağ-dərəyə,
Nə olar, söz qoşasan sünbülə, yaxud çörəyə?
Elə vəsf eyləyəsən, yol tapa bilsin ürəyə...
Axı zəhmət çəkilir süfrəmizin nemətinə,
Barı, bu neməti yaz, mövzu deyildirmi sənə?

Tarlalar ildə olur, sanki, yaşıl bağ, a kişi!
Ağ qızıldan ucalır göylərə min dağ, a kişi!
Olmuşuq alnıaçıq, həm də üzü ağ, a kişi!
Niyə biganə qalırsan elimin sərvətinə?
Barı, bu sərvəti yaz, mövzu deyildirmi sənə?

Belə vacibdi məgər dağ dumanından yazasan, –
Sən gərək yüksəlişin hər bir anından yazasan.
Zamanın əsl igid qəhrəmanından yazasan.
Şöhrəti dildə gəzir, arxa olub millətinə,
Barı, bu şöhrəti yaz, mövzu deyildirmi sənə?

İncimə, meylini sal zəhməti vəsf eyləməyə,
Axı, ilham pərinin çoxdu sözü söyləməyə.
Qol-qanad taxmalısan arzuya, azad diləyə;
Sən təkan verməlisən yüksəlişin sürətinə,
Barı, bu sürəti yaz, mövzu deyildirmi sənə?

## YAD EYLƏYƏSƏN

Yıxılıb uçdu komam, gəl ki, abad eyləyəsən,
Yazdırıb bir yoluq “üç”, qəmdən azad eyləyəsən.

Dərdimi bilsən əgər, bir “üç”ə möhtacam, dədə!
Bezmişəm, az qalıram, baş götürüb qaçam, dədə!
Məndə yoxdur elə üz, hər qapını açam, dədə!
Nə olar ildə gəlib, oğlunu yad eyləyəsən,
Yazdırıb bir yoluq “üç”, qəmdən azad eyləyəsən.

Bəs, deyirdin ki, filankəs olacaq arxa, dayaq?
Görsə, gendən sürüşür, gözdən itir ta o... bayaq,
Barı, gəl mənzilinə bəlkə açaq birgə ayaq, –
Orda məclis qurasan, könlümü şad eyləyəsən,
Yazdırıb bir yoluq “üç”, qəmdən azad eyləyəsən.

Dədə can, aylar ötüb, yoxdur balandan xəbərin,
Düşmüşəm girdabına fırtınalı dərdi-sərin...
Çıxmışam çox quyudan, olmayıb heç bunca dərin.
Belə anlarda gərək, sən yenə dad eyləyəsən,
Yazdırıb bir yoluq “üç”, qəmdən azad eyləyəsən.

Dədə, vallah bataram, gəlməsən hərgah yanıma,
İmtahan vaxtı çatıb, lərzə düşübdür canıma.
Arxayın olma daha cibdə olan imkanıma, –
Düşünüb bəlkə özün bir şey icad eyləyəsən,
Yazdırıb bir yoluq “üç”, qəmdən azad eyləyəsən.

## OLMALIDIR

Bazarın astanası "pirdi" mənimçün, ay dədə,
Hələlik "pirdə" nə var, sirdi mənimçün, ay dədə...
Burdakı müştərilər birdi mənimçün, ay dədə:
Fərqi yoxdur nə satım, cib planım dolmalıdır,
İki dünya bir ola, mənfəətim olmalıdır.

Hey deyirsən mənə ki təhsilin atdın daşını,
Nə qədər alver ilə girləyəcəksən başını?
Bəs, demirsən, nə sayaq aldın, ay oğlum maşını?
Agah ol, alver olan yerdə qazanc qalmalıdır,
İki dünya bir ola, mənfəətim olmalıdır.

Ali məktəb bitirib, məncə, Qəzənfər dayı da,
Ortağımdır, dədəcan, burda keçirdir yayı da.
Gümanım yoxdur daha kolxoza bir də qayıda;
Olmayan gün gəliri, rəngi tamam solmalıdır,
İki dünya bir ola, mənfəətim olmalıdır.

Baxasan, qarnı şişib, üz də dönübdür tabağa,
Müştəri salsa haray, ölsə də keçməz qabağa, –
Mayamı verdi bu il tağda qalan balqabağa;
Düzü çox gec satılır, meyli çəkən salmalıdır,
İki dünya bir ola, mənfəətim olmalıdır.

Tutalım, lap oxuyub mən də olaydım dayıtək,
Bazar alverçisinə, ay dədə, diplom nə gərək?
Düşmüşəm süd gölünə, ağrımır heç burda ürək;
Müştəri eyni deyil, bəzisi hay salmalıdır,
İki dünya bir ola, mənfəətim olmalıdır.

Ortağım... əhsən ona! Dostdu bazarkomla yaman,
Birgə baş girləyirik, getsə belə xeyli zaman...
Dad əlindən, bu nəzarət də bizə vermir aman;
Duymuşuq, tez-geci var, məncə, qələm çalmalıdır,
İki dünya bir ola, mənfəətim olmalıdır.

## BİLMƏMİŞƏM, QANMAMIŞAM

Açaram sirrimi mən aləmə car eyləməsən.
Orda-burda danışıb dostumu xar eyləməsən.
Sən də yaz cızma-qara, zərrəcə ar eyləmə sən, –
Gecə-gündüz bu işə sərf edirəm hər anımı,
Qonorar dərdi mənim, lap salıb əldən canımı.

Bekaram, sərf elədim topladığım daşbaşımı,
İndi kaş çap edələr... Girləyərəm öz başımı, –
Yan alıb, dost-tanışa oynadıram göz-qaşımı;
Çap üçün yalvarıram, gizləmirəm imkanımı,
Qonorar dərdi mənim, lap salıb əldən canımı.

Köhnə nimdaş plaşım zənn eləyirdim kiçilib,
Geymişəm, lap elə bil, əynimə haqdan biçilib, –
"Yumuşam" hətta o vaxt, şənimə tostlar biçilib.
İndi o töhfə verən bilməyir heç ünvanımı.
Qonorar dərdi mənim, lap salıb əldən canımı.

Yağlı yerçün dadaşım dadıma çatmır hələlik,
Dönməyə köhnə yerə, ağlıma batmır hələlik.
Çoxdur iş – xırda-para, könlümə yatmır hələlik.
Saxlayım bəs nə sayaq öz adımı, öz sanımı?
Qonorar dərdi mənim, lap salıb əldən canımı.

Var yananlar halıma, çap eləyir yazdığımı,
Eşidib amma ki, gəl, düz yolumu azdığımı.
Köhnə işdə müdirə dalda quyu qazdığımı.
Turşudur üz-gözünü... Bax, bu qaraldır qanımı,
Qonorar dərdi mənim, lap salıb əldən canımı.

Kim alıb kölgəsinə, yaxşılığın danmamışam,
Tələ qursam da ona, mən ilişib, yanmamışam!
Bir qələt eyləmişəm, bilməmişəm, qanmamışam.
Atmamışam ortalığa, tapdalasan vicdanımı,
Qonorar dərdi mənim, lap salıb əldən canımı.

## YERİ GƏLSƏ

Növcavanlar görürəm, ay kişi, mat qalmalıdır.
Xarici hər nə zibil gəlsə, tapıb almalıdır.
Paslı zəncir də ola boynuna tez salmalıdır;
Heç utanmır, işə bax, zərrə qədər eyləmir ar,
Yeri gəlsə, beləsi əslini yəqin ki, danar.

Təzə, Milli nə alıb, geyməyib heç bir kərə də,
Nə geyirsə, tikilibdir hərəsi bir dərədə –
Şalvarı Türkiyədə, köynəyi İngiltərədə.
Eyləyir öz-özünü gözgörəti gör necə xar,
Yeri gəlsə, beləsi əslini yəqin ki, danar.

İtiribdir kələfi, halına yoxdur yananı,
Olmamış olmaz onun bir böyüyü, bir qananı.
Yəqin almır vecinə nə atanı, nə ananı;
Onların da başına bəlkə edib dünyanı dar,
Yeri gəlsə, beləsi əslini yəqin ki, danar.

Gülür hərçənd kosaya, lap keçisaqqaldı özü,
Görəsən, zahirini güzgüdə görmürmü gözü?..
Bu tifil anlamır heç bəlkə, nədir "moda" sözü –
Uzadıb saqqalını, Tarzana çox oxşarı var,
Yeri gəlsə, beləsi əslini yəqin ki, danar.

Şəkk edirsənsə əgər, çıx şəhərə sən də dolan,
Gələcək rastına çox modaya aludə olan.
Görmüşəm modabazı gülləri bulvarda yolan;
Nə nəsihət, nə filan ay kişi etmir ona kar,
Yeri gəlsə, beləsi əslini yəqin ki, danar.

Vay o gündən ki, çaşıb qonşu təzə bir şey ala,
Modabaz yeznəsi var, az qalır həngamə sala.
Dad edir; mən ölərəm, qalmaram billahi dala...
Moda düşkünləri kaş, tez bu azardan sağala –
Yoxsa, həngamə qurub eyləyəcəm aləmə car...
Yeri gəlsə, beləsi əslini yəqin ki, danar.

## TAPAR ÇARƏ MÜFƏTTİŞ

Çaxnaşma düşür, getsə müfəttiş hara, vallah,
Hər yerdə səxavət gəlir hərçənd kara vallah...
İşlər düzəlir, kimsə də düşmür dara, vallah, –
Zənn etmə olar, bəlkə üzü qarə müfəttiş,
Ört-basdır edər aktı, tapar çarə müfəttiş.

Hay-küy qoparıb, çeşməyini taxmasa olmaz,
Arxivdə nə var, qurdalayıb baxmasa olmaz.
Hərdən də ki, şimşək sayağı çaxmasa olmaz;
Keç sağ-soluna, gəlsə də zinharə müfəttiş,
Ört-basdır edər aktı, tapar çarə müfəttiş.

Saqqal belə tərpətsən ona – anlayacaqdır,
Bənd olmayacaq, bəlkə bir az danlayacaqdır.
Arifdi, özü hər işi sahmanlayacaqdır;
Salsan yola, dönməz geri, dübarə müfəttiş,
Ört-basdır edər aktı, tapar çarə müfəttiş.

Var müştəbehi, uydurur hər yerdə özündən,
Gəlsə, eləsi zərrə qədər qoyma gözündən.
Cəhd eylə, onun mətləbini anla sözündən;
Söylə ona hərdən də ciyərparə müfəttiş,
Ört-basdır edər aktı, tapar çarə müfəttiş.

Təftiş elədi, aktı yazıb, çəkdirəcək qol,
Fırlan başına him-cim elə, yatma, ayıq ol,
Axtar, nə sayaq olsa da tap, sən ona bir yol, –
Yoxsa ki, əlindən gələcək zarə müfəttiş;
Hörmət elə ki, vurmaya bir yarə müfəttiş,
Ört-basdır edər aktı, tapar çarə müfəttiş.

## ŞAİRƏ ƏHSƏN
(*Sabirsayağı*)

Şairə əhsən! Çağırırmış belə:
"Ay adı insan, özü kərtənkələ".

Müştəbeh idin çox özündən özün,
Görmədi nöqsanını ancaq gözün, –
Olmadı ömründə sənin düz sözün
Yağlı vəzifə daha düşməz ələ,
"Ay adı insan, özü kərtənkələ".

Kürsüyə qalxanda olurdun mələk,
Baş aça bilmirdi işindən fələk, –
Çoxlarına, işdə gəlirdin kələk;
Düşsə məqam, hətta qururdun tələ,
"Ay adı insan, özü kərtənkələ".

Gör necə qaldı avara, ay əfəl,
Gəlmədi daday da kara, ay əfəl, –
Düşmüsən axır ki, dara, ay əfəl;
Dambadurum dalda qalıbdır hələ,
"Ay adı insan, özü kərtənkələ".

## AMANDI, QOYMA, AY SƏDR

(*Torpağın dilindən*)

Tarlaların göz oxşayır, gör necə gendən, ay Sədr!
Kolları qayğı gözləyir həmişə səndən, ay Sədr!
Ürək sözümdü, söylədim, incimə məndən, ay Sədr!
Vədə verirsən, əməl et, keçən ilə tay olmasın,
Amandı qoyma, ay Sədr, məhsulumuz zay olmasın!

Sən mənə qayğı göstərib, nə dincəlib, nə yatmısan,
Unutmaram zəhmətini, qan-tərə sən də batmısan;
Bu il rekord məhsul üçün əcəb zəmin yaratmısan!
Şıdırğı topla pambığı, müddəti heç ay olmasın,
Amandı qoyma, ay Sədr, məhsulumuz zay olmasın!

Arxayın olma, sovkalar yatıb, daha durmayacaq,
Kollara baş vurmayacaq, kolda yuva qurmayacaq,
Tər qozadan dadmayacaq, yeyib ziyan vurmayacaq,
Səhvin olubsa bir zaman, çalış, bu il, qoy olmasın,
Amandı qoyma, ay Sədr, məhsulumuz zay olmasın!

Baş qarışır, bəzən olur sovka da düşməyir yada,
Odur ki, indidən çalış bir qoza getməsin bada;
Zəhər çilə, ziyankarın yetişməsin ağzı dada, –
Kəs kökünü, bu il ona bir qoza da pay olmasın,
Amandı qoyma, ay Sədr, məhsulumuz zay olmasın!

Boldu barı tarlaların, şəkk eləmə öz gözünə.
Yetirdim ki, bu məhsulu, düz çıxasan sən özünə,
Şişirtmə ha rəqəmləri, əngəl açarsan özünə, –
Zəhmətimiz hədər gedib sonrası ah-vay olmasın,
Amandı qoyma, ay Sədr, məhsulumuz zay olmasın!

## SALARSAN YADINA

Toxta, cırtqozluq edib, çıxma özündən yenə də,
Kabinet, ağ telefon qalmayacaqdır sənə də.
Xox gəlirsən, a müdir, lap qızışanda mənə də;
Elə rəftar elə ki, pis deməsinlər adına,
Vaxt gələr sözlərimi onda salarsan yadına.

Elə zənn eyləmə ki, hamı yumubdur gözünü,
Heç görən yoxdu necə işdə boğursan özünü;
Düşün, əvvəlcə bişir, söylədiyin hər sözünü, –
Qayıdarlar üzünə, heç nə yetişməz yadına,
Vaxt gələr, sözlərimi onda salarsan yadına.

Harda biçarə ki var, yox dayağı, bircə kəsi,
Döşəyirsən o ki var bir balaca çıxsa səsi,
Qovdun işdən tutalım, bəs uşağı? Ailəsi?
Səni birdən qovalar, kim gələcək imdadına?
Vaxt gələr, sözlərimi onda salarsan yadına.

Pislik etmək adama çünki asandır, çox asan,
Sən bacar yaxşılıq et, amma çətin sən qanasan...
Bircə anlıq özünü bəlkə qovulmuş sanasan...
Baxasan, başqasıtək, sən də bir azca dadına,
Vaxt gələr, sözlərimi onda salarsan yadına.

Çox olub, sən kimilər öz-özünü "dağ" eləyib,
Saymayıb sağ-solunu, öz kefini çağ eləyib,
Çatana bir daş atıb, lap qudurub, ağ eləyib;
Gedib axırda özü, pisliyin ancaq badına,
Vaxt gələr, sözlərimi onda salarsan yadına.

## TƏZƏ İL

Yoxdu vallah, təzə il, rəhm eyləyən fəryadıma,
Dolanım gəl başına, bəlkə çatarsan dadıma.

Ürəyimdən elə bil, bir daş asıblar – yekə daş...
Sən gəlincə işimi qurdalayan olmaya kaş!
Göz açırdım təzəcə, işlərim oldu yenə yaş;
Çəkilir ərşə yuxum, yoxlama düşsə yadıma,
Dolanım gəl başına, bəlkə çatarsan dadıma.

İşdə əmmalı sənəd var, üzə çıxsa, bataram,
Ola imkan onu da arxivə xəlvət ataram.
Gecələr bir balaca, bəlkə də rahat yataram.
Ciddi nöqsan kimi yoxsa yazacaqlar adıma,
Dolanım gəl başına, bəlkə çatarsan dadıma.

Baxan olmazmı görən, bu qoca vaxtı yaşıma?
Dikməsəydi gözünü bir parası daşbaşıma...
Başa vurdum bu ili çarə qılardım başıma;
Dara düşsəm bir dam çatmayacaq imdadıma,
Dolanım gəl başına, bəlkə çatarsan dadıma.

Bəzi sexlərdə özüm rəndələmişdim planı,
Tapdılar yoxlamada nöqsanı, hər cür yalanı, –
Hətta heç işləməyib, müftə mükafat alanı...
Hələlik girlənirəm, çoxları getdi badıma,
Dolanım gəl başına, bəlkə çatarsan dadıma.

## OLA ARXAM, DAYAĞIM

Gəldim hərçənd zavala, bilmədim ancaq haradan,
Gördüm işlər dolaşıb, astaca çıxdım aradan.
Tapılar bir də görən "çak-çuka" imkan yaradan?
Möhtacam bir dayıya, qayğıma bu anda qala,
Lap uzaqdan başıma zərrə qədər kölgə sala!

Könlünə düşsə əgər, ulduzu göydən salaram,
İstəsə, xətri üçün dümbəyi züysüz çalaram.
İş düzəldən dayının lap qadasın mən alaram, –
Ətəyindən tutaram, qalmaram ölsəm də dala,
Lap uzaqdan başıma kaş ki, bir az kölgə sala!

Olsa arxam, dayağım, mən də firavan yaşaram,
Yeri gəlsə, başaçıq zəvvar olub dağ aşaram,
Elə zənn eyləməsin, işdi, ilişsəm çaşaram,
Ölərəm, qoymaram ancaq onu gəlsin zavala,
Lap uzaqdan başıma kaş ki, bir az kölgə sala!

Belə bir daydayının müntəzirəm qulluğuna,
Alaram baldızını, baxmaram heç dulluğuna.
Sala hərdən məni də müftə pulun bolluğuna,
Orda tüğyan eləyəm, öz payını ayda ala,
Lap uzaqdan başıma kaş ki, bir az kölgə sala!

Gülməyin, azdı məgər, qoltuğa girmiş neçəsi,
Biri lap Səbzəlinin lüt cibi boş qulbeçəsi, –
Gəl, güzəranına bax, kefdə keçir hər gecəsi;
Ola bir böylə dayı, düz demirəm mən, a bala!
Lap uzaqdan başıma kaş ki, bir az kölgə sala!

Yalvarırdım fələyə bəlkə bu bəxtim oyana,
Kaş yataydı... Ayılıb tuş eləyə cib soyana.
İştahından görürəm, oxşamır əsla doyana, –
Sürüyür zorla məni, gah o zala, gah bu zala,
Dələduz müflis edib, saldı məni gör nə hala?
Demə, dayday gəzir o, öz başına kölgə sala!

## YERLİLƏR YERLİLƏRƏ
(*Yerlipərəstin dilindən*)

Ay əfəl yerlilərim, harda itib-batmısınız?
Keçmişəm iş başına, bəs niyə siz yatmısınız?
Yoxsa, öz arzunuza birdəfəlik çatmısınız?
Yığılın tez başıma, kefimiz olsun daha çağ,
Yerlilər yerlilərə olmalıdır arxa, dayaq!

İstərəm, ortaq olub, müftə gəlirdi yeyəsiz,
Gündə bir "layka" plaş, modalı şalvar geyəsiz,
İşdir, ölsəm, barı hərdən mənə rəhmət deyəsiz;
Biriniz çay gətirə, başqa biri, ehsana yağ,
Yerlilər yerlilərə olmalıdır arxa, dayaq!

Olsa yerlim, mən ölüm, baxmaram əsla yaşına,
Cavan olsun, ya qoca, qoymalıyam iş başına.
Təki daşdan çıxara pul, dolanım daşbaşına;
Harda olsam, eşidin, işləmişəm mən bu sayaq,
Yerlilər yerlilərə olmalıdır arxa, dayaq!

Baxmayın, var gəlirim, ortaq olan çoxdu mənə,
Bu səbəbdən hələlik, çox dolaşan yoxdu mənə,
Göz qoyanlar da olur, küt baxışı oxdu mənə;
Yatmayın, sahman edin işləri, olsun üzüm ağ,
Yerlilər yerlilərə olmalıdır, arxa, dayaq!

Köhnə işdə mənə də bir demaqoq yaxdı qara,
Başladı yoxlamalar, xeyli qarışmışdı ara.
Badə dostum "dağ" idi, gəlmədi əfsus ki kara...
Sürüşüb çıxmalı oldum aradan ta, bu bayaq,
Yerilər yerlilərə olmalıdır arxa, dayaq!

Kəsirəm şərti bu başdan, düşünüb qanmalısız
Yeri gəlsə, bəd ayaqda alışıb-yanmalısız.
Arxanız olduğumu birdəfəlik danmalısız;
Atmaram yoxsa bir addım da sizinlə mən ayaq,
Yerlilər yerlilərə olmalıdır arxa, dayaq!

# DÜŞƏCƏKSƏN HƏLƏ HALDAN-HALA SƏN

Bəsdi hap-gop elədin, səhvini heç anlamısan?
Yerli-yersiz nə qədər işçiləri danlamısan?
Çıxıb işdən görəsən, indi kimi yanlamısan?
Yıxacaqdın müdiri, rütbə üçün az qala sən,
Çünki dünyagörüşün dardı, qalıbsan dala sən.

Kürsüdən əl-qol atıb dahi sanırdın özünü,
Səni tənqid edənin, qəsdlə kəsirdin sözünü.
Dostunun nöqsanına amma yumurdun gözünü;
İşgüzar kəslərə də dalda qazırdın çala sən,
Çünki dünyagörüşün dardı, qalıbsan dala sən.

Gözünü pərdələdin, baxmadın hərçənd yaşına,
Çəkib öz kölgəsinə, qoydu müdir iş başına.
Yumdu göz, hətta sənin məxfi gələn daşbaşına;
Təpik atdın qudurub, süfrədə yağla, bala sən,
Çünki dünyagörüşün dardı, qalıbsan dala sən.

Ötkəm olmaq yaraşır düz danışan kəslərə, bil,
Əməlin yıxdı sənin, bir də kəsərsiz acı dil.
Doluxursan görürəm, göz yaşını gizləmə, sil;
Tüpürübsən nə sayaq, bax, o sayaq da yala sən,
Çünki dünyagörüşün dardı, qalıbsan dala sən.

Xox gəlirdin çatana, arxayın idin de, nəyə?
Çox dığırlansa da qoz düşməlidir bir mərəyə.
Sən də dağdan, ay əfəl, yumbalanıbsan dərəyə;
Xod verim, bir qulaq as, köhnə, qırıq bir vala sən, –
Düşəcəksən, a kişi, çox hələ haldan-hala sən,
Çünki dünyagörüşün dardı, qalıbsan dala sən.

## BATACAQ, DÖNSƏ GERİ

Tutub az-maz yükünü bir dələduz pul-paradan
Gördü işlər dolaşır, çıxdı əlüstü aradan...
Qayıdıb gəlmək onun ağlına girmiş haradan?
Yayılıb şayiə ki, köhnə yerində gözü var,
Batacaq birdəfəlik, dönsə geri mərdimazar!

İşdə görsəydi əgər, şən keçir hər bir anımız,
Tez qatardı aranı, lap qaralardı qanımız.
Qovulub, bir balaca rahat olubdur canımız;
Bələdəm, gəlsə, utanmaz yenə böhtan da yazar,
Batacaq birdəfəlik, dönsə geri mərdimazar!

Göz dikib "yağlı yerə" çünki cibişdan boşalıb...
Tamahı yıxdı onu... Cib soyub o, rüşvət alıb.
Aman Allah, təzədən lövbərini burda salıb...
Ola bilməz, yenə də açmaya bir "gizli bazar".
Batacaq birdəfəlik, dönsə geri mərdimazar!

Yeri gəlsə, beləsi girməyə pərgardı dona,
Təkcə pulsuzluq onu rəndələyib bəlkə yona.
Öyrənib gəzdirə söz, çatdıra tez bundan ona;
İşləyibdir qanına, ölsə, sayılmaz bu azar,
Batacaq birdəfəlik, dönsə geri mərdimazar!

Götürən olsa işə, çarəsi var, neyləyərik;
Bəd ayaqda onu rüsvayi-cahan eyləyərik.
Nə əməl sahibidir, şax üzünə söyləyərik;
Çətin ancaq düzələ, eyləyə tənqid ona kar,
Batacaq birdəfəlik, dönsə geri mərdimazar!

## HEYHAT! NƏ OLA

Haqsızlıq olan yerdə ədalət yox olurmuş,
Haqsız adamın gözləri guya tox olurmuş.
Haqsızlara haqq söz belə anda ox olurmuş –
Saxla sözünü, söyləmə, sındırmayasan baş,
Heyhat! Nə ola, səhvini hər kəs qana ey, kaş!

Haqsız danışır bir parası, sən də yanırsan.
Məcbur eləyir, haqq sözünü sən də danırsan.
Çünki bu işin aqibətin sən də qanırsan;
Danmazsan əgər, işlərin axırda olar yaş,
Heyhat! Nə ola, səhvini hər kəs qana ey, kaş!

Məruzə edir kəlləsi boş, alim adından,
Olmaz, – deyir o balqabağın guya dadından...
Xəlvətcə baxır qeydinə, söz çıxsa yadından;
Dillənsən əgər oynadacaq tez sənə göz-qaş,
Heyhat! Nə ola, səhvini hər kəs qana ey, kaş!

Haqsız sözü, bir növ elə sanballı yalandır,
Zənn etməsin heç kəs ki, yalan bağlı qalandır.
Söz sahibi, fərz eylə ki, bir zurnaçalandır;
Hər yerdə çalar, süfrəyə gəlsə kasa bozbaş,
Heyhat! Nə ola, səhvini hər kəs qana ey, kaş!

Vay halına, işdə biri rüşvət alan olsa,
Böhtan atacaq, ortaya cəncəl salan olsa.
Hər kəlməsi başdan-ayağa ağ yalan olsa;
İstər ola ya zırrama, ya sadə vətəndaş, –
İmkan ola, sən bostanına tullayasan daş,
Heyhat! Nə ola, səhvini hər kəs qana ey, kaş!

## SÖYLƏYƏCƏKDİR SÖZÜNÜ

Pah atonnan, qəmiş oğlu, elə bil ki zəlidir,
Hay salıb, guya həyatda hərə bir cür dəlidir.
Bilmək olmur nəçidir, kimdi, kimin sağ əlidir, –
Dost, nahaq fikrə gedib, boş yerə yorma özünü,
Yeri gəldikcə zaman söyləyəcəkdir sözünü.

Çarə gəzmir beləsi başdan aşan dərd-sərinə,
Elə hey qurdalayır, iş də gedir lap dərinə.
Guya, var tapdalayan haqlını haqsız yerinə.
Beləsi qəsdlə əgər yumsa da haqqın gözünü,
Yeri gəldikcə zaman söyləyəcəkdir sözünü.

Gətirib bəxti, çoxu işdə ucalmış, a kişi,
Qudurubsa, bu həyat zillətə salmış, a kişi.
Nəyi vardırsa əlindən yenə almış, a kişi.
Hələ var küncdə qalan, gizlədə bilmiş izini, –
Yeri gəldikcə zaman söyləyəcəkdir sözünü.

Unudub keçmişini, var quduranlar hələ də,
Çox "mənəm" söyləyənin quyruğu qalmış tələdə;
Zənn edir keyf edəcəkdir hələ bundan belə də.
Xeyri yoxdur, nə qədər masqaya salsa üzünü,
Yeri gəldikcə zaman söyləyəcəkdir sözünü.

Nə vəzifə, nə filan, – daima qalmır, başa düş!
İşə biganə olan əsla ucalmır, başa düş!
Bu həyatdan çoxusu dərsini almır, başa düş!
Arxayındır? Vura bilməz yerə heç kəs dizini?..
Yeri gəldikcə zaman söyləyəcəkdir sözünü.

## DÜŞDÜM TORA

Baytarlıq edib keyfə baxırdım mən özümçün,
Manqalda şişə çolpa taxırdım mən özümçün, –
Məst olcaq üzür... meydə axırdım mən özümçün...
İnsan dolaşır, düz yolunu vallah azanda,
Düşdüm tora, uydurma bir akt işdə yazanda.

Kef məclisi qurmaq, elə bil məndə azardır,
Kimdirsə, yazıb: guya, bizim ferma bazardır.
Hardan biləsən badə curun mərdimazardır?...
Gəlmişdi müfəttiş, baş-ayaq gördü qazanda,
Düşdüm tora, uydurma bir akt işdə yazanda.

Aktı oxuyub güldü müfəttiş, dedi: ey dost,
Çaqqal quzunu söylə, nə vaxtı yedi, ey dost?
Manqaldakı bəs tüstülənən şiş, nədi, ey dost?
Zənn etmə çatar dadına çaqqal belə anda,
Düşdüm tora, uydurma bir akt işdə yazanda.

Getdim nə qədər minnətə, heç olmadı fayda,
Ərz etdi müfəttiş: deməmdim mən sənə yayda?..
Vicdanla çalış fermada, olsun kişi, qayda;
Susdum dedi: şahiddi sənə gölməçə, qan da,
Düşdüm tora, uydurma bir akt işdə yazanda.

İşlər belə getsə, görürəm, batmalıyam mən,
Başlansa silis, orda gedib yatmalıyam mən.
Çarəm nədir? Öz damdaşımı satmalıyam mən;
Get-gəl salıb əldən məni, can qalmadı canda,
Düşdüm tora, uydurma bir akt işdə yazanda.

## SƏNDƏ NƏ CAN VAR

Vallahi, müdir, bir tikə sənsiz yemərəm mən,
Təhlükəli yolda sənə bağlı kəmərəm mən.
Hərgah bu canım yanmasa əsla deməræm mən;
Xəlvətcə deyim ki, araya fitnə salan var, –
Hirslənmə, sən allah, a müdir, səndə nə can var?!

Açdım sənə sirri, mən ölüm, çıxma özündən,
Anbardarı qoyma uzağa işdə gözündən, –
Duydum mən onun fikrini eyhamlı sözündən;
Ad çəkmədi, ancaq dedi ki, rüşvət alan var,
Hirslənmə, sən allah, a müdir, səndə nə can var?!

Vardır təzə mülkün, maşının, cahi-cəlalın,
Heç topla dağılmaz ki, sənin dopdolu zalın;
Ömrün boyu bəsdir sənə bu dövləti-malın, –
Əfsus ki, bilən yox hələ, səndən də kalan var,
Hirslənmə, sən allah, a müdir, səndə nə can var?!

Pulgirdi müdir söyləsələr, eyninə alma,
Tənqidə hədəf eyləsələr, eyninə alma, –
Haqsız sənə lap neyləsələr, eyninə alma, –
Çünki hələlik qayğına çox yerdə qalan var,
Hirslənmə, sən allah, a müdir, səndə nə can var?!

Ehmallı dolan, qorx ki, qarışsın ara birdən.
Fürsət gəzir əbləh sənə vursun yara, birdən;
Gözlə özünü düşməyəsən sən dara birdən;
Ardınca sənin gizli hələ zurnaçalan var, –
Sadiq qulunam, zənn eləmə məndə yalan var,
Hirslənmə, sən allah, a müdir, səndə nə can var?!

## HƏM SATIB, HƏM ALMIŞAM
(*Fırıldaqçının dilindən*)

Maşın mənimdir əgər, mən bilərəm neylərəm,
İstəsə xətrim onu dostuma bəxş eylərəm.
Gülmə, bunun sirrini, sonra sənə söylərəm;
Ağlıma heç gəlməyib, indiyəcən kalmışam,
Çox maşını mən belə, həm satıb, həm almışam.

Ay kişi, olmaz məgər, töhfə verim dostuma?
Dəxli də yoxdur bunun, mən bilən heç postuma.
Badə vurub müştərim, valeh olub tostuma;
Alverimiz baş tutub tez evə zəng çalmışam,
Çox maşını mən belə, həm satıb, həm almışam.

Bərk ilişib həmkarım, xəstədi çıxmır işə,
Düşmüşəm axır zaman mən də yaman təşvişə.
Vicvicədən az qalıb, vallahi kəlləm şişə;
Döndü işim tərsinə, lap quruyub qalmışam,
Çox maşını mən belə, həm satıb, həm almışam.

Saldı məni əngələ, öz tamahım, ay kişi!
Orda araq xəstəsi, burda vurur çay kişi!
Çatmadı fəryadıma dağ kimi dayday, kişi!
Küncdə bir ildir hələ, lövbərimi salmışam,
Çox maşını mən belə, həm satıb, həm almışam.

Çox da bu cür alverin, mən daşını atmışam,
Anlamışam səhvimi, xeyri nədir, – batmışam. –
İndi haray salmışam, Aləmi lap qatmışam;
Faydası yoxdur deyə, fikrə yaman dalmışam,
And içirəm, əfv edin, dərsimi mən almışam...

## YA ÖLÜM, YA DİRİLİM

Tamahım çoxlarıtək saldı məni dərdə, inan!
Tapmıram pul-paramı gizləməyə yer də, inan!
Qorxudan açmamışam kimsəyə bir sirr də inan!
Öz təqaüd yaşıma qalsa da lap on beş ilim,
Razıyam, birdəfəlik ya mən ölüm, ya dirilim!

Baxma, hər cür özümə , ay kişi, qulluq edirəm,
Taqətim yoxdu deyə, bəzən özümdən gedirəm, –
Çünki pul gizlədiyim taxçanı hər gün güdürəm;
Dərdimi söyləməyə gəlməyir əfsus ki, dilim,
Razıyam, birdəfəlik ya mən ölüm, ya dirilim!

Bir zaman mənzilimə salmağa tapmırdım həsir,
Düşmüşəm yağlı yerə, indi əlim pul da kəsir...
Zəngi vurcaq qapının, lap ürəyim tir-tir əsir;
Az qalıb vahimədən mil kimi vallah gərilim,
Razıyam, birdəfəlik ya mən ölüm, ya dirilim!

Başıbatmış dədəmin vardı nəyi, mən bilirəm,
Eşidirdim anamın çünki dilindən, bilirəm;
Həm də pullar nə sayaq çıxdı əlindən, bilirəm...
Salmağa tabutuna qalmadı heç bircə kilim,
Razıyam birdəfəlik ya mən ölüm, ya dirilim!

Söylədi qonşu mənə; ölməmisən, şükr elə sən,
Xərclə var-dövlətini, ay kişi, bundan belə sən!
Çarəsi bircə budur... Yoxsa, yığırsan hələ sən?
Puldu qan təzyiqimi qaldıran... Heyhat! – Nə bilim?
Razıyam, birdəfəlik ya mən ölüm, ya dirilim!

Azarım qeybə çıxıb, yoxdu pulum, çünki lütəm
Xərclədim pullarımı, xam gəzirəm bəlkə ütəm, –
Elə zənn eyləməyin bir parasından da kütəm;
Hələlik girlənirəm... Yığmağa pul gəlmir əlim,
Təzədən istəmirəm, gah mən ölüm, gah dirilim.

## AY DAYI

Baxma ki, lap müştərim azdır hələ,
Qəm yemə, keyfim, dayı sazdır hələ;
Çünki bahardır, axı, yazdır hələ, –
Yayda tapılmaz bu yerin heç tayı,
Azdı qazancım hələlik, ay dayı!

Mürgüləyir, pivə satanlar yatır,
Axşama bir çəlləyi gücnən satır.
Çəkdiyimiz xərcimiz hərdən batır;
Xeyli zərərlə başa vurduq ayı,
Azdı qazancım hələlik, ay dayı!

Çayxanalar gah boşalır, gah dolur,
Çayçıların cibləri vallah dolur.
Mən yazığın sinəsinə ah dolur;
Ah çəkirəm, gözləyirəm mən yayı,
Azdı qazancım hələlik, ay dayı!

Key satıcım camları bir-bir düzür,
Hər adama dördünü birdən süzür, –
Müştərilər ağzını hərdən büzür;
Çünki qalıb pivə, çıxıbdır zayı,
Azdı qazancım hələlik, ay dayı!

Çayxanadan təşnəli döndərdi üz,
Yay ki düşüb, gündə gəlir – pivə süz;
Haqq-hesabım indi olub dübbədüz, –
Çünki gedir ayda şefin öz payı,
Kefdi, qazancım çoxalıb, ay dayı!

Gəlməyib heç qışda müfəttiş bizə,
Yay ki gəlib, indi düşübdür izə.

Zəng eləyir, gəlməliyəm mən sizə;
Baxma müfəttişlərin artıb sayı,
Yatmamışam mən oyağam, ay dayı!

Saldı müfəttiş məni bir gün yada,
Qurdaladı, istədi versin bada.
Zəng elədim dostuma, çatsın dada, –
Orda keçirdir o müfəttiş mayı...
Yatmamışam mən oyağam, ay dayı!

## SALDI YADA

Dədəmin çoxları tez-tez dolanardı başına,
Kabinet, ağ telefon çox yaraşardı yaşına.
Vurğun idi elə bil zil qara "Volqa" maşına;
Ömrü qalsaydı əgər, bəlkə çatardı bir ada,
Ölüm hardan dədəmi bilmədim heç saldı yada.

Dədəmin hörmətinin həddi-hüdudu yox idi,
Üstünə kölgə salan dostu da hərdən çox idi –
Yerinə and içərəm, gözləri vallah tox idi;
Əl tutardı yıxılan həm qohuma, həm də yada,
Ölüm hardan dədəmi bilmədim heç saldı yada.

Gündə kef məclisinə dəvət edərdi neçəsi,
Kişi çox kefqom idi, kefdə keçib hər gecəsi.
Əskik olmazdı evin əmlik əti, həm beçəsi;
Ağzımız lap təzəcə, ay kişi, gəlmişdi dada,
Ölüm hardan dədəmi bilmədim heç saldı yada.

İki dünya bir ola, yox deməmişdi sözümə,
İmkanım vardı, alım, hər nə dəyirdi gözümə.
Nə biləydim öləcək, çarə qılaydım özümə;
İş düzəldib nə qədər ağlı dayaz, kəmsavada,
Ölüm hardan dədəmi bilmədim heç saldı yada.

Elə bil gəldi gözə, qurdular axırda tələ,
Cibinə ortaq olan, dağ kişini verdi ələ...
Can verərkən dedi: sən çox cavan olsan da hələ,
Cəhd elə, verməyəsən, bir kəsi dünyada bada,
Ölüm hardan dədəmi bilmədim heç saldı yada.

## ƏNGƏLƏ SALDIM ÖZÜMÜ

Şöhrət ardınca qaçıb, qanmadım, uydum kələyə,
Öz əlimlə özümü gör necə saldım tələyə.
Zibilim çıxdı üzə, yalvarıram mən fələyə:
Kaş ki, bir çarə qıla, danlamasınlar üzümü,
Vardı xudmani yerim, əngələ saldım özümü.

Arxivi qurdalayıb, kim evimi yıxdı mənim?
Elə bil məngənədə lap suyumu sıxdı mənim –
Bəlkə varmış qərəzi, axırıma çıxdı mənim;
Ürəyim hövl eləyir, qalmayıb artıq dözümü,
Vardı xudmani yerim, əngələ saldım özümü.

Köhnə yerdə yox idi göz qoyan heç daşbaşıma,
Kəsmişəm xeyli qulaq, baxma belə az yaşıma.
Gülmüşəm çoxlarına, gəldi mənim öz başıma;
Bu ucalmaq həvəsi bağladı, sanki, gözümü,
Vardı xudmani yerim, əngələ saldım özümü.

Doru sınmış gəmitək dalğada ləngər vururam,
Çıxmaq üçün aradan indi planlar qururam, –
Təzə işdən ötəri boynumu vallah bururam;
İşə bax, harda olum, hey danışırlar sözümü,
Vardı xudmani yerim, əngələ saldım özümü.

Başılovlu yüyürüb katibə gəldi yanıma,
Diplomun saxtalığı vicvicə saldı canıma, –
Hər nə var söylədilər dalda mənim ünvanıma...
Gördüm işlər dolaşıb, aşkar ediblər izimi,
Vardı xudmani yerim, əngələ saldım özümü.

## DƏDƏMİN HÖRMƏTİ DƏ

Dərd əyibdir belimi, xəstə, cılız canıma bax
Yarısı bəlkə sudur, şəkk eləmə, qanıma bax!
Yolunu sal bu yana, evdə güzəranıma bax, –
Şakəriydi dədəmin: işdə ucaldardı yadı,
Öldü, əfsus ki, mənə zərrəcə gün ağlamadı.

Nə biləydim bu fələk tez məni gözdən salacaq,
Elə bir dağ kişi zorla əlimdən alacaq.
Çatacam ərsəyə mən, ortada pislik qalacaq;
Süfrəmin nemətinin getdi dədəm ilə dadı,
Öldü, əfsus ki, mənə zərrəcə gün ağlamadı.

Kölgəsində nə qədər müftə yeyənlər var idi,
Düzü hərçənd – qapıçı, əyrisi – anbardar idi.
Yalvarırdım ki, götür sən məni, sanki, kar idi;
Olsa da doğma dədəm, heç mənə bel bağlamadı,
Öldü, əfsus ki, mənə zərrəcə gün ağlamadı.

Göstərim tay-tuşumun hansını mən, birdi məgər?
Ucalıblar nə sayaq, yoxdu bilən, sirdi məgər?
Dədəmin hörməti də öldü, yerə girdi məgər?
Sağ olanda dağ idi, indi çəkilmir heç adı,
Öldü, əfsus ki, mənə zərrəcə gün ağlamadı.

Dədələr var ki, gəlir hörməti hər yerdə kara,
İki dünya bir ola, oğlunu qoymaz avara, –
Düzəlir, barmağını tuşlasa vallahi hara;
Çünki var pul-parası çox da ki, yoxdu savadı,
Öldü, əfsus ki, mənə zərrəcə gün ağlamadı.

Elə zənn eyləməyin, təkcə günahkardı dədəm,
Kefə qurşandı başım çünki hələ vardı dədəm...
Belə, dünya başıma indi necə dardı dədəm;
Özü də kefqom idi, əllini heç haqlamadı,
Öldü, əfsus ki, mənə zərrəcə gün ağlamadı.

## VERƏ BARI İLİMİ

Bağlanıb taleyimin, sanki, işıq pəncərəsi,
Qalmışam zirzəmidə... Beş otaq almış hərəsi...
Nə sayaq ayda verim əlli manat ev kirəsi?
Mənzil üçün müdirə hətta çıxartdım dilimi,
Ölməyib, kaş ki, görəm mən də təzə mənzilimi!

Qışda tir-tir əsirəm, yayda da çatmır nəfəsim,
Dözmüşəm indiyəcən çıxmayıb heç yerdə səsim,
Gözləyir bəlkə hərif, astanasın gündə kəsim?
Ölə də yan cibimə salmayacam mən əlimi,
Ölməyib, kaş ki, görəm mən də təzə mənzilimi!

Növbədə öndə idim, lap axıra atdı müdir,
Başıma çəkdi sığal, hey məni aldatdı müdir.
Növbəmi, rüşvət alıb, bir kalana satdı müdir;
Bəlkə də, versəm alar, lap güvə salmış kilimi,
Ölməyib, kaş ki, görəm mən də təzə mənzilimi!

Bu bürokrat müdirin "get-gəli" öldürdü məni,
İşə quyruq bulayan bir zəli öldürdü məni,
Dələduz, pul hərisi – "sağ əli" öldürdü məni;
Yalvarıb mən ikiqat əyməli oldum belimi,
Ölməyib, kaş ki, görəm mən də təzə mənzilimi!

Arxayındır müdirim vallahi, yəqin dayıya,
Yoxsa ev verməz idi göy satana, sərpayıya, –
Tapşırıb indi mənim ömrümü bir çarpayıya;
Mənə ev verməsə, ölsəm, barı versin ilimi,
Ölməyib, kaş ki, görəm mən də təzə mənzilimi!

## SƏN ÜZƏ BİR BAX

Pəh-pəh açılır könlüm, araq bumbuz olanda.
Hərdən yığılır süfrəmə lüt, yurdsuz olan da.
Zövqümcə olur məclis, ürək qurdsuz olanda;
Yoxsa ki, vurub, son tikəni udmamış axmaq,
Dalda danışar qeybətini... Sən üzrə bir bax!

Vardır eləsi, ay kişilər, əlli yaşında, –
Gəzdir beləsin gecə-gündüz şəxsi maşında;
Məclisdə də əyləşdir onu süfrə başında, –
Bilməz çörəyin qədrini, ver lap ona bal, yağ,
Dalda danışar qeybətini... Sən üzə bir bax!

Yaxud da düzəldə işini, – əl tuta, bir kəs,
Görsə yıxılıbdır yan ötər, eyləməz heç səs,
Yolda çatana qaş-göz edər, öldü filankəs;
Qanmaz edilən yaxşılığı əsla qurumsaq,
Dalda danışar qeybətini... Sən üzə bir bax!

Qəlbi qara iblislə çörək də yemək olmaz,
Dünyada ona heç cürə dostum demək olmaz.
İllərlə nəsihət edəsən də, kömək olmaz,
Çünki paxıl insan özünü tək sevir ancaq,
Dalda danışar qeybətini... Sən üzə bir bax!

Yəqin sınayırsan, a kişi, dostunu sən də?
Dostun köməyi bəlli olur, bərkə düşəndə.
Dostluq elədim bir dələduzla, elə mən də, –
Qalmışdı bekar, kef-damağın eyləmişəm çağ,
Dalda danışar qeybətini... Sən üzə bir bax!

## TƏLƏSİ BİRCƏ BUDUR
(*Taksi sürücüsünün dilindən*)

Baxıram həmkarıma, lap utanıb tər tökürəm,
Dil tökür sərnişinə, mən də yanıb tər tökürəm;
Əbləhin hiyləsini çünki qanıb tər tökürəm, –
Fırlanıb fırfıratək, lap nə qədər zurna çala,
Tələsi bircə budur: yol pulunu üçqat ala.

Eləsi var gecələr qəsd eləyir öz canına,
Cumur o, birbaşa təyyarələrin meydanına, –
Qapıb əldən çamadan, güclə salır öz yanına!
Gətirir sərnişini, bir də dönür... bir də, dala,
Tələsi bircə budur: yol pulunu üçqat ala.

Axtarır sərnişinin hər birini bir dərədən,
Cəhd edir yolpulunu ayrıca alsın hərədən.
Desələr, lap ötürər onları bir-bir bərədən;
Təki, çox pul verələr, almayalar "xırda" dala,
Tələsi bircə budur: yolpulunu üçqat ala.

Qalıq qaytarmaq ilə zalımın yoxdur arası,
Ola lap can-ciyəri, gözlərinin də qarası...
Aparar mürdəşiri, olsa bir az pul-parası;
Sayğaca baxsa əgər, qorx ki, onu yolda sala, –
Tələsi bircə budur: yol pulunu üçqat ala.

Boşboğazlıqda keçib bir çoxu arsız qadını,
Batırır, bax beləsi taksilərin lap adını...
Qovalar, onda bilər çərçiliyin duz-dadını –
Qoyasan cibləri boş axşamacan tində qala,
İstəməz, məncə, daha yolpulunu üçqat ola.

## BAŞ QOŞMA AMANDIR

Haqsız adama haqlı irad tutsan əgər sən, –
Hay-küy qoparar ki, bu işin pərgarıyam mən, –
Vadar eləyir ki, deyəsən, qanmaz özünsən!
Cəhd eyləmə qandırmağa, müşküldü, gümandır,
Ey dost, bu yarımçıqlara baş qoşma, amandır!

Nadandı, görürsən dayanıb, iş-gücü yoxdu,
Yersiz atılıb burnunu hər söhbətə soxdu.
Şəksiz, beləsi var aramızda, hələ çoxdu...
Sazdırsa çənən, qandıra bilsən, onu qandır,
Ey dost, bu yarımçıqlara baş qoşma, amandır!

Dəhşətdi, çıxıb kürsüyə nadan çıxış etsə,
Hap-gopa baharı dəyişib qarlı qış etsə, –
Yaxud da, beli, kətməni döndərsə xış etsə,
Durma çalışıb dart ipini, çünki zamandır,
Ey dost, bu yarımçıqlara baş qoşma, amandır!

Gördün ki, biri lap qızışıb, get-gedə coşdu,
Oldun ki, sən agah, hərifin kəlləsi boşdu,
Tərpət başını, hər nə desə, söylə ki, xoşdu, –
Çünki ona qandırmağı zənn etmə asandır,
Ey dost, bu yarımçıqlara baş qoşma, amandır!

Robot kimi onlar da olurlar çənədən saz,
Künclərdə, bucaqlarda qalıbdır hələ az-maz, –
Kor tutduğunu yaxşı deyiblər ki, buraxmaz;
Vay-vay, bu yarımçıqlar əlindən!... nə yamandır,
Ey dost, bu yarımçıqlara baş qoşma, amandır!

## ƏFSUS Kİ FİKİRLƏR

Beynimdə fikirlər dolanır, bil elə bəsdir,
Eh, çarəsi yoxdursa, düşünmək də əbəsdir.
Heyrət bürümürmü səni; qəlbimdə nə səsdir?
Biçarə ürəkdir alışan dərdi-sərindən,
Əfsus ki, fikirlərlə onu yükləyirəm mən!

Fikrin yükü artdıqca ürək inləyir ancaq,
Üst-üstə yığıb qəmlərini çinləyir ancaq,
Ruhumtək onun naləsini dinləyir ancaq,
Heyhat! Dözə bilmir... Duyuram ki, düşür əldən,
Əfsus ki, fikirlərlə onu yükləyirəm mən!

Fəryad eləyir, sanki, ürək qəmli olanda,
Duyman çox asandır bunu, göz nəmli olanda, –
Dəhşətli olur vurğusu matəmli olanda;
Sancır, can atır çıxmağa hər anda yerindən,
Əfsus ki, fikirlərlə onu yükləyirəm mən!

Müşküldü onu hifz eləmək hər acı dildən,
Haqsız yazılan əmri alıb qol çəkən əldən.
Yaxud da bəlalar gətirən adi bir ildən,
İldə nə günah var, düşünən olsa dərindən,
Əfsus ki, fikirlərlə onu yükləyirəm mən!

Dərman nə edər, xəstə ürək qəmlə dolubsa,
Dövrün bu qədər fikrinə bir anbar olubsa?!
Çöhrəm kimi vaxtsız saralıb rəngi solubsa;
Kaş, susmaya ancaq hələlik qəm-kədərindən,
Əfsus ki, fikirlərlə onu yükləyirəm mən!..

# BƏXTİM GƏTİRƏ

Dəllək babayam, mən duranam öz sözüm üstə,
Xam müştərinin var yeri vallah gözüm üstə.
Gəlsin başını qırxım onun, lap dizim üstə, –
Yollam çox ədəblə tükünü, heç səsi çıxmaz,
Bəxtim gətirə, kaş ki, ola yolmağa bir qaz!

Rast gəldi xəsis müştəri, cəncəl salıram mən,
Şəkk eyləmə, cib xərcimi zornan alıram mən.
Var bir para kəslər ki, baxıb mat qalıram mən, –
Guya pulunun xırdasını almasa, olmaz,
Bəxtim gətirə, kaş ki, ola yolmağa bir qaz!

Bərbərxanaya, görsəm əgər, müştəri girdi,
Fırlanmalıyam dövrəsinə, sorma nə sirdi, –
Əllaməliyin məqsədi məlumdu ki, birdi...
Dolduqca cibişdanıma pul, keyfim olur saz,
Bəxtim gətirə, kaş ki, ola yolmağa bir qaz!

Vallah, analar doğmayıb heç usta Dadaşdan,
Hər bir sözünə müştərinin, hay verir: ay can!
Göz-qaş eyləyir, tez mənə xidmətçi o başdan;
Eyhamla deyir: heç bu da səndən dala qalmaz,
Bəxtim gətirə, kaş ki, ola yolmağa bir qaz!

Bəli, belədir adətimiz, gizləmirəm mən,
Gəlsən bu yana, şahid olarsan buna hərdən.
Gəl bir qulaq as, mırt vururuq sübhi-səhərdən, –
Açdım sənə öz sirrimi, amma demirəm – yaz,
Bəxtim gətirə, kaş ki, ola yolmağa bir qaz!

## XƏTM EDİB HAKİM İŞİ...

Qonşumuz, üzdəniraq, ay kişi, düşmüşdü dara,
Qohumun, dost-tanışın gündə gətirmişdi zara, –
Kefi kök, çırtma çalır, kimsə yenə gəldi kara;
Kişinin zərrə qədər qoymadılar rəngi sola,
Xətm edib hakim işi, arxivə tez saldı yola.

İti hakim bıçağı kəsmədi vaxtında şişi,
Qovluğu seyfə atıb, xeyli süründürdü işi.
Guya bu müftəxorun təkcə günahkardı dişi;
Əlləşib "baisi" çox dartdı sağa, dartdı sola,
Xətm edib hakim işi, arxivə tez saldı yola.

Hakimin mənzilinin dövrə vurub sağ-solunu,
Gecə-gündüz çalışıb, tapdılar axır yolunu;
O da ki, xətrə görə çırmaladı əl-qolunu, –
Bənd imiş bərli-bəzəkli çəkilən bircə qola,
Xətm edib sonra işi, arxivə tez saldı yola.

Yığılıb ildən-ilə köhnə zibil çıxdı dizə,
Kələfi açmaq üçün düşdülər axır ki, izə.
Belə hakim, mən ölüm, söylə gərəkdirmi bizə?
Fikri ancaq budu ki, gündə cibişdanı dola,
Xətm edib əngəl işi, arxivə tez saldı yola.

Gəl ki, qənbərqulusu çıxdı "alanzadələrin",
Tamahı öz evini yıxdı "kalanzadələrin".
İlişib xirtdəyinə tıxdı qalan "zadələrin..."
Hakimin indi gərək hökmü ədalətli ola,
Şübhəm artar, bu işi arxivə tez salsa yola.

## EY PUL
(*Tüfeylinin dilindən*)

Sərgərdanam, ey pul, sorağında nə zamandır,
Pəjmürdədi halım yenə, olduqca yamandır...
İşdən söz açıb, qanqaralıq salma amandır;
Əl-əl gəzirəm mən səni hər tində, dalanda,
Könlüm açılır sən cibimə müftə dolanda.

Boş-boş danışırlar, nə bilim, işdi, filandı,
Tənbəllik özü adicə, vərdişdi, filandı...
Pul xəstəliyi guya ki, bəd şişdi, filandı;
Səndən ötəri uydururam, hətta yalan da,
Könlüm açılır sən cibimə müftə dolanda.

"Volqa" maşınım, sanki, Qıratdır, çapıram mən.
Harda işi müşkül əfəl olsa, tapıram mən, –
Hiyləm boşa çıxmır payımı tez qapıram mən;
Gendən tanıyır indi məni zurnaçalan da,
Könlüm açılır sən cibimə müftə dolanda.

Baş girləyirəm, arxayınam mən, hara düşsəm,
Qorxum belə yoxdur, borana, ya qara düşsəm.
Arxamda dədəm var, ilişib lap dara düşsəm;
Mütləq çatacaq dadıma mən darda qalanda,
Könlüm açılır sən cibimə müftə dolanda.

İllərlə dolurdun cibimə, sən mənim, ey pul!
Zəhmət nədi, mən istəmədim öyrənim, ey pul!
Hərçənd, mənə axırda kəsildin qənim, ey pul!
Sənsizlik olub canıma, pul!.. Lərzə salan da,
Könlüm açılırdı cibimə müftə dolanda.

Heyhat! Necə gör, indiyəcən qanmamışam mən..,
Bir zərrə qədər halıma heç yanmamışam mən, –
Qaldım avara... Bax, bu günü anmamışam mən...
Zar-zar, bəbətək ağlayıram dilxor olanda,
Səhvim çox olub, sən cibimə müftə dolanda.

## AZ QALA

Əmrin verilincə qısılıbküncdə büzüşdün.
Girdin işə, çapdın-taladın, asta sürüşdün.
Bəxtin yenə çaldı, təzə “çim yağ” yerə düşdün...
Bir vaxtı giley eyləmirdinmi, batırsan?
İndi niyə bəs şadlığına şıllaq atırsan?

Şeytan tələsin gizli dalanlarda qurursan,
Məlumdu niyə sən elə yerlərdə durursan...
Dolduqca cibişdanına rüşvət, qudurursan;
Dayday hələlik kölgə salıb orda yatırsan, –
İndi niyə bəs şadlığına şıllaq atırsan?

Zənnimcə fırıldaqlarını bilməyən olmaz,
Çox da ümid etmə, sənə əsla dəyən olmaz.
Səndə o sifət var, işini çox əyən olmaz, –
Çünki yalanı doğru libasında satırsan,
İndi niyə bəs şadlığına şıllaq atırsan?

Fürsət ki, düşüb sirri gərək ərz eləyəm mən,
Söylərdin özün də zarafatla “kələyəm mən”, –
Hərçənd, səni xəlbirdə gərək tez ələyəm mən;
Çünki aranı, hiss edirəm, dalda qatırsan,
İndi niyə bəs şadlığına şıllaq atırsan?

Müftə pul üçün az qala vallahi ölürsən,
Girsə cibinə, çırtma çalıb yasda gülürsən,
Yəqin ki, sən aldıqlarını şeflə bölürsən;
Dəllallıq edib arzuna bu yolla çatırsan,
İndi niyə bəs şadlığına şıllaq atırsan?

## ƏFSUS Kİ, CAVANLIQ...

Heyhat! Bu cavanlıq tez ötüb, keçdi... Bir anda, –
Verdim yelə öz ömrümü bu fani cahanda!..
Mənasını qandım bu həyatın qocalanda;
Artıq bükülüb bel, nə gələr indi əlimdən,
Əfsus ki, cavanlıq nə imiş, bilməmişəm mən!

Dünya, elə bildim qocalar, mən cavan ollam,
İllər ötüşür, amma çətin mən yaşa dolam, –
Hardan, nə biləydim saralıb, gül kimi sollam;
Qalmaz bir əsər dalğalı, sıx, burma telimdən,
Əfsus ki, cavanlıq nə imiş, bilməmişəm mən!

Sonsuz bu həyatın, belə bir qanunu varmış;
Biganə olan gəncliyə, vaxtsız qocalarmış...
İllər izini alnıma sakitcə salarmış;
Dördəlli tutub qocalıq, sanki, belimdən,
Əfsus ki, cavanlıq nə imiş, bilməmişəm mən!

Getmiş gözümün nuru da, taqətsizəm həm də,
Yelkənli qayıq tək üzürəm dalğalı qəmdə...
Bəzən toxunur qəlbimə nadan belə dəmdə;
Nadan deyirəm, əfv eləyin, çıxdı dilimdən,
Əfsus ki, cavanlıq nə imiş, bilməmişəm mən!

Ey dost, mənə bax, qədrini bil, hər bir anın da,
Bir gün qocalarsan... Barı, qalsın su canında...
Gəzdirməyəsən, sən də çəlik onda, yanında;
Beş gün qayıda ömrümə kaş, gənclik ilimdən,
Əfsus ki, cavanlıq nə imiş, bilməmişəm mən!

## YAZMARAM

Bəbə ikən hələ mən, yazmağa olmuş həvəsim,
Kürsüdən Şer oxuyan, şairə bənzərdi səsim.
Ümidəm bir dayıma, yoxdu daha başqa kəsim, –
Gəlmir hərçənd dayı da, müşkül olan işdə kara,
Yanıram, kim ki, deyir: "Gəldi yenə cızma-qara".

Neçə yol zəng elədi, bəlkə İşim sahman ola –
Möhtacam mən hələ də, dərkənara, bircə qola.
Çox nəzakətlə məni şerə baxan saldı yola:
Dayımın, xətri əziz olsa da gəlmişdi zara,
Yanıram, kim ki, deyir: "Gəldi yenə cızma-qara".

Baş redaktor aparır alicənabtək özünü,
Əsla turşutmayır o, zərrə qədər üz-gözünü.
Çalır hərdən qulağım bircə "zəifdir" sözünü,
Qalmayıb yer, aparım bəs yazımı indi hara?
Yanıram, kim ki, deyir: "Gəldi yenə cızma-qara".

Hələ var dalda deyən: "lap itirib sər kələfi"
Sanır hərdən özünü dahilərin bir xələfi.
Qoyasan bir beləsin çöldə yığa ot-ələfi, –
Qarışır işdə başı, həm də görünməz bir ara",
Yanıram, kim ki, deyir: "Gəldi yenə cızma-qara".

Yenə şükür eyləyirəm ki, məni azdır tanıyan,
Arabir eyham ilə amma olubdur ancaq qınayan.
Yaxşı ki, bircə dəfə olmayıb ancaq sınayan, –
Etməyib sorğu-sual, yoxsa düşərdim ki, dara,
Yanıram, kim ki, deyir: "Gəldi yenə cızma-qara".

Sərgüzəştim beləcə oxşayır az-maz nağıla,
Kəlləmi qurdalayıb, gəlmişəm artıq ağıla.
Yazmaram bir də Şer, lap belə dünya dağıla, –
Şair ilhamı üçün yollanıram gündə bara,
Orda çoxdur mənə bənzər qurayan cızma-qara.

## QOY, ELƏ BİLSİN LALAM

Kefdi, müdir görsə də xirtdəyəcən nöqsanı,
Heç tükü tərpənməyir, onda kəramət hanı?
Yaltağa məskən olub, astanası, dörd yanı;
Zənn eləyir, qanmıram, anlamıram, mən kalam,
Eyb eləməz, dinmirəm, qoy, elə bilsin lalam.

Adət edib hər səhər işdə haray salmağa,
Növbəti laqqırtıya, dostuna zəng çalmağa.
Bir də ki, fürsət tapıb, rüşvəti tez almağa, –
Qət elədim, mən gərək, üstünü bir gün alam,
Eyb eləməz, dinmirəm, qoy, elə bilsin lalam.

Gözləyirəm qaynayıb, yaxşıca bişsin hələ,
Müftə gəlirdən yeyib, qoy “kişi” şişsin hələ.
Kim çatacaq dadına, qoy bir ilişsin hələ, –
Onda gərək zurnamı mən də kənardan çalam,
Eyb eləməz, dinmirəm, qoy, elə bilsin lalam.

Yox, hələ dərs olmayıb rüşvət alanlar ona,
İşləri müşkül olan, darda qalanlar ona.
Sərfəlidir almağa, gizli dalanlar ona –
Gəl, yenə dad eyləyir: “Xeyli gəlirdən dalam”,
Eyb eləməz, dinmirəm, qoy, elə bilsin lalam.

Topladığı hər nə var, vallah haramdır, haram,
Şahidiyəm mən deyə, yoxdu müdirnən aram.
Kimliyinə baxmaram, bir gün onunçün varam, –
Çox atını oynadır, mən gərək atdan salam,
Eyb eləməz, dinmirəm, qoy, elə bilsin lalam.

## NƏ OLARDI...

Dünyanı düzəltmək, dayı, ancaq sənə qalmış?
Agahdı sənə, mən deməmiş, kimlər ucalmış.
Qonşum kələşov mənzilinə gör nələr almış...
Qaldır məni də, hər cürə imkan var əlində,
Az-maz gəlir olsa, dolanardım, dayı, mən də.

Arxamda durub, qayğıma qalsan, nə olardı?
Xudmani yerə bir işə salsan, nə olardı?
Darda başımın üstünü alsan, nə olardı?..
Çax-çuk eləyərdim, balaca budkada-tində,
Az-maz gəlir olsa, dolanardım, dayı, mən də.

Bir müftəcə pul seyfi üzrə, kaş ki, dayazda,
Dəryaya atıllam, ola lap şaxta-ayaz da.
Bəxtim açılar, bəlkə maşın almağa yazda, –
Cövlan eləyərdim şəhəri, yüz kərə gündə,
Az-maz gəlir olsa, dolanardım, dayı, mən də.

Şahidsən özün, var dayılar, arxa-dayaqdır,
Girmiş qohumu kölgəsinə, keyfi də çağdır.
Düşməz dara vallah, nə qədər ki, dayı sağdır, –
Alsan nə olar, bircə məni kölgənə sən də?
Az-maz gəlir olsa, dolanardım, dayı, mən də.

Yaxşı duyuram, dərdi olur hətta dağın da,
Yəqin səni də tərpədəcəklər bu çağında...
Çünki qocalıbsan, daha yoxdur dayağın da –
İllərlə çalışdın, qəpiyin yoxdu cibində,
Az-maz gəlir olsa, dolanardım, dayı, mən də.

Alsa başının üstünü bir vaxtı duman-çən,
Vallah, fələyə yalvarıram, ölməyəsən sən.
Ölsən, aman Allah, dara düşsəm bataram mən,
Sağsan nə qədər barı sifariş elə kəndə,
Az-maz gəlir olsa, dolanardım, dayı, mən də.

## ELMƏ NƏ FAYDA

Yüksəlməyə, qüdrətli bir əl tutdu qolundan,
Hökm etsə çıxar, bəlkə qatarlar da yolundan,
Keçmək daha olmur, nə sağından, nə solundan;
Alim də olubsan, de görək, elmə nə fayda?
Girlən, təki gəlsin maaşın müftə hər ayda.

İllərlə bilinsin, nə icad eyləmisən sən,
Guya iş ağırdır... elə dad eyləmisən sən...
Könlün haranı istəsə, yad eyləmisən sən;
Ömrün bu kurortlarda keçir, qışda və yayda,
Girlən, təki gəlsin maaşın müftə hər ayda.

Elmin nə zaman bəs çıxacaqdır üzə, ey dost?
Tətbiq edəcəklərmi çölə, ya düzə ey dost?
Tərpənmə, yaşın qoy hələ çatsın yüzə, ey dost!
Hərçənd, bu əfəllikdə tapılmaz sənə tay da,
Girlən, təki gəlsin maaşın müftə hər ayda.

Əsrin yaşı artdıqca, yaşa sən də dolursan,
Xoş haldı bu: hərdən də ki, “tənqidçi” olursan;
Gəl ki, əsərin qol-qanadın qəsdlə yolursan, –
Bəlkə, qoyasan tənqid işində yeni qayda?
Girlən, təki gəlsin maaşın müftə hər ayda.

Alimliyinə şəkk eləyən, doğrusu çoxdur,
Çünki yenilik varsa da sanballısı yoxdur.
Dalda sürünən kəslərə tənqid iti oxdur;
Sən lövbərini salmısan illərlə sarayda,
Girlən, təki gəlsin maaşın müftə hər ayda.

Əfv et, halına mən yanıram, anla, əzizim!
Varsa qələtim, sən məni lap danla, əzizim!
Elmin daşını at, məni gəl yanla, əzizim!
Tez-tez görüşək, söhbət edək toyda, ya vayda,
Girlən, təki gəlsin maaşın müftə hər ayda.

## BOZBAŞ HAVAYI,
## AŞ HAVAYI

Artist babayam, səhnə mənə darlıq edəndə,
Toylarda keçirrəm günümü hər gecə mən də;
Keyfim kökəlir, cib də dolur çünki gedəndə...
Heç bir tamada, dünyada çatmaz mənə, qardaş!
Kaş ki, bu sənətdə ola daşdan çənə, qardaş!

Çoxdur beləsi – müftə pula meyli olanlar,
Məclis yola verməklə cibişdanı dolanlar;
Əlyandıda toy sahibini hətta yolanlar...
Behləmişəm, axşam toyumuz var yenə, qardaş!
Kaş ki, bu sənətdə ola daşdan çənə, qardaş!

Bozbaş havayı, aş havayı, day nə gərəkdir?
Bumbuz arağın yoxdu sayı, çay nə gərəkdir?
Müftə gəlir olsa, daha ah-vay nə gərəkdir?
Artist gərək hər bir əməli öyrənə, qardaş!
Kaş ki, bu sənətdə ola daşdan çənə, qardaş!

Hap-gop edirəm, zərrə qədər eyləmirəm ar,
Məclis gülüşür, səhnədə çünki "pak" adım var;
İşdə bilən olsa, elə zənn etmə qovarlar, –
Sərbəst adamam, haqqı da yoxdur dinə, qardaş!
Kaş ki, bu sənətdə ola daşdan çənə, qardaş!

Arzum budu, toylar günü-gündən, kişi, arta!
Hər gün məni pullu hərif məclisə darta!
Toy vaxtı çoxu qurşanır orda gecə karta...
Gülmə, mən ölüm, sirrimi açdım sənə, qardaş!
Kaş ki, bu sənətdə ola daşdan çənə, qardaş!

## A MƏTBƏX PİŞİYİ

Ayıq ol, aşpazı sən istəyinə qoyma çata,
Köhnə kotletlərini küftəyə xəlvətcə qata, –
Gəlsə xam müştərilər, min cürə təriflə sata;
Sən görürsən, bu olur gündə, a mətbəx pişiyi,
Liberalsan deyəsən, sən də, a mətbəx pişiyi.

Elə ki, mal gətirən, restorana ət gətirir,
Təzə ətdən payını müftəcə aşpaz götürür –
Xəlvəti müştəriyə dal qapıdan tez ötürür.
Dözə bilməz buna heç cin də, a mətbəx pişiyi,
Liberalsan deyəsən, sən də, a mətbəx pişiyi.

Müdirin adətidir, nöqsana yumsun gözünü,
Çünki təmin eləyir hər müdir əvvəl özünü.
Yoxdu bir kəsdə hünər söyləyə aşkar sözünü –
Saxlayır tənqidi qəlbində, a mətbəx pişiyi,
Liberalsan deyəsən, sən də, a mətbəx pişiyi.

Orda aşpazla müdir əlbir olublar deyəsən,
Tamaha qalsa, elə bir doğulublar deyəsən –
Neçə xam müştərini yaxşı yolublar deyəsən;
Şahidəm çünki buna mən də, a mətbəx pişiyi,
Liberalsan deyəsən, sən də, a mətbəx pişiyi.

Baxma dinmir çoxusu, hər birinin öz payı var,
Sür-sümükdən, a pişik, çıxmayacaqdır sənə kar.
Əyrilik olsa edən, cəhd elə, et onları xar, –
Salma öz lövbərini gendə, a mətbəx pişiyi,
Liberalsan deyəsən, sən də, a mətbəx pişiyi.

## ZƏNG ELƏMƏ

Gülməyin, ərz eləyim müşkülümü, siz də bilin,
Necə həngamə qopur ah, gecələr... bizdə... bilin.
Hətta qonşum da çəkib şarjımı eskizdə, bilin;
Necə mən yalvarıram arvadıma, dəng eləmə,
Sənə min yol demişəm, iş yerimə zəng eləmə.

Gah deyir tez evə gəl, qonşumuza elçi gəlib,
Gah da dublyonka satan... Ay kişi, alverçi gəlib...
Nə bilim, səbzəçi, ya heyvərə bir gülçü gəlib;
Deyirəm, çoxdu İşim, gündə məni dəng eləmə,
Sənə min yol demişəm, iş yerimə zəng eləmə.

Ya da hərdən deyinir; yolla onu tez bazara, –
Kişi, dünya dağılar, katibə bir gəlsə karar?!
Belə getsə, salacaqdır məni arvad azara, –
Deyinmə, boş-boşuna işdə məni dəng eləmə,
Sənə min yol demişəm, iş yerimə zəng eləmə.

Elə xahiş eləyir, əsla yaraşmır yaşına, –
İş düzəldim qonuma-qonşuya, öz qardaşına...
Yekə bir daş düşə nolar, sənin arvad başına!
Məni infarkt elədin, bəsdi daha dəng eləmə,
Sənə min yol demişəm, iş yerimə zəng eləmə.

## MÜFTƏDİ MƏCLİS...

Elə məclis qurula, orda ola rüşvət alan,
Müftəxor, kinli, xəbis, pulu, cibişdanı kalan.
Bədəməl, zatıqırıq, söhbəti əfsanə, yalan –
Verməyib əsla macal, tullayalar bir qazana,
Olsa nəm-nüm edəni, hökm edələr gir qazana!

Gələ məclis yerinə ortada meydan sulayan,
Aya xəlvətdə hürən, aşkara quyruq bulayan,
Xeyri olsa, ucadan qurd kimi vaxtsız ulayan –
Dolalar ağzınacan... girməyə kəfgir qazana,
Olsa nəm-nüm edəni, hökm edələr gir qazana!

Xudpəsənd, kəlləsi boş, məxfi yazanlar da gələ,
Ev yıxan, mərdimazar, yoldan azanlar da gələ.
Dələduzlar, quyunu dalda qazanlar da gələ.
Atalar ətcəbala tipləri bir-bir qazana,
Olsa nəm-nüm edəni, hökm edələr gir qazana!

Məclisə gəlməlidir yerlibazovlar da hələ,
Müftə kefdən quduran keyfisazovlar da hələ.
Yeriyən qaz yerişi, çolpa qazovlar da hələ.
Salalar “xəstələri” çarə edən “pir” qazana,
Olsa nəm-nüm edəni, hökm edələr gir qazana!

Antipodlar eşidə müftədi məclis, gələlər,
Yeyələr, həm içələr, həm də doyunca gülələr.
Məclisin “ləzzətini” sirli qazanda biləlår.
Məclis arəstə ikən, boylana bir şir qazana,
Olsa nəm-nüm edəni, hökm edələr gir qazana!

# GÜNLƏRİMİ

Yazmışam dəftərimə yadda qalan günlərimi,
Bükülü bağlamada rüşvət alan günlərimi,
Gecələr lövbərimi bağda salan günlərimi, –
O zamanlar yerimin hər yanı gülşən bağ idi,
Axı, arxam, dayağım rütbəli idi, sağ idi...

Toplamışdı başına, kölgəsi yelkən dayımız,
Fırlanırdıq arada, ayda gəlirdi payımız.
Yalta aləm yer imiş... orda keçərdi yayımız...
Vardı imkan nə danım, çünki yerim çim yağ idi,
Axı, arxam, dayağım rütbəli idi, sağ idi...

Gözlərim yaşla dolur daydayım düşcək yadıma,
Dara düşsəydim əgər işdə çatardı dadıma.
Saldırıb "Volqa"sını gör neçə ildir adıma;
Dolaşardım şəhəri, kefi-damağım çağ idi,
Axı, arxam, dayağım rütbəli idi, sağ idi...

O zamanlar mənə də hörmət edənlər çox olub,
Gözə dəymir, çoxumu qeybə çıxıbdır, yox olub.
Haq sözüm çoxlarının qəlbinə bir küt ox olub;
Çünki onlar o zaman kəlləsi boş maymaq idi,
Axı, arxam, dayağım rütbəli idi, sağ idi...

Yatdı bəxtim, elə bil çarxını döndərdi zaman,
Belimi bükdü fələk, oldu halım xeyli yaman.
Oldu vaxtsız, bu ölüm vermədi bir azca aman;
Kişi gendən görünən zirvəsi qarlı dağ idi,
Axı, arxam, dayağım rütbəli idi, sağ idi...

## ARAYIŞ

(*Bürokratlara*)

Arayış verməyinə indi peşimandı müdir,
Gümanı çıxdı boşa, "tüstülənib yandı" müdir.

Başıma əngəl açıb adicə əl boyda kağız,
Xərci varmış, nə bilim, yoxsa ki, açmazdım ağız, –
Yolunu verdi nişan katibəsi – sürməli qız...
Anladım mətləbini, başqa cürə "candı" müdir,
Gümanı çıxdı boşa, "tüstülənib yandı" müdir.

Zahirən alicənab, həm də şirindildi özü,
Gördü çox yalvarıram, bir balaca güldü gözü, –
Şübhəyə saldı məni bəzi müəmmalı sözü;
Cibimi qurdaladım, yaylığa aldandı müdir,
Gümanı çıxdı boşa, "tüstülənib yandı" müdir.

Gözlədim xeyli zaman, növbə gəlib çatdı mənə,
Yenə də basdı gopa, yağlı yalan satdı mənə, –
Arabir sözarası atmaca da atdı mənə;
Bəlkə, məndən də bir az xeyri olar, sandı müdir,
Gümanı çıxdı boşa, "tüstülənib yandı" müdir.

Ötdü aylar, təzədən getməli oldum yanına,
Zilə qalxdım, balaca vicvicə saldım canına.
Söylədi: arxayın ol, and içərək vicdanına, –
Cibimə salmadım əl, öz sözünü dandı müdir,
Gümanı çıxdı boşa, "tüstülənib yandı" müdir.

Bu bürokrat çalışıb, istədi bir şey qazana,
İşə saldım qələmi, yoxdu zaval haqq yazana.
Yazdığım dərs olacaq, bəlkə yolundan azana, –
Səhvini indi yəqin bir balaca qandı müdir,
Gümanı çıxdı boşa, "tüstülənib yandı" müdir.

## NƏLƏR GÖRDÜM

Almışdı duman hər tərəfi, çökdü qaranlıq,
Bir qüvvə mənim gözlərimi yumdu bir anlıq;
Gördüm ki, verirlər mənə müftə təzə canlıq, –
Baxdım ki, qızıldandı bu töhfə, – verilən pay,
Dünya dəyişirmiş, xəbərim yoxdu, dədəm vay!

Gördüm tiyan altında yatanlar ayılırlar,
Hər yerdə dərin rişə atırlar, yayılırlar –
Məclislərin hörmətlisi onlar sayılırlar;
Tər basdı, dedim: zəhmətimiz oldu tatam zay,
Dünya dəyişirmiş, xəbərim yoxdu, dədəm vay!

Gördüm ki, keçir iş başına şorba yeyənlər, –
Kimdən işi keçsə ona üçqat baş əyənlər;
Ferma qoçuna adicə əmlikdi deyənlər,
Bir anda düşündüm: kimə gör olmalıyıq tay,
Dünya dəyişirmiş, xəbərim yoxdu, dədəm vay!

Gördüm yenə haqsız hərifə arxa çıxırlar,
Tənqid eləyən haqsızı tənqidlə sıxırlar;
İşdən götürüb haqsızı hər yerdə yıxırlar,
Sandım ki, düşərəngələ, ensə bura lap Ay,
Dünya dəyişirmiş, xəbərim yoxdu, dədəm vay!

Bir anda da, gördüm ki, dayım qalxdı qəbirdən
Asqırdı uşaqlar bu zaman hər üçü birdən.
Lap indi də zəhləm gedir hər yerdə səbirdən;
Çünki sözünü söyləməyə çatmadı dayday,
Dünya dəyişirmiş, xəbərim yoxdu, dədəm vay!

## NƏ İŞİM VAR
(*Sabirə nəzirə*)

Aləm qarışıb bir-birinə sübhi-səhərdən,
İclas yığılıb, zorla salıb sədri yəhərdən –
Dolmuşdu gözü çoxlarının yaşla qəhərdən...
Varsa dayısı, dadına çatsın, nə işim var.
Allah vara lap dəryada batsın, nə işim var.

Çoxdandı sədr lövbərini orda salıbdır,
Kölgə salanı haqq-hesabın çoxdan alıbdır-
İşlər dolaşıb, indi dərin fikrə dalıbdır;
İstər aranı şef özü qatsın, nə işim var.
Allah vara lap dəryada batsın, nə işim var.

Dolduqca cibişdan, qudurub həddini aşdı,
Düşdü dumana, büdrədi düz yolda da çaşdı;
Çoxdan gözə dəymir, görünür işləri yaşdı, –
Satsın bağı, ya mülkünü satsın, nə işim var,
Allah vara lap dəryada batsın, nə işim var.

Bərk silkələyiblər, tökülüb dəymişi, kalı,
Aləm eşidibdir çalınan zurna-qavalı;
Dilxordu yamanca, yenə pəjmürdədi halı, –
Getsin ya mey içsin, ya həb atsın, nə işim var,
Allah vara lap dəryada batsın, nə işim var.

Xəlvətdə demə, əlbir olub rüşvət alanla,
Məclislərə gizlincə gedib döngə-dalanla;
Baş girləyib hərif illərlə yağlı yalanla, –
İstər ilişib orda da yatsın, nə işim var.
Allah vara lap dəryada batsın, nə işim var.

## ASTA SÜRÜŞ
(*Dayı məsləhəti*)

Zəng eləmək, ay bala, gəlmir kara,
Asta sürüş, yoxsa düşərsən tora.

Yağlı yeri seçməmisən sən becə,
Müftə gəlir bəllidi, hardan necə, –
Məclis saldın moda hər gün, gecə;
Lövbəri qaldır, sən özün çıx dora,
Asta sürüş, yoxsa düşərsən tora.

Arzuladın: bağda bahar-yaz ola,
Ortada bir ütməyə kök qaz ola...
Sən yolasan, kef-damağın saz ola, –
İndi gözündən axıdırsan qora,
Asta sürüş, yoxsa düşərsən tora.

Toplamısan indiyəcən pul-para,
Düşməmisən bir dəfə olsun dara, –
İndi gəzirsən başına bir çara;
Gec-tezi var, yollayacaqlar “ora...”
Asta sürüş, yoxsa düşərsən tora.

Sən də görürsən qocalıbdır dayın,
Hökmü də yoxdur, olasan arxayın, –
Bəs eləyər on ilə aylıq payın;
Rahat ölüm, mən də gedim qoy gora...
Asta sürüş, yoxsa düşərsən tora.

## ƏYRİLƏR ÜSTÜN GƏLƏ BİLMƏZ DÜZƏ

(*Dostbazın dilindən*)

Şaqqulunun arxası var arxada,
İndi tapıbdır təzə bir arxa da, –
Batmaz, əgər düşsə dərin arxa da;
Arxasızın ərşə çıxır ah-vayı,
Arxa gərəkdir adama, ay dayı!

Arxan ola, söykənəsən dağ kimi,
İş də gedər, nehrədəki yağ kimi, –
Çoxdu ölənlər, sayılır sağ kimi;
Ayda gedir sovqatı, hər cür payı,
Arxa gərəkdir adama, ay dayı!

Arxalılar harda ki, lövbər salır,
Tərpədən olmur, neçə illər qalır...
Arxasız, ancaq elə töhmət alır, –
Şəxsi işində saya gəlmir sayı,
Arxa gərəkdir adama, ay dayı!

Arxalı ölsə, bütün Aləm gedir,
Arxasızın yasına çəm-xəm gedir –
Göz qoyasan, çoxları da dəm gedir...
Arxa bir aləmdi ki... Yoxdur tayı,
Arxa gərəkdir adama, ay dayı!

İstəyir artsın sayı, çatsın yüzə,
Əyrilər üstün gələ bilməz düzə...
Arxası bir gün çıxacaqdır düzə,
"Əyri" görüb doğrayacaqlar "Ayı"
Arxa gərəkdir, adama ay dayı!

## DAĞILIR GÖYDƏ BULUDLAR

*"Heydərbabaya"*

Can atırdın görüşə bir zaman Heydərbaba, sən,
Yolunu kəsdi duman. Xeyli yubatdı səni çən...
Həsrətəm, gözləyirəm, gör neçə illərdi ki, mən;
Dağılır göydə buludlar... Günəş hökmən çıxacaq!
Vətən övladı səni bağrına bərk-bərk sıxacaq!

İran aydın səhərə durmadan addımlar atır,
Həsrətin ömrü tükənmiş, görüşün vaxtı çatır,
Al günəş müjdəçitək, hər gecə zirvəndə yatır;
Şəfəqi, parçalayıb zülməti nurtək axacaq!
Vətən övladı səni bağrına bərk-bərk sıxacaq!

Kükrəyib el qəzəbi yıxsa da şahın İranın,
Eşidir cümlə-cahan qəm dolu ahın İranın...
Axtarır göydə buludlar da pənahın İranın;
Qəzəbindən tutulub, hardasa şimşək çaxacaq!
Vətən övladı səni bağrına bərk-bərk sıxacaq!

Saxla, sovqat kimi mərd oğluna zirvəndə qarı,
Arzulardır yaşadan el atası Şəhriyarı...
Açılan al səhəri bir də görəydi o, barı!
Yaxana gül-çiçəyi ilk dəfə şair taxacaq!
Vətən övladı səni bağrına bərk-bərk sıxacaq!

Kəpəz həsrətlə baxır... Gözləyir hər gün yolunu,
Gözü yollarda qalıb, boynuna salsın qolunu.
Kaş ki, birləşdirə dağlar Arazın sağ-solunu!
O günü, dil susacaq, yaş dolu gözlər baxacaq,
Vətən övladı səni bağrına bərk-bərk sıxacaq!

## İKİ SAHİL NƏ OLA

Arzular qönçə açar, olmasa hicran, Arazım!
Bürünər gül-çiçəyə hər tərəf, hər yan, Arazım!
İki sahil, nə ola, bir görüşə, Xan Arazım!..
İlhamın vəcdə gələ, kükrəyəsən, çağlayasan!
Fərəhindən o günü kövrələsən, ağlayasan!

Gözü dolmuş anatək, qəmli baxırsan o yana...
Kaş ki, qəflət yuxusundan qara bəxtin oyana!
Suların al şəfəqin rənginə hər gün boyana, –
Ağ ümid yelkəninin sahilinə bağlayasan!
Fərəhindən o günü kövrələsən, ağlayasan!

Kaş, fələk əsrimizə çatdıra şair yaşını,
Gələ sahillərinə görməyə məsləkdaşını!
Ah çəkib, vəsf eləyə, qan ləkəli hər daşını;
Odlu misralarını kürreyi-ərzə yayasan,
Fərəhindən o günü kövrələsən, ağlayasan!

Çağlayan günlərini Şəhriyar oğlun görə, kaş!
Öz şeir bağçasının tər çiçəyindən dərə, kaş!
Qəlbinin atəşini şerə qatıb göndərə, kaş!
Şairin töhfəsini ömrü boyu saxlayasan,
Fərəhindən o günü kövrələsən, ağlayasan!

Sənə sovqat kimi Heydərbaba göndərsə qarın,
Durular göz yaşıtək möhnətə dözmüş suların...
Ah, biləydin ki, həqiqət olacaq arzuların;
Sən ümidlə yaşayıb günləri bir-bir sayasan!
Fərəhindən o günü kövrələsən, ağlayasan!

## NƏ OLA, BİR QAZ OLA

Can-ciyərsən mənə sən, gəl oturaq, ərz eləyim,
Ürəyimdən nə keçir, gör nədir arzum-diləyim.
Şəkk edən olmaya kaş, baş tuta hər cür kələyim!
Keçərəm, olsa da lap yolda duman-çən, mən ölüm,
Nə olar, bir "qaz" ola, yolmağı məndən, mən ölüm!

Tində hərçənd havayı lövbərimi salmamışam,
Xam "hərif" gözləmişəm, boş-bekar ha qalmamışam –
Olsa rüşvət gətirən, zənn eləmə, almamışam.
Yaşım azdır, saçıma baxma düşüb dən, mən ölüm,
Nə olar, bir "qaz" ola, yolmağı məndən, mən ölüm!

Yaranıb bir parası qarət edib çapmaq üçün,
Ya da dəllallıq edib, öz payını qapmaq üçün;
Mən zühur eyləmişəm yağlı hərif tapmaq üçün, –
Var səriştəm oxuyum boş cibi gendən, mən ölüm,
Nə olar, bir "qaz" ola, yolmağı məndən, mən ölüm!

Göz açandan bu sayaq girləyirəm öz başımı,
Keçən olsa girimə, saldırıram daşbaşımı.
Şəkk edirsən deyəsən? Yoxsa, sorursan yaşımı?
Yaşa qalsa, kiçiyəm bəlkə də səndən, mən ölüm,
Nə olar, bir "qaz" ola, yolmağı məndən, mən ölüm!

Şahid ol mən yanaşım... Bax, o kalandır deyəsən,
Yarağından görürəm, zurnaçalandır deyəsən;
Toyu heç başlamamış, tez beh alandır deyəsən, –
Gəzirəm bir beləsin, hətta dünəndən, mən ölüm,
Nə olar, bir "qaz" ola, yolmağı məndən, mən ölüm!

İndi ki, həsr elədin sən belə bir tostu mənə,
Kaş, fələk görməyə çox, sən kimi bir dostu mənə!
Tapşırıb işdə dayım bir balaca postu mənə...
Sirrimi aləmə car eyləmə ha... sən, mən ölüm!
Nə olar, bir "qaz" ola, yolmağı məndən, mən ölüm!

## BU SƏN ÖL

Baxma ki, yumbalanıb düşmüşəm hardan, hara mən,
Çıxmışam çox tələdən, düşməmişəm heç dara mən –
Çəkmə ah, ölməmişəm, qəm yemə, gəlləm kara mən;
Gəl kəsək şərtimizi amma bu başdan, bu sən öl,
Sözüm hər səddi keçir, olsa da daşdan, bu sən öl.

Üstümü unlu görüb, şəkk eləmə sözlərimə,
Müşkül işdən ötəri çoxdu düşən izlərimə.
Cibini qurdalasan, nur süzülər gözlərimə,
Olsa xeyrim, çəkərəm lap tükü qaşdan bu sən öl,
Sözüm hər səddi keçir, olsa da daşdan, bu sən öl.

Nə əcəb bilməmisən indiyəcən ünvanımı?
İşə gəl, gör neçəsi kəsdirir hər gün yanımı, –
Cibimə əl salana, istəsə verrəm canımı;
Etmirəm əsla şikayət hələ yaşdan, bu sən öl,
Sözüm hər səddi keçir, olsa da daşdan, bu sən öl.

Gərəyin olsam əgər, çayxanaya sal yolunu,
Sal nəzər, bərk qızışıb, olsa atan əl qolunu,
O mənəm. Hap-gop edib, saldırıram çay pulunu, –
Salıram lövbərimi orda obaşdan, bu sən öl,
Sözüm hər səddi keçir, olsa da daşdan, bu sən öl.

Bazarım olsa kasad, çarəsini tez tapıram,
Oluram sərpayı da, – toyxanada at çapıram...
Baxmıram az-çoxuna, hər nə verirlər qapıram, –
Ayırırlar payımı, həm də şabaşdan, bu sən öl,
Sözüm hər səddi keçir, olsa da daşdan, bu sən öl.

## CƏMİSİ BİRCƏ YALAN

Ol xatircəm mən ölüm, adicə dümbək çalanam,
Şakərimdir düzü, əlmuzdu əvvəl alanam.
Söyləyir bir parası, guya yalandan kalanam, –
Axı, and içməliyəm müştəri gəlsə yanıma,
Cəmisi bircə yalan bəlkə düşər hər anıma.

Müşkül iş olsa belə, dil tökərəm mən – düzələr,
Belə işlər nədi ki, lap yüzü birdən düzələr.
Arxayın eyləyirəm: "Qəm yemə heç sən..." düzələr...
Cibimin xətri üçün qəsd eləsəm də canıma,
Cəmisi bircə yalan bəlkə düşər hər anıma.

Bir nəfər rütbəli var, lap çənədən taydı mənə,
O, da quyruq bulayır çünki özü paydı mənə...
O günü birnəfəsə goplarımı saydı mənə;
Dalda, vallah, beləsi söysə də lap ünvanıma,
Cəmisi bircə yalan bəlkə düşər hər anıma.

Keçən il xeyrim olub, yan cibimin doldu biri,
Çoxu düşmüşdü tora, amma ayıq oldu biri, –
Başıma vurdu qapaz, son tükümü yoldu biri;
Yola saldım hərifi, əl basaraq vicdanıma,
Cəmisi bircə yalan bəlkə düşər hər anıma.

Hələlik girləyirəm öz başımı, çarə nədir?
Deməmiş hamı bilir müftəcə pul-parə nədir...
Bilmirəm indiyəcən əsla, üzü qarə nədir, –
Satıram mən yalanı, baxmıram heç imkanıma,
Cəmisi bircə yalan bəlkə düşər hər anıma.

Yalana torba tikib bağlamışam öz belimə,
Xam hərif axtarıram, kaş ki, düşəydi əlimə.
Çoxu çaşbaş qalacaq "qammanı" yaxsam telimə,
İnanan yoxdu, yalan, vallah hopubdur qanıma,
Cəmisi bircə yalan bəlkə düşər hər anıma.

## ELƏ ZƏNN EYLƏMƏYİN

Müdirmi işdə görüb bir balaca keyfimi saz,
Turşudub üz-gözünü, coşdu, dedi: ağlı dayaz!
Sən də get, ay demaqoq, bildiyini hər yerə yaz;
Mən bunu danmıram ha, rüşvət alandan yazıram,
Elə zənn eyləməyin, mən də yalandan yazıram.

Bələdəm bir çoxunun zahirinə, batilinə,
Ölsə, bilməz nədi iş, güc verə ancaq dilinə.
Toxunan yoxdu deyə, "dağ" müdirin "sağ əlinə" –
"Sağ əlin" daz başına kölgə salandan yazıram,
Elə zənn eyləməyin, mən də yalandan yazıram.

Gizli söhbət yeridir dəllala hər döngə, dalan,
Bu yerin xəstəsidir bərk ilişib, darda qalan;
Gülər üzlə qayıdır ovcu, cibişdanı dolan,
İşi sahmana salan gizli dalandan yazıram,
Elə zənn eyləməyin, mən də yalandan yazıram.

Sex açıb gözdəniraq, üzdəniraq bir neçəsi,
Dolanır dövrəsinə gör nə qədər qulbeçəsi...
Dağıdır el malını, kefdə keçir hər gecəsi, –
Dözmürəm, tez quduran pulu kalandan yazıram,
Elə zənn eyləməyin, mən də yalandan yazıram.

Toya qurban eyləyib bəzi müğənni canını,
Yazıram, çünki yazım xeyli qaraldır qanını.
Hələ lap zurnaçının da görürəm nöqsanını;
Şabaşı göydə qapan zurnaçalandan yazıram,
Elə zənn eyləməyin, mən də yalandan yazıram.

## AY ƏFƏL

Yerli-yersiz əyilib qalxmağa adət eləsən,
Məşq edib mollasayaq gündə ibadət elə sən.
İkiqat olmağı sən birdəfəlik qət eləsən, –
Ay əfəl, məqsədinə sən də çatarsan, bu sən öl!
Yaxşı ki, var o felin, yoxsa batarsan, bu sən öl!

Boylanıb hər tərəfə, qurdalayırsan dişini,
İzləyirsən hamının söhbətini, gərdişini.
Çünki imkan yaradıb çox uzadıblar vişini...
Olsa fürsət, aranı gündə qatarsan, bu sən öl!
Yaxşı ki, var o felin, yoxsa batarsan, bu sən öl!

İnanıb hap-gopuna, qurğu quranlar hələ var,
Ləkəni düz adama qəsdlə vuranlar hələ var.
Çox təəssüf... sənə də arxa duranlar hələ var...
Yeri gəlsə, çoxunu müftə satarsan, bu sən öl!
Yaxşı ki, var o felin, yoxsa batarsan, bu sən öl!

Ucalıbsan gözə kül atmaq ilə sən hələlik,
Elmə olsan da yamaq, ad da alıbsan hələlik.
Bilirik lövbərini harda salıbsan... hələlik!
Qulp qoyan olmasa hey orda yatarsan, bu sən öl!
Yaxşı ki, var o felin, yoxsa batarsan, bu sən öl!

Tərpədən olmasa, döz, olma xəcalətli, lələ, –
Əzrail gəlsə də tez tut dilə, yaltaqlıq elə.
Çəkinə bəlkə bir az, bir balaca rəhmə gələ,
Gəlməsə, çarəsi var: tez şər atarsan, bu sən öl!
Yaxşı ki, var o felin, yoxsa batarsan, bu sən öl!

## NƏ İŞİM VAR

Dəllal babayam, köhlənimi hey çapıram mən,
Harda ev alan müştəri varsa, tapıram mən.
Behləşmə ki, oldu payımı tez qapıram mən, –
Kimlər ya satandır, ya alandır, nə işim var?
Fərz et ev alan zurnaçalandır, nə işim var?

Hay-küylü bazartək hələlik bir yerimiz var,
Əfsus, “halal” al-verdə də dərdi-sərimiz var!..
Mənzil dəyişən sərfəli çox müştərimiz var;
Ünvanı bir az döngə-dalandır, nə işim var?
Fərz et ev alan zurnaçalandır, nə işim var?

Görsəm ki, qəfil düşdü əlimyandıya bir kəs,
Əlbəttə ki, dərhal səsinə verməliyəm səs.
Hərdən də deyirlər mənə, gəl qiyməti sən kəs, –
Sövdaları bilsəm də yalandır, nə İşim var?
Fərz et ev alan zurnaçalandır, nə işim var?

Söhbət qızışan yerlərə tez-tez gedirəm mən,
Hər gün oralarda elə var-gəl edirəm mən...
Görsəm təzə bir müştəri vardır, gülürəm mən, –
Boşdu cibi, yaxud da kalandır, nə işim var?
Fərz et ev alan zurnaçalandır, nə işim var?

Bir çox dələduz lövbərini burda salıbdır,
Guya, təzə mənzil satılır... Beh də alıbdır, –
Hərçənd, sürüşüb... Beh verən ah-vayda qalıbdır...
Maymaq hələ tinlərdə qalandır, nə işim var?
Fərz et ev alan zurnaçalandır, nə işim var?

...Dartıb mənəi də sorğu-suala çəkəcəklər,
Yəqin bilirəm, abrımı vallah bükəcəklər;
Şəksiz ki, başımda hələ lap turp əkəcəklər...
Kim harda nə mərəkə salandır, nə işim var?
Fərz et ev alan zurnaçalandır, nə işim var?

## MƏN YENƏ BATDIM

Bəxtim elə yatmışdı... İlişdim, dara düşdüm,
Çıxdım o yağışdan... Təzədən yağmura düşdüm; –
Xudmani yerim vardı, gəlib gör hara düşdüm...
Dinc durmadım, axır aranı burda da qatdım,
Əfsus ki, dolaşdım təzədən mən, yenə batdım.

Sandım ki, müdir çıxsa, yerində qalaram mən,
Gen-bol kabinetdə təzə lövbər salaram mən, –
Baxdıqca geniş pəncərədən həzz alaram mən...
Az qaldı deyəm ki, daha mən arzuma çatdım,
Əfsus ki, dolaşdım təzədən mən, yenə batdım.

Əlbəttə, müdirin babalın gündə yuyurdum,
Xəlvətdə vurub dostlar ilə hey uyuyurdum...
Sərxoşluğumu bir balaca, sanki, duyurdum, –
Son dəfə özüm bilmədim ancaq necə "yatdım",
Əfsus ki, dolaşdım təzədən mən, yenə batdım.

Bir dəfə olub dəm, hələ gör neyləmişəm mən
"Gec-tez müdiri yıxmalıyam" söyləmişəm mən.
İndi yanıram ki, necə səhv eyləmişəm mən, –
Tez banlayaraq, yatmışı röyadan oyatdım,
Əfsus ki, dolaşdım təzədən mən, yenə batdım.

Öyrənmək üçün sirrimi, çox yanlayan oldu,
İllərlə kələk qurduğumu anlayan oldu –
Hətta belə işdən ötəri danlayan oldu...
Bir dosta güvəndim, neçə həngamə yaratdım,
Əfsus ki, dolaşdım təzədən mən, yenə batdım.

...Alçaq təpə bildim müdiri, amma dağ imiş,
Gördüm ki, nəhənglər ona arxa-dayaq imiş.
Sandım ki, yatıbdır... Demə, çoxdan oyaq imiş...
Böhtan da yazıb, bostanına xeyli daş atdım, –
Zəhmət mənə qaldı... Özümü xeyli qocaltdım...
Əfsus ki, dolaşdım təzədən mən, yenə batdım.

## XƏBƏRİM VAR

İllərlə susardı telefon mənzilimizdə,
Səssiz ötüşərdi ayımız da, ilimiz də.
Bəh-bəh, yenə imkan yaranıbdır əlimizdə;
Hər gün axışırlar əli sovqatlı qonaqlar,
Hardan yel əsibdir bilirəm mən, xəbərim var.

Dəymə demişəm xətrinə, arvad, gələn olsa,
İşdir, ya da zəng eyləsə bir kəs, xəbər alsa, –
Xoşdur qonağın gəlməyi mətbəx belə dolsa;
Onsuz da bilirdim çoxalıb, artacaq onlar,
Hardan yel əsibdir bilirəm mən, xəbərim var.

Vardır çoxunun mətləbi, ancaq aça bilmir,
Xahiş necə etsin, üzü yoxdur, dili gəlmir.
Gec-tez edəcəklər yenə minnət mənə bir-bir
Bir vaxtı qohum olduğumu hətta dananlar,
Hardan yel əsibdir bilirəm mən, xəbərim var.

Minnətdaram ancaq sənə dünyada, – vəzifə!
Gəldin kara, çatdın yenə imdada, – vəzifə!
Salmırdı qohumlar məni heç yada, – vəzifə!
Oldun yenə qismət mənə, indi ayılıblar,
Hardan yel əsibdir bilirəm mən, xəbərim var.

## ÇIXMA ÖZÜNDƏN

Elə dindin, ürəyim düşdü səsindən, a müdir!
Fil edib milçəyi gəl çıxma özündən, a müdir!

Kefdə-işrətdə olursan hələlik hər gecə sən,
Yaranıbsan elə bil gündə məzə-mey içəsən.
Bilirik, iş başına keçdin əlüstü necə sən, –
Heç seçilmir yalanın əsla düzündən, a müdir!
Fil edib milçəyi gəl çıxma özündən, a müdir!

Sənsayaq işdə qohumbaz az olar, – bir dənəsən,
Nə qədər var qohumun toplamısan dövrənə sən.
Niyə yanpörtü baxırsan, a kişi, bəs mənə sən?
Qanıram fikrini eyhamlı sözündən, a müdir!
Fil edib milçəyi gəl çıxma özündən, a müdir!

Bərkə düşcək, əl atırsan tez, əlüstü yalana,
Əyriyə meydan açıb, düzlüyü saldın dalana.
İşə, guya gəlirəm iclas olandan-olana;
Qara yaxmaq tökülür vallah üzündən, a müdir!
Fil edib milçəyi gəl çıxma özündən, a müdir!

Dili olsaydı, asılqan da deyərdi sözünü:
Asılıb köhnə panaman buradan il uzunu.
Olmayan gündə də sən işdə sayırsan özünü;
Pərdəni başqasının asma gözündən, a müdir!
Fil edib milçəyi gəl çıxma özündən, a müdir!

Bu fərasətlə, kişi, çox çətin işlər düzələ,
Deyirəm asta sənə: örtülü qalsın məsələ...
Gec deyildir nə qədər, öz başına çarə elə;
Tanıyan çoxdu səni hətta izindən, a müdir!
Fil edib milçəyi gəl çıxma özündən, a müdir!

## BU ŞİKAYƏT

Hakim kəsilib qorxu əzəldən mənə, ey dost!
Düşmüş canıma vəlvələ hərçənd yenə, ey dost!
Bağrım yarılıb... Sirrimi açdım sənə, ey dost!
Sakit qala seyfimdə susa kaş bu şikayət!
Qorxum budur etsin işimi yaş bu şikayət!

Qovluqda şikayət çoxalıb, yer daha dardır,
Hay-küy qoparıblar... Mənim ünvanıma ardır;
Seçdim arasından, neçə imzalısı vardır...
Sandım gətirər bəlkə də daşbaş bu şikayət!
Qorxum budur etsin işimi yaş bu şikayət!

Zinhara gəliblər bu yazıqlar neçə ildir.
Əncam çəkəcəkdim çoxuna mən hələ bildir.
Yumdum gözümü: arxivə... Saldım yola bir-bir;
Bir sözlə: edib fikrimi çaşbaş bu şikayət!
Qorxum budur etsin işimi yaş bu şikayət!

Xeyrim ki, yox idi, düzü düşsəm də həvəsdən,
Aylarla yubatdım bu şikayətləri qəsdən.
Rüşvət də alırdım arabir hər cürə kəsdən. –
Etdi mənə qismət neçə daş-qaş bu şikayət!
Qorxum budur etsin işimi yaş bu şikayət!

Xəlvətcə verim onları bir-bir oxu, ey dost!
Şahid duracaqdır üzümə bir çoxu, ey dost!
Getmir gözümə bax bu səbəbdən yuxu, ey dost!
Bəlkə, "ora..." lap göndərə birbaş bu şikayət!
Qorxum budur etsin işimi yaş bu şikayət!

...Bir gün yığılıb hətta hücum çəkdilər onlar,
Elliklə mənim abrımı lap bükdülər onlar, –
Xudmani yerimdən bu sayaq əkdilər onlar...
Saldı başıma axırı bir daş, bu şikayət!
Gəlmiş dilə... Etmiş işimi yaş, bu şikayət!

## DÜŞMƏYƏCƏK BİR DƏ ƏLƏ

Gözləyirdim bu işə, ay dədə, çoxdan keçəsən,
Nə işin varsa, gərək indidən ölçüb-biçəsən.
Sən ayıq olmalısan ki, tükü-tükdən seçəsən;
Dədə, bərkit yerini, arzularım çoxdu hələ.
Belə fürsət mən ölüm, düşməyəcək bir də ələ.

Kaş biləydin başıma dünya olubdur necə dar,
Tindəki pivə satan Pirqulunun "Volqası" var;
Sən də gəl, bilmə rəva, övladın olsun, dədə, xar.
Mənə əvvəl maşın al, sonra da ki tez toy elə,
Belə fürsət mən ölüm, düşməyəcək bir də ələ.

Dədə, sayəndə sənin indi olubdur üzüm ağ,
Darıxırsan bilirəm, düşsəm əgər səndən uzaq.
Kəndə getsəm bataram, görməmişəm mən dərə, dağ;
Zaqsa getsəm də o söz... Karıma bəlkə bu gələ,
Belə fürsət mən ölüm, düşməyəcək bir də ələ.

İşə girsəm yanına, tez tapılar mərdimazar,
Düşər hər gün izimə, aləmə min namə yazar.
Başqa yer tap, bu hərif lap sənə xəndək də qazar.
Sən ki varsan, düzələr hər cürə müşkül məsələ,
Belə fürsət mən ölüm, düşməyəcək bir də ələ.

İndi yazdır adımı bir tanışın anbarına,
Sən də əlbəttə gələrsən, yeri gəlsə karına, –
Şərik ollam bu sayaq anbarın anbardarına;
Yola verməz, quraram mən də ona gizli tələ,
Belə fürsət mən ölüm, düşməyəcək bir də ələ.

... Pah atonnan, işə baz, keçmədi heç bir neçə ay,
Evdə bir gün başına vurdu qapaz, saldı haray, –
Demə, çox bərk ilişib, sındı beli, vay dədə vay!
Deyirəm dost-tanışa zəng elə, bəlkə düzələ,
Belə fürsət mən ölüm, düşməyəcək bir də ələ.

## ÖZGƏ DADI VAR

Badəyə aşiq mənəm, Xəyyamın ancaq adı var,
Müftəcə vurmaq, qağa... müftənin özgə dadı var.

Harda bir cibdən kalan nadan gəlibsə rastıma,
Basmışam tez bağrıma, xoş-beş edərkən dostuma.
Girmişik meyxanəyə, heyran qalıbdır tostuma...
Xam hərif hardan bilir, yanında bir ustadı var,
Müftəcə vurmaq, qağa... müftənin özgə dadı var.

Ustayam tərifləyib çox "sərçəni" "qaz" etmişəm,
Qoltuğu şişmiş "qazım..." məclis qurub, naz etmişəm.
Ütmüşəm cibişdanı, lap keyfimi saz etmişəm.
Xam quşun, tor qurmağa mənim kimi səyyadı var,
Müftəcə vurmaq, qağa... müftənin özgə dadı var.

Sübh-səhər, hərgah mənə tapılsa bir "Ağdam" alan,
Fərqi yoxdu, olsa lap dümbül çalan, ya saz çalan;
Mahirəm uydurmağa əlüstü mən min bir yalan...
Söylərəm: bu zalımın çox fitri istedadı var,
Müftəcə vurmaq, qağa... müftənin özgə dadı var.

## ÇATAN OLMAZ DADINA

Kölgənin indiyəcən bilməmişəm qədrini mən,
Bacarıb orda gərək xəlvəti çax-çux edəsən.
Arxayınsan ki, sənə yoxdu zaval, kölgədəsən;
Soruşan olsa əgər, qayğına bəs kimdi qalan?
Şefimizdir – deyərəm, üstümüzə kölgə salan.

Elə zənn eyləmə ki, müftə qazancım az olur,
Göz qoyan yoxdu mənə, ilboyu keyfim saz olur.
Tapmışam isti bucaq, burda payız, qış-yaz olur;
Desələr sözgəlişi; sizdə də var rüşvət alan?
Şefimizdir – deyərəm, üstümüzə kölgə salan.

Kölgənin qüdrətinə burda inandım, a kişi,
Sanki, röyada idim birdən oyandım, a kişi
Və nəhayət, necə yerdir bura, qandım, a kişi, –
Özü seçmiş bu yeri, yolları da döngə, dalan,
Şefimizdir – potaboy, üstümüzə kölgə salan.

Boyuna baxma şefin, harda desən hörməti var,
İstəsə, kölgəsinə əlli tanış-dostu yığar.
Şəkk edirsən, görürəm, vallah ora dağ da sığar , –
Məclis arəstədi lap, yoxdu heyif zurnaçalan,
Özü dümbək də çalır – üstümüzə kölgə salan.

...“Kölgəyə” girməyimə indi peşiman oluram,
İşim əngəldi yaman, kövrəlib hərdən doluram.
Daz başımdan cücərən tükləri bir-bir yoluram, –
Son zamanlar sexi şef gözgörəti etdi talan;
İndi çox bərk ilişib üstümüzə kölgə salan,
Çatan olmaz dadına, olsa da lap pulu, kalan.

## OLDU BİR MÖCÜZƏ

Sənsiz işlər elə bildin ki, gözündən batacaq,
Zənn edirdin aranı üzdəniraqlar qatacaq;
Sorağı istədiyin yerlərə hökmən çatacaq, –
Gümanın çıxdı boşa, kefdə keçir hər anımız,
Oldu lap möcüzə, qurtardı əlindən canımız.

Od tutubsan eşidəntək düşüb işlər yoluna,
Key olubsan necə gör, baxmamısan sağ-soluna...
İtiribsən özünü, hətta giriblər qoluna;
Yıxılıb, xəndəyə düşsən də qaralmaz qanımız,
Oldu lap möcüzə, qurtardı əlindən canımız.

Müftə kef xəstəsisən, bardı yerin gündə qağa,
Tanıyır hətta səni lap südəmər körpə çağa.
Oturub çayxanada başqasını qoyma lağa,
Kişisən, gəl üzə de, bəllidi ki, ünvanımız,
Oldu lap möcüzə, qurtardı əlindən canımız.

Səni tənqid edən olsaydı, bərəldib gözünü,
Hey yerindən söz atıb qəsdlə kəsirdin sözünü.
Gəlsə bir yoxlama, guya itirirdin özünü,
Himlə-cimlə soruşurdun ki, nədir nöqsanımız –
Oldu lap möcüzə, qurtardı əlindən canımız.

Yoxdu gördüm də deyən, günlərin heç harda keçir,
Çatıb ancaq xəbəri. Bir balaca darda keçir...
Bizim isə günümüz bağ, ya da bulvarda keçir;
Kaş görəydin necə gülşəndi tamam dörd yanımız.
Oldu lap möcüzə, qurtardı əlindən canımız.

Qovrulursanmı, lələ, köhnə işindən ötəri?
Neçə illər elə bil, fəth eləmişdin o yeri.
Elə günlər təzədən dönməyəcək bir də geri, –
Umma, imdad çətin olsun bu işə imkanımız,
Səni qoymaz yaxına çünki təmiz vicdanımız,
Oldu lap möcüzə, qurtardı əlindən canımız.

## ƏFSUS Kİ

Süfrəmdəki milçək nə biləydim dil açırmış,
"Müftə kababı az ye", deyib sonra uçarmış...
Vızvız eləyirdi, demə, çoxdan sözü varmış,
Fikrimdə dolandı: tut onu yaxşıca turp ək,
Əfsus ki, yaxamdan yenə əl çəkmədi milçək.

Çəkmirdi nədənsə gözünü əsla gözümdən,
Hirs vurdu tamam kəlləmə, lap çıxdım özümdən.
Yalvardım ona, gəl qonaq ol, çıxma sözümdən;
Güldü və dedi: ver payımı, mən bura gəlcək,
Əfsus ki, yaxamdan yenə əl çəkmədi milçək.

Göz vurdu mənə, sordu ki, olmaz sənə baxmaq?
Rüşvətlə alınmış bu qədər nemətə bir bax!
Hardan qazanıbsan de görüm, müftəxor axmaq?!
Tez-tez sənə də toy tutacaqlar bunu bilcək,
Əfsus ki, yaxamdan yenə əl çəkmədi milçək.

İllah elədim sus, daha bəsdir çox uzatma,
Çoxdur sataşan, bostanıma sən də daş atma.
Əfv et məni sən üzdəniraq kəslərə qatma.
Baş girləyirəm, bilsən əgər mən də sənintək,
Əfsus ki, yaxamdan yenə əl çəkmədi milçək.

Keçmiş, ötəri söhbəti hərdən anıram mən,
İşdir bilən olsa, bataram lap, qanıram mən.
Hərçənd, gözə dəymirsə də tüstüm, yanıram mən;
Olmaz deyirəm rüşvətə meylim daha, əl çək,
Əfsus ki, yaxamdan yenə əl çəkmədi milçək.

## BU TOY, BU TOY, BU TOYDA

(*Toy mərasimindən gəlir mənbəyi kimi istifadə edənlərə*)

Toylara çox getmişəm, ay kişi, həzz almışam,
İndiki bu toylara özüm də mat qalmışam:
Zorla mənə kart verib, son pulumu salmışam;
İtib ortada vicdan, bu toy, bu toy, bu toyda!
Dolmalıdır cibişdan, bu toy, bu toy, bu toyda!

Körpə, bəbə oğluna çoxları kart vurdurur,
Toyxananı əlbəəl qurdurur, nə qurdurur...
Qonaqları pişvaza sübhi-səhərdən durur;
İtib gedir şərəf-şan, bu toy, bu toy, bu toyda!
Dolmalıdır cibişdan, bu toy, bu toy, bu toyda!

Məclisə gələnlərin həm acı var, həm toxu,
Köhnə, boyat küftəni vallahi dadmır çoxu.
Nəfsi itir dəmlənib, puç eləyir var-yoxu;
Müflis olur bu başdan, bu toy, bu toy, bu toyda!
Dolmalıdır cibişdan, bu toy, bu toy, bu toyda!

Toyxanada sərpayı, sanki, minib at çapır,
Zurnaçıya xəlvəti vurmağa bir yer tapır.
Hər nə şabaş versələr, az-çoxa baxmır qapır;
Haraydı, kefdi, ay can, bu toy, bu toy, bu toyda!
Dolmalıdır cibişdan, bu toy, bu toy, bu toyda!

Toylara pul salmamaq kaş, təzə adət ola,
Yoxsa ki, hökmən gərək, toyda cibişdan dola?
Cibləri ülgücləyib, sonra salırlar yola.
İndi alış, sən də yan, bu toy, bu toy, bu toyda!
Dolmalıdır cibişdan, bu toy, bu toy, bu toyda!

## ZƏNGLƏR...

Baxsan bu cahan mülkünə, vardır necə rənglər,
Saysızdı bu rənglər kimi aləmdəki zənglər.
Əfsus ki, bu zənglərlə olur hər cürə rənglər.
Tarix də susubdur, nə əcəb, olmaya, kardır?..
Əsrin bu yaşında belə zənglər hələ vardır.

Zənglərlə düşür sahmana müşkül olan işlər,
Məclis ki, quruldu, düzülür manqala şişlər.
Xudmani olur gözdən uzaq məxfi görüşlər.
Gen-bol kabinetlər atılıb-düşməyə dardır,
Əsrin bu yaşında belə zənglər hələ vardır.

Zəngin səsi hərdən ürəyə bir ox olubdur,
Ev yıxmağa, bədbəxtliyə bais çox olubdur.
Çox vaxt qəzəbindən neçə varlıq yox olubdur.
Bədxahlar əlindən telefonlar da bezardır,
Əsrin bu yaşında belə zənglər hələ vardır.

Zəngdən karıxıb vahimədən tir-tir əsirlər,
Hərçənd belə kəslər başı pambıqla kəsirlər.
Gec-tez yayılır aləmə zənglərdəki sirlər.
Dəllallara dilsiz telefon gizli bazardır,
Əsrin bu yaşında belə zənglər hələ vardır.

Zənglər neçə yol haqlını haqsızlara qatmış,
Fəryad edənin haqq işinə arxivə atmış.
Amma nə qədər müftəxorun dadına çatmış.
Çünki bu, cibişdanı güdənlərdə azardır,
Əsrin bu yaşında belə zənglər hələ vardır.

Hardandı bu zənglər, demə, aşkar olacaqdır,
Zəngə güvənən, arxalanan xar olacaqdır.
Kef çəkdiyi dünya, başına dar olacaqdır.
Tarix deyəcək, kimlərə kimlər havadardır.
Əsrin bu yaşında belə zənglər hələ vardır.

## ALƏM GÜLÜŞÜRDÜ

Pulgir müdirin karına hər yerdə gəlirdim,
Daşdan divarı istəsə, barmaqla dəlirdim.
Tərif elədikcə məni, ruhən kökəlirdim.
Şey-şüy daşıyırdım gecə-gündüz bağa qardaş,
Aləm gülüşürdü mənimtək yaltağa, qardaş.

Vur-tut cəmisi on ilə, bir pillə ucaldım,
Anbardarı yıxdım, yerinə əmrimi aldım.
Hər gün evinə mən dolu zənbil yola saldım,
Hərdən də deyirdim ona ərklə qağa, qardaş,
Aləm gülüşürdü mənimtək yaltağa, qardaş.

Kefcildi yaman, baməzəlik vardı canında,
Məclis qurulan yerdə olurdumsa yanında,
Pəsdən oxudardı məni, bərk kefli anında,
Həzz olsa da, hərdən də qoyurdu lağa, qardaş,
Aləm gülüşürdü mənimtək yaltağa, qardaş.

Çapdı, taladı anbarı, gördüm yeri dolmur,
Düşdüm dara, baxdım müdirin rəngi də solmur,
Gördüm belə alçaqlığa dözmək daha olmur,
Hərçənd güvənirdim elə bil ki, dağa, qardaş,
Aləm gülüşürdü mənimtək yaltağa, qardaş.

Yaltaqlıq edib məqsədinə çoxdu çatanlar,
Quyruq bulayıb, kölgə tapıb orda yatanlar,
Baş tutmadı arzum, aranı oldu qatanlar,
Düşmüşdüm əcəb süd gölünə, çim yağa, qardaş,
Aləm gülüşürdü mənimtək yaltağa, qardaş.

## YALANDI VALLAH, EY DOST

Tənbəlin bu xəbərdən yaman qanı qaraldı,
Gözlərini zilləyib dərin xəyala daldı:
Nə isə birdən-birə qarnıma sancı saldı.
Dağarcığında hiylə kalandı vallah, ey dost,
Bəhanəsi, filanı yalandı vallah, ey dost.

Var-gəl edib ortada gah özünü öydü o,
Gah da çıxıb özündən, öz-özünü söydü o.
Beh düşəndə yadına, gözlərini döydü o.
Dümbəyi var sədəfdən, çalandı vallah, ey dost,
Bəhanəsi, filanı yalandı vallah, ey dost.

Sürüşmək üçün işdən, müdirini yanladı,
Süzdü müdir tənbəli, kələyini anladı
Zəhmətə xor baxanı lap o ki var danladı.
Çünki hər gün icazə alandı vallah, ey dost.
Bəhanəsi, filanı yalandı vallah, ey dost.

Xeyli baxıb lövhəyə, inanmadı gözünə,
Əcaib bir şəkil lap oxşayırdı özünə.
Baxanlar gülüşürdü şəkilaltı sözünə.
"Həftədə üç gün işdən qalandı vallah, ey dost,
Bəhanəsi, filanı yalandı vallah, ey dost.

Bax, bu sayaq kəslərə mat qalıram, ay kişi,
Axşamacan mırt vurur, baxma ki, çoxdur işi.
Gileylənir də hərdən guya ağrıyır dişi.
Lövbərini çayçıda salandı vallah, ey dost,
Bəhanəsi, filanı yalandı vallah, ey dost.

## QOHUMLAR

A Tükəzban, eşidib bəd xəbəri ağlamışam,
Evdəki körpələrin qəlbini lap dağlamışam.
Nəzir üçün qapıda bir qara qoç bağlamışam, –
Sən bilən, çox çəkəcək dalbadal yoxlamalar?
...Toxunan olmayacaq, hər birinin arxası var.

Səbr elə, Fatmanisə, düz gələcəkdir işimiz,
Ahu-zar eyləmə çox, boş yerədir təşvişimiz.
Çox da var həbs olunan, çöldə gəzir ki, kişimiz;
Nə qədər qurdalayıb, yüz dəfə də yoxlasalar,
Toxunan olmayacaq, hər birinin arxası var.

Keçən il keçdi necə, bircə onu sal yadına:
Tək Fərəc getdi elə, cümlə günahın badına...
Heç biri baxmadı da, töhmətin hətta dadına, –
Yenə də dost-tanışı əldə əgər saxlasalar,
Toxunan olmayacaq, hər birinin arxası var.

Çəkmirəm mən adını, var dəvədən də yekəsi,
Yeriyəndə, mən ölüm, sanki, gəlir dağ təkəsi...
Keçməz onsuz boğazından ərimin bir tikəsi...
Ölməyib, sağdı hələ, işləri sahmana salar,
Toxunan olmayacaq, hər birinin arxası var.

A Tükəzban, ayıq ol, vallahi, gəlmir də dilim,
Bir şey olsa, xəbər et, öz işimi mən də bilim;
Yoxsa, var-yox puç olar, bircə qalar köhnə kilim...
– Dəli olma, düzələr...Hay-küyə çox salmasalar,
Toxunan olmayacaq, hər birinin arxası var.

## BİR OVUC QARDIR ÜMİD

Ustad! Həsrətli könül kövrək olurmuş nə yaman,
Hicranın atəşinə yandı ürək xeyli zaman...
Nə ola, ömrə verə kaş ki, fələk möhlət, aman/
Görəsən qönçə açıb dustaq olan arzu, dilək,
Dəyişər vurğusunu qəm dolu nisgilli ürək.

Səsimiz şimşək ola, kaş çata Heydərbabaya,
Yayıla əks-səda müjdə kimi el-obaya!
Kaş ola quş qanadın, baş çəkəsən bir bu taya;
Basa öz bağrına ellər səni, əllərdə çiçək,
Dəyişər vurğusunu qəm dolu nisgilli ürək.

Rza şah Pəhləvinin söndü nəhayət ki, şamı,
Tapmadı bircə macal, qanla dolu qaldı camı.
Yazılıb qanla İran tarixinə arzu-kamı, –
Gələsən bir bu yana, birgə dadaq duzla-çörək,
Dəyişər vurğusunu qəm dolu nisgilli ürək.

Qəlbi Heydərbabanın bir döyünür ellər ilə,
Gözləyir al səhəri təşnəli tək illər ilə.
Xan Araz qəmlərini ərzə yayır yellər ilə;
Nə ola, nurlu nicat şimşəyini göydə görək,
Dəyişər vurğusunu qəm dolu nisgilli ürək.

Zirvədə arzu dolu, bircə ovuc qardır ümid,
Ömrü möhnətdə keçən Şəhriyara yardır ümid.
Səbr elə, ötsə bulud, gün doğacaq, vardır ümid...
Töhfəmiz şehli gülü kaş o günü birgə dərək,
Dəyişər vurğusunu qəm dolu nisgilli ürək.

## YAZ

Yaz, əzizim, danabaş müftəxorun əksinə yaz,
İşdi, görsən təzədən qurdalanırsa, yenə yaz.
Fərqi yoxdur kimə yaz, şeytana yaz, ya cinə yaz;
Döşə hərdən hədəfə, vermə aman həddin aşa,
Bəs elər yazdığını mində biri düşsə başa.

Nə yazırsan, elə yaz, anlaya bilsin sözünü,
Açıq-aşkar hədəfin güzgüdə görsün özünü.
Eybəcər varlığına kinlə bərəltsin gözünü;
Çaşbaş olsun, karıxıb bəlkə də lap ağlı çaşa,
Bəs elər yazdığını mində biri düşsə başa.

Elə yaz göz yetirib tullamasın yazdığını,
Orda görsün özünün dalda quyu qazdığını.
Şöhrət ardınca qaçıb, düz yolunu azdığını;
Anlasın, ağrıyacaq sonra başı dəysə daşa.
Bəs elər yazdığını mində biri düşsə başa.

Bu vəzifə, bu filan, gəldi-gedərdi, a kişi,
Hələ var çoxları, ancaq budu dərdi, a kişi.
Gözləyir taxta çıxa, dəymə-düşərdi, a kişi.
Düzələr bəlkə bir az ömr eləyib dolsa yaşa,
Bəs elər yazdığını mində biri düşsə başa.

Müxtəsər, süfrə deyil, şəstlə açım mən ürəyi,
Başa düş mətləbimi, yükləmə çox sən ürəyi.
Elə onsuz da alıb qəmli duman-çən ürəyi.
Nişan alsan hədəfi, göz yerinə vurma qaşa,
Bəs elər yazdığını mində biri düşsə başa.

# CƏMİSİ BİRCƏ YALAN

Ol xatircəm mən ölüm, adicə dümbək çalanam,
Şakərimdir düzü, əlmuzdumu əvvəl alanam.
Söyləyir bir parası, guya yalandan kalanam, –
Axı, and içməliyəm müştəri gəlsə yanıma,
Cəmisi bircə yalan bəlkə düşər hər anıma.

Müşkül iş olsa belə, dil tökərəm mən – düzələr,
Belə işlər nədi ki, lap yüzü birdən düzələr.
Arxayın eyləyirəm: "Qəm yemə heç sən..." düzələr...
Cibimin xətri üçün qəsd eləsəm də canıma,
Cəmisi bircə yalan bəlkə düşər hər anıma.

Bir nəfər rütbəli var, lap çənədən taydı mənə,
O, da quyruq bulayır çünki özü paydı mənə...
O günü birnəfəsə goplarımı saydı mənə;
Dalda, vallah, beləsi söysə də lap ünvanıma,
Cəmisi bircə yalan bəlkə düşər hər anıma.

Keçən il xeyrim olub, yan cibimin doldu biri,
Çoxu düşmüşdü tora, amma ayıq oldu biri, –
Başıma vurdu qapaz, son tükümü yoldu biri;
Yola saldım hərifi, əl basaraq vicdanıma,
Cəmisi bircə yalan bəlkə düşər hər anıma.

Hələlik girləyirəm öz başımı, çarə nədir?
Deməmiş hamı bilir müftəcə pul-parə nədir...
Bilmirəm indiyəcən əsla, üzü qarə nədir, –
Satıram mən yalanı, baxmıram heç imkanıma,
Cəmisi bircə yalan bəlkə düşər hər anıma.

Yalana torba tikib bağlamışam öz belimə,
Xam hərif axtarıram, kaş ki, düşəydi əlimə.
Çoxu çaşbaş qalacaq mən xına yaxsam telimə.
İnanan yoxdu, yalan, vallah hopubdur qanıma,
Cəmisi bircə yalan bəlkə düşər hər anıma.

# ELƏ ZƏNN EYLƏMƏYİN

Müdirim işdə görüb bir balaca keyfimi saz,
Turşudub üz-gözünü, coşdu, dedi: ağlı dayaz!
Sən də get, ay demaqoq, bildiyini hər yerə yaz;
Mən bunu danmıram ha, rüşvət alandan yazıram,
Elə zənn eyləməyin, mən də yalandan yazıram.

Bələdəm bir çoxunun zahirinə, batilinə,
Ölsə, bilməz nədi iş, güc verər ancaq dilinə.
Toxunan yoxdu deyə, "dağ" müdirin "sağ əlinə" –
"Sağ əlin" daz başına kölgə salandan yazıram,
Elə zənn eyləməyin, mən də yalandan yazıram.

Gizli söhbət yeridir dəllala hər döngə, dalan,
Bu yerin xəstəsidir bərk ilişib, darda qalan;
Gülər üzlə qayıdır ovcu, cibişdanı dolan.
İşi sahmana salan gizli dalandan yazıram,
Elə zənn eyləməyin, mən də yalandan yazıram.

Sex açıb gözdəniraq, üzdəniraq bir neçəsi,
Dolanır dövrəsinə gör nə qədər qulbeçəsi...
Dağıdır el malını, kefdə keçir hər gecəsi, –
Dözmürəm, tez quduran pulu kalandan yazıram,
Elə zənn eyləməyin, mən də yalandan yazıram.

Toya qurban eləyib bəzi müğənni canını,
Yazıram, çünki yazım xeyli qaraldır qanını.
Hələ lap zurnaçının da görürəm nöqsanını;
Şabaşı göydə qapan zurnaçalandan yazıram,
Elə zənn eyləməyin, mən də yalandan yazıram.

## EY DOST

Çox qurdalama yan cibini, çünki uman var,
Nöqsan görənin gözlərini zorla yuman var.
Hay-küy salanın üstünə bəzən də cuman var.
Car eylə bunu aləmə, düşsən hara, ey dost,
Tənqid gəlir ancaq belə yerdə kara, ey dost.

Harda işə girsən, neçə il orda da qalsan,
Sakitcə dolan, qoy elə bilsin çoxu lalsan.
Haqsızlığa dözsən, deyəcəklər hələ kalsan.
İclasda durub qanmayana vur yara, ey dost,
Tənqid gəlir ancaq belə yerdə kara, ey dost.

Anla müdirin fikrini eyhamlı sözündən,
Heç vaxt atılıb-düşmə, nə də çıxma özündən.
Sərrast ox atıb "sərçəni" vur kinli gözündən.
Yəqin ki, qudurdub onu da pul-para, ey dost,
Tənqid gəlir ancaq belə yerdə kara, ey dost.

Bəzi müdirin kölgəsinə lövbər atan var,
Yaltaqlıq edib, bir neçə il orda yatan var.
Axırda müdirlə elə bir anda batan var.
Ağ rəngə, qərəzlə demə, heç vaxt qara, ey dost,
Tənqid gəlir ancaq belə yerdə kara, ey dost.

Kimlərdi soruşma belə haqsızlıq edənlər,
Şəksiz ki, cibişdanı güdənlərdi, güdənlər.
Məxfi görüşə döngə-dalanlarla gedənlər.
Yəqin ki, haçansa düşəcəklər dara, ey dost,
Tənqid gəlir, ancaq belə yerdə kara, ey dost.

## CÜMLƏ FIRILDAQ İMİŞ

Zabitəli sandılar iş başına keçəndə,
Çoxları mat qaldılar qazanc yeri seçəndə.
Duruxdular şəstlə o, yalandan and içəndə.
Sonradan öyrəndilər arxalı bir dağ imiş.
Sən demə, bu şarlatan cümlə fırıldaq imiş.

Harda işi baş tutub, orda giribdir dona,
Pərdələyib gözləri, çox inanıblar ona.
Mətləbinə çatmamış, hökmü çatıbdır sona.
Alnıaçıqmış, onun guya üzü ağ imiş,
Sən demə, bu şarlatan cümlə fırıldaq imiş.

İndiyəcən bir daşı daş üstünə qoymayıb
Sərfəli işlər görüb, amma gözü doymayıb.
Şəkk eləyirsən ki, o, bir çoxunu soymayıb?
Müftə gəlirdən elə kef-damağı çağ imiş,
Sən demə, bu şarlatan cümlə fırıldaq imiş.

Kürkünə düşmüş birə, rəngi solubdur yaman,
Müftəxor haqqında bu hökmü veribdir zaman.
Yüz yerə əl atsa da, olmayacaqdır aman.
İndi çıxıbdır üzrə hər sözü lağ-lağ imiş
Sən demə, bu şarlatan cümlə fırıldaq imiş.

İşlərin həngaməsi dalda qalıbdır hələ,
Sorğu-sual başlasa lap batacaqdır, lələ.
İndi deyən var ona daydayına zəng elə
İş başına keçəndə dost-tanışı sağ imiş,
Sən demə, bu şarlatan cümlə fırıldaq imiş.

## ÖMRÜMDƏ BELƏ

Bəh-bəh, ata, gəl gör necə xudmani bağım var,
Fəvvarə vuran çarhovuzum, dörd otağım var.
Sahildəki bu guşədə hər gün qonağım var.
Dostlar yığılır, günlərimiz burda keçir şən,
Ömrümdə hələ heç belə kef çəkməmişəm mən!

Aldım bağı, zövqümcədi, sorma necə, hardan,
Qış burda seçilmir ata, vallahi, bahardan.
Məclis ki, olur, mey də çıxır güzgülü bardan.
Dəydikcə qədəhlər, eşidirsən səsi gendən,
Ömrümdə hələ heç belə kef çəkməmişəm mən!

Ləzzət verir hərdən ki olur bağda duman-çən,
Manqalda kabab tüstülənir, sübhi-səhərdən.
Əllər uzanır badəmə, gəl, gör neçə yerdən.
Fındıqça çalıb, süzməyimi görməmisən sən,
Ömrümdə hələ heç belə kef çəkməmişəm mən!

Dostlar məni təbrik elədi "Volqa" alanda,
Uddu lotereyam, deyirəm, söhbət olanda.
Vardır qarajım da hələlik köhnə dalanda.
Təşrif gətirib, baxmağa gəlsən, görəcəksən,
Ömrümdə hələ heç belə kef çəkməmişəm mən!

Zənnimcə, bələdsən, ata, cənnətdi bu yerlər,
Mərmər hovuza baxmağa "şeflər" də gəlirlər.
Xudmani bu guşə, necə xəlvətdi, bilirlər.
Beş-on "pşeniçni" qoyuram süfrəyə hərdən,
Ömrümdə hələ heç belə kef çəkməmişəm mən!

## SATIRAM

Hərə bir cür dolanıb, girləsə də öz başını,
Yeri gəlsə, axıdır bir parası göz yaşını.
Əlqərəz, bəlkə çıxartsın azacıq daşbaşını.
Mən də öz taleyimi bağlamışam ağ yalana,
Satıram mən yalanı, ay lələ, vallah, alana.

Mayasızdır bu qazanc, qorxusu yoxdur ki batar,
Keçsə xamlar girimə, laylama yəqin ki, yatar.
Mən də söz baqqalıyam, söz neçə sövdaya çatar.
Bir ümiddir yalanım qayğıya möhtac qalana,
Satıram mən yalanı, ay lələ, vallah alana.

Baxma çox hap-gopuma, zorla yalan satmamışam,
Çünki bu saxta işin zirvəsinə çatmamışam.
Sallayıblar quyuya, ip qırılıb, batmamışam.
Çıxmışam, yağlı hərif tez məni dartıb dalana,
Satıram mən yalanı, ay lələ, vallah, alana.

Tükü-tükdən seçirəm, çox açılıb çünki gözüm,
Belə bir möcüzəyə şəkk edirəm hətta özüm.
Birinə goplamışam, doğru çıxıb amma sözüm.
Sırımışdım bu gopu, hardasa, cibdən kalana,
Satıram mən yalanı, ay lələ, vallah, alana.

Dən düşübdür saçıma, amma yaşım azdı mənim,
Bir kalan, ağlı dayaz ünvanımı yazdı mənim.
“Kəsmişəm” bir qulağın, indi kefim sazdı mənim.
Guya öyrətməliyəm zurnanı dümbək çalana,
Satıram mən yalanı, ay lələ, vallah, alana.

Bazarım olsa kasad çayxanada fırlanıram,
Biri söhbət eləsə mətləbini tez qanıram.
Arabir ah çəkirəm, halına guya yanıram.
Yağlı yer vəd edirəm ortaya söhbət salana,
Satıram mən yalanı, ay lələ, vallah alana.

## YALANMIŞ

Bağlandı gözüm, görmədim arxamda duranı,
Yaltaq, başıboş şarlatanı, qurğu quranı,
Namərdlik edib, qəsdlə mənə zərbə vuranı,
Gəlməzdi mənim ağlıma ki rüşvət alanmış,
Andı-amanı sən demə uydurma, yalanmış.

Hardan biləsən ki, aranı dalda qatırmış,
Hərdən də mənim bostanıma bir daş atırmış.
Yaltaq bu sayaq istəyinə işdə çatırmış,
Baş tutmasa hərgah kələyi, qovğa salanmış,
Andı-amanı sən demə uydurma, yalanmış.

Haqlı danışan kəslərə haqsızdı deyirdi,
"Haqsızların" ancaq şotuna müftə yeyirdi.
Kimdən işi keçsə, ona yüz yol baş əyirdi.
Bəzən gop edərdi, dədəsi guya kalanmış,
Andı-amanı sən demə uydurma, yalanmış.

Əbləh necə tipmiş, çox heyif gec tanıdım mən,
Arsızdı deyə, saçlarına düşməyib heç dən.
Mən dost kimi çox vaxtı bölürdüm tikəmi tən,
Əfsus ki, yenə dalda gedib zurnaçalanmış,
Andı-amanı sən demə uydurma, yalanmış.

Dünyanın işi şahmata bənzər bir oyundur,
Namərd bunu qanmaz, özü də çünki qoyundur.
Bir gün deyəcəklər ona da oyna "toyundur",
Çünki cibinin qeydinə hər yerdə qalanmış,
Andı-amanı sən demə uydurma, yalanmış.

## MƏN BELƏ, SƏN DƏ ELƏ

Deyinir arvadağa, gündə qaraldır qanımı,
Açılır dərdi tamam mən yerə qoycaq yanımı.
Sən deyirsən: boşayım, qurtarım ondan canımı?
Gəl demə sən də yalan, birdi bizim taleyimiz,
Dünyada məxfi qalan sirdi bizim taleyimiz.

Çox da ki, işdə müdir and içir hərdən başıma,
Heç qoyar yağlı yerə? Aşiq olub göz-qaşıma?!
Kişi, yaltaqlıq edim? Heç yaraşarmı yaşıma?
Bir xəbər olsa alan, birdi bizim taleyimiz,
Dünyada məxfi qalan sirdi bizim taleyimiz.

Allaha şükr edərəm, gündəlik olsun çörəyim,
Dünya qopmaz ki, əgər olmasa hər gün xörəyim.
Başa düşmür ki, haram aş da deyildir gərəyim,
Olmadın sən də kalan, birdi bizim taleyimiz,
Dünyada məxfi qalan sirdi bizim taleyimiz.

Başıbatmış anası ağzına dil atdı o gün,
Aldığım qət təzəcə şubasını satdı o gün,
"Layka"nı tərif edib aləmi lap qatdı o gün,
Cibimə saldı talan, birdi bizim taleyimiz,
Dünyada məxfi qalan sirdi bizim taleyimiz.

Qonşumuz "layka" alıb, evdə şivəndir bu gecə,
Olacaq arvadağa od dolu təndir bu gecə,
Dadıma bəlkə çatar ip, ya da kəndir bu gecə,
Gəzirəm indi dalan, birdi bizim taleyimiz,
Dünyada məxfi qalan sirdi bizim taleyimiz.

## YENƏ MEYDAN AÇILIB...

Yenə meydan açılıb ortada, dəllalbaşıya,
Öyrənib axşamacan peysərini hey qaşıya.
Axtarır yağlı yerin xeyrini versin naşıya,
İşi sahman eləsin, ayrıca alsın payını,
Fağırın gülməz üzü "görməsə" dəllal dayını.

Yalan uydurmalara yaxşılar işdən kürünür,
Dayılı taxta çıxır, astarı üzdən görünür,
O yerə haqqı olan bir neçə illər sürünür,
Həftə çəkmir ki, keçir iş başına öz qayını,
Fağırın gülməz üzü "görməsə" dəllal dayını.

Şəkk edənlər tapılar bəlkə də bu düz sözümə,
Dəllalın bir neçəsi rast olub hərdən özümə.
Bambılı cəhd elədi kül də üfürsün gözümə,
İşdə rüsvay elədim antipodun bir tayını,
Fağırın gülməz üzü "görməsə" dəllal dayını.

Toplayır öz başına pul hərisi, hər çatanı,
Alır öz kölgəsinə tində göyərti satanı.
Oyadan yoxdu hələ əmrə tez imza atanı,
Dəllalı birdi məgər, bilməyir heç kəs sayını,
Fağırın gülməz üzü "görməsə" dəllal dayını.

Yığılan müftə gəlir bir neçə ünvana gedir,
Bir cibin pul-parası başqa cibişdana gedir,
Səsi ancaq bu işin bəlkə də hər yana gedir.
Dəllalın görməliyik əvvəl-axır ah-vayını,
Fağırın gülməz üzü "görməsə" dəllal dayını.

## DİNMƏ

Hərdən baxıram, ay kabinet, hüsnünə gendən,
Ruhən axı ayrılmamışam mən hələ səndən.
Əfsus ki, tapıldı ayıranlar səni məndən.
Heyhat... nə qədər arzularım qaldı gözümdə,
Dinmə, bilirəm, oldu günah ancaq özümdə.

Müşküldü qayıtmaq sənin ağuşuna bir də,
Yoxdu mənə layiq təzə bir sərfəli yer də.
Səbrim tükənib, dözmür ürək də daha dərdə.
Şəkk etmə, inan, yoxdu yalan əsla sözümdə,
Dinmə bilirəm, oldu günah ancaq özümdə.

Bir vaxtı məni yolda görənlər baş əyərdi,
Hər cür yalanım olsa hamı, – "düzdü" – deyərdi.
Vallah adaşım vardı, mənə gündə dəyərdi.
Hədsiz sevinərdi, o gülüş görsə üzümdə,
Dinmə, bilirəm, oldu günah ancaq özümdə.

Göz dəydi, səni çünki nahaq sahmana saldım,
Axmaq kimi bir dəst də "ərəb" mebeli aldım,
Başqa birisi köçdü sənə, ortada qaldım.
Yəqin döşəmədən silinib köhnə izim də,
Dinmə, bilirəm, oldu günah ancaq özümdə.

Hərçənd elə bildim xoruzum daima banlar,
Hərdən yadıma düşsə o kef çəkdiyim anlar.
Səs-küylə axar lal ürəyimdən qara qanlar.
Gördüm səni lap boğdu qəhər, əsdi dizim də,
Dinmə, bilirəm, oldu günah ancaq özümdə.

## İCLASDA

İclasa getməyimə, ay kişi, oldum peşiman,
Nə bilim dost məni dümsükləyəcək orda hər an.
Söylədim ağ eləmə, məndə daha qalmadı can.
Xoşlayırdı danışa kimsə, o da ləzzət ala,
İstəyirdi o məni cəncələ, qovğaya sala.

Deyəsən böyləsinin ağlı sığışmır başına,
Odu ki, addım atır tərs mütənasib yaşına.
Vurasan yağlı qapaz, peysəri bəlkə qaşına.
Cəhd edirdi o, vurum gah mıxa mən, gah da nala,
İstəyirdi o məni cəncələ, qovğaya sala.

Anlamışdım ki, niyə fikri-qərarı belədi.
Başıboş yaxşı bilirdi bu mənimçün tələdi.
Kürsüyə qalxmadım ancaq ki, nə illah elədi.
Çox dedi: susma, döşə, Səbzəlidən qalma dala,
İstəyirdi o məni cəncələ, qovğaya sala.

Gəldim axırda cana, bəsdi dedim az qəmiş ol.
İstəyirsənsə danış, əsla belə qoymadı qol!
Çünki seçmişdi məni yıxmağa qəsdlə belə yol.
Düşünürdü bataram bəlkə, tanıtdırsa zala.
İstəyirdi o məni cəncələ, qovğaya sala.

İclasın sədri qəfildən ona söz verdi özü,
Diksinib durdu, bir anlıq bərələ qaldı gözü.
“Mən ki söz istəmədim” – zorla dedi bir bu sözü.
Çaşbaş oldu özü, düşmüşdü “tora” azca qala,
İstəyirdi o məni cəncələ, qovğaya sala.

Niyyəti çıxdı boşa, atdığı ox dəydi daşa,
Mən də güldüm ucadan, az qala vallah, savaşa.
Necə qurdum tələni, sonra düşər bəlkə başa.
Kaş görəydin belə anda özü düşdü nə hala,
İstəyirdi o məni cəncələ, qovğaya sala.

## TƏRƏZİ

Dolanım qoy başına, bir də özüm, daş, tərəzi,
Olaq həmdəm ikimiz ömrü boyu kaş, tərəzi.
Arabir işlərimiz azca olur yaş, tərəzi.
Eybi yoxdur, gələcək gündə müfəttiş qağalar,
Bata bilməz, hələ arxamda mənim daydayı var.

Qurban ollam boyuna, əqrəbinin rənginə də,
Cibimə pul axıdan sərfəli pərsənginə də.
Keçir hərçənd boğazın müştərinin cənginə də.
Eybi yoxdur, utanıb zərrə qədər eyləmə ar,
Bata bilməz, hələ arxamda mənim daydayı var.

"Nəfsi toxluqda" hələ dünyada heç yoxdu tayın,
Var adamlar – itirir başqasının haqqı-sayın.
Göz dikənlər qağana, almasa hər ayda payın.
Eybi yoxdur eləsin sirrimi qoy aləmə car.
Bata bilməz, hələ arxamda mənim daydayı var.

"Sən" bilirsən gəlirim gah çox olur, gah az olur,
Düzü, sayəndə sənin daima keyfim saz olur.
Boş cibişdan ki, dolur, qış da mənimçün yaz olur.
Çox paxıllar can atır xəlvəti bir "iş" quralar,
Bata btliəz, hələ arxamda mənim daydayı var.

Dayımın ölməyi lap əydi kamantək belimi,
Eləyib hətta vəsiyyət "Qağa versin ilimi".
Oynayır cibdə siçan, yüz dəfə salsam əlimi,
Ümidim satmağadır evdəki nimdaş kilimi.
Tərəzi, dadıma çat, dostunu qoyma ola xar,
Elə zənn eyləyərəm indi yenə daydayı var.

## AY ŞABAŞ

Mənfəət toylarda var, ciblər dolur yavaş-yavaş,
Gur keçir məclisimiz, kefim də sazdır, ay dadaş.

Gözləyib qonaqları, boylanırıq sola-sağa,
Toyxana dolan zaman, ürək dönür, sanki, dağa.
Elə ki, başlayırıq həm çalıb, həm oynamağa.
Başqa aləm yaranır, leysan kimi yağır şabaş,
Gur keçir məclisimiz, kefim də sazdır, ay dadaş.

Boş dayanmır sərpayı, arifdi: anlayır himi,
Göz vurub "Çalın" – deyir, sızıldayır tarın simi.
Bəy ki, çıxdı ortaya şabaş yağır xəzəl kimi.
Tar qabı, qaval qabı dolub şişir yavaş-yavaş,
Gur keçir məclisimiz, kefim də sazdır, ay dadaş.

Pullu toyda mənfəət, inanma ki, heç olmasın,
Düyüdən, ətdən, toyuqdan heç nə artıq qalmasın.
Yoxdur bir çalançı ki, toydan xələt, pul almasın.
Boş yerə hesablayıb toy xərcini, sındırma baş,
Gur keçir məclisimiz, kefim də sazdır, ay dadaş.

Qəmli çağlar olmaya, "səfər" ayı gələn zaman,
Lal olur, susur tamam bu müddəti tarla kaman.
Qaralır lap qanımız, bazar kasad olur yaman.
Şabaşın leysanı yağsın belə anda cibə kaş,
Qəmli ayların sayı, ömrü də azdır ay dadaş.
Gur keçir məclisimiz, kefim də sazdır, ay dadaş.

## DÜŞƏR-DÜŞMƏZ OLUR

Tikdirdi bəzəkli kabinet bir neçə ayda,
Aləmdi, lap iclas salonu, amma nə fayda.
Xudmani işində yarada bilmədi qayda.
"Be", "be" – dedilər, – bəsdi daha əmrini get al,
Qaldı kabinet, "Volqa" maşın, bir də geniş zal.

Qoymurdu yıxılsın, "dayı" tutmuşdu qolundan,
Şöhrət dəlisi pullanıb azmışdı yolundan.
Keçməkmi olardı ya sağından, ya solundan...
Şəkkin var əgər, orda "lüboy" işçiyə zəng çal,
Qaldı kabinet, "Volqa" maşın, bir də geniş zal.

Köhlən atını köndələnə şəstlə çapırdı,
Yağlı yerə meyli olanı məxfi tapırdı.
Dəllal da bu işdə payını yaxşı "qapırdı".
Gəlməzdi belə ağlına ki, çevriləcək val,
Qaldı kabinet, "Volqa" maşın, bir də geniş zal.

Aləm qarışır oğru düzü üstələyəndə,
Gəl ki, onun heç xətrinə olmurdu dəyən də.
Yoxdur daha yaltaqlıq edən də, baş əyən də.
Bir çoxlarının qəlbinə yəqin düşəcək xal,
Qaldı kabinet, "Volqa" maşın, bir də geniş zal.

Tufan elə qopdu, "kişini" rütbədən atdı,
Yan-yörəsi yas tutdu və qəm-qüssəyə batdı.
Ah-vayla keçən günlərimiz axıra çatdı,
İndi büzüşüb, dil-dil ötən, sanki, olub lal,
Qaldı kabinet, "Volqa" maşın, bir də geniş zal.

## BİLMİRƏM HEÇ NƏ EDİM

Yenə çaxnaşma düşüb köhnə idarəmdə, dayı,
Orda var bir demaqoq, bəlkə də heç yoxdu tayı.
Kürsüdən nitq eləyib, ərşə çıxıb hay-harayı.
Guya mən müftəxoram, çox danışıb ünvanıma,
Bilmirəm heç nə edim, vicvicə düşmüş canıma.

Təzə işdə təzəcə qızdırıram öz yerimi,
Zındıq oğlu yenidən artıracaq dərd-sərimi.
"Yuxarı" çatsa xəbər, lap soyacaqlar dərimi.
Mənə bir çarə elə, sal yolunu bir yanıma,
Bilmirəm heç nə edim, vicvicə düşmüş canıma.

Tərpədiblər çoxunu indi çatıb növbə mənə,
İşimin bir ucunu bağlayalar qorx ki, sənə.
Dayı, sancıb dalağım, iş dolaşıb, məncə, yenə.
Nöqsanım çıxsa üzə, bir ləkədir ad-sanıma,
Bilmirəm heç nə edim, vicvicə düşmüş canıma.

"Ütülərdən" sürüşüb, sanki, çıxan mən deyiləm,
Qorxuram indi yaman mən büküləm, lap əyiləm.
Çıxsam işdən, dayıcan, tində duran bir veyiləm.
Ümidim yoxdu daha əldə olan imkanıma,
Bilmirəm heç nə edim, vicvicə düşmüş canıma.

Sən də ki, bir demədin "əyriliyin at daşını,
Xəlvəti rüşvət alıb, girləmə işdə başını.
İlişərsən, silən olmaz ay oğul, göz yaşını",
Son dəfə çat dadıma, sonra məni heç tanıma,
Etmərəm bir də qələt, and içirəm vicdanıma,
Bilmirəm heç nə edim, vicvicə düşmüş canıma.

## DOLAŞIB "ŞANLI MÜDİR"

Kabinetdə oturub fikrə dalıb, təkdi müdir,
Hərəni bir tərəfə qəsdlə özü əkdi müdir.
Boylanıb pəncərədən bir dərin ah çəkdi müdir.
Əli işdən soyuyub heç nə görünmür gözünə,
Dolaşıb "şanlı müdir", yer gəzir artıq özünə.

Düşünür yoxdu dayı bir də şərait yarada,
Deyəsən imdadına çatmayıb heç pul-para da.
Qovsalar bilməyir heç işləyəcəkdir harada.
Yalvarır, amma məhəl qoymayır heç kəs sözünə,
Dolaşıb "şanlı müdir", yer gəzir artıq özünə.

Neçə dostu-tanışı qoymuş özü iş başına,
Yoxdur ancaq ki, yanan gizli axan göz yaşına.
Bəlkə bundan bu yana bəd əməlindən daşına.
Fikri dalğındı yaman, qüssə çöküb sərt üzünə,
Dolaşıb "şanlı müdir", yer gəzir artıq özünə.

Sanki, nöqsan şələsi üstələyibdir lələni,
Lələ heysizdi, daha qaldıra bilmir şələni.
Kimsə çox fəndlə qurub gözlə görünməz tələni.
Yerlibaz dağ kişinin qəsdlə düşüblər izinə,
Dolaşıb "şanlı müdir", yer gəzir artıq özünə.

Baxıram görkəminə yad edirəm keçmişini,
Görməmişdim büzüşən, heç belə halda kişini.
Cızığından çıxanın haqlı burublar vişini.
Səhvini anlamasa, çox vuracaqdır dizinə,
Dolaşıb "şanlı müdir", yer gəzir artıq özünə.

## BAŞINA ƏNGƏL AÇAN

Hiss edirsən, qaranoy, iş dolaşıb, qaçmalısan,
Tamahın çünki sənin həddin aşıb, qaçmalısan.
Üstəlik, olmayan ağlın da çaşıb, qaçmalısan.
Öyrədiblər sənə də, quyruğunu gizlə, ya dan
Yerlibazlıq olacaqdır başına əngəl açan.

Gördüyün işləri bir-bir salacaqlar yadına,
Bu qohumbazlığı, şəksiz yazacaqlar adına.
Arxayınsan ki, sən hökmən çatacaqlar dadına.
Kömək etməz daha vallah, sənə şöhrət, nə də şan,
Yerlibazlıq olacaqdır başına əngəl açan.

Zibilin var, hələ qənbərqulusu çıxmalıdır,
Sən sıxan tək səni də başqa biri sıxmalıdır.
Qurduğun qurğular axır özünü yıxmalıdır.
Gözləyirdim ki, haçansa gələcəkdir belə an,
Yerlibazlıq olacaqdır başına əngəl açan.

Sənə baş əyməyəni tez itirirdin, eləmi?
Yerinə bir qohumu tez ötürürdün, eləmi?
Belə işlərdə qazanc da götürürdün, eləmi?
İndi vur öz başına yağlı qapaz, səhvini qan,
Yerlibazlıq olacaqdır başına əngəl açan.

Sən gedəndə onu bil, vedrə çalan da olacaq,
Sənə beh verdiyini səndən alan da olacaq.
Hələ vallah, əli qoynunda qalan da olacaq,
Tapılar onda deyənlər sənə: əbləh kişi, yan.
Yerlibazlıqdı sənin öz başına əngəl açan.

## A MÜDİR, LƏZZƏT ALIRSAN?

Hardan biləsən kim nə çəkir, işdə əlindən,
Xoş söz hələlik çıxmayıb heç vaxtı dilindən
Yoxdur baş açan əsla sənin fitnə-felindən.
Gəlcək işə sakit yerə çaxnaşma salırsan,
Söylə, əməlindən, a müdir, ləzzət alırsan!?

Hökmün var əlində bilirik ki, bala filsən,
Rəftarına qalsa, kişi, hədsiz acı dilsən.
İnsanlığa yaddır belə adət, ata bilsən...
Görsən biri dilxordu baxıb çırtma çalırsan
Söylə əməlindən, a müdir, ləzzət alırsan!?

Zəng vursa əgər rütbəli kəs, tir-tir əsirsən,
Hər əmrinin icrasına şəksiz tələsirsən.
Dərdin deyən olsa sözünü qəsdlə kəsirsən.
Alçaldıb onu, bəlkə də qəlbən "ucalırsan"...
Söylə, əməlindən, a müdir, ləzzət alırsan!?

Fərz et ki, sənin üstünə haqsız bağıran var,
Gendirsə də dünya, başına, sanki, olur dar.
Sən də bağırırsan, elə bil aləm olub kar.
Məyus eləyib işçini, heç fikrə dalırsan?
Söylə, əməlindən, a müdir, ləzzət alırsan!?

Yersiz qızışırsan adamın adi sözündən,
Şimşək çaxır o kinlə dolu domba gözündən.
Hərdən çağırıb hətta çıxırsan da özündən.
Yaltaq olanın qayğısına amma qalırsan,
Söylə, əməlindən, a müdir, ləzzət alırsan!?

## BAŞ ÜSTƏ

Ey şanlı müavin, duyuram fikrini gendən,
Vallahi, gözüm əsla “su içmir” düzü səndən.
Səndən mənə “yar” olmayacaq, incimə məndən.
Çünki düz ilə əyri bu gün yol gedə bilməz,
Şeytan da yanımda əlini tərpədə bilməz.

Hər nə deyirəm, şəstlə deyirsən ki, baş üstə
Bircə daşı sən qoymamısan amma daş üstə.
Fikrin budu ki, çolpa ola gündə aş üstə.
Burda a kişi, xeyrini bir kəs güdə bilməz,
Şeytan da yanımda əlini tərpədə bilməz.

Göz-qaşla danışma, qanıram, kal deyiləm mən,
Sussam da gözüm gördüyünə, lal deyiləm mən.
Bir gün dinərəm, çünki qara mal deyiləm mən
Aldıqlarını sanma müdir heç vədə bilməz,
Şeytan da yanımda əlini tərpədə bilməz.

Gen-bol kabinetdə elə laqqırtı vurursan,
Öyrəncəlisən, qurğu da yəqin ki, qurursan.
İclasda da hər cür düdüyə arxa durursan.
Sərraf gözüdür, çünki gözüm səhv edə bilməz,
Şeytan da yanımda əlini tərpədə bilməz.

Alnıaçığam mən, gözüm hər yerdə olub tox,
Məndən yazan olsa sevinirsən hamıdan çox.
And içmə yalandan, inanan olmayacaq, yox
Zər qədrini zərgər bilər ancaq, gədə bilməz,
Şeytan da yanımda əlini tərpədə bilməz.

Lənət dədənə, sən mənə qəsdlə qəmiş olsan,
Yaxud da dalımca acı söz-zad demiş olsan.
Olsun haramın bir tikə müftə yemiş olsan.
Zəhmətkeş olan, dünyada qorxu, hədə bilməz,
Şeytan da yanımda əlini tərpədə bilməz.

## GÖZLƏYİR

Düşmüsən "süd gölünə" kef-damağın çağdı, hələ,
Yəqin arxan-dayağın kölgə salan dağdı, hələ.
Şübhəsiz ki, bu yerin ay kişi, çim yağdı, hələ
Müftəxor, rüşvət alan işdə keçir sağ, soluna,
Bil, nəzarət salacaq işləri hökmən yoluna.

Atılırsan oda sən, amma niyə, key də qanıb,
Odla çox oynayanın bil ki, əli odda yanıb.
Bənzəyir eyni sənə, yandığını qəsdlə danıb.
Düşüb arxanca gəzir, xahişi icra oluna,
Bil, nəzarət salacaq işləri hökmən yoluna.

Əkilirsən, başına bəlkə bir əncam çəkəsən,
Çünki vicdana düşən gözlə görünməz ləkəsən.
Pul tutub gözlərini, cütdü deyirsən təkə sən.
Dəllalın boynun əyib, dönsə də nəfsin quluna,
Bil, nəzarət salacaq işləri hökmən yoluna.

Günahın bir çoxuna bəlli deyildirmi məgər?
Köhnə yerdə işini qurdalayan olsa əgər.
Deyirəm bəlkə səni, hökmü olan dara çəkər.
Döşünə döymə nahaq, arxayın olma puluna,
Bil, nəzarət salacaq işləri hökmən yoluna.

Dalmısan fikrə yaman, anlayırıq təşvişini,
Deyəsən vaxtı çatıb yoxlayacaqlar işini.
Əminik ki, bu dəfə lap yığlayacaqlar vişini.
Sən itirsən huşunu, qorxma girərlər qoluna,
Bil, nəzarət salacaq işləri hökmən yoluna.

## AXIR Kİ...

Düşsəm də lap əldən, qələbə çaldım axır ki,
Əmrim yubanırdı, girişib, aldım axır ki.
Xudmani yerə lövbərimi saldım axır ki.
Dünya başıma az qala olmuşdu mənim dar,
Cuşa gəlirəm, çırtma çalın, oynamağım var.

Şübhə ola bilməz dəvədən çox iridir "fil",
Çatdı dadıma yaxşı ki, vallah, diridir "fil".
Daydaylarımın zorbalarından biridir "fil".
Sağdır, ilişib indiyəcən olmamışam xar,
Cuşa gəlirəm, çırtma çalın, oynamağım var.

İllərlə bu yerçün özümü mən oda atdım,
Yüz yol filə yaltaqlıq edib, qan-tərə batdım.
Gəldi kara "yaltaq əməlim", arzuma çatdım.
Dözdüm əzaba, tənəyə də eyləmədim ar,
Cuşa gəlirəm, çırtma çalın, oynamağım var.

Dünyada vəzifə sanıram nurdu gözümçün,
Minnətdaram ancaq "filə" bu səbr, dözümçün.
Gen-bol kabinetdə süzürəm indi özümçün.
Kaş ki, ola məclis, çalına, orda kaman, tar,
Cuşa gəlirəm, çırtma çalın, oynamağım var.

Əfsanədi vallah, pul olan yerdə mərifət,
Müftə nə zaman çarə edib dərdə mərifət?
Yoxdur, nədə ki, olmayacaq xərdə mərifət.
Qandım ki, bu işdən mayasız çıxmayacaq kar,
Cuşa gəlirəm, çırtma çalın, oynamağım var.

İndi deyəcəklər bu da öz əmrini aldı,
Yaltaq çox az idi, biri də işdə ucaldı.
Hərçənd ora layiq neçəsi kölgədə qaldı.
Açdım sizə öz sirrimi, siz eyləməyin car,
Cuşa gəlirəm, çırtma çalın, oynamağım var.

## OLSAYDI

Ey dost, bu kökə bil ki, məni badə salıbdır,
Dəhşət budu ki, mənliyimi məndən alıbdır.
Bircə olanım köhnə palazdır, o qalıbdır.
Tapsaydım əgər müştəri, vallahi, satardım,
Olsaydı iradəm, arağı çoxdan atardım.

Mənzil payımı arvadağa satmağa qoymur,
Bir çöp də zibil vedrəsinə atmağa qoymur.
Hər gün "döşəyir" cəmdəyimə, yatmağa qoymur.
Vallah, yer ola, çarəsizəm, damda yatardım,
Olsaydı iradəm, arağı çoxdan atardım.

Yurdsuz qocaya oxşayıram mən bu yaşımda,
Heyhat! Bu bəladan ağarıb tük də qaşımda.
Bəxtim öz əlimlə daşı sındırdı başımda.
Vaxtında ayılsaydım əgər kama çatardım,
Olsaydı iradəm, arağı çoxdan atardım.

Xoşbəxt ötüşən günləri hərdən anıram mən,
Körpəm yada düşdükcə alovsuz yanıram mən.
Tərgitmişəm artıq, nədi badə, qanıram mən.
Bilsəydim əzəldən ona mən ağu qatardım,
Olsaydı iradəm, arağı çoxdan atardım.

Tənha oturub qurdaladım kəlləmi az-maz,
Səs gəldi: "Barış, məhkəməyə ərzəni tez yaz!"
Arvad da gəlib razılığa, keyfim olub saz.
Başlandı həyatım təzədən, yoxsa batardım,
Olsaydı iradəm, arağı çoxdan atardım.

## ÖLÜRƏM VURMAQ ÜÇÜN

Mən də baş girləməyin tapmışam artıq çəmini,
Tərpədir bir yalanım lövbərin atmış gəmini.
Təzəcə öyrənirəm sirli yalan aləmini.
Girirəm əlli dona bir yalan uydurmaq üçün,
Ölürəm, ay qaranoy, müftə araq vurmaq üçün.

Var səriştəm, bilirəm kimləri aldatmaq olar,
Çəksə xərc, çolpa yeyib, yüz də araq atmaq olar.
Keflənib, tirtap olub lap küçədə yatmaq olar.
Fikrini çəkmərəm heç mən səhəri durmaq üçün,
Ölürəm, ay qaranoy, müftə araq vurmaq üçün.

Yolda, bir tində mənim rastıma şeytan da gələ,
Çəkmərəm əl, mən ölüm, keflənib üryan da gələ.
Amma qarnım ac olan, qur-qur edən anda gələ.
Apara kaş ki, məni toyxana qurdurmaq üçün,
Ölürəm, ay qaranoy, müftə araq vurmaq üçün.

Müftə məclis ki, olur, sübhi-səhərdən dururam,
Nə yalan satmalıyam, evdə planlar qururam.
Birinə and içirəm, başqasına göz vururam.
Mahirəm xam hərifə gündə tələ qurmaq üçün,
Ölürəm, ay qaranoy, müftə araq vurmaq üçün.

Lap batardım, a kişi, yaxşı ki, vardır bu dilim,
Atılardı bayıra yoxsa ki, çoxdan mitilim.
Yalanım çayxanada tez yayılarmış, nə bilim.
Axtaran çoxdu məni, burnumu ovdurmaq üçün,
Ölürəm, ay qaranoy, müftə araq vurmaq üçün.

Otarıb qarnımı mən çox güvənirdim özümə,
Kəc baxanlar elə bil şiş batırırlar gözümə.
İnanan yoxdu daha hətta mənim düz sözümə.
Duymuşam qurğu qurublar məni qovdurmaq üçün,
Ölürəm, ay qaranoy, müftə araq vurmaq üçün.

## “MÜDİR – KATİBƏLƏR”

Bilməzdim əzəldən ki, bu dünya dəyişərmiş,
Hərdən qocalar da təzə sevdaya düşərmiş.
İşdən, arada, katibə tez-tez sürüşərmiş.
Bəlkə belə adət bu müdirlərdə azardır?
Sizdə, görəsən, işdə bu cür katibə vardır?

Yer var ki, “müdir” katibədir, gülmə, a qardaş,
Şübhən var əgər sözlərimə, gəl bizə birbaş.
Versən nə sual, oynadacaqdır sənə göz-qaş.
Az-maz da uzatsan, deyəcək: çıx, bura dardır,
Sizdə, görəsən, işdə bu cür katibə vardır?

Baxsan üzünün rənginə, şübhən daha artar,
Orda bu təbiət yaradan hər cürə rəng var.
Büllur şüşədir, sanki, parıldar üzü par-par.
Həm də elə bil ki, yanağı qırmızı nardır,
Sizdə, görəsən, işdə bu cür katibə vardır?

Vaxtın var əgər katibəni izlə səhərdən,
Sakit ola bilməz özü zəng vurmasa hərdən.
Zənglər olacaqdır ona, gör, bir neçə yerdən.
Dilsiz telefon da belə yerlərdə bezardır,
Sizdə, görəsən, işdə bu cür katibə vardır?

Dinmir müdiri, katibə şimşək kimi çaxsa,
Çımxırsa şikayətçiyə, yanpörtü də baxsa.
Yaxud da ki, təhqir ilə yandırsa və yaxsa.
Çünki belə anlarda müdir daima kardır.
Sizdə, görəsən, işdə bu cür katibə vardır?

## HƏSƏD

Son zamanlar kimə tez-tez yan alırsan, bilirəm
Demə xamdır, nəyi sahmana salırsan, bilirəm.
Pillə-pillə nə sayaq tez ucalırsan, bilirəm.
Kaş olaydım yerinə, mən də girərdim qoluna,
Döşənərdim mən onun xalça-palaztək yoluna.

İndi bildim ki, filankəs müdirin sağ əlidir,
Dolanırsan başına, çünki sənə sərfəlidir.
Kimə baş əydiyini, bilsən, əgər – gülməlidir.
Ola nazir, dönərəm ilboyu vallah, quluna,
Döşənərdim mən onun xalça-palaztək yoluna.

Olmayan yerdə kişi, sən də özünçün kişisən,
Bilirəm, qoymamısan ağrıya bir dost dişi sən;
Məni dart öz yanına, həll elə müşkül işi sən.
Bəyənər adətimi, keçsəm əgər sağ-soluna,
Döşənərdim mən onun xalça-palaztək yoluna.

Girləyirsən başını, keyfə baxırsan necə də,
Vaxtın olmur, bilirəm, yatmağa hətta gecə də.
Sən vurursan – o vurur pivə, araq, lap cecə də.
Yolda səndirləsə, sən almalısan öz dalına,
Döşənərdim mən onun xalça-palaztək yoluna.

Neçə ildir görürəm keyfin olub daima saz,
Baxıram, var görəsən heç mənə tay, ağlı dayaz.
Bir əyim qoy başımı, vur, mən ölüm, sən də qapaz.
Söylə, dostun nə zaman bəs yanacaqsan halına?
Döşənərdim mən onun xalça-palaztək yoluna.

Sənə baxdım, görürəm, gəlmişəm artıq həvəsə,
Mən də can yandırıram amma ki, sanballı kəsə.
Yeri gəlsə, çıxaram mərtəbəni bir nəfəsə.
Kaş ki, qulluq buyura, aldıra şey öz puluna,
Döşənərdim mən onun xalça-palaztək yoluna.

Anlasın arif olan, qoy sözümü asta deyim,
Mən kiməm, fərqi nədir toyda deyim, yasda deyim?
Qınayan olmasa lap hər dəfə iclasda deyim,
Qurban ollam qananın həm özünə, həm malına,
Döşənərdim mən onun xalça-palaztək yoluna.

Bu cahanın görürəm müxtəlif insanları var,
Düzü var, əyrisi var, arifi, nadanları var,
Hələ vardır eləsi – hər cürə nöqsanları var,
Antipod, məncə, gərək hər dəfə tənqid oluna,
Bəlkə yaltaq utana, iş də düşə öz yoluna.

## “ORDA BOZBAŞ OLUR?”

Kefi kökdür dədəmin, həm də ki, rahatdı canı,
Açıb o zirzəmidə xırdaca qəssab dükanı.
Bura gəlmir hələlik müxbirin ancaq gümanı.
Neçə illər belədir, xırda-xuruş daşbaş olur,
Nəyimiz olmasa da, axşama bir bozbaş olur.

Dədəmin müştəridən zərrəcə yoxdur gileyi,
Kəf gəlib, dil də tökər, razı salar lap fələyi.
Köhnə qəssabdı kişi, yaxşı bilir hər kələyi.
Qatır ət növlərini, müştərilər çaşbaş olur,
Nəyimiz olmasa da, axşama bir bozbaş olur.

Yeni kəşf eyləmişəm var dədəmin bir mərəzi –
Əti şəst ilə qoyur, yırğalanır daş-tərəzi.
Onda pərsəngi itir, bax, budur ancaq qərəzi.
Hay salan olsa, günahkar tərəzi, ya daş olur,
Nəyimiz olmasa da, axşama bir bozbaş olur.

Müştəri xırdasını istəsə, yanpörtü süzür,
Qəzəbindən əl atır daşları yan-yana düzür.
Gətirib bəxti onun, lap kişi çim yağda üzür.
Gəlir hərdən ki, qonaq, evdə plov, ya aş olur,
Nəyimiz olmasa da, axşama bir bozbaş olur.

Hələ zavmaq da olub ortada, hərdən neçə il,
Gözü doymur kişinin, yığdığı azdır elə bil.
Pullanıb dərdə düşən, vardır ölənlər də qəfil.
Özü görmür elə bil, söhbəti hey daş-qaş olur,
Nəyimiz olmasa da, axşama bir bozbaş olur.

Dədəmə hey deyirəm: arxayın olma varına,
Sərvətin gəlməyəcək sən ilişəndə karına.
Ləkədir tutduğun iş həm də ki, övladlarına.
Olmayır dada çatan onda ki, işlər “yaş” olur,
Soruşur da hələ bir: “Orda oğul, bozbaş olur?”

## KAŞ Kİ, GEDƏYDİM

Səbr elə, bük barmağını, mən sayım,
Gör nə şərait yaradıb daydayım.
Ayda gəlir bir neçə yerdən payım.
Baxma ki, yoxdur savadım yazmağa,
Kefdə keçir günlərimiz, ay “qağa”.

Hansı yerə lövbərimi salmışam,
Dost-tanışın qayğısına qalmışam.
İş düzəlib hər nə verib, almışam.
Söykəmişəm arxamı, vallah, dağa,
Kefdə keçir günlərimiz, ay “qağa”.

Kaş ki, görəydin necə dağıdır kişi,
Bizlərə sanballı dayaqdır kişi.
Şükr edirik ki, hələ sağdır kişi.
Dəvət edir, dostları tez-tez bağa,
Kefdə keçir günlərimiz, ay “qağa”.

Daydayıma yoxdu batan təkbətək,
Arxası vardır ki, özündən nəhəng.
İstəsə, daşbaş da olar bir ətək.
Cəhd edirəm mən də ona çatmağa,
Kefdə keçir günlərimiz, ay “qağa”.

Olma hərif, sən də qoşul, gəl, mənə,
Öyrədərəm fəndləri bir-bir sənə.
İstəyirəm dirçələsən sən yenə.
Bir şey olar dal gününə atmağa,
Kefdə keçir günlərimiz, ay “qağa”.

Mən başıbatmış inanıb Səftərə,
Hər nə demişdimsə yazıb dəftərə.
Car eləyib, söz yayılıb hər yerə,
Sanki, gəlibmiş aranı qatmağa.
Bərk ilişib başlamışıq batmağa,
“Kefdə” keçir günlərimiz, ay “qağa”.

## ƏL ATACAM YAZMAĞA

Mən demaqoq olmamışam, olmaram,
Ərzə, şikayətlə də yoxdur aram,
Amma müdir, mən də səninçün varam!
Çünki salıbsan məni çox get-gələ,
Əl atacam yazmağa bundan belə!

Hörmət edirsən necə "hörmətcilə",
Sözsüz alıblar səni çoxdan ələ.
Axırı bir gün quracaqlar tələ.
Onda idarəndə qopar zəlzələ,
Əl atacam yazmağa bundan belə!

Vədə verirsən neçə ildir mənə,
Müşkül olubdur işim ancaq yenə.
Bəlkə, gəlib yalvarım hər gün sənə?
Baş əyərəm tülküyə yox, mən filə,
Əl atacam yazmağa bundan belə!

İndiyəcən şəkk eləyirdim özüm,
Səndə olubdur neçə illər gözüm.
Əl çəkərəm, "yoxdu desən düz sözüm".
Kəşf elədim mən bunu düz beş ilə,
Əl atacam yazmağa bundan belə!

Xeyri olub çoxlarına kölgənin,
Qopsa tufan, qərq olacaq yelkənin,
Çatmayacaq dadına bir kəs sənin,
Keyfə baxırsan, görürəm sən hələ,
Əl atacam yazmağa bundan belə!

## ELƏ ZƏNN EYLƏMƏSİN

"Dost" satır gündə yalan, mənsə yalan satmamışam,
Gözləyib batmağımı, şükr edirəm, batmamışam.
Bilirəm iç üzünü, amma onu atmamışam.
Çünki vardır səbəbi, mən hələlik dözməliyəm,
Elə zənn eyləməsin: mən elə xalis dəliyəm.

Bələd oldum düzü dabbağda onun lap gönünə,
Qalmışam mat hələ də qulluq edir hansı dinə?
Baş əyib, can deyirəm, çünki gərəkdir bu mənə.
Qışda dəryada desə üz, atılıb üzməliyəm,
Elə zənn eyləməsin: mən elə xalis dəliyəm.

Coşub hərdən də deyir: Mən Günəşəm, sən də ki Ay"
Deyirəm düzdü, "sən öl", "dünyada yoxdur sənə tay".
Hələ mən görməmişəm ağlı dayaz, bir belə zay.
Düşüb ardınca onun kölgə kimi gəzməliyəm,
Elə zənn eyləməsin: mən elə xalis dəliyəm.

Olsa tərif eləyən dartır hərif tez özünü,
Asta, ahənglə və ya şəstlə deyir hər sözünü.
Arabir saxta gülür, oynadaraq qaş-gözünü.
Çarə yoxdur, qoşulub mən də ona gülməliyəm,
Elə zənn eyləməsin: mən elə xalis dəliyəm.

Göstərirdi özünü alicənab, nəfsi də tox,
Demə varmış zibili bəlli olandan daha çox.
Həşəratdır elə bil, mənliyi yox, məsləki yox.
Bu səbəbdən də onu tapdalayıb əzməliyəm,
Yeri var onda desə... Lap elə xalis dəliyəm...

## SƏNƏ NƏ?

Hardasa Şərbətəli guya ki, bir qurğu qurub,
Duz-çörək kəsdiyinə gözləmədən zərbə vurub.
Fərəhindən güc alıb kəlləsi üstündə durub.
Lap elə sərsəridir, ağlı dayazdır, sənə nə?
Tutalım kim nə deyir, köhnə avazdır sənə nə?

Yaymısan aləmə ki, söz aparır, söz gətirir,
Aşkar aldıqlarını rəisə xəlvət yetirir.
Dəxli varmı sənə bir şey qazanır, ya itirir?
Xeyri çoxdur belə sövdada, ya azdır, sənə nə?
Tutalım kim nə deyir, köhnə avazdır sənə nə?

Sən güdürsən görəsən kim nə alır, kim nə satır,
Harda böhtan yazılır, kim aranı dalda qatır.
Dayağı kimdi kimin, yağlı yerə kim can atır.
Bəlkə bu fikrə düşən ütməli qazdır, sənə nə?
Tutalım kim nə deyir, köhnə avazdır sənə nə?

“Döşəyir” bir parası yaltağa, ya baş əyənə,
Tənbələ, müftəxora, müftə gəlirdən yeyənə.
Öyünən kəmsavada, tinbaşı “mən”, “mən” deyənə.
Antipoddur özü də keyfi də sazdır, sənə nə?
Tutalım kim nə deyir, köhnə avazdır sənə nə?

Canfəşanlıq eləyib, gözləri gəl pərdələmə,
Demirəm gördüyün hər nöqsanı aşkar eləmə.
Elə sənsiz də həriflər düşür hərdən qələmə.
Yazana bəlkə dəyən yağlı qapazdır, sənə nə?
Tutalım kim nə deyir, köhnə avazdır sənə nə?

## ÇÖLDƏ YATIRDIN, ELƏMİ?

Səndə gündən-günə bu içkiyə artırdı maraq,
Qayıdırdın evə də qoltuğun altında “yaraq”.
Anlamırdın ki, səni öz qulu etmişdi araq.
Son zamanlar evinə zorla çatırdın, eləmi?
Bəzi vaxt astanada, çöldə yatırdın, eləmi?

Gündə tay-tuşlarını tində yığırdın başına,
Arağı hopp eləyib, sonra minərdiz maşına.
Pivə gəzmək a kişi, heç yaraşardı yaşına?
Keflənib sən arağa pivə qatırdın, eləmi?
Bəzi vaxt astanada, çöldə yatırdın, eləmi?

Səni vadar eləyən içkiyə o dostun hanı?
Ağ maşın, gen kabinet, tutduğun o postun hanı?
Arağı tərif edən, söylə, bəs o tostun hanı?
Bitdi hər şey, adını çünki batırdın, eləmi?
Bəzi vaxt astanada, çöldə yatırdın, eləmi?

Tanıyırlar səni əyyaş kimi ay bəxti qara.
Ağlını aldı araq, indi qalıbsan avara.
Evdə külfət də əlindən daha gəlmişdi zara.
Çünki əşyalarını gizli satırdın, eləmi?
Bəzi vaxt astanada, çöldə yatırdın, eləmi?

Əyyaşın aqibəti agah olub indi sənə,
Söylə, atdın daşını, yoxsa içirsənmi yenə?
Son sualımdı sənə, sən deyəsən bəlkə mənə.
Bu kökə düşmək üçün çox can atırdın, eləmi?
Bəzi vaxt astanada, çöldə yatırdın, eləmi?

## GÜLMÜSƏN BAŞQASINA

Şükr elə Allaha ki, sən hələ vallah, dirisən,
Özgəyə qurğu quran yüz bədəməldən birisən.
Atılıb-düşmə daha, yaxşı olar ki, kirisən,
Ahıl olsan da, sənin baxmadılar heç yaşına,
Gülmüsən çoxlarına, indi gəlib öz başına.

Ay əfəl, anlamadın saxta gülüşlər tələdi?
"Döşədi" cəmdəyinə, qəsdlə, abırsız elədi.
Hələ sorğu-suala çəkməyi bundan belədi.
Bilmədin son qoyular ayda gələn daşbaşına?
Gülmüsən çoxlarına, indi gəlib öz başına.

Arxayındın ki, vəzifə sənə daim qalacaq,
Hər zaman tapşırığı başqası səndən alacaq.
Gözləmirdin ki, sənə zurnanın "züysüz" çalacaq.
Səs-səda bəlkə düşüb el-obanın dam-daşına,
Gülmüsən çoxlarına, indi gəlib öz başına.

Gəlməyib ağlına ki, sən də düşərsən bu günə,
Qoymadı zərrəcə hörmət başının ağ tükünə.
Dözəcəksənmi görən tənqidin ağır yükünə?
Çox inandın sən onun him-ciminə, göz-qaşına,
Gülmüsən çoxlarına, indi gəlib öz başına.

Rütbədə hökm eləyən günlərini sal yadına,
Sənə xeyri dəyəninin sən də çatırdın dadına.
Arxa çıxdıqlarının axırı getdin badına.
Dərs olar bəlkə bunu həkk eləsən yaddaşına,
Gülmüsən çoxlarına, indi gəlib öz başına.

## VAY, DƏDƏ, VAY!

Cəm edib əldə olan hər cürə imkanları sən,
Göz yumub, gizləmisən işdəki nöqsanları sən.
Keçiribsən, bilirik, kefdə bütün anları sən.
Çıxıb işdən, niyə bəs indi salıbsan, de haray,
Antipodsanmış özün, bilməmişik, vay, dədə, vay!

Yığılıbmış nə qədər üzdəniraqlar başına...
Ortaq idin görünür onların hər daşbaşına.
Cəhd edirdin evinə müftə nə varsa daşına.
Ad qoyurdun ki, gəlib bağlama kənddən sənə "pay",
Antipodsanmış özün, bilməmişik, vay, dədə, vay!

Sürünən "kölgələrin" işdə girərdi qoluna,
Gah keçərdi sağına, gah da keçərdi soluna.
Müşkül işlər çox olub, sən də salıbsan yoluna.
Demisən: xəlvəti gəl, evdə gətir, pulları say,
Antipodsanmış özün, bilməmişik, vay, dədə, vay!

Sən qudurduqca, qızışdıqca itirdin inamı,
Getdi əldən o vəzifən, eşidib bildi hamı.
Qaldı qəlbində neçə "dost-tanışın" arzu-kamı.
Bəsdi, rüşvət puluna gəzməyə getdin neçə yay,
Antipodsanmış özün, bilməmişik, vay, dədə, vay!

Uzun illər orada keyfin olubdur, demə, çağ,
Boşboğazlıq eləyib, heç atılıb-düşmə nahaq...
Böhtan atdın çoxuna, indi çəkirlər sənə dağ.
Yoxdur artıq kabinet, katibə versin sənə çay,
Antipodsanmış özün, bilməmişik, vay, dədə, vay!

Köhnə həmkarlarını tində pusursan, eləmi?
Susur onlar hələlik, sən də susursan, eləmi?
Nə yemişdinsə o vaxt, indi qusursan, eləmi?
Şəkk edirdik olasan üzdəniraq kəslərə tay,
Antipodsanmış özün, bilməmişik, vay, dədə, vay!

## ÇATDIRIRDI ASTA-ASTA

Dədəm keçib anbara kalandı, ay can, ay can!
Bazadan hər cür malı alandı, ay can, ay can!
Yer də ki xudmani yer, dalandı, ay can, ay can!
Gəl tanış ol dədəmlə, hardasan, ay müştəri!
Yoxdu bu cür sərfəli anbara tay, müştəri!

Malın əsas yarlığı atıldı altdan-altdan,
Çeşidləri, növləri qatıldı altdan-altdan.
Ən yuxarı qiymətə satıldı altdan-altdan,
Sən də gətir əlbəəl pulları say, müştəri!
Yoxdu bu cür sərfəli anbara tay, müştəri!

Zirzəmiyə vurdurub kafeli başdan-başa,
Baş xoda düşməz əgər dəyməsə daşdan-daşa,
Aləm olur ad günü, keçəndə yaşdan-yaşa,
Məclisə dostlar gəlir əlində pay, müştəri!
Yoxdu bu cür sərfəli anbara tay, müştəri!

Xəlvəti gəlsən gecə dalanda azma, ey dost,
İşdi kələk gəlsələr, heç yerə yazma, ey dost,
Üzdəniraqlar kimi sən quyu qazma, ey dost,
Batsa da, salmaz dədəm aləmə hay, müştəri!
Yoxdu bu cür sərfəli anbara tay, müştəri!

İldə gəlir müfəttiş bir dəfə – yaydan-yaya,
“Donluğunu” artırır amma ki, aydan-aya,
Sovqatını göndərir dədəm də, maydan-maya,
Kaş ki, müfəttiş qağam çıxmaya zay, müştəri!
Yoxdu bu cür sərfəli anbara tay, müştəri!

Dədəm arzu-kamına çatırdı asta-asta,
Dal qapıdan malları satırdı asta-asta.
Röyada gördüm dədəm batırdı asta-asta.
Yuxum çin olsa birdən, ondadı vay, müştəri!
Yoxdu bu cür sərfəli anbara tay, müştəri!

## İMKAN NƏDİR?

İmkan nədi? İmkan, a kişi, yağlı vəzifə,
Köklü palıdın gövdəsinə bağlı vəzifə.
Güclə açılan darvazası tağlı vəzifə
Gen-bol kabinetdə havalar ilboyu yazdı,
Baxma hələlik arxası var ki, kefi sazdı.

İmkan nədi? Hökmün gücünə fəxri ad almaq,
Zənglərlə neçə kəmsavadı məktəbə salmaq.
İllərlə bir iş görməyib heç, işdə ucalmaq.
Çox da ki bilən var ki, bir az ağlı dayazdı.
Baxma hələlik arxası var ki, kefi sazdı.

İmkan nədi? Hər yerdə sudan qupquru çıxmaq,
Zorla günahı başqasının boynuna yıxmaq.
Təbrikləri qəbul eləyib, əlləri sıxmaq.
Yəqin deyəcəksən bu avaz köhnə avazdı,
Baxma hələlik arxası var ki, kefi sazdı.

İmkan nədi? Bir zənglə bütün aləmi qatmaq,
Müşkül sayılan arzuya bir andaca çatmaq.
İldə təzə bir “Volqa” alıb, köhnəni satmaq.
Axtarsan əgər bəzisi hərçənd ədəbazdı,
Baxma hələlik arxası var ki, kefi sazdı.

Üstündü hələ imkanı ilə təpə dağdan,
Ah-vay qopacaqdır seçiləndə qara ağdan,
Ey dost, başa düş, yazmamışam şeri nahaqdan.
Zənn etmə ki, dünyagörüşüm dardı, ya azdı,
Baxma hələlik arxası var ki, kefi sazdı.

## SUSMAQMI OLAR NÖQSAN OLANDA

İclasda həmişə müdir hay-küy qopardı,
Zalda kora tın köndələnə şəstlə çapardı.
Boş-boş danışıb, vaxt itirib, baş apardı.
Olmazdı dinən, bilsə də lap goplu, yalandı,
Hərçənd ki, bilən vardı müdir rüşvət alandı.

Bəzən də o, qalxıb zilə bar-bar bağırardı,
Sözdə hamını düzlüyə ancaq çağırardı.
Amma özünün ayrıca hər ay payı vardı.
Dünya dağıla boynuna almazdı kalandı,
Hərçənd ki, bilən vardı müdir rüşvət alandı.

Cürət eləməzdim bir adam kürsüyə çıxsın,
Rüşvətxoru tənqid eləsin, yaxşıca sıxsın.
Tutsun ətəyindən onu taxtan yerə yıxsın.
Yaxud da desin ki, yolunuz döngə, dalandı,
Hərçənd ki, bilən vardı müdir rüşvət alandı.

Bilmirdisə bir vaxtı nə qorxu, nə də hürkü,
İndi alışıb, sanki, yanır təptəzə kürkü.
Aləm bürünüb "tüstü"yə, olmuş hava bürkü.
Ah-vay eləyir ki, bu hava dərdə salandı,
Qorxur ki, deyərlər üzünə rüşvət alandı.

Dövlət planı ayda şişirtməklə dolanda,
Susmaqmı olar indi belə nöqsan olanda?!
Ah-uf edəcək, bərk ilişib rəngi solanda.
Hərçənd demaqoq qeydinə hər yerdə qalandı,
Qorxur ki, deyərlər üzünə rüşvət alandı.

Şəksiz aramızda beləsi çox deyil, azdır,
Olsun ki, hələ kef-damağı indi də sazdır.
Qış fəsli, payız fəsli onunçün yenə yazdır,
Rüşvət alana, həm verənə balta çalandı.
Qorxur ki, deyərlər üzünə rüşvət alandı,
Bilmir ki, onun səksəkəli ömrü talandı.

## NEYNİM

Külfət qocalıb, dolsa da artıq yaşa, qardaş,
Meylin salıb indi təzədən daş-qaşa, qardaş.
Söhbətlə bu iş dünyada gəlməz başa, qardaş.
Neynim, bu maaşla nə sayaq daş-qaş alım mən?
Almır vecinə, lap deyinim, zurna çalım mən.

Vallah, nə edim arvadağa olsa da yaşlı,
İllah eləyir ki, üzük al bir neçə qaşlı.
Hardan gətirim müftə pulu mən başıdaşlı.
Xeyri nədi, lap sübhə qədər fikrə dalım mən.
Almır vecinə, lap deyinim, zurna çalım mən.

Toylarda görüb bərbəzəyi qonşu qadında,
Gündə yediyi qalmasa da əsla yadında.
Bir-bir sayır o gördüyünün hətta adın da.
Çarəm kəsilib, öz başıma daşmı salım mən?
Almır vecinə, lap deyinim, zurna çalım mən.

Şəksiz küsəcək, çünki o tərsdi yaman, Allah!
İnfarkt edəcəkdir məni arvad, aman Allah!
Vallah, bu günə düşməmişəm heç zaman, Allah!
Qəsdi budu ki, ömrü boyu borclu qalım mən,
Almır vecinə, lap deyinim, zurna çalım mən.

Bəsdir, nə qədər olmalıyam mən günü qarə,
Vadar eləyir ki boşayım, bir budu çarə!
Gəlsə ağıla, evlənərik bir də dübarə.
Yəqin ki, yanar halıma, qoymaz qocalım mən,
Almır vecinə, lap deyinim, zurna çalım mən.

## KEF ÇƏKMƏLİ ƏYYAM İDİ

Kef çəkməli əyyam idi durğunluq olanda,
Hər iş düzəlirdi axı cib müftə dolanda.
Çoxdur aramızda büzüşən, rəngi solan da.
Ah-ufdadılar kaş ötən illər dönə bir də,
Çarə gəzir indi neçəsi düşdüyü dərdə.

Hay-küyçülərin çıxdı əli yağlı yerindən,
Sirlər açılar qurdalayan olsa dərindən.
Hərdən söz açır bəziləri dərdi-sərindən.
Guya ki, günahsız ilişib durduğu yerdə,
Çarə gəzir indi neçəsi düşdüyü dərdə.

Gəlmiş cana keçmiş qağalar sorğu-sualdan,
Get-gəl çox uzun çəkdi, düşüblər daha haldan.
Bir gün də görərsən aparıblar elə zaldan.
Şəksiz qulağı səsdədi axşam da, səhər də,
Çarə gəzir indi neçəsi düşdüyü dərdə.

Tərif xumarında yatanın da köpü yatdı,
Tarix özü lənətlədi, çirkablığa atdı.
Bədbəxt hələ də əl-qol atır, bəlkə də batdı...
Simsarları dərin kök atıb kənddə, şəhərdə,
Çarə gəzir indi neçəsi düşdüyü dərdə.

Vallah, inana bilmirəm heç dinc duracaqlar,
Bağlardakı mənzildə planlar quracaqlar,
Baş tutmayacaq, dizlərinə hey vuracaqlar,
Bir vaxt çox asıblar gözümüzdən qara pərdə,
Çarə gəzir indi neçəsi düşdüyü dərdə.

## BÜROKRAT

Dünya dağıla, kef-damağından dala qalmaz,
Günlərlə yolölçənləri heç eyninə almaz.
Zalım balası, bir kəsi razı yola salmaz.
Almaz vecinə, lap qapısında uzanıb yat,
Rast olmaya kaş heç kəsə heç yerdə bürokrat!

Zəhmət çəkib axtarma, gəzir göz qabağında,
Qalmır düzü aciz deyilən söz qabağında.
Varsa hünərin, ağ yalana döz qabağında.
Tərpənməyəcək bir tükü, lap aləmi sən qat,
Rast olmaya kaş heç kəsə heç yerdə bürokrat!

Söz versə, inanma düzələ, çünki yalandır,
Qovluqda şikayət yenə illərlə qalandır.
Dəllal deyər ancaq bu hərif rüşvət alandır.
Him-cimlə səni qandıracaq ki, nəyə əl at,
Rast olmaya kaş heç kəsə heç yerdə bürokrat!

Çox yerdə bürokrat uzun illər kök atıbdır,
Vicdanını ya "seyfə qoyub", ya da satıbdır.
Baxma dayılar kölgəsi altında yatıbdır.
Bir gün ilişəndə, duruxub, lap qalacaq mat,
Rast olmaya kaş heç kəsə heç yerdə bürokrat!

Qəhmərlərini laxladalar kaş ki, ən əvvəl,
Sonra işinə bir balaca gəzdirələr əl.
Şəksiz ki, çıxar ortaya məxfi qalan əngəl.
Onda fələyə yalvaracaq "dadıma sən çat!"
Rast olmaya kaş heç kəsə heç yerdə bürokrat!

## SƏN DEMƏ EŞİDİBLƏR

Dayımın sayəsində
Vəzifəyə keçəndə,
Üzdəniraq dostlarım
Yığılıb gəldi kəndə.
Məclis qurdum evimdə
Həmin günün gecəsi,
Gurultulu tost dedi
Şənimə bir neçəsi.
Borcla, xərclə birtəhər
Onları saldım yola;
Kaş ki, belə görüşlər
Düşmənə qismət ola.
Boş əl ilə gələnlər
Əlləri dolu getdi,
Çoxu öpüb üzümdən
Hətta təşəkkür etdi.
Bəli... zəng edirdilər,
Mən də əməl edirdim.
Arabir başqasına
Minnətə də gedirdim.
...dolandı aylar, illər,
Mən qayıtdım şəhərə,
Onlarla rastlaşırdım
Gündə bir neçə kərə.
Fəqət soruşmurdular
Halımı-əhvalımı;
Sanki, onlar deyildi
Müftə yeyən malımı.
Çox götür-qoy elədim;
Nə qəbahət etmişəm,
Sən demə eşidiblər
Vəzifədən getmişəm.

## ALMAĞA ÖYRƏNCƏLİDİR

Görüşəndə səni öz bağrına bərk-bərk sıxacaq,
Xərcə salsın deyə, tez boynuna bir şey yıxacaq.
Sən "baş üstə" deməsən, hökmən özündən çıxacaq.
Atılıb-düşsə, bağırsa, elə bilmə dəlidir,
Bu filan oğlu filan almağa öyrəncəlidir!

Bacarır xeyri ola, daş-divara kəllə vurar,
Utanıb ar eləməz, qonşusuna qurğu qurar.
Yeri gəlsə, mən ölüm, haqsıza şahid də durar.
Adətindən görünür əlli-ayaqlı zəlidir,
Bu filan oğlu filan almağa öyrəncəlidir!

Yata bilmir gecələr sübhə kimi fikrə dalır,
Keçmişin haqq-hesabın ertəsi gün hökmən alır.
Durulur kef-damağı, astaca fındıqça çalır.
Səsləyir katibəni, çünki o da "sağ" əlidir,
Bu filan oğlu filan almağa öyrəncəlidir!

Yayda getmir bağına, çünki kurortlardı yeri,
Topdağıtmaz evi var, yoxdu daha dərdi-səri.
Görəsən kaş ki, kurortdan qayıdanda o geri.
Mat qalırsan, elə bil boynuyoğun dağ kəlidir,
Bu filan oğlu filan almağa öyrəncəlidir!

Zənn edir yaxşı tapıb müftə qazancın yolunu,
Xəbəri yoxdu kəsiblər sağını, həm solunu;
Xeyri olmaz nə qədər yelləsə də əl-qolunu.
Yoxdu heç kəsdə günah tək özünün cəncəlidir,
Bu filan oğlu filan almağa öyrəncəlidir!

## ALƏM BİLƏCƏK

Arxanda durub topla dağılmaz yekə bir dağ,
Xudmani vəzifən də ki, bəh-bəh kişi, çim yağ.
Dərd-qəm nədir heç bilməmisən, kef-damağın çağ;
Söylə, kasıba əl tutacaqsan nə zaman bəs?
Dünyanı tutub qalmayacaqsan, a filankəs.

Bir vaxt qapılarda dayanıb boynunu burdun.
Min yol azı, sən kəlləsi üstündə də durdun.
Çox çəkmədi ki, "yağlı" kresloda oturdun,
Ancaq bilə bilməz zamanın hökmünü heç kəs,
Dünyanı tutub qalmayacaqsan, a filankəs.

Mərd olsan əgər qəddini heç nə əyə bilməz,
Kimsə sənə yaltaq, nə də alçaq deyə bilməz.
Namərd də sənin xətrinə heç vaxt dəyə bilməz.
Pul xətrinə insanla gərək olmayasan pəs,
Dünyanı tutub qalmayacaqsan, a filankəs.

Sən də qolunu çırmala, əl tut, batan olsa,
Dümsüklə oyansın, nə olar, bərk yatan olsa.
Sahman olar iş, dadına hərgah çatan olsa.
Bəlkə tamahın vadar edir ki, səni şərt kəs?
Dünyanı tutub qalmayacaqsan, a filankəs.

Üst pillədəsən, var sənə indi baş əyən də,
Kölgəndə sənin çax-çux edən, "layka" geyən də.
Ordan yerə sən ombası üstə dəyəndə.
Aləm biləcək, çünki o vaxtı çıxacaq səs,
Dünyanı tutub qalmayacaqsan, a filankəs.

## DİNMƏ, GÖTÜR YAZ!

Aləm yığılar hay-küyünə, sus, daha bəsdir,
İndi eşidər qonşu, deyər ki, bu nə səsdir?
Əmrin hələ yoxdur, başının üstünü kəsdir.
Qandır müdiri, qoy başa düşsün, belə olmaz,
Gördün ki, bir əncam eləmir, dinmə, götür yaz!

Sayəndə "adam oldu", cibişdanı da doldu,
Lütsən hələ də, amma onun hər şeyi boldu.
Bir vaxtı dilindəydi adın, indi nə oldu?!
Çatdır ona tərslik eləmək əsla yaraşmaz,
Gördün ki, bir əncam eləmir, dinmə, götür yaz!

Söylə, o yoluq Murtuzəli hardadı indi?..
Bəlkə deyəsən, bərk ilişib, dardadı indi?!
Xeyr a.., kişi anbar götürüb, ordadı indi.
Şəksiz ki, müdir "xərcin" alıbdır yenə az-maz,
Gördün ki, bir əncam eləmir, dinmə, götür yaz!

Görsə quru xahişdisə, əl-qol atacaqdır,
Olmaz, – deyəcək, aləmi bəlkə qatacaqdır.
Bilsə demaqoqsan, fısı hökmən yatacaqdır.
Sən də balaca him-cim elə, müftə iş aşmaz,
Gördün ki, bir əncam eləmir, dinmə götür yaz!

Yayda müdirin kefdədi "qızlar bulağı"nda!
Amma sənin heç yoxdu bir axsaq ulağın da.
Dostun sözü ömrün boyu qalsın qulağında:
"Haqsız işə düşsən, kələfin zorla dolaşmaz",
Gördün ki, bir əncam eləmir, dinmə, götür yaz!

## ÖYRƏNİR ARTIQ BALAM...

(*Zəhmətsiz gəlir ardınca qaçanların dilindən*)

Oğluma haqq-hesabı öyrədirəm, ay lələ!
Qurban olum ağlına, beş yaşı yoxdur hələ.
İstəyirəm əl tuta, karıma hərdən gələ.
Qoy elə lap indidən çırmalasın əl-qolun,
Tapsın özüyçün o da müftə qazancın yolun.

Getməsə də məktəbə, öyrənə kaş alveri,
Pul nədi, hərçənd bilir lap dil açandan bəri.
Bilsə alıb-satmağı, əsl bazardır yeri.
Bəlkə bu yolla sudan orda çıxartsın çulun,
Tapsın özüyçün o da müftə qazancın yolun.

Öyrənir artıq balam tində çörək satmağı,
Sübh-səhərdən durur, xoşlamır heç yatmağı.
Kaş görəsən sən onun var necə nərd atmağı.
Yalvarıram mən ona qədrini bilsin pulun,
Tapsın özüyçün o da müftə qazancın yolun.

Özüm də körpəlikdən bax bu yola uymuşam,
Var həvəsi onun da fikrini mən duymuşam.
"Krupnı" alverçiyə indi "şəyird" qoymuşam.
Söyləmişəm mən ona, baqqal olubdur ulun,
Tapsın özüyçün o da müftə qazancın yolun.

Alver edəndən bəri ağzı gəlibdir dada,
Arxayınam bir daha məktəbi salmaz yada,
Hey deyirəm oğluma cəhd elə bu dünyada
Olma pulun sən qulu, pul sənin olsun qulun,
Tapsın özüyçün o da müftə qazancın yolun.

## BƏBƏ DƏ BƏLKƏ BİLİR

İmtahanda kasıbın arzu oxu dəydi daşa,
O qədər qısnadılar, az qala lap ağlı çaşa.
İndi ley-peydədilər, çünki qəbul çatdı başa.
Aldı hər kəs payını, müftə gələn pul-paradan,
Bəbə də bəlkə bilir kimdi şərait yaradan.

Eşidən olmadı heç bir kasıbın fəryadını,
Yaza bilmir, – dedilər, – bisavad oğlu adını.
Özləri, çünki bilir müftə qazancın dadını.
Gözə dəymir biri də, asta çıxıblar aradan,
Bəbə də bəlkə bilir kimdi şərait yaradan.

Axı Nyuton nəçidi, çox da onun yoxdu tayı,
İki dünya bir ola, qiymət alammaz havayı.
Alan olmaz vecinə, ərşə də çıxsa harayı.
Pul olan yerdə ağı, heç seçən olmur qaradan,
Bəbə də bəlkə bilir kimdi şərait yaradan.

Hay-haray salma nahaq, boş yerə yorma özünü,
Pula vicdanı satan kəs eşidərmi sözünü?!
Çünki qiymətli kağız pərdələyibdir gözünü.
Külfətə paltar alır xeyli baha zər-xaradan,
Bəbə də bəlkə bilir kimdi şərait yaradan.

A kasıb, bəxti qara, üzmə xudadan əlini,
Övladın dərdi-səri əyməsin əsla belini.
Səbr elə, ley aparar əlli-ayaqlı zəlini.
Başa düş, müftə işə yandıran olmur axı can,
Bəbə də bəlkə bilir kimdi şərait yaradan.

## “KİM NƏ DEYƏR BİZDƏ OLAN QEYRƏTƏ”

Olsa batan dəryada əl tutmarıq,
Fəryad olan yerdə qulaqdan karıq.
Bəs bu cahanda nə üçün, biz varıq...
Xor baxırıq çoxlarımız zəhmətə,
“Kim nə deyər bizdə olan qeyrətə”!

Yüksələn olsa işini burmuşuq,
Böhtan atıb, min yalan uydurmuşuq.
Şərləmişik, sözlə tələ qurmuşuq.
Hər işimiz bağlı olub hörmətə,
“Kim nə deyər bizdə olan qeyrətə”!

Kürsüyə qalxanda alovlanmışıq,
Guya ki, xalqın halına yanmışıq.
Amma əzab çəkdiyini danmışıq.
Qayğımız olmuş bu sayaq millətə,
“Kim nə deyər bizdə olan qeyrətə”!

Yerliləri kölgəmizə almışıq,
Hər nə olub qayğısına qalmışıq.
Yadları gəl, çək-çevirə salmışıq.
Gəlməmişik insafa, nə mürvətə,
“Kim nə deyər bizdə olan qeyrətə”!

Haqq deyəni ömrü boyu sıxmışıq,
Qoymamışıq əl-qol aça, yıxmışıq;
Əlbir olub axırına çıxmışıq.
Salsa belə çoxlarını heyrətə,
“Kim nə deyər bizdə olan qeyrətə”!

## SƏN DEMƏ...

Aləmə düşdü səda huri-mələkdir dadaşım,
Gözütoxluqda bu gün bəlkə də təkdir, dadaşım.
Demə üzdə belədir, dalda kələkdir, dadaşım,
Baxasan şəkk qulağı külqabıdan da iridir,
Pah atonnan, ürəyi, sən demə, şeytan "piri"dir.

Tanış olsan görəcəksən kişidə var "qanacaq",
Düşəcək əl-ayağa, halına guya yanacaq.
Keçməmiş həftə belə, vədini ancaq danacaq.
Çox müəllifləri öz yağlı diliylə kiridir,
Pah atonnan, ürəyi, sən demə, şeytan "piri"dir.

Qohumu-əqrəbası bəllidi ki, kimdi onun,
Yekəsi qalsın hələ, xırdası hakimdi onun.
Harda olsa peşəsi sən demə him-cimdi onun.
Bələd oldum ki, gözükölgəlilərdən biridir,
Pah atonnan, ürəyi, sən demə, şeytan "piri"dir.

Yolladım can-ciyəri qulluğuna əlli kərə,
Əfsus olsun ki, onun xahişini vurdu yerə.
Var təmənnası yəqin, heç yaramır xeyrə-şərə.
Kimsəsizçün ölüdür, arxalılarçın diridir,
Pah atonnan, ürəyi, sən demə, şeytan "piri"dir.

Hələ ki, arxası var, ağrıdan olmaz başını,
Qapısında dayanıb lap tökərsən göz yaşını.
Yumşalan-zad deyil o, çünki güdür daşbaşını.
Özgənin qayğısı yox, qəlbini pul dərdi didir,
Pah atonnan, ürəyi, sən demə, şeytan "piri"dir.

## AY KABİNET

Sən olan səmtə süründüm neçə il, ay kabinet!
Yalvarıb çoxlarına etmişəm ah-vay, kabinet!
İndi mən anlamışam yoxdu sənə tay, kabinet!
Vallah, arzum budu: yüz yol qadanı gündə alam,
Sən yox idin, mənə heç qonşu da vermirdi salam.

Nə əzab çəkdiyimi çoxdu bilən, gizli deyil,
Keçməyim iş başına, müşkül olubdur otuz il.
Axı mən arxasızam, əsl səbəb bax budu, bil.
Olmasa mərdimazar bəlkə bir az burda qalam,
Sən yox idin, mənə heç qonşu da vermirdi salam!

Bələdəm qüdrətinə, hörmətinə, izzətinə,
Sənə lövbər salanın işləri düşməz çətinə;
Hətta cürət eyləməz kimsə aş atsın itinə.
Sanma ki, anlamıram, keyquluyam, ya da kalam.
Sən yox idin, mənə heç qonşu da vermirdi salam.

Kölgən altında sənin qurğu quranlar çox olub,
Dayılı kəmsavada arxa duranlar çox olub.
Fağıra, arxasıza zərbə vuranlar çox olub.
Xəbərin var bilirəm, mən də axı əhli-halam,
Sən yox idin, mənə heç qonşu da vermirdi salam.

Gen gəzən dost-tanışım indi görəndə baş əyir,
Üzü dönmüş qohumum hətta mənə gündə dəyir.
Xırda bir yaxşılığı toyda deyir, vayda deyir.
Bilmir ancaq hələlik pul sarıdan xeyli dalam,
Sən yox idin, mənə heç qonşu da vermirdi salam.

Xoş keçir səndə günüm, hər bir anım, saxla məni,
Yoxdu səndən savayı bir gümanım, saxla məni.
Qurban olsun sənə bu xəstə canım, saxla məni.
Yumbalansam aşağı, bir də çətin ki, ucalam,
Sən yox idin, mənə heç qonşu da vermirdi salam.

## SƏN DƏ YAZ, MƏN DƏ YAZIM

Döşəyim, ay kişi, yaz, altına cüt imza ataq,
Yollayaq lap yuxarı, aləmi hay-küylə qataq.
Yıxa bilsək müdiri, arzumuza bəlkə çataq.
Görürəm öz-özünə heç düzələn-zad deyil o,
Çox da simsardı mənə, özgə deyil, yad deyil o.

Tərpədən olsa, müdir ya sən olarsan, ya da mən,
Nə olar ortada bir mən bilərəm, bir də ki, sən.
Gündəlik müftə qazancı bölərik dost kimi tən.
Bu tamah onda ki var, heç düzələn-zad deyil o,
Çox da simsardı mənə, özgə deyil, yad deyil o.

Gecə-gündüz yanırıq, görməyir heç tüstümüzü,
Saya salmır, deyəsən unlu görüb üstümüzü,
Qoyduraydı o gərək indiyəcən büstümüzü,
Başa düşmürsə əgər, heç düzələn-zad deyil o.
Çox da simsardı mənə, özgə deyil, yad deyil o.

Yatmırıq sübhə kimi səksəkədən, amma ki, gəl,
Dara düşsək, sürüşür, zərrə qədər tutmayır əl,
Düzələn yerdə işə barı özü vurmaya pəl,
Çox xəbisdir, görünür heç düzələn-zad deyil o,
Çox da simsardı mənə, özgə deyil, yad deyil o.

Yaz ki, tək bircə maaşla kefi olmaz belə saz,
Deməli, var gəliri, biz nə bilək, çoxdu, ya az.
Gəlməsə yoxlayıcı, yatma, dübarə, yenə yaz!
Düzələ, bəlkə, axı çox da avam-zad deyil o,
Çox da simsardı mənə, özgə deyil, yad deyil o.

## BİZƏ NƏ

Sənə nə, harda, necə, ay kişi, aləm qarışır,
Kürsüdə bir parası lap tutalım ki, yarışır.
Didişir, ya söyüşür, gah küsüşür, gah barışır.
Unudublar deyəsən qövr eyləyən dərdimizi,
Sən canın, uyma felə, gəl biz ataq nərdimizi.

Xoşlamır bir-birini, özləri bilsin, bizə nə?!
Gülmürük heç nəyə biz, özləri gülsün, bizə nə?!
Yaş axan gözləri də özləri silsin, bizə nə?!
Çox nəsihət eylədik, bilmədilər qədrimizi,
Sən canın, uyma felə, gəl biz ataq nərdimizi.

Çox dedi ki, barışın, xalqa olun arxa-dayaq,
Sizi də hamı kimi torpağın övladı sayaq.
Bu ağır gündə belə atmadılar birgə ayaq.
Tanıdıq indi daha mərdi ilə namərdimizi,
Sən canın, uyma felə, gəl biz ataq nərdimizi.

İstəyirlər bölələr ölkəni kəndə, şəhərə,
Bağlayan var ümidin hardasa bir al səhərə.
Eşşəyə möhtac olan da can atırmış kəhərə.
Çaşdıran var hələ də az-maz olan zəndimizi,
Sən canın, uyma felə, gəl biz ataq nərdimizi.

Dinmədikcə qızışır bəzisi lap ağ eyləyir,
Özü bir bambılıdır, başqasına lağ eyləyir.
Quru vədlərlə elin kef-damağın "çağ" eyləyir.
Axı yaxşı tanıyır el-oba hər yerdə sizi,
Sən canın, uyma felə, gəl biz ataq nərdimizi.

Bizə nə kim yıxılıb, arxa tapıb kim duracaq!
Yersiz hay-küy salana yağlı qapaz kim vuracaq.
Yeni dövrün təməlin kim dağıdıb, kim quracaq.
Boş xəyaldır bu, sən öl, aldadalar bir də bizi,
Sən canın, uyma felə, gəl biz ataq nərdimizi.

## HEYKƏLİN ÖNÜNDƏ

(*Keçmiş məsul bir işçinin dilindən*)

Ayə, Marks, xəbərin var nə gəlibdir başıma?!
Təzə fərman məni də qərq eylədi göz yaşıma.
Son qoyuldu beləcə, hörmətimə, daşbaşıma.
Çıxdı əldən kabinet, yağlı vəzifə, batıram,
Sən susursansa, deməк, boş yerə əl-qol atıram.

Yığılıb mənzilimə bir neçə həmdəm bu gecə,
O ki var nuş elədik, olmadıq heç dəm bu gecə.
Sübhəcən gözlərimiz, amma olub nəm bu gecə.
Zənn edirsən ki, yəqin hər gecə rahat yatıram,
Sən susursansa, demək, boş yerə əl-qol atıram.

Cibimə ortaq olan çatmadı əsla dadıma,
Ağzıgöyçək hələ bir söz də qoşubdur adıma.
Verdiyim pul-paranı, indi salanda yadıma.
Sinəm üstdə, elə bil, ay qağa, tonqal çatıram,
Sən susursansa, demək boş yerə əl-qol atıram.

Söykəmişdim neçə il arxamı möhkəm dayağa,
Hara düşsəydi yolum, hamı durardı ayağa.
Belə getsə, qoyacaqlar məni hər yerdə lağa.
Əl tutan yoxdu daha, aləmi vallah, qatıram,
Sən susursansa, demək boş yerə əl-qol atıram.

Gəlmişəm ərz eyləyim dərdimi gizlincə sənə,
Dünyagörmüş qocasan, bəlkə sözün oldu mənə
Yuxu getmir gözümə, qayğılarım artdı yenə.
Güman etmə sənə də bəlkə yalan-zad satıram,
Sən susursansa, demək, boş yerə əl-qol atıram.

## ƏYRİ, DƏLƏDUZ BƏLKƏ UTANSIN

Aşkarlığa meydan açılıb istədiyintək,
Xəlvətdə, dodaq altda gileydən daha əl çək.
Daşbaş güdənin gündə başında təzə turp ək.
İclasda ədalətlə danış hamı inansın,
Maska taxan əyri, dələduz bəlkə utansın.

Varsa günahın, başqasının boynuna yıxma,
Tənqid də olunsan, qızışıb çox zilə çıxma.
Tənqid işi sahmana salar, qəlbini sıxma.
Sən də döşə, nöqsanı olan səhvini qansın,
Maska taxan əyri, dələduz bəlkə utansın.

Düz gəlməsə sözlə əməlin, inci özündən,
Gec-tez düşəcəksən hamının işdə gözündən.
Gəlməz sənə heç yerdə zaval doğru sözündən.
Söylə düzünü, eyb eyləməz, qoy naşı dansın,
Maska taxan əyri, dələduz bəlkə utansın.

Bambaşqadı hərçənd, tələbi indi zamanın,
Vermiş el-oba qiymətini yaxşı-yamanın.
Bağlandı daha bənd-bərəsi pul-zad umanın.
Olsa eləsi, kürkünə od vur ki, o yansın
Maska taxan əyri, dələduz bəlkə utansın.

Düşsən də dara heç vədə vicdanını satma,
Cib xətrinə sən haqlını haqsızlara qatma.
Bir də ki, nəbadə qərəz işlətmə, şər atma.
İllər də ötüşsə səni qoy çoxları ansın.
Maska taxan əyri, dələduz bəlkə utansın.

## BƏS DEYİLDİR?

Ayıl, ey arzusuna, kamına röyada çatan,
Səni bəxş etməyəcək bir də bu dünyaya atan.
Qınayır taleyini şellənib illərlə yatan.
Verməsən qeyrətini şöhrətin ancaq badına,
Hardasa çatmaq olar bir fağırın imdadına.

Zamanın dərd yükünü çəkməyə acizdi ürək,
Qeyrətin varsa elin dərdini birlikdə çəkək.
Nicat axtarmaq üçün yanğı ola canda gərək.
Bir vətəndaş kimi sən borcunu salsan yadına,
Hardasa çatmaq olar bir fağırın imdadına.

Bir zamanlar ağalar zəncini salmırdı saya,
İndi ancaq kölələr lərzə salıb Afrikaya.
Bəs deyildir, neçə il ağ demisən zil qaraya?!
Yansa qəlbin əzilən millətinin fəryadına,
Hardasa çatmaq olar bir fağırın imdadına.

Yetmiş il ortaq olub "əcnəbilər" el malına,
Yanmayıb zərrə qədər xalqının ancaq halına.
Vaxt çatıb, indi gərək zorla azadlıq alına.
Keçirə bilsən əgər sərvətini öz adına,
Hardasa çatmaq olar bir fağırın imdadına.

Sən düşün bir gələcək nəslimizin aqibətin,
Bilmək olmaz, yaşamaq bəlkə də lap oldu çətin.
Sən də bir övladısan dərdi ağır səltənətin.
İndi əl tutsan əgər bircə bəşər övladına,
Hardasa çatmaq olar bir fağırın imdadına.

# TƏPƏRİN VAR GÖRƏSƏN

Elə ki, sən seçilib, ay kişi, olsan deputat,
Sən çalış dünyada öz arzuna, öz kamına çat.
Güzəranın azacıq keçməsə xoş, aləmi qat!
Sənə lazımdı məgər millətə can yandırasan?
Bu işin zilləti var, sən bu işi sanma asan.

Açmısan, sanki, qanad, heç yerə dəymir ayağın,
Görünür hardasa var cüssəli arxan, dayağın.
Yoluna şölə düşür gur işığından mayağın.
O mayaq puldu, pulun hökmünü bəlkə danasan?
Bu işin zilləti var, sən bu işi sanma asan.

Səni gendən tanıdan olsa əgər döş nişanın,
Görcək ağzın sulanır, cuşa gəlir hətta qanın.
Alsan artar ki, yəqin şöhrətin hər yerdə şanın
Belə bir arzunu xalqa nə sayaq qandırasan,
Bu işin zilləti var, sən bu işi sanma asan.

Təpərin var görəsən, söz deyəsən sessiyada?..
Deməsən salmayacaq dərdimizi kimsə yada.
Sən özünçün ki yanırsan belə həddən ziyada.
İnana bilmirəm heç millətə qəlbdən yanasan,
Bu işin zilləti var, sən bu işi sanma asan.

Deputat olmağına söz demirik, amma ki, gəl,
Hörmətin olmayacaq bir kasıba tutmasan əl.
Sən gərək qoymayasan haqq işə haqsız vura pəl.
Doğrusu, şəkk edirəm mətləbimi anlayasan,
Bu işin zilləti var, sən bu işi sanma asan.

Fərz edək zorla-filanla səni seçdik deputat,
Axı sən bil ki, seçir yaxşını pisdən bu həyat.
Sən də hərdən qızışıb durmayacaqsan farağat.
Güdəcəksən cibini, xeyrini hər yerdə hər an,
Bu işin zilləti var, sən bu işi sanma asan.

## AY PAXILLAR

Keçdi axır ki, çətin iş başına canıyanan,
Dərdlinin mətləbini adicə bir sözlə qanan.
Büzüşübdür özünü daima meydanda sanan.
Görünür indi daha baş tuta bilməz kələyi,
Yalvarıb heç narahat etməsin hər gün fələyi.

Ay paxıllar, neçə illərdi gülürdü gözünüz,
Çünki hər yerdə keçirdi axı haqsız sözünüz.
Yanmasaz da hələlik tüstülənirsiz özünüz.
Hər kəsin öz əməlilə ələnibdir ələyi,
Yalvarıb heç narahat etməsin hər gün fələyi.

İş başında oturan az qala olmuşdu yalan,
Daha hörmətli idi qulbeçəsi – rüşvət alan.
Üstünə olmayacaq bir də elə kölgə salan.
Müşkül işdir nə qədər qalsa yarımçıq diləyi,
Yalvarıb heç narahat etməsin hər gün fələyi.

Qohum olmuşdu ona az qala lap səbzi satan,
Neçə dəllal, neçə əyyaş, tiyan altında yatan.
Tapdayan duz-çörəyi, dost-tanışa şıllaq atan.
Yıxılıb şəkk eyləmə, yerdədi artıq kürəyi,
Yalvarıb heç narahat etməsin hər gün fələyi.

Naşılar taxsa da eynək görə bilmir uzağı,
Seçə bilmir qaradan, ay kişi, vallahi, ağı.
Qudurur, həddin aşır olsa əgər bir dayağı.
Sanki, bir vaxtı yemişdi neçəsi “qurd” ürəyi
Yalvarıb heç narahat etməsin hər gün fələyi.

Kabinet xəstələri əl-qol atırlar, hələ də,
Düşsə fürsət aranı dalda qatırlar, hələ də.
Orda-burda yalanı müftə satırlar, hələ də.
Dastan olmuş çoxunun xəlvəti haqsız gileyi,
Yalvarıb heç narahat etməsin hər gün fələyi.

## ƏFSUS Kİ, SUSUB

Tale bizi dünyaya gətirdi, yaşa dolduq,
Baxma ki, əzəldən elə buyruq qulu olduq.
Yetmiş ili dözdük, nə saraldıq, nə də solduq.
Zəhmin gücünə az qala lap çökdürələr diz,
Əfsus ki, susub indiyəcən dinməmişik biz.

Harda, nə zaman dur, dedilər, durduq əlüstü,
Böhtan tələsi qur, dedilər, qurduq əlüstü.
Haqq söz deyəni vur, dedilər, vurduq əlüstü.
Şahiddi bu bədxahlığa tarixdə qalan iz,
Əfsus ki, susub indiyəcən dinməmişik biz.

Millət nə əzab çəkdiyini yaxşı qanırdıq,
Zahirdə gülürdüksə də, daxildə yanırdıq.
Gəl ki, olan haqsızlığı hər yerdə danırdıq.
Guya nə olubdursa olub onda qərəzsiz,
Əfsus ki, susub indiyəcən dinməmişik biz.

Oldu qara günlər ayımız da, ilimiz də.
Cürət eyləmirdik ki, yazaq öz dilimizdə.
Yaddaşdadı ümmana dönən nisgilimiz də.
Düşdükcə yada tüklərimiz olsa da biz-biz,
Əfsus ki, susub indiyəcən dinməmişik biz.

Dövran bizə dağ çəkdi, nə gəldi əlimizdən?
Əskilmədi dərdin yükü heç vaxt belimizdən.
Fəryad səsi gəldi obamızdan, elimizdən.
Gendən görünürdük kiməsə qüssə-kədərsiz,
Əfsus ki, susub indiyəcən dinməmişik biz.

## BOĞMUŞAM NƏFSİMİ

Düşmüşəm qəm gölünə, qalmayıb heç yarı canım,
Az qala vahimədən laxtalana cümlə qanım.
Rüşvətə meylim olub, aldığımı mən nə danım.
Görürəm darda qalan yalvarır hər gün fələyə,
Boğmuşam nəfsimi mən, düşməmək üçün tələyə.

Əməlim kənddə-kəsəkdə qıpıq etmiş gözümü,
Ali məclisdə də kəskin danışıblar sözümü.
Saldı yorğan-döşəyə qəmli xəbərlər özümü.
Daha son qoymuşam, ey dost, düzü, hər cür kələyə,
Boğmuşam nəfsimi mən, düşməmək üçün tələyə.

Tamahım yoxdu daha, çünki başım dəydi daşa,
Həddini qoymaram heç yerdə tamah bir də aşa.
Olub hərçənd qələtim, düşməmişəm bəlkə başa.
Almaram rüşvəti ki, öz başıma kül ələyə,
Boğmuşam nəfsimi mən, düşməmək üçün tələyə.

Birə düşmüş elə bil kürkünə bir çoxlarının,
Çoxu rüşvətdi axı evdəki var-yoxlarının.
Canına lərzə düşüb bəzi "gözü toxlarının".
Çalışır arxa tapa, dərdinə əncam eyləyə,
Boğmuşam nəfsimi mən, düşməmək üçün tələyə.

İndi rüşvət alanın halı yamandı, görürəm,
Keçdiyi xəlvəti yol çəndi, dumandı, görürəm.
İlişənlər büzüşüb xeyli zamandır, görürəm.
Qoymaram bir də tamah mənliyimi üstələyə,
Boğmuşam nəfsimi mən, düşməmək üçün tələyə.

## LİBERAL OLMA

Tarixin səhvdimi, ya belə də olmalıdır?
İşi müşkül olanı, hökmü olan yolmalıdır?
Pul axıb müftəxorun ciblərinə dolmalıdır?
Var bilən, amma susur, sanki, olubdur dili lal,
Bir ayıl, qeyrətə gəl, barı sən olma liberal!

Kimə bu sərfəlidir istəmir heç vaxtı dinə,
Cəhd edən var fağırı noxtalaya, sonra minə.
Belə azğınlara bir gərməyə yoxdurmu sinə?
Az da olsa, hələ ki, vallahi, vardır belə hal,
Bir ayıl, qeyrətə gəl, barı sən olma liberal!

Var məsəl: bir dana rüsvay eləyər bir naxırı.
Hələ var yoldan azanlar, üzə çıxmır paxırı.
Cibkəsənlər hara girsə, puç olubdur axırı.
Sən də iclasda durub onları hərdən yada sal,
Bir ayıl, qeyrətə gəl, barı sən olma liberal!

Sən görürsən ki, zaman başqa zamandır, ayıq ol.
Tamahın çək cilovun, seç özünə ayrıca yol.
Sənədin saxtasına çəksən əgər bir dəfə qol.
Bu işin aqibətin köhnə müdirdən xəbər al,
Bir ayıl, qeyrətə gəl, barı sən olma liberal!

Sən də sus, mən də susum, kim deyəcək dərdimizi?
Tanısın qoy el-oba mərdilə namərdimizi.
Mən dedim bildiyimi, indi ataq nərdimizi
Yalanım varsa əgər, gül mənə, lap çırtma da çal,
Bir ayıl, qeyrətə gəl, barı sən olma liberal!

Dinməsə əhli qələm, kim qarışar bəs bu işə?
Dözmək olmaz dələduz müftə yeyə, qarnı şişə.
Qudura, üstümüzə aşkara hər yerdə düşə.
“Döşəsən” cəmdəyinə, əl çalacaqdır sənə zal,
Bir ayıl, qeyrətə gəl, barı sən olma liberal!

## AY BALA

Ay bala, insanlığı satma pula, sərvətə,
Gördüyün işlər salıb gözlərimi heyrətə.
Mat qalıram indidən səndə olan qeyrətə.
Göz qoyuram, dinmirəm, amma dolubdur sinəm,
Böylə deyərdi mənə, rəhmətə getmiş nənəm.

Əlsiz-ayaqsız batıb, darda qalıbdır əgər,
İmdadına çatmağa borclu deyilsən məgər?
Yaxşı adam olmasa aləm əziyyət çəkər.
Çox demişəm mən sənə, az qala çıxsın çənəm, –
Böylə deyərdi mənə, rəhmətə getmiş nənəm.

Hökmünü, imkanını sanma ömürlük, bala,
Kim ki bu xülyadadır, çox qalıb eldən dala.
Sən elə iş tut, bala, dünyada bir iz qala.
Bəxt gəminə dünyada mən hələlik yelkənəm,
Böylə deyərdi mənə, rəhmətə getmiş nənəm.

Özgə yola burulma, öz yolunu get, oğul,
Hər işi ölçüb-biçib sonra əməl et, oğul.
İnsana tacdır səbr, ağıl, mərifət, oğul.
Mən daha dağlardakı ömrü tükənmiş çənəm, –
Böylə deyərdi mənə, rəhmətə getmiş nənəm.

Əyrini düzdən seçən gözdü sənin vicdanın,
Haqqı bəyan eyləyən sözdü sənin vicdanın.
Bəs niyə çox nöqsana dözdü sənin vicdanın?
Mən belə öyrətmişəm? Bəlkə günahkar mənəm? –
Böylə deyərdi mənə, rəhmətə getmiş nənəm.

# AYNADA GÖRSÜN ÖZÜNÜ

Görməyə yoxdu gözüm bir para biganələri,
Ola imkan, çəkərəm lap dara biganələri.
Gətirəm bəlkə bu cür mən zara biganələri.
İşdə nöqsanı görər, amma yumar çəp gözünü,
Yazıram, kaş oxuyub, aynada görsün özünü.

Olsa haqsızlıq edən tənə də etməz "utanar",
Üzünə şax deməyə başqasının borcu sanar.
"Mənə nə" söyləsə də, bax bu sözü hətta danar.
Əl uzatmaz batana, yan çevirər tez üzünü,
Yazıram, kaş oxuyub, aynada görsün özünü.

Olsa fəryad eyləyən üz çevirər, yan keçər o,
Sanki, dəllaldı, baxar yaxşını, pisdən seçər o,
Görməyib guya onu, vicdanına and içər o,
Düşə fürsət əlimə qamçılayardım izini,
Yazıram, kaş oxuyub, aynada görsün özünü.

Bu sağalmaz azarın dərmanı yoxdur, elə bil,
O diriykən ölüdür, al-qanı yoxdur, elə bil.
Bir müqəvvadı yəqin, heç canı yoxdur, elə bil.
Olsa heykəl də belə qatlayacaqlar dizini,
Yazıram, kaş oxuyub, aynada görsün özünü.

Bəlkə dünyada bu biganələrin yoxdu tayı,
Nə olardı mən ölüm, gündə azalsaydı sayı.
Baxma insandı özü, yoxdur adamlıqda payı.
Harda olsan eşidərsən onun ancaq sözünü,
Yazıram, kaş oxuyub, aynada görsün özünü.

## QOPA TUFAN, NƏ OLA

Atıb öz rişəsini əlli yana canlı "Palıd",
Dağı dağ üstə qoyur guya bu "vicdanlı" "Palıd".
Qudurub həddin aşır amma "gözü qanlı" "Palıd".
Baxasan göy meşəni indi salıbdır nə hala,
Kaş ki, tufan "Palıdın" varlığına lərzə sala!

Gəzəsən əldə çıraq, bəlkə də heç yoxdu tayı,
Alıb öz kölgəsinə "doğmaları" doğma dayı.
Keçirir orda çoxu həm payızı, həm də yayı.
Bu qohumlar özü də qalmayır heçə yerdə dala,
Kaş ki, tufan "Palıdın" varlığına lərzə sala!

"Palıd"ın getməyib heç zəhməti dünyada hədər,
Boy atıb qol-budağı bilməyib heç qəm, nə kədər.
Arxayındır özü də, arxası vardır bu qədər –
Hərəsi bir meşədə, az qalıb artıq ucala,
Kaş ki, tufan "Palıd"ın varlığına lərzə sala!

Meşələr azlıq edir, zəbt eyləyibdir talanı,
O, didərgin salacaq orda bitib, yurd salanı.
Yığacaq dövrəsinə sərfəli rüşvət alanı.
Batacaq çoxlarının "barmağı" yəqin ki, bala,
Kaş ki, tufan "Palıd"ın varlığına lərzə sala!

Sınadı öz gücünü bir balaca əsdi külək,
Çatmadı amma gücü, bərk yorulub kəsdi külək.
Çünki zalım "Palıd"a nəğmə kimi səsdi külək.
Yeldə qüdrət nə gəzir gövdəsinə balta çala,
Kaş ki, tufan "Palıd"ın varlığına lərzə sala!

Meşədə körpə fidan yer tapa bilmir özünə,
Qalıb həsrət günəşə, kölgə salıblar gözünə.
Bir məhəl yoxdu qoyan, çünki fidanın sözünə.
Yıxa bilsə "Palıd"ı bəlkə qisasın o ala,
Kaş ki, tufan "Palıd"ın varlığına lərzə sala!

## DÜNYAYA GƏLİB-GETSƏ DƏ

Dünyada qalıb şöhrətə hədsiz can atanlar,
Düşmür belə bir fikrə yer altında yatanlar.
Ad-san qazanır zirvəyə zəhmətlə çatanlar.
Hər kəs ki, elin xeyrinə bir bağça salıbdır,
Dünyaya gəlib-getsə də yaddaşda qalıbdır.

Sahibsiz olan torpağa dən düşsə də bitməz,
Bolluq yaradan qəhrəmanın zəhməti itməz.
Hərçənd əməyə xor baxan öz kamına yetməz.
Hər kəs ki, külüngü el üçün şəstlə çalıbdır,
Dünyaya gəlib-getsə də yaddaşda qalıbdır.

Dünya düzəlibdir, gözəl aləmdi – deyənlər,
Bilmir ki, qalıbdır hələ də müftə yeyənlər.
Yaltaq sayağı rəisə yersiz baş əyənlər.
Hər kəs ki bu yolla günü-gündən ucalıbdır,
Dünyaya gəlib-getsə də yaddaşda qalıbdır.

Xalqın yoluna şölə salanlar da olubdur,
Millət deyə, boş zurnaçalanlar da olubdur.
Şəksiz, hünərilə ad alanlar da olubdur.
Hər kəs ki, şərəfli adı zəhmətlə alıbdır,
Dünyaya gəlib-getsə də yaddaşda qalıbdır.

Baxdıqca geniş Mil düzünə, yol boyu bağdır,
Orda ucalan ağ tayalar, çalmalı dağdır.
İnsan əməyi bəhrə veribdir, üzü ağdır.
Burda ürəyi xalqa yanan seyrə dalıbdır;
Dünyaya gəlib-getsə də yaddaşda qalıbdır.

## DEMƏDİM?

Demədim gülmə mənə, sən də düşərsən tələyə?
Üzdə güldün üzümə, dalda əl atdın kələyə.
İndi get yalvar özün hər səhər-axşam fələyə.
Arxayın ol, elə yer düşməyəcək bir də ələ,
Müşkül işdir bu işin, yoxdu ümid-zad düzələ.

Düşmüsən əl-ayağa, çarə gəzirsən özünə,
Qoymur hərçənd ki, məhəl işdə də bir kəs sözünə.
Axı bir vaxt çoxunun kül üfürürdün gözünə.
Yəqin olmuşdu deyən hər nə bilirsənsə elə,
Müşkül işdir bu işin, yoxdu ümid-zad düzələ.

İlk tanışlıqda səni əsl mələk sandı çoxu,
Zahiri görnüşünə şübhəsiz aldandı çoxu.
Nə yolun yolçususan sonra bilib, qandı çoxu.
Gördülər heç sənə bel bağlamaq olmaz, a lələ,
Müşkül işdir bu işin, yoxdu ümid-zad düzələ.

Çox döyürdün döşünə, arxalanırdın dayına,
Müftə kim arxa durar, ortaq olubmuş payına.
Harayın ərşə çıxıb, darda da gəlmir hayına.
Daldadı əsl kino, bu bala "jurnaldı" hələ,
Müşkül işdir bu işin, yoxdu ümid-zad düzələ.

Əmrinin surətini almısan artıq əlinə,
Sal suya, rəngi çıxar, gündə çəkərsən telinə.
Sənə min yol demişəm uyma tamahın felinə.
İlişərsən, başa düş, getməyəcək, çünki belə,
Müşkül işdir bu işin, yoxdu ümid-zad düzələ.

## HEÇ KƏS BİLƏ BİLMƏZ

Dünyanın işin fəhmlə heç kəs bilə bilməz,
Tale nə yazıbsa, onu bir kəs silə bilməz.
Yüz yaxşılıq et nadana, heç bir gilə bilməz.
Sən də gələcəksən axı bir vaxtı zavala,
Gendən baxacam, xod verəcəm zurna, qavala.

Sərvət dəlisi olmusan artıq bu yaşında,
Kefdən heç ayılmır görürəm yastı başın da.
Qalmaz sənə də gen kabinet, "Volqa" maşın da.
Bir gün çəkəcəklər səni də sorğu-suala,
Gendən baxacam, xod verəcəm zurna, qavala.

Çox çəkməyəcək bənd-bərəni bağlayacaqlar,
Daş qəlbini tənqidə tutub dağlayacaqlar.
Dövrəndəki key qulbeçələr ağlayacaqlar.
Onda dalacaqsan ki, yəqin fikrə, xəyala,
Gendən baxacam, xod verəcəm zurna, qavala.

Dəhşət budur ki, əyri düzə xox gəlir hərdən,
Hərçənd nə qazanc olsa səninlə bölünür tən.
Fitvanı verən çünki özünsən, bilirəm mən.
Tənbeh səni yəqin yetirər "ağla-kamala",
Gendən baxacam, xod verəcəm zurna, qavala.

Dünyada vəzifə, a "kişi", gəldi-gedərdi,
Diqqətlə nəzər sal, qovulan gör nə qədərdi.
İndi çoxunun qisməti ah-vaydı, kədərdi.
Sən də düşəcəksən ki, yəqin bir elə hala,
Gendən baxacam, xod verəcəm zurna, qavala.

## YAZIRAM

Şairəm, gördüyümü mən necə vardır, yazıram,
Haqqa biganələrin vicdanı "kardır", yazıram.
Zəhmətə xor baxanın meydanı dardır, yazıram,
Atacam çoxlarının bostanına daş da hələ,
Yazıram, bəlkə bir az əyri əməllər düzələ.

Hələ də yağlı yerə qarğa avazlar çəkilir,
Ya da qu tüklü olan yolmalı "qazlar" çəkilir.
Dayılı, pullu, kalan, kefləri sazlar çəkilir,
İlişən olsa belə, quyruğunu vermir ələ,
Yazıram, bəlkə bir az əyri əməllər düzələ.

Qudurub bir parası tanrısına şıllaq atır,
Eyləyir cızma-qara, aləmi bir anda qatır.
Yedəyə olsa alan, rütbəyə əlbəttə çatır.
Bərkə düşsə tapılır arxa çıxanlar da hələ,
Yazıram, bəlkə bir az əyri əməllər düzələ.

Mən ölüm, vicdanını seyfə qoyanlar hələ var,
Yalan andın gücünə cib də soyanlar hələ var.
Yalayıb yağlı qazan qarnı doyanlar hələ var,
Gözləyir cibkəsəni tinbaşı hər yerdə tələ,
Yazıram, bəlkə bir az əyri əməllər düzələ.

Bu alaqlar qudurub dalda quyu çox qazacaq,
Görsə yoxdur toxunan, öz yolunu lap azacaq.
Yazmayım, bəs nə edim, bunları bəs kim yazacaq?!
Damğa vurram çoxuna kaş qələm ilhama gələ,
Yazıram, bəlkə bir az əyri əməllər düzələ.

## BİR DAYAQ OLSUN SƏNƏ

Sal yadına təşvişə düşdüyün o anları,
Saxlamısan sən yenə işdə "ölü canları".
Qurdalayıb tapsalar, yoxlamada onları
Bil, qoyacaqlar sənin kündəni, şəksiz, oda.
Barı götür yeznəni, bir dayaq olsun o da.

Varsa idarəndə yer, saxla onunçün, dədə,
Sən axı söz vermisən yeznəmizə evdə də.
Kölgənə al, qoyma bu fürsəti əldən gedə.
Qoy kabinet qalmasın, çıxmalı olsan, yada,
Bəlkə müdir olmağa namizəd olsun o da.

Cəhd eyləyir çoxları xəlvəti qursun tələ,
Özgə kənardan baxar düşsən əgər əngələ.
Yeznə salar sahmana işləri bundan belə.
Qoy hələlik girləsin öz başını daldada,
Bəlkə müdir olmağa namizəd olsun o da.

Anbara təyin elə, mənfəət olsun bir az,
Sən də şərait yarat, keyfi də olsun taraz.
Əsil məqamdır, dədə, əmrini lap evdə yaz.
Yaxşılıq itməz inan ömrü boyu dünyada,
Bəlkə müdir olmağa namizəd olsun o da.

İşdi, ilişsən, dədə, kim çatacaq dadına?
Özgə səni dünyada salmayacaq yadına.
Barı bilək getmisən yeznəmizin badına.
Qorxuram ancaq səni başqası versin bada,
Bəlkə müdir olmağa namizəd olsun o da.

## MÖCÜZƏ OLMUŞ BU CAHANDA

Dostlar da nədənsə mənə çıxmışdı vəfasız,
Hərdən düşünürdüm bu ömür keçdi səfasız.
Gördüm düzəlir müşkül işim müftə, cəfasız.
Qaldım mən özüm mat nə dəyişmişdi bir anda.
Sandım ki, yəqin möcüzə olmuş bu cahanda.

Sədrin özü ev verməyə şəxsən can atırdı,
Mənzil alacaqdım, deyəsən növbə çatırdı.
Çoxdandı ərizəm qara qovluqda yatırdı.
Aldım, a kişi, orderimi indi bir anda,
Sandım ki, yəqin möcüzə olmuş bu cahanda.

Gördüm ki, ədalətli olub işdə müdir də,
"Haqsızlığa yol verməyəcəm", – söylədi, – bir də.
Çəkmişdim əzab işlədiyim bir neçə yerdə.
Amma bu bürokrat işi həll etdi bir anda,
Sandım ki, yəqin möcüzə olmuş bu cahanda.

Gördüm dəyişib, sadələşib lovğa yerişlər,
Zəngsiz düzəlir hər cürə müşkül olan işlər?
Müftə pula manqalda düzülmür daha şişlər.
Dünya dəyişib, cənnətə dönmüşdü bir anda,
Sandım ki, yəqin möcüzə olmuş bu cahanda.

Vallah, düşünürdüm: "Ay ürək, arzuna çatdın",
Arvad məni dümsüklədi: "Bəsdir daha yatdın!
Boş-boş danışıb sübhə qədər aləmi qatdın.
Guya ev alırsan, düzəlib iş də bir anda,
Sandın ki, yəqin möcüzə olmuş bu cahanda".

## BİRLƏŞİB

Yenə aləm qarışıb, dildə gəzir ünvanımız,
Eybi yoxdur dözərik, bərkiyib artıq canımız.
Çətin anlarda belə hətta qaralsa qanımız.
Bizi sarsılmağa qoymaz, a kişi, qeyrətimiz,
Birləşib, qardaş olub, verməliyik əl-ələ biz.

Tarixə baxsan əgər, orda da çox qan izi var
Eyləyiblər neçə yol millətimə dünyanı dar.
Səsimiz ərşə çatır, sanki, olub bəzisi "kar".
Yaxşı ki, var gücümüz, mənliyimiz, qüdrətimiz,
Birləşib, qardaş olub, verməliyik əl-ələ biz.

"İt hürər, karvan keçər" – var belə bir el məsəli,
Baxma hay-küylərinə, çoxlarının sındı beli.
Qarabağ torpağına çatmayacaq bir də əli.
Olsa lap əjdaha da, boğmağa var cürətimiz.
Birləşib, qardaş olub, verməliyik əl-ələ biz.

Zənn edirlər ki, yəqin yoxdu bizim heç kəsimiz,
El gücü sel gücüdür, bu bəsimizdir, bəsimiz.
Unudaq hər nə olub, birgə ucalsın səsimiz.
Göz dikən torpağıma çökməlidir axırı diz,
Birləşib, qardaş olub, verməliyik əl-ələ biz.

Vətən övladı gərək indi, bu gün yandıra can,
Ananın çağırışına səs verə hər yerdə hər an.
Atıla meydana... bəli.., budu şöhrət, budu şan,
Qalmayıb darda hələ indiyəcən millətimiz,
Birləşib, qardaş olub, verməliyik əl-ələ biz.

## DAYILAR, AY DAYILAR!

Almısız kölgənizə bəzi savadsız naşını,
Güvənir arxasına, girləyir ancaq başını.
Toplayıb dövrəsinə cümlə qohum-qardaşını.
Yollayır sizlərə də bağlamada pay dayılar,
Ram edin nəfsinizi, bəsdi daha, ay dayılar!

Nə ola tövbə edib, son qoyasız köhnə dəbə,
Bəs deyil müftə pula aldığınız xalça, gəbə?..
Sizi görsə, tanıya, kaş dil aça körpə bəbə.
Söyləyə: olmusunuz antipoda tay dayılar,
Ram edin nəfsinizi, bəsdi daha, ay dayılar!

Əl tutun arxasıza, qeyrətiniz varsa əgər,
Olmasın ortada pul, yığdığınız azdı məgər?!
Çəkə bilməz tərəzi, bəlkə qapan zorla çəkər.
Hələlik kefdəsiniz, Yaltada hər yay, dayılar,
Ram edin nəfsinizi, bəsdi daha, ay dayılar!

Arxayınsız ki, bütün işləriniz düzdü, yəqin,
Göstərib astarını, çox demisiz üzdü, yəqin.
Çox güman gizli qalan əngəliniz yüzdü, yəqin.
Balaca büdrəsəniz, tez düşəcək hay, dayılar,
Ram edin nəfsinizi, bəsdi daha, ay dayılar!

Zamanın son tələbi könlünüzə yatdı görən?
Məğzi, mənası nədir, beyninizə batdı görən?
Köhnə adətlərini bir çoxunuz atdı görən?
İndidən çarə qılın, olmasın ah-vay, dayılar,
Ram edin nəfsinizi, bəsdi daha, ay dayılar!

Sanmayın hamı yatıb, bircə oyaq sizsiz elə,
Neçə əngəl iş ola, quyruğunuz keçməz ələ.
Xam xəyaldır, bu sayaq ömr eləyən vardır hələ.
Gec-tez hökmən olacaq zəhmətiniz zay, dayılar!
Ram edin nəfsinizi, bəsdi daha, ay dayılar!

## BOŞ-BOŞ DANIŞIB

Odlu danışırsan müdirin gəlhagəlindən,
Guya ki, idarə dağılır lap təməlindən.
Bir kəlmə demirsən niyə bəs öz əməlindən?
Yəqin ki, səninçün aranı qatmaq asandır,
Boş-boş danışıb, dalda qırıldatmaq asandır.

İllərlə niyə lövbərini burda salıbsan?
Ah-vay eyləyirsən, elə bil darda qalıbsan.
Söylə, maşını, mülkü, bağı nəynən alıbsan?
Şayiə yayıb, özgəyə şər atmaq asandır,
Boş-boş danışıb, dalda qırıldatmaq asandır.

Allah da gəlib lap dura, vallah, başın üstə,
Qoymazsan özün bir daşı əsla daşın üstə.
Barı başa düş, yaş gəlir hər il yaşın üstə.
Yəqin sənə bir "kölgə" tapıb yatmaq asandır,
Boş-boş danışıb, dalda qırıldatmaq asandır.

Haqsızlığı, nöqsanı görəndə demirəm döz,
Vicdanın əgər varsa, nə sus, sən nə də yum göz.
Söylə ucadan, çünki qılıncdan itidir söz.
Hərçənd ki, unutma günaha batmaq asandır,
Boş-boş danışıb, dalda qırıldatmaq asandır.

Dünyada sənintək yaşamaq məncə hədərdir,
Haqsız kimisə şərləməyi sanma hünərdir.
Zəhmətlə, əməklə ucalan gör nə qədərdir.
Şan-şöhrətə zənn etmə ki, tez çatmaq asandır,
Boş-boş danışıb, dalda qırıldatmaq asandır.

## AÇIQ-AŞKAR DEYİR HƏR KƏS SÖZÜNÜ

Dalğalı ümman imiş, sanki, zəmanə o zaman
Fırtına hökm sürüb, dəhşət olub onda yaman.
Yox! Otuz yeddidə haqq söz deyənə yoxmuş aman.
Susdurublar dinəni, zorla yumublar gözünü,
İndi ancaq açıq-aşkar deyir hər kəs sözünü.

O zamanlar düz işi, haqqı dananlar da olub,
Səhvini dərk eyləyib, sonra qananlar da olub.
Əməlindən büzülüb lap utananlar da olub.
Tarixin yaddaşı açmış çoxunun iç üzünü,
Çünki indi açıq-aşkar deyir hər kəs sözünü.

Artıq aşkarlığa meydan açılıb, amma ki, gəl,
Görməli hər bir işə qəsdlə vurur bəzisi pəl.
Yaradır xariqələr ölkədə milyon qızıl əl.
Şöhrətin zirvəsinə zəhmət ucaltmış yüzünü,
Çünki indi açıq-aşkar deyir hər kəs sözünü.

Girləyən var hələ də küncdə-bucaqda başını,
O miras köhnəliyin tullaya bilmir daşını.
Yenilik söhbətinə oynadır o göz-qaşını.
Deyəcəklər üzünə əyrisini, həm düzünü
Çünki indi açıq-aşkar deyir hər kəs sözünü.

Hələ də var öyünən: – bağ belə, bostan belədi,
Amma bəzən görürük düz işi alt-üst elədi.
Bir bəhanə gətirib, sözlə gözə kül ələdi.
Başa düşmür ki, özü aldadır ancaq özünü,
Bəli, indi açıq-aşkar deyir hər kəs sözünü.

Dünənilə yaşayan vərdiş edib maska taxa
Mütərəqqi üsula zərrəbin altında baxa.
Paxırı çıxsa üzə, qurtara bilməz o yaxa.
Necə ört-basdır edə, xalq tapacaqdır izini,
Çünki indi açıq-aşkar deyir hər kəs sözünü.

## DƏXLİ NƏDİR BİZLƏRƏ

Zənn eyləyirsiz yəqin kütbeyin insanlarıq,
Məclisə getsək əgər, rütbəlini yanlarıq.
Yox! Hər işin xeyrini ömrü boyu anlarıq.
Qüdrətimiz, hökmümüz pul-parada vardadı,
Dəxli nədir bizlərə millətimiz dardadı.

Kölgədə rahat yatan kef-damağı çağ, bizik,
Axtaran olsa əgər işləri çim yağ, bizik.
Daş qayanın tərkinə rişə atan tağ, bizik.
Çoxları bilmir hələ məskənimiz hardadı,
Dəxli nədir bizlərə millətimiz dardadı.

Mətləbimiz sirlidi, çoxları düşməz başa,
Fikrimizi anlasan bəlkə də ağlın çaşa.
Atdığımız ox ki, var heç vədə dəyməz daşa.
Çox da ki, məzlum bəşər indi ahu-zardadı,
Dəxli nədir bizlərə millətimiz dardadı.

Eynimizə almırıq dövri-zaman ağlasa,
Naləsi atəş kimi ürəkləri dağlasa.
Taleyi gülmür deyə, hətta qara bağlasa.
Fərz eyləyək ki, günah "kordadı", ya "kardadı",
Dəxli nədir bizlərə millətimiz dardadı.

Zəncirimiz bağlıdı gözlə görünməz dağa,
İşlərimiz məxfidi, baş açan olmaz, qağa.
Zərrəcə qəm çəkmərik qar yerinə daş yağa.
Bağda xaşın ləzzəti borandadı, qardadı,
Dəxli nədir bizlərə millətimiz dardadı.

## ALLAHA ŞÜKR EYLƏ Kİ

Can atırdın olasan hökmü olan kəslərə tən,
Xəbərin çatdı mənə, şəkk eylədim doğrusu mən.
Nə sayaq iş başına müftə keçibsən axı sən?
Keçib imkan əlinə, dünya görünmür gözünə,
Allaha şükr eylə ki, arxa tapıbsan özünə.

Yuvasından çıxarır gürzəni də yağlı dilin,
Harda sən işləmisən olmayıb heç bircə ilin.
Qovlayıblar, açılıb, çünki sənin zir-zibilin.
Görünür ki, hələ də var inananlar sözünə,
Allaha şükr eylə ki, arxa tapıbsan özünə.

Dayının bir təkanı atdı səni süd gölünə,
Müftə aylıq gəlirin indi gərək tən bölünə.
Paylasan da bəs elər həm dirinə, həm ölünə.
Kəf gələrsən sən özün şeytanın hətta yüzünə,
Allaha şükr eylə ki, arxa tapıbsan özünə.

Çox güvənmə özünə, çıxma cızından qırağa,
Söykənənlər çox olub arxalı, köklü dayağa.
Yıxılan var hələ də heç dura bilmir ayağa.
Adam ol, barı, yıxılsan baxan olsun üzünə,
Allaha şükr eylə ki, arxa tapıbsan özünə.

Düzəlibdir deyəsən, xeyli əyilmişdi belin,
Bilmək olmaz neçə il baş tutacaq fitnə-felin.
Amma ki, çatmayacaq heç yerə bir vaxtı əlin.
Vuracaqsan o zaman gah başına, gah dizinə,
Allaha şükr eylə ki, arxa tapıbsan özünə.

## HƏR SÖZÜ QURDALAMA

Millətin halı yaman olsa da dinmə, sənə nə?!
Saralıb rəngi tamam olsa da dinmə, sənə nə?!
Kimsənin cibləri lap dolsa da dinmə, sənə nə?!
Dillənərsən, çəkilər hamı, qalarsan arada,
Tapılar damğa vuran, vecsiz olar pul-para da.

Hər sözü qurdalama doğrudu, yaxud da yalan,
Sənə nə, harda nəyi, kimdi verən, kimdi alan?!
Dinmə, axırda olarsan sən özün darda qalan.
Başlasa sorğu-sual, yaxşı bilirsən harada...
Tapılar damğa vuran, vecsiz olar pul-para da.

Farağat durmayanın rəngə salırlar sözünü,
Özünü karlığa vur, lal dayanıb, yum gözünü.
Bu sayaq, üzdəniraqdan qoruyarsan özünü.
Susmasan, bağlama bel evdəki dövlət-vara da,
Tapılar damğa vuran, vecsiz olar pul-para da.

Dil olub əngəl açan öz başına bir çoxunun,
Səsi də çıxmayıb heç atdığı saysız oxunun.
Qalmayıb heç izi də ad-sanın, var-yoxunun.
Dilini saxla, gətirsə səni dövran zara da,
Tapılar damğa vuran, vecsiz olar pul-para da.

Qovulub el-obadan saxlamayanlar dilini,
Eşidən olmayıb heç nə bəmini, nə zilini.
Olmayıb yad eyləyən yeddisini, nə ilini.
İstəyirmiş çoxusu, guya ki, bir şey yarada,
Tapılar damğa vuran, vecsiz olar pul-para da.

Oda atma özünü, çünki yanarsan, başa düş!
Zamanın gərdişini izlə, qanarsan, başa düş!
Dağ çəkilsə sinənə, haqqı danarsan, başa düş!
Dönməz olsan da lal ol, düşməli olsan dara da,
Tapılar damğa vuran, vecsiz olar pul-para da.

## İCLASA GET!..

Aman Allah, görürəm bir çoxunun var mərəzi,
Kürsüdən baş aparan boş danışıqdır çərəzi.
Canfəşanlıq eləməz, olmasa hərgah qərəzi.
Odlu-odlu danışır, guya yanır xalqa canı,
Oxucu! İclasa get, "xəstələri" sən də tanı!

Gurlayır boş-boşuna, hər dəfə mətləbdən uzaq,
İstəyir ki, "Təpəyə" səcdə qıla bir uca dağ.
Başıboş, boşboğazın niyyətinə, ağlına bax.
Söhbəti dinləyənin, söylə, qaralmazmı qanı?
Oxucu! İclasa get, "xəstələri" sən də tanı!

Hökmü olsa, beləsi aləmi bir gündə qatar,
Yerdəki bir tərəfə, Allaha da lap əl atar.
Xeyri olsa, araba kölgəsi altında yatar.
Yaxşı ki, böyləsinin nə adı vardır, nə sanı,
Oxucu! İclasa get, "xəstələri" sən də tanı!

Dərinə getsən əgər bir çoxu vallah, naşıdır,
Yolunu azmağa vadar eləyən küt başıdır.
Ağlı olsa düşünər hər acı söz göz yaşıdır.
Müdrik ağsaqqala keçmişdə olan hörmət hanı?
Oxucu! İclasa get, "xəstələri" sən də tanı!

Fikri-zikri odu ki, evdə də hey iclas ola,
Axışa qonşuları, razıdı mətbəx də dola.
Dəyməsə yağlı qapaz, gəlməyəcəkdir ağıla.
Batacaq gec-tezi var, olmasa candan yananı,
Oxucu! İclasa get, "xəstələri" sən də tanı!

Mən deməк azdı, belə səhnələri görsə gözün,
Dinləyənlər nə çəkir, şahid olarsan sən özün.
Çox güman yazdığıma zərrəcə olmazdı sözün.
Keçməyib orda sənin ömrünün heç bircə anı,
Oxucu! İclasa get, "xəstələri" sən də tanı!

## DƏDƏCAN

Dərsə meyl eyləmədim, boş keçirib hər anımı,
İmtahan verməliyəm, dərd alıb ancaq canımı.
Arxayınsan görürəm bax, bu qaraldır qanımı.
Mənə bel bağlama ha, bir yana zəng çal, dədəcan!
Mənə qalsa, nə sayaq toplayaram “bal”, dədəcan!

Axtarıb, arxayınam ki, tapacaqsan yolunu,
Çıxarar onda sudan bəlkə də oğlun çulunu.
Ümidim bir sənədir, çırmalayıb əl-qolunu.
Qonşumuztək deyirəm, sən də haray sal, dədəcan!
Mənə qalsa, nə sayaq toplayaram “bal”, dədəcan!

Səni dəng eyləmişəm, incimə, gəlsən də zara,
Çatmasan dadıma, şəksiz, qalar oğlun avara.
Nə qədər dost-tanışın var, biri gəlməzmi kara?
Neçəsi gündə tutur səndən hal-əhval, dədəcan!
Mənə qalsa, nə sayaq toplayaram “bal”, dədəcan!

Axı səndən savayı kim məni şad eyləyəcək?
Yazdırıb qiymətimi, dərddən azad eyləyəcək?
Arxayın olma bizi başqası yad eyləyəcək.
Gec deyil, çarə eylə, qayğıma sən qal, dədəcan!
Mənə qalsa, nə sayaq toplayaram “bal”, dədəcan!

Güvənirdim ki, dədəm işləri sahmana salar,
Nə biləydim ilişər, bel bükülər, rəngi solar.
Büzüşər məhkəmədə, əlləri qoynunda qalar.
Qalmayıb səndə daha, mən görürəm hal, dədəcan!
Mənə qalsa, nə sayaq toplayaram “bal”, dədəcan!

## EY FƏLƏK

Ey fələk, millətimin zəndini azdırdı zaman,
Cəllada qəbrimizi yan-yana qazdırdı zaman.
Qanımızla adını tarixə yazdırdı zaman.
Çox şəhid gənclərimin olmadı heç ömrü yarı,
Gələcək nəslə bu dəhşətləri sən söylə, barı!

Qulunam, həkk elə bu faciəni yaddaşına,
Nə müsibət gətiriblər gecə xalqın başına!
Məzlumu zalım əli qərq elədi göz yaşına.
Qan tökənlər itirib insafı, namusu, arı,
Gələcək nəslə bu dəhşətləri sən söylə, barı!

Yas tutub, söylə, bu dərdə necə dözsün analar?
Az qalıb ki, analar odsuz-alovsuz yanalar.
Gəl ki, qatillərimiz cəhd eləyirlər danalar.
Gündə minlər axışır bu məzarıstana sarı,
Gələcək nəslə bu dəhşətləri sən söylə, barı!

Bu qanı, zülmü gərək qoymayasan yerdə qala,
Bu günahsızları talemi salıbdır bu hala?..
Yox əzizim! Daş ürəklər bizə göndərdi bəla.
Xoş günü matəm olub, artıb elin ahu-zarı,
Gələcək nəslə bu dəhşətləri sən söylə, barı!

Ucalır nalə səsi, ərşə çıxır, dözmür ürək,
İndi imdad sənədir, milləti qoyma qala tək.
Birgə lənət oxuyaq baisə illərlə gərək.
Necə lənətlədilər doqquzu yanvarda Çarı,
Gələcək nəslə bu dəhşətləri sən söylə, barı!

## ƏFSANƏ DANIŞIR

Dünya işini bilməyə bir baş, hələ azdır,
Keçmişləri öyrənməyə min yaş, hələ azdır.
Tarixləri aşkar olunan daş, hələ azdır.
Hər halda külüngü belə işlərdə çalan var,
Şəksiz, cibinin də hayına işdə qalan var.

Əfsanə danışmır qocalar, yaşlı adamlar,
Torpaqda yatır rütbəli, daş-qaşlı adamlar.
Dəhşətdi, olub pul hərisi "başlı" adamlar
Baxsan nə qədər "kəlləlilərdən" ad alan var.
Şəksiz, cibinin də hayına işdə qalan var.

Sərvətlilərin çoxları çaşbaş olur hərdən,
İnsanı qudurdan da bu daş-qaş olur hərdən.
Hər halda yıxan da elə daşbaş olur hərdən.
Vicdanlılar haqqında da bir xeyli yalan var,
Şəksiz, cibinin də hayına işdə qalan var.

Əsrin gedişi başqadır indi, duyan olsa,
Dərdi, ələmi yüz nədi, mindi, duyan olsa.
Bunlar axı hər halda elindi duyan olsa.
Yəqin tapılar çarəsi, çox fikrə dalan var,
Şəksiz, cibinin də hayına işdə qalan var.

Xalqa, vətənə borcunu fikrindən atan var,
Sərvət matahın toplayıb, üstündə yatan var.
Aludə olub sərvətə, çox yerdə batan var.
Saymaq belə olmaz nə qədər indi kalan var,
Şəksiz, cibinin də hayına işdə qalan var.

Bir sözlə, yəqin söhbətimi xeyli uzatdım,
Bir çoxlarının bostanına mən də daş atdım.
Yatmışları, vallah, mənə vacibdi, oyatdım.
Çünki belə bir söhbəti hər yerdə salan var,
Şəksiz, cibinin də hayına işdə qalan var.

## BİLSƏ DƏ ÖZ DİLİNİ

Dilimə əcnəbi də göstərir hər yerdə maraq,
Gəl ki, öz millətimin bəzisi çəkmiş mənə dağ.
Bilsə də öz dilini, amma bəyənmir işə bax!
Bilməsə öyrədərəm, ay kişi, vallah, havayı,
Neçə dildə danışır, doğma dilindən savayı.

Bilmirəm qonşumuzun nə adını, nə yaşını,
Salam almır bu adam tərpədir ancaq başını.
Ya da mütrüb sayağı oynadır hey göz-qaşını.
Var deyənlər ki, yaman "başdıdı". – Heç yoxdu tayı,
Neçə dildə danışır, doğma dilindən savayı.

Nə soruşsan bu kişi, "hər" yerinə, "da" deyəcək
Bilsə də "mən sözünü", amma gülüb, "ya" deyəcək
Olsa bir fikrə şərik, mən əminəm "za" – deyəcək.
Budu laylay çalanın, süd verənin haqqı-sayı?!
Neçə dildə danışır, doğma dilindən savayı.

Sən demə çəngələ – vilka, qaşığa – loşka, – deyir,
İtə yəqin ki, sobaka, pişiyə – koşka, – deyir.
Eşidənlər çox olub donquza da – çoşka, – deyir.
Məhlədə var ləqəbi, məşhur olubdur bu "dayı",
Neçə dildə danışır, doğma dilindən savayı.

Düşsə dil barədə söz, bəlkə də "alimlik" edər,
Ona dil öyrədənin zəhməti də getdi hədər.
Künc-bucaqda beləsi var hələ də gör nə qədər.
Nə ola birdəfəlik bəlli ola kaş ki, sayı,
Neçə dildə danışır, doğma dilindən savayı.

Anamızdır bu vətən, taleyimizdir dilimiz,
Bilməyən varmı görən, var nə qədər nisgilimiz?!
Xeyli işlər görülüb, kaş uzanaydı ilimiz.
Çox güman qonşumuzun yoxdu bu işlərdə payı,
Neçə dildə danışır, doğma dilindən savayı.

## ŞÖHRƏT XƏSTƏSİ

Şöhrət, uzun illər sənə qəlbən can atırdım,
Çox vaxt gecəni gündüzə vallahi, qatırdım.
Qurbanın olum, xətrinə çox dada çatırdım.
Əfsus ki, mənim elmi işim kölgədə qaldı,
Gəl ki, adı dağ arxalı bir bambılı aldı.

Dünyada sənə çatmağa bir yol gəzir hər kəs,
Layiq deyiləm lap tutalım, duz-çörəyim bəs?
Saldım yadına "daydayımın", çıxmadı bir səs;
Baxdı üzümə, dinmədi də, sanma ki, laldı,
Gəl ki, adı dağ arxalı bir bambılı aldı.

Vallah, nə edim, könlüm olubdur sənə mail,
Şərtin ağır olsa belə, ollam ona qail.
Kaş ki, çoxutək mən də olam arzuma nail;
Baxma ki, dayım xeyli işi sahmana saldı,
Gəl ki, adı dağ arxalı bir bambılı aldı.

Bir zənglə salan var işi sahmana bir ayda,
Çıxdım keçən il çul-çuxadan, olmadı fayda.
Yəqin görünür orda nəsə başqadı qayda;
Mən də düşünürdüm ki, "dayım" Rüstəmi-Zaldı,
Gəl ki, adı dağ arxalı bir bambılı aldı.

Röyada düşəndə yadıma dik dururam mən,
Falçı qarıtək sübhə qədər tas qururam mən.
Hərdən başıma yağlı qapaz da vururam mən;
Çünki deyən olmuşdu mənimçün: hələ "kaldı",
Elmi adı dağ arxalı bir bambılı aldı.

Sən atlı olubsan elə bil, mən də piyada,
Salmır yoluma hətta Günəş azca ziya da.
Vardır belə işdə deyəsən hiylə, riya da;
Çünki pul olan yerdə yalan adicə haldı,
Elmi adı dağ arxalı bir bambılı aldı.

## BORCUNU QAYTAR

(*Analarını qocalar evinə qoyan övladlara*)

Dünyada müqəddəs anadır, bir də vətəndir,
Övlada məhəbbətləri ümmanlara təndir.
Düşsən dara onlar deməmiş, dada yetəndir.
Bəs sən niyə atdın ananı, eyləmədin ar?
Dünya sənin olsun, ananın borcunu qaytar!

Daşdır ürəyin, yoxsa dəmirdir, nə bilim mən,
Tapşırdın onu özgələrə, uf demədin sən.
Borcundu axı baş çəkəsən barı sən hərdən.
Orda qocanın qayğısına bil ki, qalan var,
Dünya sənin olsun, ananın borcunu qaytar!

Süd verdi döşündən sənə lay-lay dedi, yatdın,
Çəkdi nə əzablar, böyüyüb ərsəyə çatdın.
Qəlbin sənin heç göynəmədi, sən onu atdın!?
Yəqin ki, deyənlər çox olub, eyləməyib kar,
Dünya sənin olsun, ananın borcunu qaytar!

Yollarda qalıb gözləri səndən də xəbər yox,
Ömrü qısalar, çəksə bu həsrət nə qədər çox
Hər gün düşünür: "İndi balam acdı, görən tox?"
Qıydın necə sən, dərdli anan ağlaya zar-zar?!
Dünya sənin olsun, ananın borcunu qaytar!

İllər ötüşər səndə yəqin ki, qocalarsan,
Övladın atar bəlkə səni, tənha qalarsan.
Şəksiz belə nankorluğunu yada salarsan.
Olmazmı bu dünya başına, bax o zaman dar?
Dünya sənin olsun, ananın borcunu qaytar!

Çarəm kəsilib indi sənə dost deyirəm mən,
Tənha ananı yad eləyib, qəm yeyirəm mən.
Kövrək ürəyin vurğusuna baş əyirəm mən.
Hər kəs ki, atır öz anasın, olmalıdır xar,
Dünya sənin olsun, ananın borcunu qaytar!

## FAYDA VERMƏZ

(*Hippokrat andını pozan həkimlərə*)

Mənə təriflƏmə çox bağ belə, bostan belədi,
Bələdəm bir həkimə hər sözü qurğu, tələdi.
Əbləhin bəd əməli fikrimi alt-üst elədi.
Beləsi işdə çətin ki, yaraya xeyrə-şərə,
Fayda verməz, lap onu tənqid elə əlli kərə.

O Hippokrat dayının andına sadiq ki, deyil,
Güdəcək yan cibini işləsə vallah, neçə il!
Düzələn zad deyil o, olsa da alim, onu bil.
Nəfsi qoymaz havayı qulluq edə xəstələrə,
Fayda verməz, lap onu tənqid elə əlli kərə.

Ağrıdan azca qala xəstələr hərdən keçinə.
Belə anda gələ kaş ki, həkim insafa, dinə.
Əfsus olsun ki, o heç zərrəcə almır vecinə.
Gözləyir ki, xam hərif yanlaya, cib xərci verə,
Fayda verməz, lap onu tənqid elə əlli kərə.

Xəstənin yoxsa pulu, neyləsin, assın özünü?
Bic həkim xəstəyə him-cimlə deyir öz sözünü.
Görsə ki, çıxmadı səs, oynadır o qaş-gözünü.
Turşudur üz-gözünü, bircə sözü düşsə yerə,
Fayda verməz, lap onu tənqid elə əlli kərə.

Cibinə girsə əlin, şübhəsiz, əldən gedəcək,
Gecə-gündüz çalışıb xəstəyə qulluq edəcək.
Girəcək lap qoluna gəzməyi də öyrədəcək.
Müftəcə tutmayıb əl indiyəcən bir nəfərə,
Fayda verməz, lap onu tənqid elə əlli kərə.

Hələ var arxa duran doğru yolundan azana,
İstəyir ki, beləsi ad ala, hörmət qazana.
Bilirəm kəc baxacaq şeiri qərəzsiz yazana.
Kaş ki, öz fikrini aşkar deyə iclasda hərə,
Fayda verməz, lap onu tənqid elə əlli kərə.

## AMAN ALLAH

Yaşamaq xeyli çətin, xoş güzəran müşkül olur,
Bircə bədbəxt kasıbın çöhrəsinin rəngi solur.
Ara dəllallarının cibləri daşbaşla dolur.
Başlayıb gözgörəsi zirvələrə yol davası,
Aman Allah, qızışır ölkədə stol davası!

Harda bir iclas olur tərs kimi aləm qarışır,
Sanki, məruzəçilər kürsü dalında yarışır.
Döşəyir bir-birinə, gah küsüşür, gah barışır.
Düşür hərdən də açıq, ay lələ, sağ, sol davası,
Aman Allah, qızışır ölkədə stol davası!

Araya qovğa salan həddini bəzən də aşır,
Çox zaman şorpa kimi qaynamamış, sanki, daşır.
Gurlayır boş-boşuna, çaşbaş olur, ağlı çaşır.
Kişi, vallah, dayanır bir fitə futbol davası!
Aman Allah, qızışır ölkədə stol davası!

Rütbəyə can atanın dünya görünmür gözünə,
Haqlı tənqid edənin qulp qoyur hərdən sözünə.
Fikri-zikri odu ki, başda yer etsin özünə.
Ortaya qəsdlə salır barsız olan kol davası,
Aman Allah, qızışır ölkədə stol davası!

Qağa, vallah, bu sayaq iş düşə bilməz yoluna,
Yetmiş ildir axı zəncir salınıbdır qoluna.
Taleyi xalqımızın başla gərək həll oluna.
Çox şükür, indiyəcən düşməyib əl-qol davası,
Aman Allah, qızışır ölkədə stol davası!

## DÜNYA ÇƏTİN DÜZƏLƏ

Bazar baha, cib də boş,
Gəlməsə də sənə xoş.
Nə əsəbləş, nə də coş.
Zaman belədir belə,
Dünya çətin düzələ.

Birinin başında tac,
Biri toxdu, biri ac.
Həyat ümidə möhtac.
Dözüm olsa da hələ,
Dünya çətin düzələ.

Arzu yüyənsiz atda,
Uçur yeddinci qatda.
Sən ona çataçatda
Dönəcək əsən yelə,
Dünya çətin düzələ.

Yer fırlanır tərsinə,
Möhtac qaldıq ərsinə.
Oğulsansa gər sinə –
Dərd üz verəndə elə,
Dünya çətin düzələ.

Başdan aşır dərdimiz,
Var zərimiz, nərdimiz.
Gəlsin atsın mərdimiz.
Zər qoşa gəlsə, lələ,
Dünya bəlkə düzələ.

## OLDU ARXAM-DAYAĞIM

(*Pulgirin dilindən*)

Eləyib zorla məni pul özünə adicə qul,
Kaş ki, puldan tikələr ildə mənimçün təzə çul.
Oldu bir müşkül işim, bir daha bildim nədi pul.
Pulu minnətçi salıb, elmi ad aldım, a kişi,
Oldu arxam, dayağım, pulla ucaldım, a kişi.

Çalır hərdən qulağım, guya ki, mən kəmsavadam,
Başımı girləyirəm, keyquluyam, elmə, yadam.
Belə yolla ad alır, indi də vallah, çox adam!
Neçə il, gözdən uzaq, kölgədə qaldım, a kişi,
Oldu arxam, dayağım, pulla ucaldım, a kişi.

Qalmışam mat, elə bil, elmə yamaq təkcə mənəm,
Yorulur axşamacan sorğu-sualdan bu çənəm.
Bir tərəfdən də məni dəng eyləyir evdə nənəm.
Birtəhər, zorla, axır ki, başa saldım, a kişi,
Oldu arxam, dayağım, pulla ucaldım, a kişi.

Dünya görmüş kişisən, de, tanımır pul haranı?
Çətini bircə odur ki, açan olsun aranı.
Pul olan yerdə seçən var ki, heç ağdan, qaranı?!
O görürdü hər işi, mən də ki "laldım", a kişi.
Oldu arxam, dayağım, pulla ucaldım, a kişi.

Pilləyə qalxmağım, hərçənd başa gəlmişdi baha,
Tərpədən olmayacaq, arxayınam indi daha.
Çox şükr, son qoyulub evdə də fəryada, aha.
Ad alan gün oxuyub, çırtma da çaldım, a kişi,
Oldu arxam, dayağım, pulla ucaldım, a kişi.

## ƏLDƏ QALIB YAXASI

Sütül, cavan yaşında
Xaloğlu iş başında.
Çox sürətlə ucaldı,
Hələ medal da aldı.
Dayının sayəsində
Zəhm vardı səsində.
Artırdı baş əyənlər.
Hər sözə "can" deyənlər.
İlin gözəl çağında.
Hər gün sahil bağında
Manqallar düzülərdi,
Badələr süzülərdi,
Fürsət düşcək hər iflər
Deyərdilər təriflər.
Kefi kök, damağı çağ,
Ömr edirdi bu sayaq.
Fəqət zaman dəyişdi,
Halı yaman dəyişdi;
Ərşə çıxdı yuxusu,
Çünki vardı qorxusu.
Satdırdı dam-daşını,
Təzə "Volqa" maşını.
Sən demə dolmuş plan
Əsla yalanmış, yalan!
Bir əlidir, bir başı,
Kara gəlmir, göz yaşı.
Əldə qalıb yaxası,
Yoxdu daha arxası.

## ÇATMIR

Tək-tük hələ var Məşdi İbadlar aramızda,
Çatmaz puluna, dövlətinə pul-paramız da.
Hətta pula dönsə mələşən mal-qaramız da.
Əfsus ki, bu yaşda hələ də eşqə düşən var,
Çatmır deyirəm, toyxanası, bir də kaman, tar.

Hərçənd yaşayıb əllicə il, sonra bir anda
Bəzən tapılır arvadı qəsdlə boşayan da.
Özgə, təzə "Leyliylə" bir aylıq yaşayan da.
Bilməm niyə bəs eldən utanmır, eləmir ar?
Çatmır deyirəm, toyxanası, bir də kaman, tar.

Sözsüz ki, qələtdir elədi Məşdi İbad da,
Evlənməyinə güldü qohum da, neçə yad da.
İllərlə qalıbdır, qalacaqdır hələ yadda.
Vardır ona oxşar hələ də kəblə Qubadlar,
Çatmır deyirəm, toyxanası, bir də kaman, tar.

Sağlam qocalar var, a kişi, nur var üzündə,
Yoxdur qələti davranışında, nə sözündə.
Danlar özünü xırda günah bilsə özündə.
Sevdaya düşən anda ona söz eləmir kar,
Çatmır deyirəm, toyxanası, bir də kaman, tar.

Gizlətmədim öz fikrimi mən, ay kişi, səndən,
Çoxdan eşidirdim belə söhbətləri gendən.
Kaş ki, qocalar inciməsin zərrəcə məndən.
Çünki cavan arvad alan olsa, olacaq xar,
Çatmır deyirəm, toyxanası, bir də kaman, tar.

## İŞLƏRİ SAHMANLAMIŞAM

Nigaran qalma, dədə, işləri sahmanlamışam,
Bitirib məktəbimi bir qadını yanlamışam.
Gizlədir məndən hələ, dövləti var, anlamışam.
Dədə, ancaq onu bil, Zaqsa hələ getməmişik,
Qala kaş ki, mənə bu topla dağılmaz ev-eşik.

Pulu var, baxma onun əllidən artıqdı yaşı,
Qırışıb sir-sifəti, zil qaradır amma başı.
Şəvə tək saçları var, azca da seyrəkdi qaşı.
Görüşüb xeyli zaman, əhdə vəfa eyləmişik,
Qala kaş ki, mənə bu topla dağılmaz ev-eşik.

"Əlvida" söyləyib arvad neçə ildir ərinə,
Yazdırıb zorla məni daimi "ev dəftərinə".
Aparır toy-nişana gündə məni ər yerinə.
Bəlkə artsın sayımız, indidən aldırdı beşik,
Qala kaş ki, mənə bu topla dağılmaz ev-eşik.

Ay dədə, mən deyiləm təkcə bu cür arvad alan,
Həmyaşım var, lüt idi, arvad alıb pulu, kalan.
Toyunu verdi yola tarçı ilə zurnaçalan.
Toyda hətta yığılıb, dolma, kabab, aş yemişik,
Qala kaş ki, mənə bu topla dağılmaz ev-eşik.

Dədə, bəxtim gətirib, arvadımın var maşını,
Özü sürmür, itirir, çünki qəfildən huşunu.
Sevmirəm doğrusu mən heç bu bazarlıq işini.
Salıb əldən məni lap meyvə dolu taxta yeşik,
Qala kaş ki, mənə bu topla dağılmaz ev-eşik.

Kəndə gəlmək həvəsi yoxdu daha məndə, dədə,
Anama söylə salam, yaz mənə bir sən də, dədə.
Düşüb arvad yatağa, zəhlə tökür gündə, dədə.
Halı pisdir, çəkirəm mən başı üstündə keşik,
Qala kaş ki, mənə bu topla dağılmaz ev-eşik.

## XƏYALPLOV

Ay dədə, vallah, bitirib məktəbi,
Evlənəcəm mən də bu il el dəbi.
Gör necə yerdən qız alıbdır Cəbi:
Cahi-cəlalı demə düşməz ələ,
Durma, mənimçün, dədəcan, toy elə.

Kaş ki, təzə qaynatam olsun kalan,
Eyb eləməz olsa da dümbək çalan.
Dövlətinə mən də salardım talan.
Kaş ki, bizə gündə qonaqlar gələ,
Durma, mənimçün, dədəcan, toy elə.

Olsa varı, dərdi-sərim az olar,
Lap bekar olsam da, kefim saz olar.
Hətta payız, qış da dönüb yaz olar.
Zənn eləyirsən tuturam mən dilə,
Durma, mənimçün, dədəcan, toy elə.

Sirrini evlənməyimin qoy deyim:
Yoxdu həvəs kənddə gedib işləyim.
De, nəyim əskikdi Cəbişdən, nəyim?
"Volqa"sı var, sanki, dönübdür yelə,
Durma, mənimçün, dədəcan, toy elə.

Var keçən ildən kəsirim, ay dədə,
Qoyma ola zəhmətimi zay, dədə.
Bəlkə bir "üç" yazdıra dayday, dədə.
Yoxsa düşübdür canıma vəlvələ,
Durma, mənimçün, dədəcan, toy elə.

El-obada hörmət edən var sənə,
Arxalı, həm varlı qız axtar mənə.
Elçi gedib olmayasan xar yenə.
Toyda qiyamət qopacaqdır hələ,
Durma, mənimçün, dədəcan, toy elə.

## AL GƏTİR DİPLOMUMU

Elmə sahib olaram, dal qapıdan salsan ora,
Məncə, artıqdı demək, yaxşı bilirsən ki, hara?
Atacan, gəlməlisən burda da sən indi kara.
Sən bilirsən nə sayaq, kimlərə yalvarmalısan,
Dəxli yoxdur mənə heç, diplomumu almalısan.

Ali məktəbdə danışdın neçə dostunla özün,
Bilirəm, arxayınam onlara "qanundu" sözün.
Bataram burda da mən, olmasa üstümdə gözün,
Hara əl atmalısan, kimlərə zəng çalmalısan,
Dəxli yoxdur mənə heç, diplomumu almalısan.

Müxtəsər söyləyirəm, mətləbimi, ay atacan,
Atalar gör necədir, sən də elə halıma yan.
Belə getsə, görürəm, qalmayacaq məndə də can. –
Hansı ünvana gedib lövbərini salmalısan,
Dəxli yoxdur mənə heç, diplomumu almalısan.

Sən ki varsan hər anım keçməlidir burda da şən,
Xərcim artıb nə qədər, kaş ki, biləydin bunu sən.
Var qazancın, ayırıb xərcliyimi verməlisən.
Oxudursansa əgər, qayğıma da qalmalısan,
Dəxli yoxdur mənə heç, diplomumu almalısan.

Kefə qurban elədim hər günümü, hər anımı,
İmtahan verməliyəm, dərd alıb ancaq canımı.
Arzuma çatmamışam – bax, bu qaraldır qanımı,
Belə anlarda yanımda sən özün olmalısan.
Çarə yoxdur, yeri gəlsə, ata, yalvarmalısan,
Dəxli yoxdur mənə heç, diplomumu almalısan.

## AY OĞUL

Ay oğul, bir yada sal möhnətə dözmüş babanı,
Yerə qoymazdı bir an dəryazı, yaxud yabanı.
Çarığı dəlmə-deşik, çöldə qalardı dabanı.
Sən “platforma” geyib, “cinsi” gəzirsən alasan,
Nə ola, bircə dəfə çöldə gedib ot çalasan.

Arzusundan qocanın nisgili qat-qat çox idi,
Qarnı ac olsa belə, gözləri amma tox idi.
Ot-ələf yükləməyə eşşəyi hətta yox idi.
Sənin altında maşın, qonşuda kimdən dalasan?
Nə ola, bircə dəfə çöldə gedib ot çalasan.

Köhnə bir arxalığın toyda geyib, vayda geyib,
Rəngi solmuş çuxasın qışda geyib, yayda geyib.
Saxlayıb, müxtəsəri, bayram olan ayda geyib.
Kaş ki, yoxsul babanı sən yada hərdən salasan,
Nə ola, bircə dəfə çöldə gedib ot çalasan.

Faydası yoxdu sənə əsla nəsihət-öyüdün,
Ərköyünsən, görürəm, çünki firavan böyüdün.
Atalar yaxşı deyiblər: barı olmaz söyüdün.
Sən də bir növ eləsən, qayğıma bəlkə qalasan?
Nə ola, bircə dəfə çöldə gedib ot çalasan.

Dönüb artıq çoxsu, sanki, yüyənsiz bir ata,
İstəmir arzusuna, kamına zəhmətlə çata.
Çalışır müftə yeyib, kölgədə rahatca yata.
Bataram sən də məni ilboyu çapsan, talasan,
Nə ola, bircə dəfə çöldə gedib ot çalasan.

## SUS DEYƏN KİMDİ

Qalmışam mat niyə hey əlsiz-ayaqsız döyülür?!
Əksər iclasda elə arxa-dayaqsız döyülür.
Mən deyəndə bu kişi hər dəfə haqsız döyülür.
Xoşlamır bir parası hətta bərəldir gözünü,
Yanıram haqsız olan haqlı sananda özünü.

Var deyənlər mənə sus, haqlı çəkilsə dara da,
Dözməsən, yum gözünü, ay kişi, olsan harada.
Torlu gözlərdə demə ağ görünürmüş qara da.
Haqsızın hay-harayı üstələyir haq sözünü,
Yanıram haqsız olan haqlı sananda özünü.

Sus deyən kimdi axı? – Rəisə gendən baş əyən,
Ona dəllallıq edən, müftə pula – "layka" geyən.
Özü tək müftəxora "gözləri çox toxdu" deyən.
Gözü ki kölgəlidir, söyləyə bilmir düzünü,
Yanıram haqsız olan haqlı sananda özünü.

Elə zənn eyləməyin doğru yolumdan azıram,
Guya haqsız nə gəzir, mən bunu qəsdən yazıram.
Axı var... danmıram əsla, ona xəndək qazıram.
Salmışam səksəkəyə bəlkə də vallah, yüzünü,
Yanıram haqsız olan haqlı sananda özünü.

Elə haqsızlıq olur, ay kişi, sığmır ağıla,
Oxşadırlar belə bir söhbəti hərdən nağıla.
Haqq tutur öz yerini, aləmi-dünya dağıla
Haqsıza hamı gərək göstərə öz sərt üzünü,
Yanıram haqsız olan haqlı sananda özünü.

## SƏHV DÜŞƏNDƏ YERİMİZ

“Səhv düşəndə yerimiz” dünyanı görmür gözümüz,
Zor deyil, əsla uyuşmur işimizlə sözümüz.
Danırıq haqqı da bəzən bilərəkdən özümüz.
Batırıq min günaha, amma susur vicdanımız,
Eybi yoxdur, kaş ola bir balaca ad-sanımız.

Keçmişik iş başına zorla, təkanla yüzümüz,
Lənət olsun dədəmə, varsa əgər bir düzümüz.
Çox zaman alçalırıq, bəlkə ağ olsun üzümüz.
Var deyənlər ki, bizim yoxdu ədəb-ərkanımız,
Eybi yoxdur, kaş ola bir balaca ad-sanımız.

Bizə nə, harda kimin külfəti toxdur, ya da ac!
Axı bilmir çoxusu dava tac üstündədi, tac!
Göz-qulaq olmalıyıq kim verəcəkdir bizə bac.
Çoxuna bəlli deyil indiyəcən ünvanımız,
Eybi yoxdur, kaş ola bir balaca ad-sanımız.

Öyrənib cəmdəyimiz, bərkiyib artıq dərimiz,
Döşəsinlər, nə olar, əsla tökülməz zərimiz.
Sanmayın kef çəkirik, yoxdu bizim dərd-sərimiz.
Keçsə də səksəkədə hər günümüz, hər anımız,
Eybi yoxdur, kaş ola bir balaca ad-sanımız.

Tutalım əmrimizə qol çəkənin səhvi olub,
Müftə olmaz bu yəqin, yan cibi hər halda dolub.
Aman Allah! Nəsə vardır, “kişinin” rəngi solub.
Qorxuruq birdən ölər, bərk qaralıbdır qanımız,
Eybi yoxdur, kaş ola bir balaca ad-sanımız.

## TARİX ÖZÜ YAZDI

Dünya düzələn vaxtı gör hardan hara düşdü,
Sanki, yayın o cırhacırında qara düşdü.
Aləm bilir hərçənd niyə lapdan dara düşdü.
İclasda deyərdi: el üçün qışda da yazdı,
Yəqin unudubmuş, yalanın ömrü çox azdı.

Düşmüşdü özü "süd gölünə", orda üzürdü,
Açmışdı qanad gah da fəzalarda süzürdü.
Boş sözləri, boş vədlərin ardınca düzürdü.
Bəzən deyən olmuşdu ki, bu köhnə avazdı
Yəqin unudubmuş, yalanın ömrü çox azdı.

İllərlə planlar kağız üstündə dolurdu,
Pambıqçı da ki, son qozanı qarda yolurdu.
Haqqın tələb etsəydi əgər, haqsız olurdu.
Çox vax o deyirdi: "Görürəm kefləri sazdı",
Yəqin unudubmuş, yalanın ömrü çox azdı.

Keçmişdi təkanla qabağa küncdə qalanlar,
Yaltaqlığı can-başla edən rüşvət alanlar.
Gözdən asılan pərdəyə dönmüşdü yalanlar.
Baxma desə də işləri sahmandı, tarazdı,
Yəqin unudubmuş, yalanın ömrü çox azdı.

Yersiz hədələrdən yatağa düşmüş əlil var,
Yüzlərlə şikəst, bəlkə də bir xeyli zəlil var.
Zalımlığa guya nə sübut var, nə dəlil var.
Tarix olan haqsızlığı bir-bir özü yazdı,
Bildirdi, açıqca, yalanın ömrü çox azdı.

## İŞİN DÜŞƏNDƏN-DÜŞƏNƏ

Düzü mat qalmışam sənə,
Möhür, açar sahibinə.
Baş əyirsən dönə-dönə.
Gəl ki, zəng edirsən mənə
İşin düşəndən-düşənə

Əl tutursan dosta-yada,
Ya qəsdən salmırsan yada.
Fikrindən çıxmışam ya da.
Amma yalvarırsan mənə
İşin düşəndən-düşənə.

Öyrənmisən sən him-cimə,
Hey vurursan sarı simə.
Üçlüyü gəlirsən kimə.
Guya ki, qohumsan mənə –
İşin düşəndən-düşənə.

Hələ sənə çoxdu sözüm,
Açıb-ağartmıram özüm.
A bişərəf, görmür gözüm.
Necə baş çəkirsən mənə
İşin düşəndən-düşənə.

Var hələ arxanda dayaq
Əmr eyləyirsən bu sayaq.
Kandarıma basma ayaq.
Nə də salam vermə mənə
İşin düşəndən-düşənə.

## YAD ET BARI

Axtarma məni, yüz tanışından biriyəm mən,
Yoxdur sənə fərqi, ölüyəm, ya diriyəm mən.
Dünyada çətin ki, belə dərdlə kiriyəm mən...
İllərlə olan dostluğumuz çıxdı yadından,
Yad et barı hərdən, ötüşən günləri bir an.

Nəymiş bu həyat, dünya özü fani, xəyalmış?!
Keçmiş ola, eh..., dostluğun ancaq adı qalmış.
Yəqin təzə dostlar yığılıb, dövrəyə almış.
Düşmür yadına, darda sənə əl tutan insan,
Yad et barı hərdən, ötüşən günləri bir an.

Sənsiz də mənim kef-damağım çağdı, həmişə,
Dostluqda dönüklük mənə bir dağdı, həmişə.
Əfsus ki, deyirsən ki, üzün ağdı həmişə.
Yox, yox özünə baxmamısan əsla kənardan,
Yad et barı hərdən, ötüşən günləri bir an.

Dünyada nə yaxşı sənə bənzər adam azdı,
Baxma ki, kefin pul sarıdan indi də sazdı.
Nimdaş çulu, bil, abra salan güllü qotazdı!
Dostsuz qazanardınmı görən sən belə ad-san?
Yad et barı hərdən, ötüşən günləri bir an.

Dünyanı tutub, qalmayıb heç kəs hələ, vallah,
Anla sözümü, karına bəlkə gələ, vallah.
Axtarma məni sən daha bundan belə, vallah.
Hər kəs fələyə, harda ola, borcludu bir can,
Yad et barı hərdən, ötüşən günləri bir an.

## AYƏ, BƏS MƏN NƏ YAZIM?

Ölkədə bəllidi ki, ac-yalavac yoxdu hələ,
Hərə bir cür dolanır, gözləri də toxdu, hələ.
Gələcək, xoş sabaha, çünki güman çoxdu, hələ.
Çalır hərdən qulağım, şübhə edən var sözümə,
Ayə, bəs mən nə yazım, gülməsin aləm özümə?!

Olsa bir darda qalan, aləmə hay-küy yayılır,
Belə hal el-obada, çünki fəlakət sayılır.
Axışırlar köməyə, hətta yatanlar ayılır.
Görürəm, mən nə sayaq şəkk eləyim öz gözümə?!
Ayə, bəs mən nə yazım, gülməsin aləm özümə?!

Çox şükür, var hamının ev-eşiyi, baxça-bağı,
Dırmaşır eyvana lap, balqabağın barlı tağı.
Ələ düşməz belə sort, dadlı, şirin balqabağı.
Niyə yanpörtü baxır yolda görənlər üzümə?
Ayə, bəs mən nə yazım, gülməsin aləm özümə?!

Harda olsam qapının zəngi aramsız vurulur,
Elə ev var, mən ölüm, hər gecə məclis qurulur.
Sübhəcən badə, filan, kef öz-özündən durulur.
Doğrusu mat qalıram badə vuranda dözümə,
Ayə, bəs mən nə yazım, gülməsin aləm özümə?!

A kişi, zorla deyirlər olanı tərsinə yaz,
Nə sayaq yazmayasan ölkədə çoxdu kefi saz!
Ola bilsin birinin müftə qazancı olub az.
Adını çəksəm əgər, bəlkə də düşsün izimə,
Ayə, bəs mən nə yazım, gülməsin aləm özümə?!

## HƏR KƏS ALIR ÖZ PAYINI

Qapını gizli döyən möcüzəli "əldi" xəbər,
Kefinin çırtma vuran vaxtı sənə gəldi xəbər.
Gözlərin doldu bir an, bağrını lap dəldi xəbər.
Ah çəkib, ərz elədin ki, çıxarıblar dayını,
Bəli, dünya belədir, hər kəs alır öz payını.

Dayının bəd xəbəri, ay kişi, ağlatdı səni,
"Bağladı" əl-qolunu, xeyli dala atdı səni.
Neçə min arxasızın cərgəsinə qatdı səni.
Olmamışdı eşidən indiyəcən ah-vayını,
Bəli, dünya belədir, hər kəs alır öz payını.

Çox döyürdün döşünə, şəstlə çatırdın qaşını,
Zənn edirdin ki, nə var, girləyəcəksən başını.
Çünki tərif eləyən vardı sənintək naşını.
Dəm tutanlar çoxalırdı itirirdin sayını,
Bəli, dünya belədir, hər kəs alır öz payını.

Haqq deyən kəslər açıb çoxlarının iç üzünü,
İstəyirsənsə deyim indi sözün lap düzünü.
Tullayıb qəm gölünə arxalılardan yüzünü.
Qovlayıblar o günü daydayının bir tayını,
Bəli, dünya belədir, hər kəs alır öz payını.

Güdmüsən öz cibini, işləmisənsə harada,
Elə arxan hanı ki, bir də şərait yarada.
Çıxarıblar səni də, indi qalıbsan arada.
Sən daha yad eləmə katibənin tünd çayını,
Bəli, dünya belədir, hər kəs alır öz payını.

Çox güman yetməyəcək bir də əlin yağlı yerə,
Bir daha çatmayacaq daşbaşın ortaqlı yerə.
Qorxasan göndərələr gözdən uzaq bağlı yerə.
Gecə-gündüz sayasan hər gününü, hər ayını,
Bəli, dünya belədir, hər kəs alır öz payını.

## DÜNYA DÜZƏLƏR

Keçirəydin yuxuda ömrünü kaş bir neçə il,
Bəlkə görməzdi gözün nalə çəkir hansı tifil.
Ərsəyə çatmayacaq, əl tutanı olması bil.
Səsinə hay verəni yoxsa, əlindən nə gələr?!
Deyirəm səbr eləsək, yəni bu dünya düzələr?

Güləşir haqla nahaq, kaş ki, bunu görməyə göz,
Yıxılan haqdı yenə, gəl belə haqsızlığa döz!
Haqqa biganələrə kar eləmir zərrəcə söz.
Belə getsə, arabir tanrı da göydən daş ələr,
Deyirəm səbr eləsək, yəni bu dünya düzələr?

Əl çalırlar bu yarışda yenə qalib çıxana,
Gül verirlər yenə də haqqı kələklə yıxana.
Baxıram haqqın əlin cüzi, yalandan sıxana.
Baxışım dönsə oxa, bağrını yəqin ki, dələr,
Deyirəm səbr eləsək, yəni bu dünya düzələr?

Görməməkçün nə sayaq alim olur ağlı dayaz,
Kasıbın taleyini həll eləyir bir kefi saz.
Məsləhətdir yatasan, ay qağa, vallahi, bir az.
Yoxsa dözməz ürəyin, tab eləməz, lap üzülər,
Deyirəm səbr eləsək, yəni bu dünya düzələr?

Sabahın yaxşı güzəranına yoxsa gümanın,
Qalxmayıbdır hələ ki, göylərə ahın, amanın.
Yat ki, azad olasan dərdi-sərindən zamanın.
Umma, ah-vay eləsən kimsə sənə çarə elər,
Deyirəm səbr eləsək, yəni bu dünya düzələr?

# NƏSİHƏT

Yıxdı axırda tamah dağdan ağır dağ kişini,
Oğul, ibrət götürüb sahmana sal öz işini.
Sənə mən söz deyirəm, qurdalayırsan dişini.
Bəsdi, kefqomluq edib, arxayın oldun dayına,
Dayın artıq ilişib, indi qalıb öz hayına.

Evinə müftə gələn ət, yağı görmürdü gözü?
Heç eşitmirdi məgər tənəli, eyhamlı sözü?
Bu günə düşməyinə aşkara baisdi özü.
Ortaq olmuşdu axı bir neçə dostun payına,
Dayın artıq ilişib, indi qalıb öz hayına.

Qapısında qaralı-ağlı cüt idi "kəhəri",
Vardı imkanı belə lap satın alsın şəhəri.
Düşdü səs şənbə günü, yoxlama gəldi səhəri.
Sanki, düşmüşdü duyuq, istədi gözdən yayına,
Dayın artıq ilişib, indi qalıb öz hayına.

Səhvini dərk eləyib düşmədi vaxtında başa,
Qaldı mülkü, maşını, indi başı dəydi daşa.
Ay oğul, ömrü boyu cəhd elə zəhmətlə yaşa.
Dara düşsən nə sayaq mən dözərəm ah-vayına,
Dayın artıq ilişib, indi qalıb öz hayına.

Zəhmətə xor baxanın axırı yoxdur, a bala.
Yaxşı iş tut ki, adın bəlkə bu dünyada qala.
Vərdişindən hələ də "dağ" kişi qalmırdı dala.
Həftə çatmır orada yatmağının beş ayına,
Dayın artıq ilişib, indi qalıb öz hayına.

## ANALAR, AY ANALAR
(*Körpəsini atan analara*)

Analıq borcunu dünyada bilir hər bir ana,
Gərək o məşəl olub körpəsi üstündə yana.
Yoxsa dilsiz, südəmər körpəsini qəsdlə dana?
Deyirəm onlara mən, toplayın öz səbrinizi,
Eşidin, əfv eləməz, kimsə bu dünyada sizi.

Var gəlinlər neçə il körpə üçün dad eləyib,
Gecə-gündüz axıdıb göz yaşı, övlad diləyib.
Körpə dünyaya gələn gün başına gül ələyib.
Bir baxın onlara siz, ram eləyin hissinizi,
Eşidin, əfv eləməz, kimsə bu dünyada sizi.

Evə şənlik gətirən gül balanın şən səsidir,
Sanki, bir quşcığazın incə, zərif nəğməsidir.
Bu səadət ananın məncə ömürlük bəsidir.
Anlayırsız bunu siz bilsəniz öz qədrinizi,
Eşidin, əfv eləməz, kimsə bu dünyada sizi.

Daş ürəkli analar sən demə vardır, hələ də,
Atır öz körpəsini quyruğu qalcaq tələdə,
Ürəyin parçasını atmaq olarmı belə də?
Deyirəm onlara, bu ağrıdacaq qəlbinizi,
Eşidin, əfv eləməz, kimsə bu dünyada sizi.

Uyub "eşqin" felinə bağlanır hərdən gözünüz,
Körpə dünyaya gəlir, kimdi günahkar? Özünüz.
Təmiz ad xatirinə "eşqə düşərkən" dözünüz
Analar, ay analar, atsanız öz körpənizi,
Eşidin, əfv eləməz, kimsə bu dünyada sizi.

## NƏ OLAR!

Guya xoş əyyam olub, bilməmişik indiyəcən?
Bir doyunca danışıb, gülməmişik indiyəcən?
Gözümüz yaşlı qalıb, silməmişik indiyəcən?
Bəlkə bundan belə sahman ola, dünya düzələ,
İnsan insanlığının naminə kaş rəhmə gələ!

Biləkdən özümüz haqqı nahaq eyləmişik,
Xırda nöqsanı şişirdib yenə dağ eyləmişik.
Həm də insafsız olub, işdə də ağ eyləmişik.
Kaş ki, hər yerdə asan həll ola müşkül məsələ,
İnsan insanlığının naminə kaş rəhmə gələ!

Halına yanmamışıq nalə çəkib ağlayanın,
Qəsdinə durmamışın rüşvətə bel bağlayanın.
İşdə haqsızlıq edib çox sinələr dağlayanın –
Nə ola, hökmü olan baxmaya heç vaxtı ələ,
İnsan insanlığının naminə kaş rəhmə gələ!

Olsa can yanğısı iş görmək asandır – kaş ola,
Vay o gündən ki, müdirlərdə ağılsız baş ola;
Ya da insafsız ola, qəlbi gərəksiz daş ola.
Deyəcək: arxayın olma, başına çarə elə,
İnsan insanlığının naminə kaş rəhmə gələ!

Nə sayaq indi deyək hər nə olub qanmamışıq,
Od vurub başqasına heç özümüz yanmamışıq?
Kəsdirib astananı, yalvaranı danmamışıq?
Ömrü sonsuz sananın insafı olmaz, a lələ,
İnsan insanlığının naminə kaş rəhmə gələ!

## SƏN DƏ ÖLƏNDƏ BARI

Hay vermədin bir səsə,
Əl tutmadın bir kəsə.
Nə xeyirdə, nə şərdə
Nə qohumun, nə yadın
İşinə yaramadın.
Çəkildin öz "qınına",
Qulluq etdin canına.
Fəqət yetişdi zaman,
Əcəl vermədi aman.
Əzrayılla görüşdün,
Yaman təşvişə düşdün.
Gözləmirdin axı sən
Ölümlə üzləşərsən.
Əzrayıl gülüb dedi:
Büzüşübsən bu nədi?
Nə etmisən dünyada
İndi bir-bir sal yada.
Başının tükü sayı,
Yaxşılıqdan savayı,
Hər iş gəlib əlindən
Şahidiyəm, çünki mən.
Nədənsə heç bircə an
Bu günü anmamısan
Gündə getmisən kefə,
Heç olmasa bir dəfə
Ac-yalavac görəndə,
İnsaf olaydı səndə,
Rəhmə gələydin bir az,
Tikəni bölüb yarı,
Bir rəhmət qazanaydın,
Zalım, öləndə barı?

## BİRLİKDƏ

Yan keçmə, salam ver, ürəyimdən asılıb daş,
İncikliyin olsa belə, vurma üzə qardaş.
Aləm dəyişib, işlər olub gör necə çaşbaş.
Düşmən quyusu sən düşünəndən də dərindi,
Birlikdə bu meydanda gərək çarpışaq indi.

Hər gündə yeyib süfrəmizin duz-çörəyindən,
Hardan biləsən ki, nə keçirmiş ürəyindən.
Alçaqların hökmən tökülər göz-bəbəyindən.
Murdar üzünü pərdələyən yüz nədi, mindi,
Birlikdə bu meydanda gərək çarpışaq indi.

Varmış səbəbi kefləri neyçün durulubdur,
İllərlə demə məxfi planlar qurulubdur.
Saxta sənədə saxta möhürlər vurulubdur.
Tapdıqları qoltuq hələ yəqin ki, sərindi,
Birlikdə bu meydanda gərək çarpışaq indi.

Bağlanmalıdır bənd-bərəsi peşkəş alanın,
Sirri açılıb, olmadı bir xeyri yalanın.
Müşküldü işi, üstlərinə kölgə salanın.
Hardan yel əsir, arxaları kimdi, bilindi,
Birlikdə bu meydanda gərək çarpışaq indi.

Artdıqca sayı züy tutanın, ərşə çıxır səs,
Neyçünsə deyən yoxdu, a bayquş, səsini kəs.
Susduqca qızıb vəhşiləşirlər, nə edək bəs?
Göstər gücünü, qoy deməsin qorxdu, çəkindi,
Birlikdə bu meydanda gərək çarpışaq indi.

Daşnak gədələr hay salaraq aləmi qatdı,
Tülkü sayağı, hər dəfə bir fəndə əl atdı.
Bəsdir bu qədər mürgülədin, iş başa çatdı.
Çırma qolunu, keç irəli, növbə sənindi,
Birlikdə bu meydanda gərək çarpışaq indi.

## BİZDƏ DƏ...

İndiki aşkarlığa qulp qoyan az-maz qalıb,
Tənqidi heç dadmayan kef-damağı saz qalıb.
Rütbəli nadanların ömrünə çox az qalıb.
İndiyəcən sən demə ağ yalan uydurmuşuq,
Dillənənin ağzına bir şapalaq vurmuşuq.

Gündə basıb-kəsmişik, bağ belə, bostan belə,
Guya bu kef əyyamı düşməyib heç vaxt ələ.
Bunca yalan vədlərin axırı yoxmuş, lələ!
Çəp baxana xəlvəti, dalda tələ qurmuşuq,
Dillənənin ağzına bir şapalaq vurmuşuq.

Kürsüyə qalxanları xalqa yaxın sanmışıq,
Gözlərimiz görsə də, ilğıma aldanmışıq.
Zərbələrin qorxudan ağrısını danmışıq.
Guya ki, qanunların keşiyində durmuşuq.
Dillənənin ağzına bir şapalaq vurmuşuq.

Zirvələrə qalxmışıq, guya zəfər çalmışıq,
Çəkdiyimiz zəhmətin haqq-hesabın almışıq.
Bəs elədirsə niyə biz bu günə qalmışıq?
Xətrimizə kim dəyib burnunu ovdurmuşuq.
Dillənənin ağzına bir şapalaq vurmuşuq.

Arxalının nöqsanı olsa da göz yummuşuq,
Xeyrimizi güdmüşük, həm də kömək ummuşuq.
Arxasızın üstünə ley kimi biz cummuşuq.
Düşsə məqam yıxmağa, tez puçunu burmuşuq.
Dillənənin ağzına bir şapalaq vurmuşuq.

İndi qərarlar yeni, həm də tələblər yeni,
El gücü, haqqın səsi silkələyib ölkəni.
Ey oxucu, sən yəqin anlayacaqsan məni.
Bəs edər, haqsız neçə işçini qovdurmuşuq
Dillənənin ağzına bir şapalaq vurmuşuq.

## ATALAR, AY ATALAR

Atalar, borcunuzu bir də salın yadınıza,
Sevdirin bir peşəni ərköyün övladınıza.
Sonralar hay-küyünüz çatmayacaq, dadınıza.
Qoymayın axşamacan tində durub şey satalar,
İndidən çarə qılın siz, atalar, ay atalar!

Əyləşib bir neçəsi maqnitofonlu maşına,
Hardasa bir nadanın tez yığılırlar başına.
Gəlmir uyğun çoxunun gördüyü işlər yaşına.
Qoymayın verdiyiniz pula gedib nərd atalar,
İndidən çarə qılın siz, atalar, ay atalar!

Evdə yoxdursa əgər, bəs gecələr harda olur!
Dəyməsin xətrinizə, meyxanada, barda olur.
Süfrədə pivə, araq, orda kaman, tar da olur.
Elə yerlərdə axı baş verir hərdən xatalar,
İndidən çarə qılın siz, atalar, ay atalar!

Belə getsə, inanın, zəhmətiniz zay olacaq,
Növcavan övladınız antipoda tay olacaq.
Gecə-gündüz işiniz bəlkə də ah-vay olacaq.
Çalışın, elm oxuyub, sizlərə barı çatalar,
İndidən çarə qılın siz, atalar, ay, atalar!

İndidən sizsiz olan günlərini anmalısız,
Gec deyildir nə qədər taleyinə yanmalısız.
Ya da öz borcunuzu birdəfəlik danmalısız.
Qoymayın ömrü boyu kölgəniz altda yatalar,
İndidən çarə qılın siz, atalar, ay atalar!

## EH SƏXAVƏT

İndi xeyriyyə cəmiyyətləri var, gör nə qədər,
Yaranıb ki, azala bəlkə bir az qüssə-kədər.
Əfsus olsun ki, çox elan verilir, amma hədər...
Çünki əl tutmağa tək bircə kasıblar can atır,
Milyoner daşbaşını çinləyir, üstündə yatır.

Daş ürəklərdə səxavət dil aça, kaş ki, bir an,
Deyə him-cimlə: "tələs, bir yetimin halına yan.
Qoyma, ah-vay eləsin, millətə yandır barı can"
Dindirərsən, bu xəsis dad eyləyər, guya batır,
Milyoner daşbaşını çinləyir, üstündə yatır.

Xoş güzəranı ola, çöhrəsi solmaz fağırın,
Bəlkə heç bir o qədər dərdi də olmaz fağırın.
Ürəyi ağlamasa, gözləri dolmaz fağırın.
Yaxşı ki, dövlətimiz ilboyu imdada çatır,
Milyoner daşbaşını çinləyir, üstündə yatır.

Kürsüdən od ələyən, çox danışan pulu, kalan,
Hardasan? Dur irəli, gözgörəsi satma yalan.
O yetim körpələri fərz elə öz doğma balan.
"Ağlama", bəllidi ki, səndə də var xeyli yatır,
Milyoner daşbaşını çinləyir, üstündə yatır.

"Can deyil ki, verəsən", var belə bir eldə məsəl,
Bir xəsis varlı hələ tutmayıb heç bir kəsə əl.
Kasıbın fəryadına qoymayıb ömründə məhəl.
Alsa bir tazə papaq, nimdaşını gizli satır,
Milyoner daşbaşını çinləyir, üstündə yatır.

Yandıran qəlbimizi dərdə yanar, gözdü, lələ,
Eh, səxavət sözü də sən demə boş sözdü, lələ.
Varlı pulzadələrin əksəri acgözdü, lələ.
Xeyri olsa, gecəni gündüzə yəqin ki, qatır,
Milyoner daşbaşını çinləyir, üstündə yatır.

## A KİŞİ, TÖVBƏLİYƏM

Dərdimi ərz eləyim, sanki, şəbehdir, qulaq as,
Durdum ət növbəsinə, düşdü qəfildən basabas.
Gedib orda ürəyim, çöldə qurublar mənə yas.
Mənə baxdıqca həkim yırğalayırmış başını,
Çox şükür, tez yetişib dadıma yardım maşını.

Bərk əzilmişdi başım, altı qabırğam, bir əlim,
Bir tərəfdən də mənim, ay kişi, sərpmişdi belim.
Qalmamışdı ümidim bir də bu dünyaya gəlim.
Evdə ki arvad-uşaq da axıdıb göz yaşını,
Çox şükür, tez yetişib dadıma yardım maşını.

Nəql edirlər həkimin gözləri varmış badamı,
Soruşurmuş elə hey, varmı bunun bir adamı?
Var deyəndə, bu həkim az qalıb alsın qadamı.
Yollayıblar görünür yoldan ötən bir naşını,
Çox şükür, tez yetişib dadıma yardım maşını.

Gecə-gündüz dolanır ət dükanında xəyalım,
Çox güman batdı, çətin köhnə talonla ət alım.
Xeyli yatdım beləcə, yaxşılaşıb indi halım.
Evdə hey yad edirəm mən həkimin göz-qaşını,
Çox şükür, tez yetişib dadıma yardım maşını.

Durmaram növbəyə mən ilboyu ətsiz də qalam,
A kişi, tövbəliyəm bir də talonla ət alam.
Dəliyəm, qarnım üçün öz canımı dərdə salam?!
Ay canım, mən yemirəm heç o ətin bozbaşını,
Çox şükür, tez yetişib dadıma yardım maşını.

Ətə möhtac olanın çox da minindən biriyəm,
İl olar, ət yemirəm, ölməmişəm ki, diriyəm!
Bəzən, hərdən dururam, taqətim olmur yeriyəm.
Atmışam birdəfəlik ət yeməyin mən daşını,
Çox şükür, tez yetişib dadıma yardım maşını.

## FƏLƏYİN FƏRMANI VAR

Eşit, ey can-ciyərim, dost-tanışın qeydinə qal,
Gündə yüz yol demirəm, halını hərdən xəbər al.
Fani dünyadakı ömrün sonunu bir yada sal.
Dost sağikən əl uzat, vaxtı itirmə, gec olar,
İnsan haqqında, unutma fələyin fərmanı var.

Dost deyibsənsə əgər, sən o kəsin qədrini bil,
Dostluğun qayçısıdır yağlı yalanla, acı dil.
Bil, xəyanət açılır keçsə də, vallah, neçə il!
Kəsdiyin duz-çörəyi tapdamağa vermə qərar,
İnsan haqqında, unutma fələyin fərmanı var.

Sanma dost sən özünə yoldan ötən hər naşını,
Üzdə min cildə girər, girləmək üçün başını.
Heç güman etmə ki, ölsən axıdar göz yaşını.
Gəlməz heç dəfninə də, gəlsə də bir küncdə durar,
İnsan haqqında, unutma fələyin fərmanı var.

Taleyimdənmi, nədənmi, nə bilim, dost acıyam,
Lal durub susmağımı anlayanın möhtacıyam.
O mənim, mən də onun, sanki, başında tacıyam.
Möhlət azdır, düşünən, zənn edirəm fikrə dalar,
İnsan haqqında, unutma fələyin fərmanı var.

Dünyadan olsa da hərçənd hələ də çox şey uman,
Sabaha çıxmağa da bəlkə də çox azdı güman.
Ömr olub tez ötüşən göydə bulud, yerdə duman.
Gedəni saxlamaq olmur, çəkirəm aləmə car,
İnsan haqqında, unutma fələyin fərmanı var.

## ALLAH TANIYIR

Allah deyəni bəndəsi etsəydi nə vardı,
Dünyada nə yoxsul, nə də bir haqsız olardı.
Fəryad səsini hər kəs eşitmirsə o kardı.
Tanrı özü üz döndərir hər vaxt beləsindən,
Allah tanıyır hər vələdüzznanı səsindən.

Məhbəsdə yatan da çağırır: dada çat, Allah!
Dəryada batan da çağırır: dada çat, Allah!
Vicdanı satan da çağırır: dada çat, Allah!
Yaddan çıxar heç, rüşvət umurdu dədəsindən,
Allah tanıyır hər vələdüzznanı səsindən.

Allah yada düşmür niyə haqsızlıq edəndə,
Qanmırmı məgər mətləbi fitvaya gedəndə.
Ah-uf eyləyir, vicvicə gəzdikcə bədəndə.
Artıq gec olur, tüstü çıxanda təpəsindən,
Allah tanıyır hər vələdüzznanı səsindən.

Yalvarmağa adət eyləyib əyri də, düz də,
Düz batsa da, əyri can atır qalmağa üzdə.
Vallah, çıxa bilməz qoşalar hətta öküz də.
İmdad diləsə lap dayısından, ləłəsindən,
Allah tanıyır hər vələdüzznanı səsindən.

Zalım əl açır göylərə, ya darda qalanda,
Yaxud da ki, müşkül iş üçün fikrə dalanda.
Əfsus ki, bir insaf eləmir rüşvət alanda.
Ləzzət alır hərçənd özünün zümzüməsindən,
Allah tanıyır hər vələdüzznanı səsindən.

Yox, yox, bəşər övladı gərək haqqa inansın,
Hər bir əməlin dərk eləyib, Allahı ansın.
Yoxsa ki, böyük xaliq olan varlığı dansın?!
Heyhat! Beləsi yaş da axıtsa giləsindən,
Allah tanıyır hər vələdüzznanı səsindən.

## BƏRƏKALLAH, BELƏ XALQA

Ay baba, zülm evinin laxlayıb artıq təməli,
Xalqımı qərq elədi öz qanına zalım əli.
Sirr qalıbdır hələ də fitnəkarın fitnə-feli.
Çox axıtdı elimiz qəlbinə öz göz yaşını,
Bərəkallah, belə xalqa, uca tutmuş başını.

Ötsə də qanlı bir il, qövr eləyir nisgilimiz,
Tarixə düşdü dübarə qara günlü ilimiz.
Cəllada dost deməyə de, necə gəlsin dilimiz?!
Axı qanla suladı torpağımın hər daşını,
Bərəkallah, belə xalqa, uca tutmuş başını.

Baxma ki, indi qışın, ay baba, "oğlan çağıdır",
Məzarıstan babacan, sanki, qərənfil bağıdır.
Gələcək nəslə ömürlük bu da bir göz dağıdır.
İtiribdir neçəsi doğma bacı-qardaşını,
Bərəkallah, belə xalqa, uca tutmuş başını.

Çoxdu biganə hələ millətimin ah-vayına,
Kürsüdən dil-dil ötür, çünki qalıb öz hayına.
Gözləyir "yağlı" vəzifə düşə bəlkə payına.
Başçı seçməz özünə el-oba başsız naşını,
Bərəkallah, belə xalqa, uca tutmuş başını.

Birliyi parçalayıb qollara bölmək nə gərək,
Düz, geniş doğru yolu, yollara bölmək nə gərək.
Xalqı həm sağlara, həm sollara bölmək nə gərək.
Artıq hər kəs tanıyır dostunu, öz sirdaşını,
Bərəkallah, belə xalqa, uca tutmuş başını.

## USTAD!

**(*M.Ə.Sabirin heykəlinin önündə*)**

Ustad, nə yazım ki, oxuyan xəyala dalsın...
Millət çəkən ağrı-acının qeydinə qalsın.
Ömrə yük olan kəm-kəsiri sahmana salsın.
Çarəm kəsilib ki, bu sualı sənə verdim,
Əfv et məni, sandım azalar bəlkə də dərdim.

Ustad, axı millət çox ağır gündədi indi
Ah-vay eyləyən çoxdu, nə yüzdü, nə də mindi.
Toplandığı yer qul bazarı olduğu tindi.
Açdım sənə bu sirri, inan, yoxsa ölərdim,
Əfv et məni, sandım azalar bəlkə də dərdim.

Ustad, ötüşən illər ümidlə dolu idi,
Guya gələcək xoş güzəranın yolu idi.
Şəksiz ki, azadlıq yolunun bir qolu idi.
Agah edirəm, məndə əzaba sinə gərdim,
Əfv et məni, sandım azalar bəlkə də dərdim.

Ustad, qınamaq, məncə, əbəsdir bu zamanı,
Çünki, ayıran yoxdu hələ yaxşı-yamanı,
Dollardı bu gün çoxlarının andı-amanı,
Meydan mənim olsaydı, bilərdim nə edərdim.
Əfv et məni, sandım azalar bəlkə də dərdim.

Ustad, zamanın hökmü qərarı belə qalmaz,
Getsə belə haqqın səsi də ərşə ucalmaz.
Allah da bezər bəndəsinə kölgə də salmaz.
Vallah, o zaman baş götürüb mən də gedərdim
Əfv et məni, sandım azalar bəlkə də dərdim.

Ustad, zamanın hər üzünü gördün özün də,
Dünyanın ağır dərdi yatır sanki gözündə.
Hikmət dolu aləmdi sənin adi sözün də.
Dansaydı zəmanə səni, mən nalə çəkərdim.
Əfv et məni, sandım azalar bəlkə də dərdim.

*2000*

## NƏDİR QƏM?

Şair babasan, şerini yaz, ver çapa getsin,
Qulp qoyma nahaq, qoy hərə öz çaxçuxun etsin.
Bəlkə belə yolla çalışıb kamına yetsin
Bəndə nəyə möhtacdır bilir büsbütün aləm,
Əfsus ki, kef əhli hələ bilmir ki, nədir qəm.

Çox yerdə ədalət büzüşüb mürgü vurursa.
Yaltaq baş əyib, kəlləsi üstündə durursa.
Hərdən də ki, lap əl tutana qurğu qurursa.
Orda tapılarmı sənə bir həmfikir, həmdəm?
Əfsus ki, kef əhli hələ bilmir ki, nədir qəm.

İndi başını girləməyə yer gəzir hər kəs,
İşsizliyə bir çarə tapan olmayacaq bəs?
Qışqırsan əgər, əks-sədası verəcək səs.
Yaxud da sənə hay verən ancaq dəli, sərsəm
Əfsus ki, kef əhli hələ bilmir ki, nədir qəm.

Hərçənd sözümün məğzi nədir yaxşı qanırsan,
Hərdən də bezib, bəlkə də lap haqqı danırsan...
Yəqin ki, özün öz halına gizli yanırsan.
Çünki ürəyində nə qədər dərd-sər olub cəm,
Əfsus ki, kef əhli hələ bilmir ki, nədir qəm.

Biçarələrin donluğu vallah, yaman azdır,
Gendən görünür kimlərin indi kefi sazdır.
Onlar nəyi vəd eyləsə bil, köhnə avazdır.
Olmaz quru söz çarəsiz dərdinə məlhəm,
Əfsus ki, kef əhli hələ bilmir ki, nədir qəm.

*2002*

## DARIXMA

Gözləyirdim ki, babat bir işə təyin edilim,
Get-gəlim az-maz olar, amma tamam oldu ilim. –
Qarnının sancısını ay kişi, hardan, nə bilim.
Hər kəs olsa yerimə, vallahi, cəzanə gələr, –
Elə ki, gördü, deyir: "Darıxma, vot-vot, düzələr".

İl tamam olsa da, get-gəl deyəsən çox çəkəcək,
Bəlkə də iş verəcək, sonra başından əkəcək?!
Özünün də, görünür xərci çıxıbdır bir ətək.
Çalışır yığmağa, bilmir olacaq, amma nələr...
Elə ki, gördü, deyir: "Darıxma, vot-vot, düzələr".

Vadaram "iş gəzirəm" lövhəsi boynumdan asım;
Çünki nə zəng edənim var, nə də ki əsginasım.
Bəlkə əlborcu alım, ovcuna ehmallı basım?
Olsa agah, mənə yəqin ki, tanış, dost da gülər,
Elə ki, gördü, deyir: "Darıxma, vot-vot, düzələr".

Şəkk edirlər sözümə, saqqalım ağ olsa belə,
Beləsin görməmişəm, a tövbə, ömrümdə hələ!
Belə nəfsin qulu heç yerdə yəqin düşməz ələ.
Böhtan atsam, başıma göydəki Allah daş ələr, –
Elə ki, gördü, deyir: "Darıxma, vot-vot, düzələr".

Görürəm şanlı müdir gündə girir əlli dona;
Eşidənlər nə deyər, ayıbdı, yalvarsam ona?
Verərəm nəzir-niyaz, bu get-gəlim çatsa ona:
Pulgirin sərt baxışı sərt daşı da bəlkə dələr,
Elə ki, gördü, deyir: "Darıxma, vot-vot, düzələr".

Arxayındır görünür arxasının ad-sanına,
"Ağ" yalan mikrobu da sirayət etmiş qanına.
"Payını" vermək üçün son dəfə girdim yanına. –
Getmərəm bir də ora, minnətə hətta gələlər,
Daha görmür ki, deyə: "Darıxma, vot-vot, düzələr".

*2004*

## DÜNYA

Zamanın nehrəsini çalxalayan keyfə baxır,
Yağı da, ayranı da dollar olub seyfə axır.
Elə ört-basdır olub ki, üzə çıxmır bu paxır.
Toplanır cümlə yatır bir neçə əldə bu sayaq,
Fani dünyanın işi lap baş-ayaqmış, baş-ayaq!

Belə imkan görünür düşməyəcək bir də ələ,
Əsginasla hələ ki, həll olur hər cür məsələ.
Bacarırsansa, buyur, bildiyini sən də elə.
Əldə sərmayə olanda tapılır arxa-dayaq,
Fani dünyanın işi lap baş-ayaqmış, baş-ayaq!

Səbr elə, adə, görürsən ki, zəmanə düzəlir,
Düzələr kəm-kəsərin, olsa bir az müftə gəlir.
Gözlə də, çarə nədir, başqa əlindən nə gəlir...
Şəkk edirsən, elə də, dinmə barı, eyləmə lağ,
Fani dünyanın işi lap baş-ayaqmış, baş-ayaq!

Dünyanın faniliyin anlamayan ağlı dayaz,
Bilməsək də gəliri çoxdu və yaxud da ki az,
Dolanır bəy kimi lap kef-damağı daima saz.
Beləsi sorğu-sualdan çıxır hər vaxt üzüağ,
Fani dünyanın işi lap baş-ayaqmış, baş-ayaq!

Yerlibazlıq hələ də dəbdə olan ənənədi,
Danmağın bəs görəsən sərfəsi, mənası nədi...
Elə onsuz da zəmanə özü bir məngənədi. –
Ağzıgöyçək danışırdı nəsə bu haqda bayaq,
Fani dünyanın işi lap baş-ayaqmış, baş-ayaq!

Allahım, haqq boğulursa günahı səndə deyil,
Nə də ki bais olan ac-yalavac bəndə deyil.
Əhli-keflərdi inan, özləri də gendə deyil.
Oturub seyr eləyirlər bu halı, kefləri çağ,
Fani dünyanın işi lap baş-ayaqmış, baş-ayaq!

*2001*

## GÜZGÜDƏ BİR BAX ÖZÜNƏ

Daşbaşın gəlhagəli yaman qudurtmuşdu səni,
Şeytana papış tikib, aldada bilsən də Cini.
Çıxmaram hövsələdən lap atmacan tutsa məni. –
Guya kefsiz dəyirəm, nədənsə, hərdən gözünə, –
Ay yazıq, nə gündəsən güzgüdə bir bax özünə?!

Düşdün yorğan-döşəyə zorla durubsan ayağa,
Gümanın varmı tapıb, söykənəsən bir dayağa?
Qurşanıbsan təzədən ley-peyə, pivə, arağa. –
Keyləşib əl-ayağın, heç biri baxmır sözünə,
Ay yazıq, nə gündəsən güzgüdə bir bax özünə?!

Sallanıb mısmırığın, sağ, solununsa kefi saz,
Zənn edirsən ki, sənə boş-boşuna dəydi qapaz?!
Qorxasan ki, deyələr: mürəxxəs ol, ərizə yaz.
Vaxt olub ki, badalaq gəlmisən hərçənd yüzünə,
Ay yazıq, nə gündəsən güzgüdə bir bax özünə?!

Gözləmirdin belə tezliklə düşərsən bu hala,
Çalışan var, yerinə lövbərini zorla sala.
Yola bəh-bəhlə salıb, dalıncada zurna çala.
Yatma, dümsükləyirəm bil ki, düşən var izinə,
Ay yazıq, nə gündəsən güzgüdə bir bax özünə?!

Dolların çoxdandı ki, yaxşı bələdsən "dadına",
Qurdala yaddaşını, nələr olub sil yadına.
Nəfsini cilovla ha.., yoxsa gedərsən badına.
Ah çəkib döyməyəsən gah başına, gah dizinə,
Ay yazıq, nə gündəsən güzgüdə bir bax özünə?!

Hələlik şükr elə ki, dost başına kölgə salıb,
Səndən ötrü, çox güman minnət edib, zəng də çalıb.
Gördüyün jurnaldı bu kino hələ dalda qalıb.
Çarə axtar, nə qədər qalmamısan "çorni" günə,
Ay yazıq, nə gündəsən güzgüdə bir bax özünə?!

*2004*

## BAŞ GÖTÜRÜB

Getdi o kef əyyamı, bir daha dönməz geri,
Yaxşı nəzər sal mənə, bir sümüyəm, bir dəri.
Kaş ola xudmani bir ayrıca söhbət yeri.
Ərz eləsəm dərdimi, dinləsən hərgah qağa,
Baş götürüb, bəlkə də üz çevirərsən dağa.

Döndü zaman tərsinə, yaxşı gedir, pis qalır,
Müftə gəlir harda var, orda da lövbər salır.
Sərfəli yerlər tapır, dollarla hopdum alır.
Bilsən əgər, yoxsulu işdə qoyan var lağa,
Baş götürüb, bəlkə də üz çevirərsən dağa.

Cah-calalı, sərvəti şotkada gəlməz saya,
Millətinin xətrinə heç nəyə qoymaz maya.
İstəsə, ancaq uçar, bəlkə də pulnan aya,
Görsən əgər, külfətin evdə tutub bal, yağa,
Baş götürüb, bəlkə də üz çevirərsən dağa.

İndiki "Sim-Simlilər" dəyməyib heç vaxt gözə,
Bəs nə sayaq oldu ki, indi çıxıblar üzə?
Kasıb görür ah çəkir, səbri də yoxdur dözə.
Eşitsən ki, övrəti evdə doğubdur çağa,
Baş götürüb, bəlkə də üz çevirərsən dağa.

Ədalətin hökmünə, bəlkə zaman zor gəlib?
Olmaya dərd əlindən gözlərinə tor gəlib?
Yoxsa əzəldən elə bu dünyaya kor gəlib?!
Haqq özü yox, kölgəsi işdi olarsa ağa,
Baş götürüb, bəlkə də üz çevirərsən dağa.

*2000*

## BELƏSİ DƏ VAR

Nadir hallarda görürsən ki, kefim kökdü mənim,
İşdə bir ağlı dayaz zəhləmi lap tökdü mənim.
Zorla qırsaqqız olub xirtdəyimə çökdü mənim.
Ədabaz şəstlə dedi: sandığı açıb-tökəcəm,
Əlimə keçsə möhür, hər şeyə əncam çəkəcəm.

Yatmısız fil qulağında, niyə görmür gözünüz,
Belə rüsvayçılığa yoxdu məgər bir sözünüz?
Çox güman Bəydadaşa ortaq olubsuz özünüz.
Eybi yoxdur dözürəm, başlarında turp əkəcəm,
Əlimə keçsə möhür, hər şeyə əncam çəkəcəm.

Sanki, antenadı kefqom rəisin şəkk qulağı,
Kəsilib atmacası, bəlkə də sancıb dalağı.
Çıxarıb atmalıyıq xeyli kök atmış alağı.
Elə ki, gəldi məqam qəddini hökmən bükəcəm,
Əlimə keçsə möhür, hər şeyə əncam çəkəcəm.

Çəkinirsiz, səbəbin, bəlkə, açıqca deyəsiz?
Xətrinə Bəydadaşın nəbadə ha... siz dəyəsiz!
Axı öyrəncəlisiz qul sayağı baş əyəsiz.
Toy tutar çünki, susursuz, susanın öz qəmi-kəm,
Əlimə keçsə möhür, hər şeyə əncam çəkəcəm.

Dözmədim hap-gopuna, axırı kəsdim sözünü,
Dedim: heç lovğalanıb, indidən öymə özünü.
Çağıranda büzüşüb, sən ki, döyürsən gözünü.
Görürəm sübh səhər badə edibdir səni dəm,
Bəsdi, sus, goplama ki, "hər şeyə əncam çəkəcəm".

Mindirib cin atına badə səni ay başıboş,
Keflisən, boş-boşuna sən nə atıl-düş, nə də coş.
Deyəsən döndü üzün, gəlmədi yəqin sənə xoş.
Görməmişdim hələ dünyada ağıldan belə kəm,
Bəsdi, sus, goplama ki, "hər şeyə əncam çəkəcəm".

*2002*

## YAZIRAM...

(*böhtançının dilindən*)

Məndə məşhuri-cahan olmağa artdıqca həvəs,
Ağız açdım qohuma, dosta, fəqət çıxmadı səs.
Çox düşündüm, bu işin indi əlacı nədi bəs?
Tapdım axır ki, gedib çorta, xəyala dalıram,
Böhtanın xəstəsiyəm, çünki yazıb həzz alıram.

Düzü, böhtan sözü lap qəlbimə yağtək yayılır,
Partlayır bomba kimi cümlə yatanlar ayılır.
Şərləmək, məncə, elə tutarlı "tənqid" sayılır.
Niyə təşvişə düşür bir parası, mat qalıram,
Böhtanın xəstəsiyəm, çünki yazıb həzz alıram.

Sayıram şərləməyi fəlsəfi fikrin özəyi,
Verəcək əks-səda olmasa da bərbəzəyi.
Yapıram, amma yapışmır nəsə "zadlar" təzəyi.
Eybi yoxdur, "zato" mən tazə cığır-yol salıram,
Böhtanın xəstəsiyəm, çünki yazıb həzz alıram.

Dahiyə şər atıram ki, deməsinlər naşıdı.
Ola bilməz belə cürətli bu əsrin yaşıdı.
Hər yazım böhtanıma xəyali bir baş daşıdı,
Bu daşa səcdə qılıb, baş əyirəm, alçalıram,
Böhtanın xəstəsiyəm çünki, yazıb həzz alıram.

Toyda böhtançı çağırdı adımı bir tamada,
Deməli, var tanıyanlar məni də el-obada.
Zorla vallah, şər atıb, nail olmuşam bu ada.
Elə ki, bitdi "yazım", dost-tanışa zəng çalıram,
Böhtanın xəstəsiyəm, çünki yazıb həzz alıram.

*2002*

## BƏSDİ SON QOYMALIYIQ...

Dərbədər oldu bu millət gələ bilmir özünə,
Sən demə, ATƏT – əmoğlum kül atırmış gözünə.
Quru vədlər verənin heç kəs inanmır sözünə.
Rəhbərin də görünür ki, tükənib səbri daha,
Bəsdi, son qoymalıyıq ölkədə fəryada, aha!

Neçə illərdi Vətən torpağı tapdaqda qalıb,
Dığalar lövbərini səfalı yerlərdə salıb.
Dayısından da açıq, xəlvəti top, tank da alıb.
Dağda-daşda hələ ki, səngəridir gizli kaha,
Bəsdi, son qoymalıyıq ölkədə fəryada, aha!

Dığa saymır daha bu qədər hökmü olan ölkələri,
Üstünə kölgə salır çünki, Şimal bölgələri.
Dığaya "arxa" olub xaçlıların kölgələri.
Tərpənək çünki, ümid azdı bu gündən sabaha,
Bəsdi, son qoymalıyıq ölkədə fəryada, aha!

Yaşayır millət ümidlə neçə illərdi belə,
Get-gəlin çoxdu sayı, amma düzəlmir məsələ.
Çox güman daşnak alıb ATƏT-i xəlvətcə ələ.
Alarıq torpağı, yəqin ki, sarılsaq silaha,
Bəsdi, son qoymalıyıq ölkədə fəryada, aha!

ATƏT-in xeyli qərarı hələ arxivdə durur,
Gəl ki, icrasını neyçünsə, nədənsə unudur.
Bu cəzasızlığı görcək yağılar lap qudurur.
Başa düşmür ki, qara günləri var, daldadı ha...
Bəsdi, son qoymalıyıq ölkədə fəryada, aha!

Sülhə gəldikdə, kimin cəmdəyi səddir, bilirik,
Hərbə əl atmağımız, amma son həddir, bilirik.
Rəhbərin qüdrətinə dünya bələddir, bilirik.
Çatacaq məqsədinə rəhbərimiz – Şanlı Düha,
Bəsdi, son qoymalıyıq ölkədə fəryada, aha!

*2001*

## GÖRÜRƏM...

Qulp qoyursan görürəm hər nə deyirsə gözünə,
Sən cilovla dilini, yoxsa ki, baxmır sözünə?
Yerli-yersiz danışıb əngəl açırsan özünə.
Çox da döymə döşünə, arxayın olma dayına,
Ağrımaz bil ki, başın qalsan əgər öz hayına.

Sənə nə, yerlisini kimsə çəkibdir irəli,
Başlanıb əl tutanın, lap tutalım gəlhagəli.
Çox güman ya qədəmi, ya da ki yüngüldü əli.
Olmayıb heç elə bir iş ki, gözündən yayına,
Ağrımaz bil ki, başın qalsan əgər öz hayına.

Gözünü yum a kişi, kim nə edirsə, sənə nə?
Nə sayaq pul qazanır, Həccə gedirsə, sənə nə?
Kim kimə üzdə gülüb, dalda güdürsə, sənə nə?
Bu sözü sırğa elə, as qulağın bir tayına,
Ağrımaz bil ki, başın qalsan əgər öz hayına.

Nə işin var a kişi, kim nə alır, kim nə satır,
Kim kimin bostanına qərəzlə hərdən daş atır.
Ya da kim simsarının kölgəsi altında yatır.
Sənə nə, ortaq olub kim kimin aylıq payına?
Ağrımaz bil ki, başın qalsan əgər öz hayına.

Etmə tez aləmə hər gördüyünü car, a kişi!
İş qəhətdir başına, başqa iş axtar a kişi!
Sən unutma ki, yerin də qulağı var, a kişi!
Qovsalar, baxmayacaq kimsə sənin ah-vayına,
Ağrımaz bil ki, başın qalsan əgər öz hayına.

*2002*

## YAĞLI YERİMDƏN NECƏ...

(*Vəzifəpərəstin dilindən*)

Söykəmişəm arxamı,
vəzifə bir dağdı, dağ!
Şükr edirəm, üstümə
kölgə salan sağdı, sağ!
Ev-eşiyim dopdolu,
kefim də ki, cağbacağ!
Qurğu quran bədxahı
gərək başımdan əkim.
Yağlı yerimdən necə
öz xoşumla əl çəkim?!

Vəzifəyə keçəndən
düşməmişəm heç dara,
Dadıma hər an çatıb
möhür, açar, pul-para.
Başda olubdur yerim
düşsə güzarım hara,
Büllur olub süfrədə
istəkanım, nəlbəkim,
Yağlı yerimdən necə
öz xoşumla əl çəkim?!

Dost-tanışa bəllidi
bu yerdə can qoymuşam.
Xeyrim olan işdə lap
daş-divarı oymuşam,
Bəsdi mənə yığdığım,
toxdu gözüm, doymuşam.
Qamçılayan kölgəmi
mən bilirəm kimdi, kim!
Yağlı yerimdən necə
öz xoşuma əl çəkim?!

Dözmüşəm hərçənd başım
dəysə də daşdan-daşa,
Başımdakı ağrını
bədxahım düşməz başa.
Yolda qalıb gözləri
tamarzıdır daşbaşa,
“Xəstəliyi” güclənir,
çarə də tapmır həkim.
Yağlı yerimdən necə
öz xoşumla əl çəkim?!

Tənqid olunsam da mən
almıram heç eynimə,
Çünki hədə-qorxular
təsir edər beynimə.
Hər nə varımdır təzə
gündə geyib əynimə,
İstəyirəm bədxahın
sinəsinə dağ çəkim.
Yağlı yerimdən necə
öz xoşuma əl çəkim?!

Gör necə birdən-birə
dəyişdi dövran, qağa,
Keçmiş ola, bir zaman
sanki ağaydım, ağa!
Üzüldü işdən əlim
indi qoyurlar lağa.
Olmamışdı heç zaman
köks ötürüm, ah çəkim.
Ağlıma gəlməzdi ki,
“süd gölündən” əl çəkim?!

*2002*

## BU NƏ DÜNYADI, AY ALLAH!

Dost-dosta baxıb fəxr eyləyib köhnə zamanda,
Aləm dəyişib, eyniləşib yaxşı, yaman da.
Dost qalsa əlimyandıda, yaxud əlamanda.
Dostu çevirir üz, bu nə dünyadı, ay Allah?!
Dünya bir həqiqətdi, ya xülyadı, ay Allah?!

İllərlə çörək kəsdiyin indi salam almır,
Gündə demirəm, heç arabir də yada salmır
Bəs yaxşılığın yadda məgər heç izi qalmır?
Dəhşətdi bu şəksiz, bu nə dünyadı, ay Allah?!
Dünya bir həqiqətdi, ya xülyadı, ay Allah?!

Mat qalmalıdır üzdəniraq birpara dosta,
Məclisdə deyərdi neçə dost şəninə tost da.
Aldı keçən il əmrini məsul, təzə posta.
Artıq gözə dəymir, bu nə dünyadı, ay Allah?!
Dünya bir həqiqətdi, ya xülyadı, ay Allah?!

Dostluqda təmənnasız olub hər görülən iş,
Kaş ki, belə bir adətə hər kəs edə vərdiş.
Vardır eləsi zahirən ancaq mələk imiş.
Əslində ilanmış, bu nə dünyadı, ay Allah?!
Dünya bir həqiqətdi, ya xülyadı, ay Allah?!

Köhnə tanışı, dostu axı anmalıyıq biz
Dostluq yox olursa, alışıb-yanmalıyıq biz.
Dost dosta xilaf çıxdığını danmalıyıq biz
Əfv et məni ey dost, bu nə dünyadı, ay Allah?!
Dünya bir həqiqətdi, ya xülyadı, ay Allah?!

Dost dostdan alır verdiyi borcun sələmin də,
İlham dedi: yaz, dərddi bu, sınsa qələmin də.
Öz nəşəsi var hardasa dərdin, ələmin də
Yazdım ki, bilinsin bu nə dünyadı, ay Allah?!
Dünya bir həqiqətdi, ya xülyadı, ay Allah?!

*1999*

## YALTAQ ÖYRƏNCƏLİDİR...

Yaltağın var neçə cür sortu, bilən yoxdu hələ,
Eləsi var ki, çıraqla gəzərsən düşməz ələ.
Çox çətin ki, beləsi bir də bu dünyaya gələ.
Nə desən, zatıqırıq kəlləsi üstündə durar,
Yaltaq öyrəncəlidir, düşsə məqam, zərbə vurar.

Yaltağın adətidir tərif edər öz şefini,
Fırlanar dövrəsinə zorla durultsun kefini.
Elə zənn eyləmə ki, keydi, güdər öz nəfini.
Öyrənib, kəc baxana torba tikər, qurğu qurar,
Yaltaq öyrəncəlidir, düşsə məqam, zərbə vurar.

Şeytana papış tikən yaltağın heç yoxdu tayı,
Görsə ki, büdrəmisən, hətta danar haqqı-sayı.
Axtarar tez özünə vəzifəli tazə "dayı".
Tapsa da sərfəli yer, zənn eyləmə dinc oturar,
Yaltaq öyrəncəlidir, düşsə məqam, zərbə vurar.

Görsə bir rütbəlini əlüstü gendən baş əyər,
Baş əyəndə çənəsi sinəsinə, hətta dəyər.
Nə desə, hər sözünə yüz dəfə "baş üstə" dəyər.
Baxma ki, ah-vay edər, boynunu hər yerdə burar,
Yaltaq öyrəncəlidir, düşsə məqam, zərbə vurar.

Sadəlövh var inanır yaltağın hər cür sözünə,
Çox güman ki, görünür mələk donunda gözünə.
Gəl ki, bilmir qənimin o, özü tapmış özünə.
Düşünə kaş ki, ipin yığmasa, yaltaq qudurar,
Yaltaq öyrəncəlidir, düşsə məqam, zərbə vurar.

*2002*

## KAŞ DEMƏSİNLƏR
(*Dilənçinin dilindən*)

Zorla büküb qəddimi bu ehtiyac,
Öyrəşirəm qalmağa günlərlə ac.
Tanrı özü qətlimə versin rəvac.
İçimdədir dərdimin ahu-zarı,
Öldü acından deməsinlər barı...

Taleyimi yazan yazıbdır belə,
Bekar qalıb baxmalı oldum ələ.
Yaşamağa azca ümid var hələ.
Birtəhər, ömrü eyləsəydim yarı,
Öldü acından deməsinlər barı...

Xəyal oldu arzulara çatmağım,
Müşkül olub bir gecəlik yatmağım.
Ağır dərddi köhnə-külə satmağım.
Neyləməli, rəngim olub sapsarı
Öldü acından deməsinlər barı...

Güzəran artıq gətiribdir zara,
Yalvarıram Allaha, gəlmir kara.
Dərdim içimdən çəkir hər gün dara.
Çox qorudum namusu, bir də arı,
Öldü acından deməsinlər barı...

Vaxtsız ağardı bu bəlalı başım,
Döndü gölə ürəyimdə göz yaşım.
Taleyimi kaş danışa başdaşım.
Düşsə yolum gedər-gəlməzə sarı,
Öldü acından deməsinlər barı...

*2002*

## NANKOR

Aman Allah, çoxalıb şadlığına şıllaq atan,
Uydurub ağ yalanı, doğru libasında satan.
Kişidir indi məgər, hər papaq altında yatan?!
Çünki vardır eləsi yaxşıya qəsdən şər atır,
Tapdılar, qovladılar, rüsvay olub, xəstə yatır.

Şərçinin ömrü boyu böhtan olubdur yarağı,
Baxma ki, müftə gəlirdi kababı, tut arağı.
Şərləməkdə görəsən ayə, nə imiş marağı?
Düşünürmüş ki, yəqin şərçi belə kama çatır,
Tapdılar, qovladılar, rüsvay olub, xəstə yatır.

Bədxah atmaz ölə də cızma-qara vərdişini,
Zənn edirmiş ki, yıxar, yazdığı böhtan, kişini.
Əksinə, çıxdı boşa, korladı lap öz işini.
Atdılar qəm gölünə, əl uzadan yoxdu, batır, –
Tapdılar, qovladılar, rüsvay olub, xəstə yatır.

Batabatda karına gəlmədi sanballı dayı,
Neçəsi getdi bada, hətta özündən savayı;
Hərənin, çünki bu işdə olub uydurma "payı".
Dolaşıb indi kələf, bir-birini gizli satır, –
Tapdılar, qovladılar, rüsvay olub, xəstə yatır.

Dolanırdı hər üçü kef-damağı daima saz,
Qurşanıb bəd əmələ lovğa, naşı, ağlı dayaz.
Demə çoxdan varımış gizli, qərəzli yaza-yaz.
Belə kəslər həmişə aləmi hər yerdə qatır, –
Tapdılar, qovladılar, rüsvay olub, xəstə yatır.

*2001*

## DƏYİŞİB İNDİ ZAMAN...

Yığılardı başıma müftə yeyən lüt gədələr,
Şənimə tostu muğam üstə deyən lüt gədələr;
Harda rast gəlsə, uzaqdan baş əyən lüt gədələr, –
Pullanıblar görünür, onlara mən tən deyiləm;
Dəyişib indi zaman, bəlkə o mən, mən deyiləm?

Vardı hərdən keçəni gah sağıma, gah soluma,
Yolda görsəydi əgər, şəstlə girərdi qoluma;
Gecə olsaydı, yəqin lampa tutardı yoluma, –
Az qalırdım ki, deyəm, ayə, dədən mən deyiləm!
Dəyişib indi zaman, bəlkə o mən, mən deyiləm?

Birisi “bəy” sözünü bərk calamışdı adıma,
Yalvarardı: “Çatasan bəlkə a bəy, imdadıma”.
Müşkül işdir, dediyim, a tövbə gəlmir yadıma. –
Elə bil özgələrə minnət edən mən deyiləm!
Dəyişib indi zaman, bəlkə o mən, mən deyiləm?

Tanıdım çoxlarını işsiz olanda, arada,
Yan keçirdi gədələr, rastıma çıxsa harada;
Hətta vermişdim o vaxt bəzisinə pul-para da.
Sanki dar gündə belə dada yetən mən deyiləm!
Dəyişib indi zaman, bəlkə o mən, mən deyiləm?

Çox təəssüf, belə kəslər itirir haqqı-sayı,
Belə baş girləyənin var neçə yerlərdə tayı.
Qoymayın əsla yaxın, ərşə çıxa ahu-vayı.
Söylədim, neyləməli, amma deyən mən deyiləm,
Dəyişib indi zaman, bəlkə o mən, mən deyiləm?

*2002*

## VALLAH, BELƏ OLMAZ!

Hay-küylü qəzet var ki, yolundan azır hərdən,
Əndazəyə heç sığmayan hədyan yazır hərdən.
Bədbəxtdi, özüyçün beləcə gor qazır hərdən. –
Yazdıqları qondarmadı, yaxud da ki, lağ-lağ,
Uydurma yazır, milləti çaşbaş salır ancaq.

Adətkər olubdur, can atır ki, qara yaxsın,
Gendə dayanıb, səs-küyə, həngaməyə baxsın,
Bəlkə belə yolla cibinə pul-para axsın. –
Hər halda gəlir var ki, alır mülk, maşın, bağ,
Uydurma yazır, milləti çaşbaş salır ancaq.

Bəzən də yazır ki, tutalım, var elə bir qaz,
Bülbül qəfəsində oxuyur kef-damağı saz.
Vallah, belə bir hap-gopa sərsəm də inanmaz.
Çox vaxt cüzi nöqsanı şişirdib eyləyir dağ,
Uydurma yazır, milləti çaşbaş salır ancaq.

Meydan sulayır, bərk yapışıb köhnə dayaqdan,
Bədxahlar üçün sanki gedir əldən-ayaqdan.
Məqsəd nədi, var-gəl edirəm mən də bayaqdan.
Hardandı qəzetdə belə cürət ki, edir ağ?
Uydurma yazır, milləti çaşbaş salır ancaq.

Guya ki, bilən yoxdu, görürsən ki, çəkir car, –
Agah olun ha... keçmişə qaytarmağa cəhd var!
Hərdən də ki, sancır hədəfi lap açıq-aşkar.
Bətnindəki neştər – ya qıyıqdır, ya da sancaq,
Uydurma yazır, milləti çaşbaş salır ancaq.

Susduqca qələm əhli, bu hay-küy özü yatmaz,
Çünki, nə güman var, yalana bir də əl atmaz.
Düşsə dara, şəksiz, əli heç bir yerə çatmaz.
Bədxah əmələ kimsə qazandırmayacaq haqq, –
Uydurma yazır, milləti çaşbaş salır ancaq.

*2002*

## RESTORANDA

Bəstəkar, şair olub cızma-qara xəstələri, –
Guya var xoruz səsi eşitməmiş bəstələri.
Axışıb restorana müğənni, rəqs dəstələri.
Bəzisi "atlıdısa", bəzisi lap "pay-piyada",
"Şou" konsert verilir, tazə "filarmoniyada".

Yarıçılpaqdı "göbək" rəqsinin ifaçıları,
A kişi, rəqs eyləsin milli geyimlərdə barı...
Beləmi qoruyur isməti, namusu, arı?!
Belə getsə, görünür düşməyəcək heç nə yada,
"Şou" konsert verilir, tazə "filarmoniyada".

Restoranlar çoxalıb "əsir" olan yer adına,
Millətin taleyini çoxları salmır yadına.
Görəsən kim çatacaq bəs kasıbın imdadına?!
Ah-vayı ərşə çıxıb, versə də lap əks-səda,
"Şou" konsert verilir, tazə "filarmoniyada".

Qorxasan opera da, sirk də köçə restorana, –
Belə bir "möcüzədən" səs düşə cümlə-cahana.
Bəlkə dollar hərisi sənətçilər bir utana.
Əhli-keflər belə yerlərdə alır ruhi qida,
"Şou" konsert verilir, tazə "filarmoniyada".

İstəsən, musiqidən "həzz" alasan, vaxt da keçə,
A kişi, sal yolunu restorana bircə gecə.
Görəcəksən orada vurhavur, hay-küydü necə.
Durular xeyli kefin də, gələr ağzın dada da,
"Şou" konsert verilir, tazə "filarmoniyada".

*2002*

## DÖVRAN BELƏDİR

Ah-vay eləmə, Kəbleyi dövran belə qalmaz,
Cib boşdusa, dünya dağıla, dərdin azalmaz
Yoxsul olanın halını heç kəs xəbər almaz.
Çarə gəzirəm, bəlkə çıxım bir yana mən də,
Dövran belədir, bəyənsən də, bəyənməsən də.

Hərrac bazarında gecə-gündüz çəkilir car,
Qiymətli zavod, fabriki də hətta alan var.
Gördükdə bu halı kasıba dünya olur dar.
Allah da eşitmir səsini nalə çəkəndə,
Dövran belədir, bəyənsən də, bəyənməsən də.

Zənn etmə çıxıb "ağ günə" kəndçi pay alandan,
Hap-gop eyləyir, hər şeyi var, amma yalandan.
Xeyri bu olur ki, canı qurtardı plandan
Yer yoxdu otarsın malını çöldə, çəməndə.
Dövran belədir, bəyənsən də, bəyənməsən də.

Çoxdur gecə-gündüz çalışan, amma nə fayda?!
Cüzi maaşın da ala bilmirsə hər ayda.
Evdə boğulur, tər axıdır bürkülü yayda.
Sərmayəsi var ki, gedə dincəlməyə kəndə?
Dövran belədir, bəyənsən də, bəyənməsən də.

Yollar qırağında oturan görməmisən heç?
Fəhlə gərəyindirsə, yubanma, ora get seç.
Tanrı! Bu sözümçün günahımdan sən özün keç
Müftə hələ əl tutmamısan bir kəsə sən də
Dövran belədir, bəyənsən də, bəyənməsən də.

İnsan üyüdür gündə dəyirmanı zamanın,
Yoxdursa bu gündən sabaha ömrə gümanın.
Mənası nədir, hay-harayın, andın, amanın.
Kaş, Kəbleyi, bundan betərin görməyə bəndə,
Dövran belədir, bəyənsən də, bəyənməsən də.

*1998*

## ADİL ALLAH...

Yalvarırdım ki, sənə bəxtimi dümsüklə, oyat,
Saatın əqrəbinə kəməndi ehmallıca at.
Zamanın gərdişini saxla, mənim dadıma çat.
Varlanım mən də bir az, doğulmuşam bəxtiqara,
Dar günümdə gələcək pul-para hər yerdə kara.

Doğdu gün taleyimə, düşdü gözəl fürsət ələ,
Lümlüt üryandım axı "tüklənirəm" indi hələ.
Çox güman cibişdanım dolmayacaq bir də belə.
Bilmək olmaz, ilişib, hardasa düşsəm də dara,
Dar günümdə gələcək pul-para hər yerdə kara.

Göydə sən, yerdə də dayday, dayağımsız, nə danım,
Başıma saldığınız kölgəyə qurbandı canım;
Varsa hərgah yalanım, axirətdə odda yanım.
Salsalar işdi gözümçıxdıya, gəlsəm də zara,
Dar günümdə gələcək pul-para hər yerdə kara.

Arxamı söykədiyim çalması ağ "dağdı" mənim,
Sayənizdə bu yerim dəryadı, çim yağdı mənim;
Pul ki var, minnətə də getsəm üzüm ağdı mənim.
Zamanın dönsə üzü, baş götürüb getsəm hara,
Dar günümdə gələcək pul-para hər yerdə kara.

Hələ ki, kimsəsizə əl tutanın azdı sayı,
Kar qulaqlar eşidirmi görəsən ahu-vayı?!
Adil Allahdı verən bəndələrə ruzi-payı.
Ruzigar yıxsa məni, qəlbimə də vursa yara,
Dar günümdə gələcək pul-para hər yerdə kara.

Allahım, büdrəməyə qoyma mənim daydayımı,
Adamın Allahı var, itirmir haqqı-sayımı.
Ortada hər nə olur, versə də aylıq payımı.
Pul böləndə üzünü, amma tutur daş-divara,
Dar günümdə gələcək pul-para hər yerdə kara.

*2002*

# ÇAĞIRSAN

Dost sayırdın özünə ömrü boyu adə, məni,
Bənzədirdin hələ bir hardasa Fərhada məni.

Fəxr edirdim ki, ucaldın, ürəyim döndü dağa,
Etibarın bu imiş, salmadın heç yadə məni.

Əhdi-peymanımızın "xeyri" bu oldu mənə ki,
Qoyur hərdən də lağa dostun haramzadə məni.

Tanıyırdınsa əgər, hansı yuvanın quşudur,
Niyə ürcah elədin xanəsi bərbadə məni?

Şəninə tost dedilər, nuş elədim cüzi şərab,
Zəhər içdim elə bil, məst elədi badə məni.

Müjdə verdim özümə, dost da dönük çıxdı belə,
Daha kim yad edəcək fani bu dünyadə məni.

İşdi düşsən çətinə, mən sözümün sahibiyəm,
Yenə gəlləm karına, çağırsan imdadə məni.

*2001*

## YAZ!

Yaz ki, lüt arxalılar kefdədi indi, görürəm,
Hərə bir yerdə özüyçün xozeyindi, görürəm.
Yerləri qışdı "hamam", yayda sərindi, görürəm.
Mən də gendən baxıram, doğrusu, ağzım sulanır,
Ümidim ölməsə də, şübhəsiz, ömrüm talanır.

Yaz ki, ömrün çoxunu hərraca qoydum naəlac,
Dolanırdım yarıtox, danmıram əsla, yarıac.
İndi aylıq maaşı verməliyəm rəsmi "xərac".
Qayğılar bir-birinə zəncirə bənzər calanır,
Ümidim ölməsə də, şübhəsiz, ömrüm talanır.

Yaz ki, qüdrətli dəyirmandı bu dünyada zaman,
Fırlanır daşları çox qorxulu sürətlə, yaman.
Üyüdür hər nə gəlir, haqqı da hətta, ay aman!
Haqq-ədalət yox olan yerdə rəzil daldalanır,
Ümidim ölməsə də, şübhəsiz, ömrüm talanır.

Yaz ki, mülküm, maşınım olmasa da xoşdu günüm,
İmkanım yoxdu deyə, sadə keçir toy-düyünüm.
Düşkünü olmamışam, sərvətim olsun, öyünüm.
İndi də boşdu cibim, orda siçan qurdalanır,
Ümidim ölməsə də, şübhəsiz, ömrüm talanır.

Yaz ki, dünya düzəlib, başqa təmtəraq görürəm,
Küçədə, zirzəmidə indi çilçıraq görürəm.
Süfrəsində kasıbın ilboyu "bal", "yağ" görürəm.
Ac qalan yoxdu daha hamı birtəhər dolanır,
Ümidim ölməsə də, şübhəsiz, ömrüm talanır.

Yazmısan, yazdığını təkcə özünçün sən oxu,
Çünki, bu ərzi-hali anlamadı bəlkə çoxu.
Ola bilsin narahat etmədi heç qarnıtoxu.
Yaz ki, dövran özü də nehrə kimi çalxalanır,
Ümidim ölməsə də, şübhəsiz, ömrüm talanır.

*2001*

## BELƏ QONŞULAR DA VAR

Üzümüzə üz bağlayıb,
Mən utana-utana
Ağız açdım qonşuda
Bir göyərti satana.
Elə bildim adamdı,
Dərdimi ona dedim.
Sələmiylə, əlborcu
Bir qədər pul istədim.
Bildi hara gedirəm,
Ah çəkdi çox dərindən
Daşdan pul çıxarmışam, –
Dedi: – O yerlərdə mən.
Evdən didərgin düşüb,
Aylarla nar satmışam.
Cibişdanın xətrinə
Bazarda da yatmışam.
Get dincəl, bu dünyada
Ancaq gəzmək qalacaq.
Mümkün olsa, a qonşu,
Bir xahişim olacaq;
Buyur, dedim, baş üstə!
Nə istəsən alaram,
Əlüstü ünvanına
Ordan yola salaram.
Defisit nə vardısa
Bir-bir yazdı adını,
Üstəlik harayladı
Evdən də arvadını.
Qıyıb gözünü, dedi:
Çətin olmaz ki, sənə?
Sual yerinə kaş ki,
Qapaz vuraydı mənə.

Sicilləmə siyahı
Lap qorxutdu gözümü,
Gücüm çatdı özümə,
Qınadım öz-özümü.
Həmən günün səhəri
Mən döndüm öz sözümdən.
Pulpərəst, bu dələduz
Tamam düşdü gözümdən.
Sən demə, bu qurumsaq
Qalıb qazanc hayına.
Harda belə qonşu var,
Oturasan vayına!

## XİFFƏT ELƏMƏ...

Xudmani yerin vardı, vəzifən də ki, çim yağ,
Oldu dayağın gözlə görünməz uca bir dağ.
Çox çəkmədi ki, həddini aşdın, elədin ağ.
Əl çəkməli oldun kabinetdən və möhürdən,
Xiffət eləmə, çarə nədir, dözməlisən sən.

Saldı səni də hökm-zaman köhlən atından,
Hər tənəli söz indi keçər yeddi qatından.
Hər halda gileylənmə nahaq öz həyatından.
Çünki, ayağın üzülməyib ki, hələ yerdən,
Xiffət eləmə, çarə nədir, dözməlisən sən.

Saydıqca yaşıl əsginası ləzzət alırdın,
Vicdanın əgər, nəfsini boğsaydı, qalardın.
Yüngülcə təkanla, hələ, bəlkə, ucalardın.
Saldıqca yada gəlhagəli, köks ötürürsən,
Xiffət eləmə, çarə nədir, dözməlisən sən.

Yastıqlı kreslonda sən illərlə yayıldın,
Məclisdə də, iclasda da hörmətlə sayıldın
Sancdı dalağın röyada, diksindin, ayıldın.
Yəqin ki, düşündün: "Əcəba, neyləmişəm mən"?
Xiffət eləmə, çarə nədir, dözməlisən sən.

Tağlı qapılarda dayanıb boynunu burma,
Kef çək, yatırın var, nə olubsa üzə vurma.
Yoxdur maşının, gəz piyada, evdə oturma.
Çox yerdə şəriksən, oralarda görün hərdən,
Xiffət eləmə, çarə nədir, dözməlisən sən.

Artıq olan oldu, a kişi, torba da doldu,
Agahsan özün, bəlkə də neyçün belə oldu.
Alma vecinə, var pulun, hər şey də ki, boldu.
Əfsus ki, vəzifən belə tez çıxdı əlindən,
Xiffət eləmə, çarə nədir, dözməlisən sən.

*2000*

## QORXURAM...

Düşmüsən el-obadan xeyli zamandır aralı,
Sanmısan ordakılar guya olub pul-paralı.
Bilmək olmur dəyişib indi olmusan haralı;
Salmısan lövbərini orda – bazarda, hələ də,
Qorxuram dönməyəsən kəndinə bundan belə də.

Deyəsən mamlımatan "can" da tapıbsan özünə,
Geyinir şalvarını, pudra yaxır üz-gözünə.
"Yest", deyirsən ki, yəqin madmazelin hər sözünə;
Qalmayınca, a kişi, quyruğun orda tələdə, –
Qorxuram dönməyəsən kəndinə bundan belə də.

Kövrəlirsənmi anan orda düşəndə yadına?
Heç yanırmı ürəyin evdə qalan övladına?
Bəlkə səndən savayı yoxdu çatan imdadına.
Daşürəksən görünür, bağrını həsrət dələ də, –
Qorxuram dönməyəsən kəndinə bundan belə də.

Gözləri yolda qalıb həm ananın, həm bacının,
Brilyant zərrəsidir hər biri qeyrət tacının;
Qeydinə qalmısan heç qardaş, oğul möhtacının?
Doğmalar ah-vay edir, barı köməklik elə də...
Qorxuram dönməyəsən kəndinə bundan belə də.

Papağın varsa, qoyub qənşərinə, azca düşün,
Bir zaman kövrələcək qəlbin elin, yurdun üçün;
Üzünü görmədi heç, bəlkə, anan köçdüyü gün...
Qaytarammaz onu lap huri-mələklər gələ də, –
Qorxuram dönməyəsən kəndinə bundan belə də.

*2001*

## ALLAH DA BEZİB...

Pəh, pəh bu “gözəllikdə” bazar harda var, harda?!
Abı-havası eyni olur qışda, baharda
Lövbər salır orda çoxusu boranda, qarda.
Hopdum mal alır sübh-səhər dumanda, çəndə,
Şəkk etsən əgər, sal yolunu, seyr elə sən də.

Allah da bezib bəndələrin ahu-zarından, –
Ərşə ucalan gündə xəcalət bazarından.
Hərçənd sağalan olmayıb heç pul azarından.
Ordan dolanır çiyni poqonlu neçə bəndə,
Şəkk etsən əgər, sal yolunu, seyr elə sən də.

Hay-küylü bazarda matahın gündə satan var,
Bir loğma çörəkçün gecələr orda yatan var.
Daşbaşlı yerə darğalığa çox can atan var.
Vallah, hamar olmaz, kötüyə dəyməsə rəndə,
Şəkk etsən əgər, sal yolunu, seyr elə sən də.

Hərdən dağıdırlar bazarı, amma nə fayda,
Artırmaq üçün nırxı, qoyurlar “təzə” qayda.
Müftə gəlir aylıq yığılır orda hər ayda.
Hər halda şəriklər dayanır özləri gendə,
Şəkk etsən əgər, sal yolunu, seyr elə sən də.

Vağzal bazarı “ad” qazanıb sanki şəhərdə,
Millət axır hər gün ora, axşam da, səhər də.
Əfsus ki, üfunət ocağı çoxdu bu yerdə.
Çatmır səsi İcraya, çatıb, amma ki, kəndə,
Şəkk etsən əgər, sal yolunu, seyr elə sən də.

Orda həlalik çaxçux edirlər neçə gəldi,
Yəqin bazara “arxa duran” güclü bir Əldi.
Hərçənd ki, ümidlə baxırıq, bəlkə düzəldi.
Gəl ki, nəsə şübhə yaranıb ay kişi, məndə,
Şəkk etsən əgər, sal yolunu, seyr elə sən də.

*2000*

## BİZLƏRİK...

(*Özəl telekanallara baxarkən*)

Dilxor olsan gecələr yatma, özəl ekrana bax, –
Yarıçılpaq oxuyan, rəqs eləyən “ceyrana” bax.
Sonsuz hiddət doğuran musiqili hədyana bax.
Sən nəbadə bu yazıq məxluqa rişxənd edəsən,
Bizlərik, çünki günahkar ya mənəm, ya da ki sən.

Zorla dar şalvara pərçim eləyiblər bədəni,
Eybəcərlik budu, bax, bəlkə düşündürdü səni.
Qınama, amma belə “modanı” təbliğ edəni.
Düşmə təşvişə nahaq, bu “yenilikdir”, biləsən,
Bizlərik, çünki günahkar ya mənəm, ya da ki sən.

Durular xeyli kefin hər gecə etsən tamaşa,
Belə şey görməmisən, bəlkə də dolsan da yaşa.
Özünü rüsvay edən eybini düşmürmü başa?
Sən də çox dərinə getmə, nə üçün də gedəsən...
Bizlərik, çünki günahkar ya mənəm, ya da ki sən.

Nə bilək ki, özəl ekran dönəcəkdir bazara,
Görünür bəzi müğənni tutulub bu “azara”.
Döz görək, neyləyərik, ay kişi, gəlsən də zara.
Hələ bundan betəri öndədi vallah, deyəsən...
Bizlərik, çünki günahkar ya mənəm, ya da ki sən.

Ədəb-ərkan nə gəzir, pul qazanırlar bu sayaq,
Teleekranda bu gün hər şey olubdur baş-ayaq.
Çox güman ki, tapılır mütrüfə də arxa-dayaq, –
Yoxsa olmazdı belə, xeyri nədir bəs, görəsən?
Bizlərik, çünki günahkar ya mənəm, ya da ki sən.

Göstərir əndamını, səhnə hamam-zaddı məgər?
Səni külfət qınayar, baxdığını bilsə əgər.
Belə naqisliyi alt-üst eləmək çoxmu çəkər?
Gözləyək, bəlkə düşən hay-küyü oldu eşidən,
Bizlərik, çünki günahkar ya mənəm, ya da ki sən.

*2001*

## BABA DƏRVİŞ

Baba Dərviş, bu yana gəlmə amandır, biləsən!
Millətin, çünki bu gün halı yamandır, biləsən!
İndi aləm dəyişib, başqa zamandır, biləsən!
Agah ol, birliyimiz olmasa Allah da gələ,
Arxayın olma yaxın vaxtda bu dünya düzələ!

Gəz, görərsən küçədə, tində dilənçi dayanır,
Eləsi var əlini açmağa bəzən utanır.
Şaxtada, qışda donur, yayda gün altında yanır.
Yalvarır: "Ac-susuzam, sən mənə bir yardım elə"
Arxayın olma yaxın vaxtda bu dünya düzələ!

Pullu, imkanlı olan kəs bunu görmürmü məgər?
Çox güman dollarını daş-tərəzi zorla çəkər.
Varlı insafa gəlib, yoxsula əl tutsa əgər.
O da yəqin dolanar, gözlərini tikməz ələ,
Arxayın olma yaxın vaxtda bu dünya düzələ!

Köhnə dəllal dəyişib indi də biznesmen olub,
Əsginasla çoxunun küpləri yəqin ki, dolub.
Düşünən var ki, nədən bəs kasıbın rəngi solub?
Daş ürəklə nə ola, yumşala, bir rəhmə gələ,
Arxayın olma yaxın vaxtda bu dünya düzələ!

Su bulandırmağa da cəhd eyləyən çoxdu bu gün,
Guya ki, özlərinin gözləri lap toxdu bu gün.
Kasıba əl tutanı, amma nəsə yoxdu bu gün.
Nə qədər ki, araya qovğa salanlar var hələ,
Arxayın olma yaxın vaxtda bu dünya düzələ!

Baba Dərviş, kasıbın var hələlik səbri bir az,
Evi bomboşdu, daha bircə qalıb köhnə palaz.
Satsa yəqin ki, onu lap olacaqdır kefi "saz".
Varlı artdıqca əgər, getsə kasıblaşma belə,
Arxayın olma yaxın vaxtda bu dünya düzələ!

*1990*

## BELƏLƏRİ DƏ VAR

Əbləhin heç təpəni aşmağa çatmır nəfəsi,
Təzəliklə oyanıb zirvəyə qalxmaq həvəsi.
Sallayıb mısmırığın zalım oğlunun nəvəsi...
Belə xülyaya düşən hökmən ağıldan kəm olur,
Gülüşür baməzələr, başqa cürə aləm olur.

Döyür hərdən döşünə, bağ belə, bostan belədi,
Guya ki, tək dalına aldığı ağır şələdi.
Çox basıb-bağlasa da, hər necə vardı, elədi.
Bircə pillə ucalan olsa, gözündə qəm olur,
Gülüşür baməzələr, başqa cürə aləm olur.

Zahirən bir dəridir, bir də sümükdür bu kişi,
Altı cüt bir tək olar, bəlkə də ağzında dişi.
Qaldırır dağ başına gördüyü bir cüzi işi.
Tər tökür guya ki, lap şalvarı hətta nəm olur,
Gülüşür baməzələr, başqa cürə aləm olur.

Çənəsi düşdü xoda, zəhlətökən vermir aman,
Yalan uydurmağa da ustadı, pərgardı yaman.
Düşünürsən, görəsən mumlayacaqdır nə zaman.
Belə vaxtlar başına tay-tuşu ancaq cəm olur,
Gülüşür baməzələr, başqa cürə aləm olur.

Neçə illərdi sudan zorla çıxardır çulunu,
Salıb Allah özü bu hala qudurğan qulunu.
Paylayır borclarına aldığı aylıq pulunu.
Dolduranda tuluğun müftə araqla dəm olur,
Gülüşür baməzələr, başqa cürə aləm olur.

*2001*

## ÖYRƏNƏRSƏN

(*Müğənnilik eşqinə düşən qocalara*)

Görmüşəm səhnədə aləmdi sənin oynamağın,
Ley süzür ha, eləsən, heç yerə dəymir ayağın.
Heç darıxma, uzaq eldən gələcəkdir sorağın. –
Bəm səsin, xoş avazın kaş üzünü ağ eləsin,
Bədxahın adətidi dalda gedib lağ eyləsin.

Baxma heç hay-küyünə, didsə də külfət ətini,
Çəkmə əl zümzümədən, bir neçə aydır çətini.
Öyrənərsən, dəyişən azdır məgər sənətini?
Hələlik qoy dayılıq lap naşı, maymaq eləsin,
Bədxahın adətidi dalda gedib lağ eyləsin.

Yaşın az-çoxluğunun dəxli də yoxdur bu işə,
Şərt odur ki, oxuyan püxtələşə, yaxşı bişə.
Ola müftə gəliri, yan cibi getdikcə şişə.
Sənəti ömrü boyu kef-damağın cağ eləsin,
Bədxahın adətidi dalda gedib lağ eyləsin.

Elə ki, bəxtin əli atdı kəmənd fəxri ada,
Nə ki var kəm-kəsirin düşməyəcək əsla yada.
Görəcəksən ki, gəlir ay kişi, ağzın da dada.
Bu sənət kaş ki, güzəranını çim yağ eləsin,
Bədxahın adətidi dalda gedib lağ eyləsin.

"Samauçka" çoxalır, bəhsə giriblər elə bil,
Yol tapır səhnəyə də, amma necə, bəlli deyil.
Nəyin əskikdi sənin, məşq eləsən bir neçə il.
Deyəcəksən mənə: "Allah canını sağ eləsin!"
Bədxahın adətidi dalda gedib lağ eyləsin.

Bir də düşməz belə fürsət ələ, dünya dağıla,
Sərgüzəştin dönəcək hardasa, bəlkə nağıla.
Çoxusu mat qalacaq səndəki, zehnə, ağıla.
Qoy şişirtsin bu işi kimsə təpə, dağ eləsin, Bədxahın adətidi dalda gedib lağ eyləsin.

*2000*

## BƏSDİR

Bəsdir, ay fəhlə baba, keçmişi hey yad elədin,
Gecə-gündüz zamanı qamçıladın, dad elədin.
Oldu heç xeyri sənə, bir belə fəryad elədin?
Bekar olsan da yenə, döz, nə qədər var nəfəsin,
Başa düş, dözməlisən, çıxmasın ha, bir də səsin!

Yuxarı çatsa səsin, gəlsələr işdi, köməyə,
Görsələr ki, hələlik şor-çörəyin var yeməyə.
Pərt olarsan axı, vallah, sözün olmaz deməyə.
Olmaya boş yerə hay salmağa vardır həvəsin?
Başa düş, dözməlisən, çıxmasın ha, bir də səsin!

Əcnəbi darğa olub, sən də baxırsan əlinə,
Yükləyib qəm yükünü tək sənin ancaq belinə.
De, haçan tənəli bir söz gətiribsən dilinə?
Susmusan ki, ağadır, qoy nə bilirsə eləsin.
Başa düş, dözməlisən, çıxmasın ha, bir də səsin!

Nədi, dünya dağılıb, ah-uf edirsən bu qədər?
Guya ki, indiyəcən bilməmisən qüssə, kədər.
Zəhmətin getməyəcək dirçəliş uğrunda hədər.
Boğazından da kəsib, verməlisən ev kirəsin,
Başa düş, dözməlisən, çıxmasın ha, bir də səsin!

Yüksəliş naminə, hər cövrə gərək qatlaşasan,
Bu keçid dövrünün hər səddini hökmən aşasan.
Görəcəksən bəhərin, ölməsən, hərgah yaşasan.
Cəhd elə, ağrı-acı qoyma səni üstələsin,
Başa düş, dözməlisən, çıxmasın ha, bir də səsin!

Fəhlə bədbəxt çalışır xeyri dəyə ölkəsinə,
Çarəsizlər axışır dünyanın hər bölgəsinə.
Bilirəm boşdu cibin, yoxdu çəkən kölgəsinə.
Eybi yoxdur, təki bir kəs – demaqoqdur, – deməsin,
Başa düş, dözməlisən, çıxmasın ha, bir də səsin!

## ƏSGİNAS XƏSTƏSİ

Od alıb ağzına rüşvət yığılır hər məkana,
Bənd imiş sanki alovlanmağı bircə təkana.
O da ki oldu zəmanə dəyişəndən bu yana.
Məmura vermə sual, çünki bilirsən danacaq,
Nəfsi öyrəncəlinin əlləri şəksiz "yanacaq".

Şübhəsiz ki, alovundan isinir birparası,
Görünür yanmayıb ha... indiyəcən heç harası.
Düşsə bir çınqılı da, gec sağalandır yarası.
Nə fəlakət gətirir od alışanda qanacaq,
Nəfsi öyrəncəlinin əlləri şəksiz "yanacaq".

Əsginas xəstəsinin quyruğu düşsə tələyə,
Macalı olmayacaq əsla əl atsın kələyə.
Diz çöküb yalvaracaq göydə pənahı fələyə.
Odla çox oynadığı günləri bir-bir anacaq,
Nəfsi öyrəncəlinin əlləri şəksiz "yanacaq".

Rüşvətin "od-alovun" heç vədə görmür gözümüz,
O sönərmi, onu ram eyləməsək biz özümüz?!
Qalmayıb yoxsa bu haqda deməyə bir sözümüz?
Axı susduqca, qudurğan daha da varlanacaq,
Nəfsi öyrəncəlinin əlləri şəksiz "yanacaq".

İndi tənqid də daha müftəxora etmir əsər,
Adını çəksəm əgər, dəbbələyər, hətta küsər.
Bəd əməldən çəkinər, sözdə əgər, olsa kəsər.
Çox güman əvvəl-axır birparası xoflanacaq,
Nəfsi öyrəncəlinin əlləri şəksiz "yanacaq".

*2001*

## GÖRƏSƏN
(*Təqaüdçünün dilindən*)

Ay təqaüd, baxıram, məbləğin azdır nə yaman!
Sən ki şahidsən özün, xeyli ağırdır güzəran.
Ah-vayım ərşə çıxır, yoxdu nədənsə inanan.
Boğazımda çatıya, kimsə gülərmi, görəsən?
Bəzi məmur ağalar rəhmə gələrmi, görəsən?

Ay təqaüd, neçəsi gündə gəlirsə qapına,
Gəl, oğulsansa tab et hər birinin tap-tupuna.
Elə bil başlamışam evdə əsginas çapına.
Ağlasam, göz yaşımı kimsə silərmi, görəsən?
Bəzi məmur ağalar rəhmə gələrmi, görəsən?

Ay təqaüd, havadan qeyri nə var, müftə deyil,
Nə qədər xərc aparır qaz, su, işıq, bir də zibil.
Neyləyim ki, kommunal xərcləri artırsa hər il.
"JEK"-ə yalvarsam əgər, çarə elərmi, görəsən?
Bəzi məmur ağalar rəhmə gələrmi, görəsən?

Ay təqaüd, dağılar dünya, bir az artsan əgər?
Büdcə müflisdə bəyəm, imkanı heç yoxdur məgər?
Sənin artan gününü gözləməyim çoxmu çəkər?
Vaxtsız ölsəm, səbəbin kimsə bilərmi, görəsən?
Bəzi məmur ağalar rəhmə gələrmi, görəsən?

Ay təqaüd, əsəbim lap günü-gündən gərilir,
Axı insana ömür bir dəfə ancaq verilir.
Vaxt olur, ac-yalavac yolda acından sərilir.
Nifrətim ox kimi daş qəlbi dələrmi, görəsən?
Bəzi məmur ağalar rəhmə gələrmi, görəsən?

Ay təqaüd, səsimi bir eşidən olsa əgər,
Qəlbi kövrəlsə bir az, gözləri də dolsa əgər.
Qalsa ac bir neçə gün, rəngi tamam solsa əgər,
Gəlsə vicdanı dilə, iş düzələrmi, görəsən?
Bəzi məmur ağalar rəhmə gələrmi, görəsən?

Ay təqaüd, özümü lap qoyum əbləh yerinə,
Elə üzdən sovuşum, getməyim əsla dərinə.
Özümü qışda peçə, yayda da versəm sərinə, –
Tanrı göydən başıma ruzi ələrmi, görəsən?
Bəzi məmur ağalar rəhmə gələrmi, görəsən?

*2001*

# BELƏ...

Ayə, dil pəhləvanı, çox atılıb-düşmə nahaq,
Keçirib aksiyalar, ortalığa salma nifaq.
Dayanıb gendə baxırsan, sənə dəymir şapalaq.
Belə hay-küylə düzəlməz axı müşkül məsələ,
Bəhrə verməz əməlin, aləmi qatsan da belə.

Başa düş, millət ayılmış, daha yoxdur yatanı,
Başçı seçməz özünə yoldan ötən hər çatanı. –
Kürsüdən hap-gop edən, boş yerə əl-qol atanı.
Xələfin neylədi ki, barı baxıb ibrət elə,
Bəhrə verməz əməlin, aləmi qatsan da belə.

Bənzədirsənsə əgər, yarpıza yovşan kolunu,
Nə bilirsən axı sən şərəfli sülhün yolunu.
Bilmiş olsaydın əgər, çırmalayardın qolunu.
Göstərərdin nə sayaq qurmalıyıq qurğu, tələ,
Bəhrə verməz əməlin, aləmi qatsan da belə.

Dinmədikcə, daha da yer tutur hərdən ayağın,
Daş-kəsəkdir, ya da ki boş şüşələrdir yarağın.
Heç nə baş tutmayacaq, çünki çürükdür dayağın.
Boş yerə, muzdlulara müftə pulu az səpələ,
Bəhrə verməz əməlin, aləmi qatsan da belə.

Oynama odla, yanıb tüstülənərsən neçə il,
Gələn olmaz haraya, puç olar ömrün axı, bil!
Ətəyindən daşı tök, gözlərini yaxşıca sil,
Sal nəzər dörd yanına, yaxşı düşün, uyma felə.
Bəhrə verməz əməlin, aləmi qatsan da belə.

İstəmirsənsə əgər, qərq olasan göz yaşına,
Zamanın nəbzini tut, ağlını topla başına.
Yoxsa lənət yazılar taleyinin başdaşına. –
İndidən, sağ-salamat dünyada olsan da hələ,
Bəhrə verməz əməlin, aləmi qatsan da belə.

*2001*

## HACI

(*Haram pulla ziyarətə gedənlərə*)

Bəllidi ki, yoxdu zaval zəvvara,
Amma halal olmalıdır pul-para.
Faydası yoxdur daha getsən hara.
Sayma bizi sən bu qədər xam, Hacı,
Gəl özünü eyləmə bədnam, Hacı.

Əlli fırıldaqla yığıb sikkəni,
Sən də ziyarət elədin Məkkəni.
İşdi, yeritsən tutalım hikkəni.
Bəlkə məsciddə olasan zam, Hacı,
Gəl özünü eyləmə bədnam, Hacı.

Çoxlarına sən axı şər atmısan,
Haqq dil açanda ilişib batmısan. –
Lap arabir türmədə də yatmısan.
Söylə, düşürmü yadına dam, Hacı?
Gəl özünü eyləmə bədnam, Hacı.

Gör neçə illərdi ziyarətdəsən,
Hamı bilir, amma ticarətdəsən,
Barı danış, indi nə niyyətdəsən?
Xam deyilik, başqadı əyyam, Hacı, –
Gəl özünü eyləmə bədnam, Hacı.

Haqq evinə yüz dəfə getsən belə,
Gecdi, günahı yumaq olmaz Lələ!
Ay lotu, bəsdir bizi saldın ələ, –
Gəl bizə, birlikdə edək şam, Hacı.
Süfrədədi meylə dolu cam, Hacı,
Gəl özünü eyləmə bədnam, Hacı.

*2001*

## ETİRAF ETMƏLİYƏM

Dərdimi ərz eləyim, gülmə sən Allah, qulaq as,
Çatmadı dadıma heç falçı nənəm qurduğu tas.
Deputat seçmədilər, evdə tutublar mənə "yas"
Batdı getdi nə qədər payladığım pul-para da,
İt də getdi, hələ bir üstəlik ip də arada.

Olacaqmış çox uzun döngəli yollar, nə bilim,
İşə pəl vurdu ya "sağlar", ya da "sollar", nə bilim.
İmzalar toplamağa getsə də dollar, nə bilim.
Saxta çıxdı neçəsi, gəlmədi əsla kara da,
İt də getdi, hələ bir üstəlik ip də arada.

Deputat olmaq üçün mən maya qoydum nə qədər,
Neçə dostun, tanışın zəhməti də getdi hədər.
Salsa yorğan-döşəyə çulğalayan qüssə, kədər.
Yanacaq halıma lap tövlədəki mal-qara da,
İt də getdi, hələ bir üstəlik ip də arada.

Bilmədim millətimə harda, nəyim gəlmədi xoş,
Tək nənəm evdə deyir: Sən nə əsəbləş, nə də coş.
Düz deyir, xeyri nədir, qalmışam indi cibi boş.
Daydayım biznesimə kaş ki, şərait yarada,
İt də getdi, hələ bir üstəlik ip də arada.

Qələbə çalmağıma zərrəcə şübhəm yox idi,
Çünki, arxamda duran, vəd eləyənlər çox idi.
Çoxunun, mən biləni, nəfsi də, vallah, "tox" idi.
Toplamaqçün iki min imzanı düşdüm dara da,
İt də getdi, hələ bir üstəlik ip də arada.

Məclisin iclasına baxdım o gün doldu gözüm,
Orda vardı deməyə ilboyu sanballı sözüm.
Günah heç kəsdə deyil, şöhrətə uymuşdum özüm.
Etiraf etməliyəm mən bunu olsam harada
İt də getdi, hələ bir üstəlik ip də arada.

*1998*

## EY DOST!

Millət qırılır nəmli çadırlarda, ay Allah!
Qızmar günəş altında, boran, qarda, ay Allah!
Çoxmu qalacaqdır bu sayaq darda, ay Allah?!
Yurd həsrəti insanları min dərdə salandı,
Ey dost, “mən ölüm”, düz demirəm, bəlkə yalandı?

Yoxdursa seçən bir balaca astarı üzdən,
Kimdir ayıran ölkədəki əyrini düzdən?
Getmir dərinə, çünki baxır hər şeyə üzdən.
Getsə belə, millət ayaq altında qalandı,
Ey dost, “mən ölüm”, düz demirəm, bəlkə yalandı?

Daşdan çıxarır öz çörəyin cümlə kasıblar,
Saymaq belə olmur nə qədər ac-yalavac var.
Tanrı, eşidirsən, qulağın yoxsa olub kar?
Əfsus ki, hələ el malı çox yerdə talandı,
Ey dost, “mən ölüm”, düz demirəm, bəlkə yalandı?

Dollarda olan güc hələ ki, heç nədə yoxdu,
Yağlı yerə bu yolla keçənlər hələ çoxdu.
Zənn etmə ki, hər əl tutanın gözləri toxdu.
Nəfsi itilər ömrü boyu rüşvət alandı,
Ey dost, “mən ölüm”, düz demirəm, bəlkə yalandı?

Möhlət verib Allah elə bil, can veririk, can!
Hardan biləsən ki, gələcəkdir belə dövran.
Vallah, bu çətinliklərə dözmür axı insan.
Ömrün yolu onsuz da çətin döngə-dalandı,
Ey dost, “mən ölüm”, düz demirəm, bəlkə yalandı?

*1991*

## AMAN ALLAH

Ölərəm, uf demərəm, sınsa qabırğam, ya qolum,
Təki bu məmləkətin hakimi mütləq mən olum.
Əfsus olsun ki, yaman döngə-dalan oldu yolum.
Çox çalışdım ki, gedəm axıracan, amma əbəs...
Aman Allah! Nə edim, vermədi xalqım mənə səs.

Güvənib pul-parama, düşdüm axırda bu hala,
Qorxuram ki, eşidə, birparası zurna çala.
Çırmayıb qollarımı başlamışam qalmaqala.
Hər görüşdə, döşümə döyməyə artırdı həvəs,
Aman Allah! Nə edim, vermədi xalqım mənə səs.

Yanıram zəhmətimə, gör necə də getdi hədər,
İnanan olmadı heç hap-gopuma zərrə qədər.
Yuxumu ərşə çəkib çulğalayan qüssə, kədər.
Təpiyib dil-dodağım, qulbeçələr hardadı bəs?
Aman Allah! Nə edim, vermədi xalqım mənə səs.

Çox tələsmə dedilər, sən hədəfi yaxşıca seç,
Kürsüdən əl-qol atıb, ləngimə çox, tənqidə keç.
Ha bağırdım, kişinin bir tükü tərpənmədi heç.
Düşdüm əldən, nə danım, oldum özüm təngnəfəs
Aman Allah! Nə edim, vermədi xalqım mənə səs.

Vermədi əks-səda odlu sözüm də, mən ölüm,
Neçə arzum, diləyim qaldı gözümdə, mən ölüm.
Bilmirəm heç nə edim, indi özüm də, mən ölüm.
Kabinet darlıq edir, sanki, dönüb oldu qəfəs,
Aman Allah! Nə edim, vermədi xalqım mənə səs.

Görürəm ki, yuxuda məndədi Şeyxin də gözü,
Mənə təzim eyləyib, kürsüyə yan aldı özü.
Çox alovlu danışıb, şəstlə dedi, tək bu sözü:
“Açılış vaxtıdı, Bəy, məqbərənin lentini kəs”,
Aman Allah! Nə edim, vermədi xalqım mənə səs.

*1998*

## EY XUDA...

Dünyanın faniliyin yoxdu lüzum etməyə car,
Ölüm haqdırsa da, ancaq unudan bambılı var.
Zalım oğlu elə bil kordu, qulaqdandakı kar. –
Gündə yüz yol deyəsən, həllini tapır məsələ,
Ey Xuda, sən bu işi sahmana sal, çarə elə.

Dünyada heç bir işin olmur ömürlük təməli,
İndi ki, yoxdur ölüm xofu ürəkdə, deməli.
Başa salmaq da çətindir belə bir bədəməli.
Atını oynadacaq, arxası var, çünki hələ,
Ey Xuda, sən bu işi sahmana sal, çarə elə.

Gülərüz katibəsi dilli-dilavərdi yaman,
Elə bil öz "peşəsin" məşq eyləyib xeyli zaman.
Gələn olsa qəbula, söz deməyə vermir aman.
Mat qalırsan, bu nədi, orda elə, burda belə, –
Ey Xuda, sən bu işi sahmana sal, çarə elə.

Vardı keçmişdə bürokrat, nədi bəs indi adı?
Hər nədirsə, nə edibsə qalıb ağzında dadı.
Qoymur heç həndəvərə darda qalan bircə yadı.
Gözləmə, yalvarasan, bəlkə bir az rəhmə gələ, –
Ey Xuda, sən bu işi sahmana sal, çarə elə.

Guya dünya düzəlib, şəstlə deyir birparası,
Varsa meydan sulayan, bəs düzəlibdir harası?!
İlanın eyni olur həm ağı, həm də qarası.
Ovsunun yoxdu gücü, pul gərək olsun a lələ!
Ey Xuda, sən bu işi sahmana sal, çarə elə.

Olanı ərz elədim, tüstü çıxan səmtə yozun,
Boldusa istiotu, istənilən bəndi pozun.
Vardı "qozbaz", o da getdi badına bircə qozun.
Yoxdu qoz, şaxşaxısı səsdi, o da gəlməz ələ,
Ey Xuda, sən bu işi sahmana sal, çarə elə.

*2000*

## YA RƏBB...

Ya Rəbb, bu yazıq məxluqa rəhm eylə, amandı!
Millət gedir əldən, yiyə dur, halı yamandı!
Yoxdur toxun acdan xəbəri, gör nə zamandı!
Ərşə ucalır körpələrin naləsi, ahı,
Agahsan özün, bəndələrin çoxdu günahı.

Ya Rəbb, nə olar, lütf elə, boylan yerə sarı,
Gör bir necə fəryad edir ağ saç qoca qarı.
İmdad eyləsən, bəlkə təsəlli tapa barı.
Sənsən bu cahanın axı yeganə pənahı,
Agahsan özün, bəndələrin çoxdu günahı.

Ya Rəbb, dözümün ölçüsü varsa, nə qədərdi?
Bəlkə kasıbın xoş güzəran cəhdi hədərdi?
Vallah, batırıq, gözlərə bax, qəmdi, kədərdi.
Millət gülərüzlə hələ açmırsa sabahı,
Agahsan özün, bəndələrin çoxdu günahı.

Ya Rəbb bu qədər ac-yalavac olduğu halda,
Bəlkə qara gündən betəri var hələ dalda?
Olsa elə, vallah, dözə bilməz qaramal da.
Hərçənd ki, o dilsizlərin heç yoxdu tamahı
Agahsan özün, bəndələrin çoxdu günahı.

Ya Rəbb, sən özün yaxşı-pisi saf-çürük eylə,
Gəl ki, necə israr eyləyim mən, kimə neylə.
Bəlkə hələlik məst edəsən milləti meylə?
Məst olsa sanar ki, düzəlib guya rifahı
Agahsan özün, bəndələrin çoxdu günahı.

Ya Rəbb, bu əzabları o taydan da sovuşdur,
Bais olanın burnunu bir yolluq ovuşdur.
Sərhəd dirəyi ayrı salan xalqı qovuşdur.
Xoş günləri müşküldü hələ yıxsa da şahı,
Agahsan özün, bəndələrin çoxdu günahı.

*1998*

## NANKORLUQ

Hay salıb, qoyma gəlir köhnə müdir öz yerinə,
Demə çoxmuş müdirin işdə dikən göz, yerinə.
Deyəcəm, ay kişilər, düşməsə də söz yerinə.
Kölgəsində dolanan indi bəyənmir "müdiri"
Böylə nankorluq edər min gədədən bəlkə biri.

Təşvişindən görünür vic-vicə düşmüş canına,
Qurğu qurmaq bu tipin işləyib artıq qanına.
Harda bir zatıqırıq var çağırır öz yanına,
Qorxudur: "Ac qalarıq, köhnə müdir dönsə geri"
Böylə nankorluq edər min gədədən bəlkə biri.

Başı pambıqla kəsən əbləhin heç yoxdu tayı,
Tapıb indi özünə sərfəli bir tazə dayı.
Tutacaq gözlərini əl tutanın haqqı-sayı
Pisə lənət oxunur, ya ölü olsun, ya diri,
Böylə nankorluq edər min gədədən bəlkə biri.

Bir zamanlar siçan oynardı cibində bu lütün,
Orda-burda sülənərdi, dəyişib indi bütün.
Xəlvəti fitva verir: işçiləri yaxşı "ütün".
Xırda köşklər yaradıb, zəbt eyləyir xeyli yeri,
Böylə nankorluq edər min gədədən bəlkə biri.

Bəy dedikcə, deyəsən qoltuğunun altı şişir,
Müftə pulçün görünür ovcu da tez-tez gicişir.
Nəfsi hədsiz itidir, hər şeyə çünki girişir.
Şir kimi nərə çəkir ayda gecikse "nəziri",
Böylə nankorluq edər min gədədən bəlkə biri.

"Zənn edirlər ki, yəqin bərli-bəzəkli mələyəm,
Ola bilməz ki, çaşıb bir kəsə pislik eyləyəm.
Yaxşı ki, yoxdu bilən başdan-ayağa kələyəm,
Xal salıblar təzədən qəlbimə qozdan da iri,
Olmuşam guya ki, min bir gədədən mən də biri".

*1993*

## HƏLƏ Kİ...

Millətin xeyrinə iş görməliyik hər birimiz,
Bizi əfv etməyəcək nə ölümüz, nə dirimiz.
Çünki gendən çağırır öz gözümüzdə tirimiz.
Amma biz tük gəzirik özgə gözündə, hələ ki,
Sirli məna gəzirik özgə gözündə, hələ ki.

Bəs deyil, hər yetənə "bəli", "baş üstə" demişik?
Dözmüşük tənəyə də, təhqirə də, dinməmişik.
Üstəlik azmı olub yağlı qapaz da yemişik?
Gəl ki, görmür günahı heç kəs özündə, hələ ki,
Sirli məna gəzirik özgə gözündə, hələ ki.

Təzə bir söz deyənə ya deyirik ki, dəlidi,
Ya da bir arxalının züy tutanı, "sağ əlidi".
Dünya qopmaz ki, desək, xalqa bu söz sərfəlidi
Paxılıq, yoxdu bizə tən yer üzündə, hələ ki.
Sirli məna gəzirik özgə gözündə, hələ ki.

Kürsüdə haqlıya da, haqsıza da əl çalırıq,
Çox güman boş-boşuna ortaya hay-küy salırıq.
Sonradan səhvimizə biz özümüz mat qalırıq.
Şər gəzir gözlərimiz özgə izində, hələ ki,
Sirli məna gəzirik özgə gözündə, hələ ki.

Başımız başdı əgər, yaxşı, pisi dərk eləsin,
Pisi də, yaxşını da yüz cür ələkdən ələsin.
Xalqa can yandırana şanlı uğurlar diləsin.
Yoxdu millət deyərəm heç bu dözümdə, hələ ki,
Sirli məna gəzirik özgə gözündə, hələ ki.

Belə getsə, a qağa, bitməyəcək dava-dalaş,
Atacaq şər xeyirin bostanına daima daş.
Səhvini birparası dərk eyləyə, anlaya kaş!
Axı əl-qol atırıq qəm dənizində, hələ ki,
Sirli məna gəzirik özgə gözündə, hələ ki.

*1992*

## DƏDƏCAN!

Xəstələnmə, Dədəcan, çünki fənadır halımız,
Tökülüb dəymişimiz, heç ələ düşməz kalımız.
Satmışıq evdə nə var, bombulu-boşdur zalımız. –
İndi yorğan-döşəyə düşmə amandır, Dədəcan!
Elə zənn eyləmə ki, köhnə zamandır, Dədəcan!

Dəyişib abı-hava, pulludu tibb xidməti də,
Daha yoxdur a kişi, müftə sağaldan iti də.
Artıb həddən ziyada ağ cunanın qiyməti də.
Daha düşmüş kasıbın halı yamandır, Dədəcan!
Elə zənn eyləmə ki, köhnə zamandır, Dədəcan!

Vay təqaüd alanın halına ki, xəstələnə,
Borc alıb verməlidir çağrışa dərhal gələnə;
Olmasa əl uzadan, bircə qalır ki, dilənə.
Yola salmaq həkimi sanma asandır, Dədəcan!
Elə zənn eyləmə ki, köhnə zamandır, Dədəcan!

Qurban ollam həkimin insafına, varsa əgər,
Hey genəldir xalatın yan cibini, darsa, əgər.
Çətin ancaq eşidə, şəkk qulağı karsa, əgər.
Hələ var birparası vallah, umandır, Dədəcan!
Elə zənn eyləmə ki, köhnə zamandır, Dədəcan!

Adı var xəstəxana, xəstə qalır axşamacan,
Gələn olmur yanına, lap zarıyıb versə də can. –
Soruşur tez adamın, işdi həkim gəlsə bir an;
Görünür xeyri olan səmtə cumandır, Dədəcan!
Elə zənn eyləmə ki, köhnə zamandır, Dədəcan!

Dədəcan, gördüyümü ərz elədim, sanma yalan;
Demirəm xəstələrin qayğısına yoxdu qalan.
Bu fikirdən uzağam, amma ki, var rüşvət alan.
Gələcəkdə düzələr, bax bu gümandır, Dədəcan!
Elə zənn eyləmə ki, köhnə zamandır, Dədəcan!

*1996*

## ALLAHA MÜRACİƏT

İlahi, varmı görən taleyimizdən xəbərin?
Gecə-gündüz düşünür cümlə kasıb dərd-sərin.
Yaxşı ki, yerdən uzaq mavi səmalardı yerin.
Şəksiz agahdı sənə bəndələrin ahu-vayı,
Yoxdu bir istəyimiz bircə ruzidən savayı.

Zaman öz qəm yükünü bənd eyləyib çiynimizə,
Güzəran dərdi də ki riştə atıb beynimizə.
Əhli-kef bəndələrik, almırıq heç eynimizə.
Zorla salsaq da yola qayğı dolu hər bir ayı,
Yoxdu bir istəyimiz bircə ruzidən savayı.

Get-gedə yaxşı, pisin qiyməti lap eyniləşir,
Nə üçün? Tək bu sual hər düşünən beyni deşir,
Baisi dünya deyil, çünki adamlar dəyişir. –
İtirənlər çoxalıb yaxşılığı, haqqı-sayı,
Yoxdu bir istəyimiz bircə ruzidən savayı.

Olmuşuq adi həyat tərzinə möhtac, ay aman!
Olmasa çaxçuxumuz, qalmalıyıq ac, ay aman!
Az qalıb varlı qoya öz başına tac, ay aman!
Talanır sərvətimiz "işbazın" artdıqca sayı,
Yoxdu bir istəyimiz bircə ruzidən savayı.

Əl açanlar çoxalır yoldan ötən hər yetənə,
Göstər öz qüdrətini, bəndəni qoyma dilənə.
Binəvalar ümidin bağlayıb hər-halda sənə.
Keçirir nəmli çadırlarda qışı, həm də yayı,
Yoxdu bir istəyimiz bircə ruzidən savayı.

Mərhəmət sahibisən, yüz dəfə ölç, bir dəfə kəs!
Kasıbın halına yan, sanki, alır zorla nəfəs.
Çəkməsə korluq əgər, zəhmətə də artar həvəs.
Bəzi məmur ağanın var neçə yerlərdə payı,
Yoxdu bir istəyimiz bircə ruzidən savayı.

*2001*

## DOLLAR

Dollar, nə gözəl, qəlbə yatan doğma adın var,
Baldan da şirin indi də ağzımda dadın var.
Aldım prosentə səni, əldə mayam olsun,
Çaxçux eyləyim, müftə gəlir yan cibə dolsun.
Vallah, düzü gördüm ki, pulum günbəgün artır,
Nəfəsim, nə biləydim məni bədbəxtliyə dartır.
Çek alveri düşmüşdü moda, mən də edirdim,
Hərdən qızışıb, risk eləyib bangə gedirdim.
Yüzlərlə çeki xeyli ucuz, hopdum alırdım,
Artdıqca qazancım, arabir çırtma çalırdım.
Sayəndə dolandım neçə il kef-damağım saz,
Baxdıqca sənə ruhum edərdi göydə pərvaz.
Fərz et ki, bazar süd gölüdür, sərfəli göldü,
Bəxtim elə bil yatdı qəfildən, bazar "öldü".
Heyhat! Bu nə işdir, özümü əngələ saldım,
Qiymət ki, ucuzlaşdı, tamam pis günə qaldım.
Çıxdın sən əlimdən, dəli-divanəyəm indi.
Dünyada nə var, hər şeyə biganəyəm indi.
Artıq batıram, dadıma bir kimsədə çatmır,
Min cür yayılan şayiələr beynimə batmır.
Dollar, mən özümdən də səni istəmişəm çox,
Vallah, tamahım yıxdı məni, səndə günah yox.
Kimsə səni alsa sələmə, ah, aman Allah!
Şəksiz olacaq halı mənimtək yaman, Allah!
Borcum sinəmə çəkdi çalın-çarpazı bir dağ, –
Dollar, bir əlac var, özümü mən asım ancaq.

*2000*

## DİPLOM

Elmə həvəsim söndü zəmanə dəyişəndən,
Yumşaq yerə göydən naşı zənbillə düşəndən.
Gündən-günə xeyli kökəlib, qarnı şişəndən.
Diplomsuz əgər, ildə tapırsa təzə bir post,
Diplom nə gərəkdir mənə bundan belə ey dost!

Mən bir qapı döydüm, nə qədər növbədə durdum,
Məmurlar önündə dayanıb boynumu burdum.
Əldən düşüb axırda gedib evdə oturdum,
Diplomsuz əgər, ildə tapırsa təzə bir post,
Diplom nə gərəkdir mənə bundan belə ey dost!

Ömrün beş ilin sərf eləmək elmə, – hədərmiş,
İllərlə ümid bəslədiyim arzu, – kədərmiş.
Vallah, nə bilim diploma “hörmət” bu qədərmiş.
Diplomsuz əgər, ildə tapırsa təzə bir post,
Diplom nə gərəkdir mənə bundan belə ey dost!

Getsə belə, heç ali savad almağa dəyməz,
Qiymət ki, verən yoxdu, haray salmağa dəyməz.
Nadanlar önündə axı alçalmağa dəyməz.
Diplomsuz əgər, ildə tapırsa təzə bir post,
Diplom nə gərəkdir mənə bundan belə ey dost!

Yoxdursa əgər, təyinatım, neyləyim indi?
Mən dərddə olan bəlkə, ya yüzdü, ya da mindi...
Baxsan, gecə-gündüz hələ ki, yerləri tindi.
Diplomsuz əgər, ildə tapırsa təzə bir post,
Diplom nə gərəkdir mənə bundan belə ey dost!

Vallah, a kişi, əsginasım olsa cibimdə,
Gəl-gəl deyər iş lap Xəzərin olsa dibində.
Ah-vay eyləyir halıma ağsaçlı bibim də. –
Diplomsuz əgər, ildə tapırsa təzə bir post,
Diplom nə gərəkdir mənə bundan belə ey dost!

*2000*

## DƏDƏN DƏ VURDU...

(*Külfətin dilindən*)

Vurmağa meylin yenə artır, kişi,
Meyxana öz səmtinə dartır, kişi.
Sir-sifətin gör necə qartır, kişi.
Lül-atəş olmaq dədənə xasdı, ha...
Dədən də vurdu, özünü asdı, ha...

Zakuskasız hökmən içəydin gərək?!
Gətirməyə yaxşı ki, vardır xərək.
Əndərəcəksənsə tədarük görək.
Qənşərinə qoyduğumuz tasdı, ha...
Dədən də vurdu, özünü asdı, ha...

Sən məni vallah, gətiribsən cana,
Gör neçə şalvar tökülüb yan-yana.
Beş-altısın batırmısan qatrana.
Girmə tiyan altına, his-pasdı, ha...
Dədən də vurdu, özünü asdı, ha...

Dinlə mənim sözlərimi maraqla,
Zərbə vuran güclü olur yaraqla.
Ac qarına çox güləşmə araqla.
Bir də görərsən ki, səni basdı, ha...
Dədən də vurdu, özünü asdı, ha...

Rüsvay edib tində oturmaq səni,
Boynubükük dükanda durmaq səni.
Öldürəcək ay kişi, vurmaq səni.
Gündə bizim evdə elə yasdı, ha...
Dədən də vurdu, özünü asdı, ha...

*1999*

## AH, YALAN!

Ah, yalan! Valeh olan çoxdu sənin “qüdrətinə”,
Ümidi tək sənədir, çünki düşəndə çətinə.
Var satanlar səni hərdən də keçi qiymətinə.
Hikmətin olsa təsəlli, qurudur göz yaşını,
Sən gərəksən çoxuna girləmək üçün başını.

Sənə öyrəncəli kəs yaxşı bələddir “dadına”,
Çünki sayəndə nə iş görsə, çıxır öz adına.
Olub hərdən də gedənlər sənin ancaq badına.
Olsa rüsvayi-cahan da yenə atmır daşını,
Sən gərəksən çoxuna girləmək üçün başını.

Çox şükür, varsan hələ, yoxsa batar birparası,
Olmasan işdi əgər, bəs nə “satar” birparası.
Sənsiz öz istəyinə çətin çatar birparası.
Olsa bir xeyri-zadı, qurdalayır yaddaşını,
Sən gərəksən çoxuna girləmək üçün başını.

Səni çox rəngə salır, bəlli olur tək özünə,
Alan heç şəkk eləmir də satanın bir sözünə.
Qara olsan, alanın ağ görünərsən gözünə.
And içir öz canına, çünki güdür daşbaşını,
Sən gərəksən çoxuna girləmək üçün başını.

Sənə bel bağlayanın min üzü, min bir donu var,
Bələdəm bir yerdə, orda azı, vallah, onu var.
Düşmüsən indi moda, hər şeyin ancaq sonu var
Xoflular tutsa xəbər, oynadacaq göz-qaşını,
Sən gərəksən çoxuna girləmək üçün başını.

*2000*

## DAYININ MƏSLƏHƏTİ...

Düzüb-qoşdum, sən əmrini alınca,
Keç o başa mən də gəlim dalınca. –
Kölgələnim, evdə bekar qalınca.
Bundan belə muğayat ol özündən,
Çalış, pərdə asma haqqın gözündən.

Möhtac olan çoxdu bu gün kölgəyə,
Bekarçılıq bəla olub ölkəyə.
Sal yolunu lap ucqar bir bölgəyə. –
Giley yağır, dost-tanışın üzündən,
Çalış, pərdə asma haqqın gözündən.

Kasıb-kusub sənə ümid bağlayır,
Gün-güzəran ürəklərin dağlayır.
Üzdə gülür, öz içində ağlayır.
Danışdırsan, anlayarsan sözündən,
Çalış, pərdə asma haqqın gözündən.

Dağ kişilər daş qoyublar daş üstə,
Hər gədaya deməyiblər baş üstə.
Kövrəlsən də, yaş gələcək yaş üstə.
İbrət götür, əyrisindən, düzündən,
Çalış, pərdə asma haqqın gözündən.

Zəmanənin gərdişinə gər sinə,
Getmə haqqın, ədalətin əksinə.
Düşmən sənin hay verirsə səsinə. –
O mərd olar cib dostunun yüzündən,
Çalış, pərdə asma haqqın gözündən.

*2000*

## BƏS DEYİL...

Su almısan ağzına, dayanmısan lal kimi,
Tənələrə dözürsən, sanki, qara mal kimi.
Sayma belə təhqiri adicə bir hal kimi.
Dünyada qüruru var, təpənin də, dağın da,
Əyildiyin bəs deyil nadanın qabağında?

Kənardan baxıb gülür qohum sənə, yad sənə,
Əsla yaraşmır belə xəcalətli ad sənə.
Tanış deyildir məgər, ləqəbdəki, "dad" sənə?
Manqala şiş düzürsən filankəsin bağında,
Əyildiyin bəs deyil nadanın qabağında?

Evində, eyvanında kef məclisi qurursan,
Astanadan girməmiş dik atılıb durursan.
Şəninə sağlıq deyib, şəstlə badə vurursan.
Səhvini anlayarsan bəlkə ahıl çağında,
Əyildiyin bəs deyil nadanın qabağında?

Qulpa yer axtarırsan başqasının sözündə,
Nədəndir ki, bəs tiri görmürsən öz gözündə?
Özgə sənə neyləsin, təpər yoxsa özündə.
Təpiyəcək sözümdən hələ dil-dodağın da,
Əyildiyin bəs deyil nadanın qabağında?

Başağrısı oldu bu bəlkə sənə ay qağa?
Söz açıb əməlindən sanma qoymuşam lağa.
Mətləbimi anlayar dərk edə bilsə çağa.
Ərz elədim fikrimin qarasın da, ağın da,
Əyildiyin bəs deyil nadanın qabağında?

*1999*

## AL APAR

Aldım dükanı, hər yerə özüm gəzdirdim əl,
Topdansatış açdım, canım ay müştəri, tez gəl!
Dərd-qəm satıram, mərdimazar, vurmaya kaş pəl.
Boldur hələ ki, gəl al apar, olmayacaq ha...
Ay müştəri, al ki sabaha qalmayacaq ha...

Hər fitnə-fəsad qulp olana gündə gərəkdir,
Düz işlərə əngəl törədən sanma ki, təkdir.
Zatıqırıq əlbəttə cəzasın çəkəcəkdir.
Qulp qoymağa söz var, al apar olmayacaq ha...
Ay müştəri, al ki sabaha qalmayacaq ha...

Gerçək donu geymiş yalanım var, alan olsa,
Hopdum sataram, xeyli ucuz, bir kalan olsa.
Hökmən gələcək almağa, darda qalan olsa.
Xeyrin görən olmuş, al, apar, olmayacaq ha...
Ay müştəri, al ki sabaha qalmayacaq ha...

Ah dərmanı var, al kişi, qoy dərdin azalsın,
At bir dənə, qan təzyiqini normaya salsın.
Aptekdə tapılmır, eşidənlər gəlib alsın.
Qurtarsa gileylənmə nahaq, olmayacaq ha...
Ay müştəri, al ki sabaha qalmayacaq ha...

Agah edirəm, aləmə qəsdən edirəm car,
Ağır güzərandan yaxa qurtarmağa yol var.
Gəl ki, elə iş tut ki, kişi, olmayasan xar.
Çarəm kəsilib, həb satıram, olmayacaq ha...
Ay müştəri, al ki sabaha qalmayacaq ha...

*1999*

## ARİF ADAMIQ

Korluq çəkirik, amma haray salmırıq, əhsən!
Hərdən həyəcan təbili də çalmırıq, əhsən!
Dünya dağıla, eynimizə almırıq, əhsən!
Heç uf demirik, ölsə də bir ac yanımızda,
Arif adamıq, çünki dözüm var canımızda!

Gendən görürük yurd talanır, göz yumuruq biz
Gəl gizləməyək ki, özümüz də umuruq biz.
Him-cim eyləyən olsa, əlüstü cumuruq biz.
Yan cib ki, dolur, mürgü vurur vicdanımız da,
Arif adamıq, çünki dözüm var canımızda!

Dövran bizə gün ağlamadı bu yaşımızda,
İllərlə zaman turp əkib ancaq başımızda
Yoxdur satılan bir şeyimiz, dam-daşımız da.
Min fitnə-fəsad virusu var qanımızda,
Arif adamıq, çünki dözüm var canımızda!

Dartışma uzandıqca hələ öz aramızda,
Yəqin ki, sağalmaz neçə illər yaramız da!
Dözməz belə dartışmaya heç mal-qaramız da.
Getsə belə, alt-üst olacaq ad-sanımız da,
Arif adamıq, çünki dözüm var canımızda!

Heyrətlə baxırsan, dediyim sanma yalandı,
Mömin sayılan birparası rüşvət alandı.
Baxma a kişi, hap-gopuna, zurna çalandı.
Çalma demirik, olsa da lap imkanımız da,
Arif adamıq, çünki dözüm var canımızda!

Qeyrət gəzirik özgələrində, özümüz bəs?!
Verdim bu sualı çoxuna, çıxmadı bir səs.
Hərçənd düşünür, ayrıca, öz taleyin hər kəs.
Biganəlik artır, dəyişir dövranımız da,
Arif adamıq, çünki dözüm var canımızda!

*2000*

## DÜZƏLƏR...

Sən basıb-bağlama çox köhnə zamandan, a kişi!
Olmusan guya uzaq ahdan-amandan, a kişi!
Nə ola, söz açasan yaxşı-yamandan, a kişi!
Eşidək, hali olaq, çətin bu dünya düzələ...
Xoş güzərana ümid, çünki hələ azdı, Lələ!

İndi millət axışır ruzi olan səmtə sarı,
Çarəsiz vadar olur, getməz əgər, olsa varı.
Görə öz bəndəsini, rəhmə gələ Tanrı, barı...
A kişi, olsa yalan bircə sözüm, tənqid elə,
Xoş güzərana ümid, çünki hələ azdı, Lələ!

A kişi, millət olub indi fağırdan da fağır,
Baxasan sir-sifətindən elə bil hüzn yağır.
Zamanın bəxtinə düşmüş bu ağır dərddi, ağır...
Quru vədlərlə düzəlməz axı müşkül məsələ...
Xoş güzərana ümid, çünki hələ azdı, Lələ!

Sübh-səhər bir çoxu iştahla yeyir yağla balı,
Kefi kök, qarnı da tox, kef çəkir əhli-əyalı.
Binəvanınsa acından dəyişir yolda halı.
Kasıbın dərdi sağalmaz, necə loğman da gələ,
Xoş güzərana ümid, çünki hələ azdı, Lələ!

Toxun acdan xəbəri yoxdu deyənlər, – yanılır,
Şübhəsiz hamı bu gün toxdu deyənlər, – yanılır.
Əl tutan, dada çatan çoxdu deyənlər, – yanılır.
Boş-bekar lap çoxalar ha... a kişi, getsə belə,
Xoş güzərana ümid, çünki hələ azdı, Lələ!

Gecələr sübhə qədər ah-vay edən azdı məgər?!
Allahın rəhmi gələ, amma o da xeyli çəkər.
Düzələr, bəzilərin rəndələyən olsa əgər.
Bağlayıb bənd-bərəni, gizli veriblər əl-ələ,
Xoş güzərana ümid, çünki hələ azdı, Lələ!

*2000*

## BELƏ-BELƏ İŞLƏR

Xaloğlunun əlindən,
Cəzanə gəlmişdim mən.
Səhər-axşam zəng edir,
Qulağımı dəng edir.
Guya biri borc alıb,
Vermir, get-gələ salıb.
Yaman dartışma olub,
Polisin cibi dolub.
Şayiələr toplayır,
Bala-bala goplayır.
Biri Həccə gedibmiş,
Guya tövbə edibmiş.
Küpünə girir indi,
Əyyaşın yeri tindi.
Söylədim: babal yuma!
Özüm keçdim "hücuma",
Qəfil kəsdim sözünü,
Dedim: yorma özünü,
Xəstəlik keçib sənə,
Bir də zəng etmə mənə!
Xaloğlu küsdü məndən,
Kaş küsəydi dünəndən,
Küsüb, rahatdır canım,
Şükür, qaralmır qanım.

*2000*

## AMAN ALLAH! BU NƏDİ?!

Gözə girmək mərəzi çoxdan hopubdur canına,
Başıboş cəhd eyləyir bəlkə bu yolla “tanına”.
Tərgidə bilməyəcək, çünki keçibdir qanına.
Belə tiplərlə düzü, hətta çörək də yemişəm,
Aman Allah! Bu nədi?! Böyləsini görməmişəm.

Bələd olduqca onun həm bəminə, həm zilinə,
Görürəm ustadı çox, dil çata bilməz dilinə.
Maska altında olan kimliyi kaş ki, bilinə.
Hardasa şəstlə deyib: “Mən qəmiş oğlu, qəmişəm”
Aman Allah! Bu nədi?! Böyləsini görməmişəm.

Əməlindən beləsi heç utanırmı görəsən?
Necə alçaldığını cüzi qanırmı, görəsən?
Gələcək taleyini əbləh anırmı, görəsən?
Yaltağa, harda gəlib, öz sözümü mən demişəm,
Aman Allah! Bu nədi?! Böyləsini görməmişəm.

Görəsən indiyəcən harda yatıbdır, beləsi?!
Hansı qoltuqda görən lövbər atıbdır, beləsi?!
Yəqin öz vicdanını orda satıbdır, beləsi.
Düşə fürsət, ipini yaxşıca ehmallı, eşəm,
Aman Allah! Bu nədi?! Böyləsini görməmişəm.

İtirib mənliyini, məsləkini, öz soyunu,
Yaltağın tək özünə xoş gəlir hər cür oyunu.
Ona bənzətmərəm heç dilsiz-ağızsız qoyunu,
Yaltağı ömrü boyu tənqidə tutmaqdı peşəm,
Aman Allah! Bu nədi?! Böyləsini görməmişəm.

## İNDİ DƏ DAD ELƏYİR

Potaboy, pul hərisi tutdu yükün pul-paradan,
Aləmi qatdı özü, istədi çıxsın aradan.
Kələyi tutmadı baş, qoymadı çünki, Yaradan,
Mitilin atdı çölə, dönməyəcək bir də geri,
Hələ də dad eləyir, yad eləyir köhnə yeri.

Damarından pul axır, bəlkə də al-qan yerinə,
Sinəsində döyünən puldu, ürək-can yerinə.
Pul gərəkdir belə bir pulgirə ad-san yerinə.
Yığdığı bəsdi yüz il, yoxdu hələ dərdi-səri,
Hələ də dad eləyir, yad eləyir köhnə yeri.

Öyünürdü arabir, guya kiminsə curudu,
Satdı-sovdu olanı, çıxdı sudan, qupqurudu.
Bağı, mülkü, maşını, əhvalı da dupdurudu.
Ölsə də, müftə götürməzdi işə bir nəfəri,
Hələ də dad eləyir, yad eləyir köhnə yeri.

Düz deyiblər: gədədən bəy ola bilməz, nə ola,
Qane olmurdu aza, heç cür o, gəlmirdi yola.
Uzadırdı hər işi, bəlkə cibişdanı dola.
Bazarın bağladılar, olmadı əsla xəbəri,
Hələ də dad eləyir, yad eləyir köhnə yeri.

Tapdadı duz-çörəyi, saymadı dostun sözünü,
Sən demə, pul gədənin pərdələyibmiş gözünü.
Uydu axırda felə, verdi güdaza özünü.
Qarışıb bir-birinə indi sevinci, kədəri,
Hələ də dad eləyir, yad eləyir köhnə yeri.

Büdrəyib harda, necə, anlamayıbdır, hələ də,
Gözləməzdi heç özü, quyruğu qalsın tələdə.
Belə namərdi gərək, zəmanə hökmən mələdə.
Bəxti vardı, o zaman şeş qoşa düşmüşdü zəri,
Hələ də dad eləyir, yad eləyir köhnə yeri.

*1999*

## DÖZMÜR, ÇATI TAPSIN...
(*Laqeyd müdirin dilindən*)

Fəhlə maaş almır neçə aydı, gözüm aydın!
Külfət deyinir, evdə də vaydı, gözüm aydın!
Bozbaş yerinə süfrədə çaydı, gözüm aydın!
Dözsün demaqoq, hövsələsin səbrlə bassın,
Dözmür, çatı tapsın, özünü tövlədə assın.

Göydən tökülür pul ki, yığım, paylayım hər ay?
Diz çöksə də, yalvarsa da, lap etsə də ah-vay.
Allah da eşitsə, səsinə verməyəcək hay
Dözsün demaqoq, hövsələsin səbrlə bassın,
Dözmür, çatı tapsın, özünü tövlədə assın.

Yanpörtü baxırlar mənə, sanki, günahım var,
Bəzən də deyən var qulağım guya olub kar
Tab etməlidir, gəlsə də qış, yağsa da bərk qar.
Dözsün demaqoq, hövsələsin səbrlə bassın,
Dözmür, çatı tapsın, özünü tövlədə assın.

Gəlmir vecimə, xətrimə hərdən dəyən olsa,
İşdə qapımı lap ayağıyla döyən olsa,
Çırtqozluq edib, hətta dalımca söyən olsa.
Dözsün demaqoq, hövsələsin səbrlə bassın,
Dözmür, çatı tapsın, özünü tövlədə assın.

Boynumda kasıbzadənin haqqı-sayı çoxdu,
Aylarla maaş almasa dinməz, gözü toxdu,
Hərçənd eləsi var ki, xudaya, tayı yoxdu!
Dözsün demaqoq, hövsələsin səbrlə bassın,
Dözmür, çatı tapsın, özünü tövlədə assın.

Ağlaşma qurub, hay salana bircə sözüm var,
Hərgah eləsə aləmə bu sirrimizi car.
Vallah, qovacam, qoy yerimi eyləməsin dar.
Dözsün demaqoq, hövsələsin səbrlə bassın,
Dözmür, çatı tapsın, özünü tövlədə assın.

*1992*

## HƏLƏ VAR

Lələ biznesmen olub, pulludu ki, ad-sanı var,
Dağı dağ üstə qoyar, istəsə, hər imkanı var.
Gəl ki, şəkk eyləyirəm onda müsəlman qanı var.
Çünki əl tutmayıb heç bircə qohum-qardaşına
And içən var Lələnin, bəlkə də heykəl başına.

Neçə yerdə dükanı, firması, hər yerdə payı
Gəl, xəsislikdə onun bəlkə də heç yoxdu tayı.
Qapıbir qonşusunun ərşə çıxır ahu-vayı. –
Acımır zərrə qədər naləsinə, göz yaşına,
And içən var Lələnin, bəlkə də heykəl başına.

Belə tüğyan eyləməz, olmasa arxa-dayağı,
Sanki göylərdə uçur, heç yerə dəymir ayağı.
Yol gedəndə görəsən lap yeriyir qaz sayağı
Bu ədası, yerişi əsla yaraşmır yaşına,
And içən var Lələnin, bəlkə də heykəl başına.

Bir cür insan yaradır, ay kişi, vallah, Yaradan,
Beləsi bəs görəsən peyda olubdur haradan?
Savada qalsa əgər, heç ağı seçmir qaradan
Hər kəsin kimliyi hərçənd, yazılır başdaşına,
And içən var Lələnin, bəlkə də heykəl başına.

Zənn edir ki, nə yığıbdır yeyəcək axıradək,
Bahalı hər nəyi varsa, geyəcək, axıradək.
Elə ömrü boyu “mən”, “mən” deyəcək, axıradək.
Zamanın dönsə üzü, son qoyacaq daşbaşına,
And içən var Lələnin, bəlkə də heykəl başına.

*1998*

## ƏFSUS Kİ...

Artdıqca kasıblaşma bu millət arasında,
İllər ötüşür dərd ilə zillət arasında.
Dartışma düşür evdə də külfət arasında.
Əslində gərək od tökülə hər sözümüzdən,
Bəsdir bu qədər müştəbeh olduq özümüzdən.

Hərdən də günahkar sayırıq qonşunu, ancaq,
İblis həmən iblisdi, dəyişmir donu, ancaq.
Ağır güzəranın da görünmür sonu, ancaq.
Sanki zəlidir bərk yapışıb xirtdəyimizdən,
Bəsdir bu qədər müştəbeh olduq özümüzdən.

Allah niyə verdi görəsən xalqa bu dərdi?
Gözlərdən axan göz yaşı yox, qəmdi, kədərdi.
Müşkül olan işdə, axı ah-vay da hədərdi.
Çoxdandı təbəssüm yox olubdur üzümüzdən,
Bəsdir bu qədər müştəbeh olduq özümüzdən.

Əfsus ki, hələ çoxdu kasıb, varlılar azdı,
Mülkü, maşını, bağça-bağı, kefləri sazdı.
Cibdə telefon, görməmiş oğlu ədabazdı.
Bax külfətinə, yubka geyir, ölçüsü dizdən,
Bəsdir bu qədər müştəbeh olduq özümüzdən.

Alim də çıxıb kürsüyə, dərdin deyir indi,
Köhnə-külədən hər nəyi varsa, geyir indi.
Daşdan yumşaq hər nə tapırsa, yeyir indi.
Getsə belə, nifrət yağacaq üz-gözümüzdən,
Bəsdir bu qədər müştəbeh olduq özümüzdən.

Yoxdur toxun acdan xəbəri, böylə zamandır,
Dəhşətdi! Təqaüdçülərin halı yamandır.
Rəhm eylə özün millətə, ay Allah, amandır!
Az mətləbə hərçənd ki, toxundum hələ üzdən,
Bəsdir bu qədər müştəbeh olduq özümüzdən.

*1998*

## DEYƏSƏN...

Dünən lüt gədəsi oxşasa da balqabağa,
Görünür pul-paradan xeyli düşübdür qabağa.
Baxasan, sir-sifəti bənzəyir unsuz tabağa.
Pulu üçkünc eyləyir qurdalamaqçün dişini,
Deyəsən, görməmiş oğlu unudub keçmişini.

Yerlibazlıq gədənin sanki hopubdur canına,
Harda olsa, elə bir-bir axışırlar yanına.
Pulun öz virusu var, bax o keçibdir qanına
Bəzən, hədsiz dəm olanda sürüyürlər leşini,
Deyəsən, görməmiş oğlu unudub keçmişini.

Gətirib bəxti yaman çünki, düşüb yağlı yerə,
Qapısı, pəncərəsi, yad üzünə bağlı yerə.
O şərikdir qohumu olduğu ortaqlı yerə.
Ədabaz yolda da "Sim-Sim"lə görür hər işini,
Deyəsən, görməmiş oğlu unudub keçmişini.

Dağı dağ üstə qoyan dağ kişilər çoxdu bekar,
Sənə dünya, nə deyim, eyləmisən kimləri xar.
Arxalı bir dələduz at oynadır, hər şeyi var.
Belə bir nakişiyə möhtac edibsən kişini,
Deyəsən, görməmiş oğlu unudub keçmişini.

Yağlı yer, süd gölüdür, çoxdu ora qarmaq atan,
Gedə bilməz o gölə, hər tiyan altında yatan.
Oranı zəbt eyləyib rütbəni dollarla satan.
Sən demə, pul dəyişirmiş zamanın gərdişini,
Deyəsən, görməmiş oğlu unudub keçmişini.

Pah atonnan! Buna mat qalmayasan neyləyəsən?
Alaq artırsa, haray salmayasan, neyləyəsən?
Götürər aləmi, tez çalmayasan, neyləyəsən?
Bəlkə tənqid arabir damğalaya dörd-beşini,
Deyəsən, görməmiş oğlu unudub keçmişini.

*1999*

## BU SƏBƏBDƏN DƏ OLUB...

Qondu şahlıq quşu sol çiyninə hardan, nə bilək,
Çox güman qoydu maya yığdığı vardan, nə bilək.
Qurtarıb bəlkə dayı yaltağı dardan, nə bilək.
Yıxılanda dayısı, car çəkəcək aləmə haqq, –
Bu səbəbdən də olub işlərimiz lap baş-ayaq.

Əlini vurmasa da ilboyu ağdan-qaraya,
Mülk, maşın, hər şey alıb müftə gələn pul-paraya.
Arxası bağlıdı, yəqin ki, bilən var, haraya.
Girələyir öz başını gör neçə ildir bu sayaq,
Bu səbəbdən də olub işlərimiz lap baş-ayaq.

Qoltuq altında yatan gündə girir əlli dona,
Pah atonnan! A kişi, söz də deyən yoxdu ona.
Çatacaq axırı bir gün "ŞOU" konserti sona.
Elə bu barədə də söhbət açan vardı bayaq,
Bu səbəbdən də olub işlərimiz lap baş-ayaq.

Qapıdan qovlasalar, pəncərədən yol tapacaq,
Olsa bir saxta sənəd, atmağa bir qol tapacaq.
Başlasa sorğu-sual, girməyə bir kol tapacaq.
Bəd ayaqda karına, çünki gəlir arxa-dayaq,
Bu səbəbdən də olub işlərimiz lap baş-ayaq.

Keçirib "süd gölünü" gör neçə ildir əlinə,
Oxşayır üzdəniraq boynuyoğun dağ kəlinə.
Göz yumanlar hələ var xəlvəti gəlhagəlinə.
Ortağı çoxdu əgər, şübhə edən varsa, sayaq,
Bu səbəbdən də olub işlərimiz lap baş-ayaq.

*2000*

## BİLMƏK OLMUR...

Kabinet xəstələri baxma, hələ işdədilər,
Üzlərindən oxunur ki, necə təşvişdədilər.
Elə him-cimdədilər, otaqda gərdişdədilər.
Gözləyirlər hələ ki, hər nədisə, sirdi hələ,
Bilmək olmur təzə bir hoqqadı bu, yoxsa tələ.

Yayılıb şayiə ki, dilxor olub pullu, kalan,
Görəsən doğrudu bu, yoxsa ki, qondarma yalan?
Tüstü çıxmaz tayadan olmasa bir çınqı salan.
Ağ yalandırsa əgər, bəs bu nə hay-küydü belə?
Bilmək olmur təzə bir hoqqadı bu, yoxsa tələ.

İstəyir birparası firmasını guya sata,
Götürə öz mayasın, hər gecə rahatca yata.
Yalvarır Allaha ki, çıxmaya kaş bircə xata.
Olsa da səksəkəli, şəkk eyləyir fitnə-felə,
Bilmək olmur təzə bir hoqqadı bu, yoxsa tələ.

Daraşıb yorğanına varlıların sanki birə,
Yumaq üçün günahın üz tutub axır ki, pirə.
Çalışır indi pirin kölgəsinə bəlkə girə.
Fırlanır dövrəsinə, bəlkə bir imdada gələ,
Bilmək olmur təzə bir hoqqadı bu, yoxsa tələ.

Kasıb almır vecinə, çünki nəyi var itirə,
İş-zad olsa, çalışır ki, yerinə tez yetirə.
Evinə, bəlkə, çörək, bir də yavanlıq gətirə.
İtirən öz başını şayiədən çoxdu lələ,
Bilmək olmur təzə bir hoqqadı bu, yoxsa tələ.

Xoflanan şayiədən sən demə, bir dəstə imiş,
Ola bilsin çoxunun şəkk qulağı səsdə imiş.
Xamların bir qulağın məxfi kəsə-kəsdə imiş.
Belə yolla neçəsi pul keçirib gündə ələ,
Bilmək olmur təzə bir hoqqadı bu, yoxsa tələ.

*1999*

## FAĞIR, BİNƏVA KASIB!

Aləmə car çəkirsən dərdini gör haçandı,
Zirzəmidə gözləmə MİS qapını açandı?!
Gəlib görsə halını başın tutub qaçandı.
Yaxşı ki, bu dünyada müftədi hava kasıb,
Ay evi bərbad olan fağır, binəva kasıb.

Ədalət axtarırsan, tapsan əgər, oğulsan!
Yatan bəxtin oyanmaz təzədən də doğulsan.
Əl verən olmaz hətta gölməçədə boğulsan.
Amandı xəstələnmə, bahadı dava, kasıb,
Ay evi bərbad olan fağır, binəva kasıb.

Durma yol qırağında başına yer qəhətdi?!
Kasıblıq taleyindən keçən bir qara xətdi.
Dözürsənsə möhnətə, bu çox yaxşı cəhətdi.
Həsrətdi, ətə-yağa, pas atıb tava, kasıb,
Ay evi bərbad olan fağır, binəva kasıb.

Ahın daşı əridər, daş ürəyə kar etmir,
İmkanlı görür səni, zərrə qədər ar etmir.
Ömründə bir dəfə də axı, ahu-zar etmir.
Özünə tən olmağı o, bilməz rəva, kasıb
Ay evi bərbad olan fağır, binəva kasıb.

Taleyindən xəbərsiz çəkir dara zəmanə,
Səni salıb bu hala üzüqara zəmanə
Aparır belə kökdə səni hara zəmanə?
Malın yox, dövlətin yox, dilin də yava kasıb,
Ay evi bərbad olan fağır, binəva kasıb.

*1999*

## SATMAQDADI...

Dünyanı tez tərk elədin, ay dədə!
Kasıb-kusublar edir ah-vay, dədə!
Səslərinə yoxdu verən hay, dədə!
Çarə qılanlar hələ yatmaqdadı,
Ağ yalanı millətə satmaqdadı.

Xoş güzərandan bir əsər qalmayıb,
Möcüzədi, sözdə kəsər qalmayıb.
Qəlbi yanan sanki bəşər qalmayıb.
Varlı pulun dal günə atmaqdadı,
Ağ yalanı millətə satmaqdadı.

Yaxşı ki, köçdün, bu günü görmədin,
Dəbdəbəli toy-düyünü görmədin.
Kim kimə çox güldüyünü görmədin.
Çox gülən öz kamına çatmaqdadı,
Ağ yalanı millətə satmaqdadı.

Baş əymədin zərrəcə namərdə sən,
Çətin dözərdin bu ağır dərdə sən.
Nə yaxşı ki, əl çatmayan yerdəsən
Hoqqabazı hoqqa çıxartmaqdadı
Ağ yalanı millətə satmaqdadı.

Şəkk qulaq hədsiz çoxalıb, çoxdu, çox!
Şikayətə məhəl qoyan yoxdu, yox!
Özləri, çünki dədəcan, toxdu, tox!
Kül üfürənlər gözə artmaqdadı,
Ağ yalanı millətə satmaqdadı.

Ölməyin hədsiz mənə dağ çəkdi, dağ!
Kaş ki, öləydim dədə, səndən qabaq
Çoxdu hələ ağlı dayaz, balqabaq.
Bəzisi pul içində batmaqdadı,
Ağ yalanı millətə satmaqdadı.

*2000*

## TƏZAD

Bulvara bəzi harın gündə zər atmağa gedir
Ya udur, ya uduzur, dəmdisə yatmağa gedir.
Kasıb isə palazın hardasa satmağa gedir
Bu təzad bəndələrin, yoxsa zamanın işidi?
Bu təzad dünyamızın sağalmayan bəd şişidi.

Biri sərgərdan olub iş gəzir hər gün özünə,
O biri rüşvət alır, dünya görünmür gözünə.
Çünki dəllaldı axı müştəri var hər sözünə.
Dünənin bambılısı zənn eyləyir ki, kişidi,
Bu təzad dünyamızın sağalmayan bəd şişidi.

Eləsi var yığılıb cümlə qohumlar başına,
İmkanı var ki, çexol tikdirə puldan maşına.
Kasıbı ehtiyacı qərq eyləyir göz yaşına.
Bu nədi, faciədi, ömrümüzün keçmişidi?
Bu təzad dünyamızın sağalmayan bəd şişidi.

Varlını görmüsən heç ah çəkə, ya dad eyləyə?
Dara düşsə əl atır xəlvəti hər cür kələyə.
Kasıb olsa, qalacaq bircə ümidi fələyə.
Kələk işlətmək axı pulluların vərdişidi,
Bu təzad dünyamızın sağalmayan bəd şişidi.

Dünya bir sirli dəniz, orda üzən çoxdu hələ,
Pullular qəvvas olur, onlara tay yoxdu hələ.
Ac kasıbdır hələlik, varlı, filan toxdu hələ.
Nədi bu, bəlkə də hər taleyin öz gərdişidi?
Bu təzad dünyamızın sağalmayan bəd şişidi.

A kişi, söylə görüm, qəlbini sıxmır bu təzad?
Axı neyçün çoxalır, bəs yoxa çıxmır bu təzad?
Günahı baisin boynuna yıxmır bu təzad?
Bu təzad ah-vay edən millətimin təşvişidi,
Bu təzad dünyamızın sağalmayan bəd şişidi.

*1999*

## OLSAN DA BEKAR...

Evdə uzanıb axşamacan yüz dəfə zarı,
Xeyri nədi, zarıltı oyatmaz axı karı.
Çıx çöldə bağır istəyini bir kərə barı.
Bəlkə tapıla iş yeri bundan belə, fəhlə!
Olsan da bekar, şellən özünçün hələ, fəhlə!

Fəhlə yada düşmür, kimə nə acdı, ya toxdu,
Can qoyduğun iş yerləri viranədi, yoxdu.
Qəm-qüssə içində boğulan bəlkə də çoxdu.
Heç gözləmə xoş gün öz-özündən gələ, fəhlə!
Olsan da bekar, şellən özünçün hələ, fəhlə!

Bir loğma çörəkçün küçədə səbzi satırsan,
Çarən kəsilib, çünki görürsən ki, batırsan.
Bəzən də neçə arzuna röyanda çatırsan.
Dünya düzələr heç, baxırıqsa ələ, fəhlə?
Olsan da bekar, şellən özünçün hələ, fəhlə!

Külfət qınamır, çünki bilir yoxdu günahın,
Şahiddi özü, ərşə çıxır naleyi-ahın.
Çox çəkmə xəcalət, tapılar bəlkə pənahın.
Axtar bir əlac, dərdinə çarə elə, fəhlə!
Olsan da bekar, şellən özünçün hələ, fəhlə!

Həsrətlə baxırsan ətə yəqin ki, görəndə,
Nəfsin çəkir, ancaq pul hanı almağa səndə?
Yoxdursa gəlir bircə qəpikdə neçə gündə.
Ət-yağ sözünü evdə gətirmə dilə, fəhlə!
Olsan da bekar, şellən özünçün hələ, fəhlə!

Çarən nədi, sən dözməlisən iş düzəlincə,
Azuqə tədarük elə qış fəsli gəlincə.
Yoxsa keçinərsən, eşidib, qonşu bilincə.
Başda oturanlar halını kaş bilə, fəhlə!
Olsan da bekar, şellən özünçün hələ, fəhlə!

*1999*

# ... HƏDƏRDİ

Tale səni vaxtsız sürüyüb saldı atından,
Dərdin ox olub, sanki, keçib yeddi qatından.
Kam al barı ömrün ötüşən hər saatından.
Göz dikmə bu dünya malına gəldi-gedərdi,
Ah-vay eləmək fani bu dünyada hədərdi.

Ağır güzəran olmayıb heç vaxt belə, ey dost,
Səbrin tükənib, çünki baxırsan ələ, ey dost.
Az-çox nə tapırsan yeməyə, şükr elə, ey dost.
Üzlərdə dərin iz buraxan qəmdi, kədərdi,
Ah-vay eləmək fani bu dünyada hədərdi.

Dırnaqla gor eşdin, gecəni gündüzə qatdın,
Az-maz gəlirin cüzisini dal günə atdın.
İşsiz qalan illərdə nəyin vardısa satdın.
Olsaydı dayın sağ, sənə bir çarə edərdi,
Ah-vay eləmək fani bu dünyada hədərdi.

Düşmüşdü zərin şeş qoşa neyçün axı çöndü?
Bəxtin yatan anda çırağın da özü söndü.
Dövran ki, dəyişdi fələyin də üzü döndü.
Namərdlərə möhtac eylədi gör necə mərdi,
Ah-vay eləmək fani bu dünyada hədərdi.

Dövran yıxanı qaldıra bilmir axı heç kəs,
Gördün ki, qohum-əqrəbadan çıxmadı bir səs.
Dar gündə ölüblər ki, məgər, hardadılar bəs?
Şotka götürüb saysan əgər, gör nə qədərdi,
Ah-vay eləmək fani bu dünyada hədərdi.

*1999*

## QALMAZ BU DÜNYA BELƏ...

Sən Allaha şükr elə, təkan verən dağ oldu,
Müftə düzəldin işə, yerində çim yağ oldu.
Daşbaşın sayəsində kef-damağın çağ oldu.
Arxalısan sən deyə, quran olmayıb tələ,
Çox güvənmə, ay kişi, qalmaz bu dünya belə.

Yapışdığın ətəkdən əlin üzüləndə bax!
Qərəzli əməllərin sapa düzüləndə bax!
"Torba" tiksələr sənə, ağzı büzüləndə bax!
Əl tuta bilməz sənə fələk də göydən gələ,
Çox güvənmə, ay kişi, qalmaz bu dünya belə.

Dağ oynasa yerindən, güclü zəlzələ vaxtı,
Qaçıb tərk edəcəksən oturduğun bu taxtı.
Qınama ha.., qınama onda taleyi, baxtı.
Nələr gözləyir səni dərk eləmirsən hələ,
Çox güvənmə, ay kişi, qalmaz bu dünya belə.

Göylə gedirsən yenə, yerə dəymir ayağın,
Dəyişsə dövran axı laxlayacaq dayağın.
Sönəcək öz-özündən şölə saçan çırağın.
Yubanma, sən indidən nə var yerbəyer eylə,
Çox güvənmə, ay kişi, qalmaz bu dünya belə.

Dəhliz də, kabinet də var-gəlinə dar gəlir,
Köhnə plaş geyməyin indi sənə ar gəlir.
At oynadırsan bu gün, çünki hələ var, gəlir.
Əlin bəd gətirəndə quyruğun keçər ələ,
Çox güvənmə, ay kişi, qalmaz bu dünya belə.

*1999*

## YAYILIB...

Yerlimə arxa çevirsəm qınayarlar adamı,
Əlim üstündə olan az qala alsın qadamı
Kəndçimi burda qoyub, əl tutum indi yadamı?
Nə deyər bəs eşidən, başqası yox, lap elə sən?
Yayılıb şayiə ki, yerlibazam guya ki, mən.

Yerlim olsa sağ əlim, sahmana sallam işimi,
Özgəsi qurğu qurur qurdalasam bir dişimi.
Tökülüb üstümə hay-küylə yığarlar vişimi.
Yad mənə can da desə, yerlimə olmaz yenə tən
Yayılıb şayiə ki, yerlibazam guya ki, mən.

Yad elə yaddı axı, olsa qohumdan da yaxın,
Yada üz versəm əgər, başlanacaq gündə axın.
Elə ki, artdı sayı, onda gəlin keyfə baxın.
Bəzisi şərçi olur, bəzisi də zəhlətökən
Yayılıb şayiə ki, yerlibazam guya ki, mən.

Damğa da vursa paxıl, ovqatıma kar eyləməz,
Yüz oyundan çıxa da gen yerimi dar eyləməz,
Tapdamaz duz-çörəyi, yerli məni xar eyləməz.
Özgədən görməmişəm, çünki xeyir indiyəcən,
Yayılıb şayiə ki, yerlibazam guya ki, mən.

Hərə öz yerlisini kölgəsinə alsa əgər,
Azalar ac-yalavac, bəlkə də çox şey düzələr.
Xoş gedər Allaha da, de, savab iş pisdi məgər?
A kişi, sən də elə yerlipərəstsən deyəsən?
Yayılıb şayiə ki, yerlibazam guya ki, mən.

*1999*

## VALLAH, DEMƏK OLMUR...

Meydan hərəkatı zamanı lərzəyə saldı,
Hayqırdı bu millət özü azadlığın aldı.
Sandıq ki, çətin günlərimiz arxada qaldı.
İndi nöş ağırdır güzəran, kimdi günahkar?
Vallah, demək olmur nə qədər ac-yalavac var.

Bir baş ki, dumanlandı pulun gəlhagəlindən,
Heç uf da deməz, oynasa Yer öz təməlindən.
Əfsus ki, çəkinmir beləsi bəd əməlindən.
Allah xofu olsa ürəyində axı qorxar,
Vallah, demək olmur nə qədər ac-yalavac var.

Harda nə vəzifə boşalır, pulludu başda,
Dəxli belə yoxdur ola vallah, neçə yaşda.
Haqsızlıq olanda dil açır az qala daş da!
Millət susur, öz dərdini neyçün eləmir car?
Vallah, demək olmur nə qədər ac-yalavac var.

Nəfsin cilovun öz əlinə dollar alıbdır,
İnsaf daha yoxdur, adı lüğətdə qalıbdır.
Xalqı bu günə bəlkə keçid dövrü salıbdır?
Heyrətlə baxırsan, qulağın yoxsa olub kar?
Vallah, demək olmur nə qədər ac-yalavac var.

Ah-vay eləməkdən qabar olmuş daha dil də,
Allah ümidinə dolanaq bir neçə il də.
Aylar tutalım keçdi dayı, ya əmigildə.
Bəs sonra nə olsun, gələcək çarə qılanlar?
Vallah, demək olmur nə qədər ac-yalavac var.

*1999*

## GÖRDÜM

Dollar ki, durub indi zamanın sükanında,
Gördüm yuxuda tindəki baqqal dükanında,
Vicdan satılır tərcümeyi-halı yanında
Təriflə dolu, büsbütün hap-gopdu yalandan
Baqqal da güdür xeyri cibişdanı kalandan.

Evdə nəyimiz vardı, daha satdıq, ilahi!
Vicdan satılırsa, deməli, batdıq, ilahi!
Rüsvayçılığın zirvəsinə çatdıq, ilahi!
Baş qatmağı da öyrənirik zurna çalandan,
Baqqal da güdür xeyri cibişdanı kalandan.

Vicdan satışı möcüzədi, yaddı bu yurda,
Aləm axışar satmağa vicdanını burda.
Vicdan satanı, kimsə yerində kaş oturda
Yoxsa gələcək gündə səsi köhnə dalandan
Baqqal da güdür xeyri cibişdanı kalandan.

Çoxdur ləkəli vicdanı hərraca qoyanlar,
Xamlar ala bəlkə, ya da fitvaya uyanlar.
Carçı bağırır, xorna çəkir xalqı soyanlar.
Alver də sönüb, çünki satan çoxdu alandan,
Baqqal da güdür xeyri cibişdanı kalandan.

Vicdan nədi, kimsə soruşub su pərisindən,
Rişxəndlə deyib ki, soruşun pul hərisindən.
Nəynən alıb o, çəkməni timsah dərisindən
Hədsiz dəyişib, üstünə pul kölgə salandan,
Baqqal da güdür xeyli cibişdanı kalandan.

Vicdan satılır, bu yalan olsaydı nə vardı?!
Yəqin ki, cəmiyyət özü hay-küy qopardı.
Əfsus ki, bu hal rütbəlilərdə bir azardı.
Satsın baha, alsın çox ucuz darda qalandan
Baqqal da güdür xeyli cibişdanı kalandan.

*2000*

## ŞÜKR EYLƏYİRƏM...

Gen bol kabinetdə elə ki, tənha qalırdım,
Müftə gəliri çin-çin edib ləzzət alırdım
Öyrəncəli olmuşdu əlim çırtma çalırdım
Heyhat! Bu nədi, göydə gəzir indi xəyalım?!
Kövrəltmə məni, ay qağa, pəjmürdədi halım.

Şəksiz, canıma lərzə salan adda günah yox,
Ağzımda zəhər varsa, acı dadda günah yox.
Nəfsim məni yıxdı a kişi, yadda günah yox.
Heç kəs demədi, tərifə aldanma, a zalım!
Kövrəltmə məni, ay qağa, pəjmürdədi halım.

Dağ boyda vəzifəm başıma kölgə salanda,
Sayəmdə tanış, dost günü-gündən ucalanda.
Bəzən də gəlirdi karıma yağlı yalan da.
İşdən qovulanda havada qaldı sualım,
Kövrəltmə məni, ay qağa, pəjmürdədi halım.

Hökmün cilovu olsa da illərlə əlimdə,
Xeyrim olan işlərdə olub fitnə-felim də.
Allah özü haqsızlığı gördü əməlimdə.
Bərk silkələdi, qoymadı zövqümcə kam alım,
Kövrəltmə məni, ay qağa, pəjmürdədi halım.

Daşdan keçən hər bir sözümün qüdrəti vardı,
İndi baxıram, sanki, bu dünya mənə dardı
Qalsın hələlik sonraya bu söhbətin ardı.
Şükr eyləyirəm, yaxşı ki, var cahı-calalım,
Kövrəltmə məni, ay qağa, pəjmürdədi halım.

*2000*

## FƏRZ ELƏ Kİ...

Fərz elə ki, hap-gopunu qanmıram,
Eyb eləməz, kəmsavadam, danmıram.
Gərçi elə boş-boşuna yanmıram.
Çünki kalan kəm-kəsirin var, müdir,
Bəsdi bağırdın, deyiləm kar, müdir!

Müftə gəlir olduğunu görmürük?
Xam hərifi "yolduğunu" görmürük?
Yan cibinin dolduğunu görmürük?
Yoxdu məgər, səndə həya, ar, müdir?
Bəsdi bağırdın, deyiləm kar, müdir!

Vurulmusan göy kağızın rənginə,
Keçirmisən yağlı yeri cənginə.
Heyf, zərbə dəyməyibdir ənginə.
Dəysə, olar dünya sənə dar müdir!
Bəsdi bağırdın, deyiləm kar, müdir!

Yaş süzülür millətinin gözündən,
Sənsə elə müştəbehsən özündən.
Baş açmıram əməlindən, sözündən.
Yalan demə, edər səni xar, müdir!
Bəsdi bağırdın, deyiləm kar, müdir!

Gözün doymur bu dünyanın malından,
Xəbərsizsən pulgirlərin halından.
Gəlir səsi məhkəmənin zalından.
Sürüşməsən, eyləyəcəm car, müdir,
Bəsdi bağırdın, deyiləm kar, müdir!

*2000*

## YOXDUR BİR ƏTƏK...

Yatdıqca cahan əhli bu qəflət yuxusunda,
İllərlə görüb bolluca sərvət yuxusunda.
Şükr etməyə də eyləyib adət yuxusunda.
Əfsus ki, düşüb təşvişə röyadan ayılcaq,
Vallah, belə millət bir olar, ya iki ancaq!

Ah-vayla verilmir axı heç nə bu cahanda,
Yoxdur bir ətək ki, tutasan ən çətin anda.
Aləm tapır öz çarəsini ah da, aman da.
Arsızları hərçənd eləyir ilboyu lağ-lağ
Vallah, belə millət bir olar, ya iki ancaq!

Tanrı yerə baxdıqca qalır mat-məəttəl,
Çünki, yaradır çox şeyə millət özü əngəl.
Xeyrin güdənə sərfəsiz işdirsə, vurur pəl.
Maymaq da susur, çünki olub əldə oyuncaq,
Vallah, belə millət bir olar, ya iki ancaq!

Millət çəkəni çəksə əgər, birpara kəslər,
Yəqin ucalar göylərə lənət dolu səslər.
Aydındı ki, qəlbində bu dövrana nə bəslər.
Dözməz axı, illərlə olub kef-damağı çağ,
Vallah, belə millət bir olar, ya iki ancaq!

İnsan elə məxluqdu ki, hər şeydən umandı,
Acgözləri ehsan verilən səmtə cumandı.
Can atdığı aləm özü xülyadı, gümandı.
Şəksiz gözü doymaz, işi lap olsa da çim yağ,
Vallah, belə millət bir olar, ya iki ancaq!

Dünya malı dünyada qalır, bəllidi çoxdan,
Heç kəs qaça bilməz fələyin atdığı oxdan.
Kef-hal soruşan olsa, ya acdan, ya da toxdan.
Yəqin ki, deyər, çoxları çoxdan eyləyib ağ,
Vallah, belə millət bir olar, ya iki ancaq!

*2000*

## AY DAYI...

Ay dayı, xeyli zamandır gəzirəm boynubükük,
Qəddimi dövran əyib, dərddi bu çiynimdəki yük.
Başım ağappaq olub, qalmayıb heç bir qara tük,
Batıram borcun içində, çox ağırdır güzəran,
Dayıcan, sazdı kefin, mənim də bir halım yan.

Külfət ah-vay eyləyir, tez araya söz qatıram,
Neyləyim, çarə nədi, hətta yalan da satıram.
Elə bəd gün də olur ki, gecə şamsız yatıram.
Ümidim tək sənədir, əl tutanım yoxdu, inan,
Dayıcan, sazdı kefin, mənim də bir halıma yan.

Dünənin dəllalını zorla çəkiblər qabağa,
Üz-gözündən görünür nömrədi başdan-ayağa.
Neçə vaxtdır bekaram, dönmüşəm artıq yumağa.
Düşmüşəm qəm gölünə, çıxmağıma azdı güman,
Dayıcan, sazdı kefin, mənim də bir halıma yan.

Hərənin bir dayısı... olmayanın vay halına! –
Ötürürlər qapıdan əlüstü kandar dalına.
Qalsa işsiz, dönəcək başaçıq, ayaqyalına,
Yüzdü, mindi eləsi, bir ürəyi varmı yanan?..
Dayıcan, sazdı kefin, mənim də bir halıma yan.

Dünyagörmüş kişisən, bir işarə bəsdi sənə,
İndi də çoxdu çapanlar kor atı köndələnə.
Hər görəndə baş əyən indi salam vermir mənə.
Ciblərim boşdu deyə, haqqı-sayı çoxdu danan,
Dayıcan, sazdı kefin, mənim də bir halıma yan.

Eləsi var ki, inan, kef-damağı olsa da saz,
Yenə də gileylənir ki, “gəlirim azdı, çox az”...
Vaxtı çatdı, vuracaq zəmanə yəqin ki, qapaz.
Olacaq bəlkə məndən də betər halı yaman,
Dayıcan, sazdı kefin, mənim də bir halıma yan.

*2003*

## SƏN DƏ YAZ!

Yaz ay qələm, gördüyünü sən də yaz,
Keyfimizi bəlkə duruldaq bir az
Yoxsa bu işlər çətin olsun taraz.
Əlbir olaq işləri sahmanlayaq,
Dərk eləyək səhvimizi, anlayaq.

Sən də çaşıb düz yolunu azma, gəl,
Doğru sözü tərsinə sən yazma, gəl
Dalda qərəzlə quyunu qazma, gəl
Əyriləri tənqid edək, danlayaq,
Dərk eləyək səhvimizi, anlayaq.

Milçəyi döndərmə nahaqdan filə,
Bəmdə dayan, boş yerə qalxsan zilə,
Sən özünü bil ki, salarsan dilə.
Şərləməyi boş quru söz sanmayaq,
Dərk eləyək səhvimizi, anlayaq.

Həddini gəl aşma, amandır, qələm!
İndi zaman başqa zamandır, qələm!
Şərləyənin halı yamandır, qələm!
Yağlı, şirin vədlərə aldanmayaq,
Dərk eləyək səhvimizi, anlayaq.

Ortada vurnuxma gələrsən gözə,
Qulp qoyur indi çoxusu hər sözə.
Tənqidə ancaq gərək hər kəs dözə.
Nöqsanımız olduğunu danmayaq,
Dərk eləyək səhvimizi, anlayaq.

## A MÜƏLLİM!

A müəllim, nə anam var, nə atam, dadıma çat!
Yetiməm, evdə də şey yoxdu satam, dadıma çat!
Yaz mənə bir yoluq üç, qoyma batam, dadıma çat!
İndi, yəqin atamın da qaralım gorda qanı,
Xəyalından nə keçir, anlayıram, amma hanı?..

Kəsilən oldusa da, əsginası gəldi kara,
Başıma gəlsə əgər, bəlkə də qallam avara.
Əl tutan olmayacaq, vallah, əl atsam da hara.
Əlacım bircə qalır Allaha, alsın bu canı,
Xəyalından nə keçir, anlayıram, amma hanı?..

Nə ola, kövrələsən, yumşala az-maz ürəyin,
Fani dünyada bilən yoxdu məramın fələyin.
Döndərəndə üzünü, bəlkə mən oldum gərəyin.
Vaxt olub, möhtac edib ərbaba sərdarı, xanı,
Xəyalından nə keçir, anlayıram, amma hanı?..

Taleyim bəd gətirib, bircə ümidim sənədir,
Çox deyildir kəsirim, gizləmirəm, bir dənədir.
Yaxşılıq, mən biləni tarixi bir ənənədir.
Nə olar, yad eləsən tarixi, keçmiş zamanı?
Xəyalından nə keçir, anlayıram, amma hanı?..

Yaz mənim qiymətimi, üz çevirim kəndə sarı,
Nə zamandır yolumu gözləyir ağsaçlı qarı.
Bu qədər yalvarıram, insafa gəl sən də barı.
Nənəmin bil ki, gəlir tək mənə ancaq gümanı,
Xəyalından nə keçir, anlayıram, amma hanı?..

A müəllim, nənəmi al nəzərə, gəl üçü yaz,
Eşidib şad xəbəri, barı sevinsin o bir az.
Görməyə getməliyəm, olsa gətirəm sənə qaz.
Nə olar, gəl o yana, kəndimizi sən də tanı,
Xəyalından nə keçir, anlayıram, amma hanı?..

*1999*

## BAŞ TUTMADI...

Qırğınları şəksiz ki, “məharətlə” salırsan,
Millət əzilir, şəstlə baxıb ləzzət alırsan.
Dingildəyib hərdən də yəqin çırtma çalırsan.
Vallah, belə çirkin əməlin millətə qəsddi.
Allah da bezib, ağ eləmə, həvəsdi-bəsdi!

Keçmişdə günahın nə olub dərk elə barı,
Vicdanı satıb, atma itə namusu, arı.
Lənətlədi, hətta səni ağsaç qoca qarı.
Qatmaq aranı səndə bu çoxdankı həvəsdi,
Allah da bezib, ağ eləmə, həvəsdi-bəsdi!

Sərmayə alıb əcnəbidən, həddini aşdın,
Yəqin ki, gicəlləndi başın, əlüstü çaşdın
Çatmırdı zorun, boş yerə dövlətlə tutaşdın.
Hərçənd səni təbrik eyləyənlər də tələsdi,
Allah da bezib, ağ eləmə, həvəsdi-bəsdi!

Bətnində xəyanət boy atıb, ərsəyə çatdı,
Çıxdı eşiyə, saldı haray, aləmi qatdı
Fitnə-fəsadın tufanı gördün necə yatdı?!
Göz açmağa heç qoymadı millət yolu kəsdi,
Allah da bezib, ağ eləmə, həvəsdi-bəsdi!

Bəy, bəy deyə, dövrəndə gəzən qulbeçələr var,
Təriflə səni “dağ” başına qaldırıb onlar
Yersiz atılıb-düşmə, olub niyyətin aşkar.
Him-cim elədin ki, qara yellər yenə əsdi,
Allah da bezib, ağ eləmə, həvəsdi-bəsdi!

Baş tutmadı hiylən, hədəfə dəymədi güllən,
Yer tap özünə gözdən uzaq, orda da küllən.
Kef çək hələlik çöldə-bayırda, hələ şellən.
Xalqın tələbi, sanma ki, yersizdi, əbəsdi,
Allah da bezib, ağ eləmə, həvəsdi-bəsdi!

*2003*

# KÖHNƏ QONŞUM...

Əlimin bəd gətirən vaxtı işim düşdü dara,
Ümidim çıxdı boşa, vallah, əl atdımsa hara.
Gəlmədi karlı qohum da belə dar gündə kara
Gözləmirdim belə bir müşkül olan iş düzələ,
Köhnə qonşum əl uzatdı və düzəldi məsələ.

Yıxılan yerdə dikəldim, yenə durdum ayağa,
Eşidib, əlüstü düşmüşdü qohum əl-ayağa.
Yəqin etdim ki, bu tip nömrədi başdan-ayağa.
Bil dedim: xalı deyil dünya yaxşılardan hələ,
Köhnə qonşum əl uzatdı və düzəldi məsələ.

Yad mənim dadıma çatdı, qohumum tutmadı əl,
Yalvarır indi mənə, "dur mən ölüm, bir bizə gəl"
Getmərəm çöksə də diz, qoymaram heç əsla məhəl.
Özü çox yaxşı bilir kim mənə qurmuşdu tələ,
Köhnə qonşum əl uzatdı və düzəldi məsələ.

Sən demə, barmağı varmış bu işimdə gədənin,
Bəllidir aqibəti mərdimazarlıq edənin
Ağlı olmur gədə fitvasına vallah, gedənin.
Çox nahaq, qohum bilib əl açmışam bədəmələ,
Köhnə qonşum əl uzatdı və düzəldi məsələ.

Belə naqis qohumun olmağının xeyri nədir?
Dədəsi gorbagorun getdiyi yolla gedir.
Demə, əlmuzdu alır xəlvəti dəllallıq edir.
Qoymaram kandarıma minnətə lap gəlsə belə,
Köhnə qonşum əl uzatdı və düzəldi məsələ.

*2003*

## KİMDİ, ÖZÜN TAP!

Yaltaqlığa varmış necə meyli, aman Allah!
Öyrəncəlini ram edə bilmir, zaman, Allah!
Şəksiz olacaq taleyi, halı yaman, Allah!
Yüzcə qrama lap tiyan altında yatandı, –
Şəkk etmə, keçi qiymətinə adam satandı.

Keyfi kökəlir lap, elə ki, yan cibi doldu;
İndi, hələ ki, keyfə baxır, hər şeyi boldu.
Antenası çox yaxşı tutur, harda nə oldu;
Düşsə girəvə dosta da daldan daş atandı, –
Şəkk etmə, keçi qiymətinə adam satandı.

Aləm biləcək, yanında bir "qa" eləsən sən;
Vadar eyləyir ki, deyəsən lap, beləsən sən –
Robot sayağı, sanki, qurulmuş tələsən sən.
Əbləh aranı xeyri olan yerdə qatandı, –
Şəkk etmə, keçi qiymətinə adam satandı.

Satqınlığa adət eyləyib, andı yalandı;
Çünki, gözüac, nəfsi iti, rüşvət alandı.
Züyçü gərək olmur, özü tək zurnaçalandı;
Zənn etmə ki, tənqid eləsən bəlkə utandı, –
Şəkk etmə, keçi qiymətinə adam satandı.

Etdi neçə il qulbeçəlik, qeydinə qaldı, –
Məclisdə durub oynadı da, çırtma da çaldı;
Axırda şefin zurna qavalla yola saldı.
Xeyri olan işdə bu hərif çömçə tutandı, –
Şəkk etmə, keçi qiymətinə adam satandı.

Əfsus ki, çox azdır tanıyan, şarlatandı lap!
Doldur tuluğun, min belinə, axşamacan çap.
Yazdım neçə cür nəm-nişanın, kimdi özün tap! –
Dollar verənin dadına hər işdə çatandı, –
Şəkk etmə, keçi qiymətinə adam satandı.

*2004*

## A KASIB!

A kasıb, dərd elə ki, qəm dolu dünyada bu gün,
Müşkül işdir, düşəsən hardasa bir yada, bu gün.
Kimsədən umma nicat, azdı çatan dada, bu gün.
Çox şükür Allaha ki, alverə imkan var hələ,
Birtəhər çaxçux elə, qalmayacaq dünya belə!

Səndə imkan nə gəzir gündə plov, aş yeyəsən, –
Ya da əmlik pitisi, ya da ki bozbaş yeyəsən.
Sən gərək darda qalanda, üyüdüb daş yeyəsən.
Qorxma, mədən əridər, bil, bu "qida" düşməz ələ,
Birtəhər çaxçux elə, qalmayacaq dünya belə!

Taleyin bəd gətirib, Allaha yalvar, əl uzat,
Səbr elə, sən hələlik dərdini El dərdinə qat.
Ölməsən, bitməyəcək çünki, əzablı bu həyat
İzlə dünyanın işin, yatma, nə də uyma felə,
Birtəhər çaxçux elə, qalmayacaq dünya belə!

Qına öz bəxtini, dövranda günah yoxdu, yəqin,
Səni Allah yaradıb, onda səbr çoxdu, yəqin.
Asi düşmə nə ola, qarnın hələ toxdu, yəqin.
Zamanın nəbzini tut, öz başına çarə elə,
Birtəhər çaxçux elə, qalmayacaq dünya belə!

Dünyanın bəllidi ki, bir əzəli, bir sonu var,
Sirli dünya belədi, min üzü, min bir donu var.
Tək deyilsən axı sən dərddə bu gün milyonu var.
Səsini kaş eşidə, Allah özü rəhmə gələ,
Birtəhər çaxçux elə, qalmayacaq dünya belə!

*2000*

## AMAN ALLAH, KÖMƏK OL!

Ahımız ərşə çıxır, Allah amandır, kömək ol!
Ölən öldü, qalanın halı yamandır, kömək ol!
Gün keçir səksəkədə, başqa zamandır, kömək ol!
Bizə meydan oxuyan hər cürə fəndə əl atır,
Xallı bir daydayının kölgəsi altında yatır.

Zalıma zərrə qədər kar eyləmir haqq sözümüz,
Daş dəyir kəlləmizə, amma açılmır gözümüz.
Gədələr ağ eləyib, çünki qudurtduq özümüz.
Hay salır, istəyinə zorla da lap, olsa çatır.
Xallı bir daydayının kölgəsi altında yatır.

Pah atonnan! Bu yerin sahibi yoxdur elə bil,
Sahibi-hökmdara taleyimiz bəlli deyil?!
Azğının həmləsinə dözməliyik bir neçə il?
Göz dikib torpağıma zatı qatır oğlu qatır,
Xallı bir daydayının kölgəsi altında yatır.

Həb veriblər elə bil ki, bu qədər yatmaq olar?
Quru fərman gücünə arzulara çatmaq olar?
Yalın əllə bu qədər quldura heç batmaq olar?
Uydurub şayiələr, namusu, vicdanı satır,
Xallı bir daydayının kölgəsi altında yatır.

Çağır Allah, bu eli birliyə, bir doğru yola,
Gərək el yumruğunun dəydiyi nöqtə bir ola.
Birliyi görsə quduzlar girər hər yerdə kola.
Düşsələr qəm gölünə, bir də görərdik ki, batır,
Xallı bir daydayının kölgəsi altında yatır.

*1990*

## UNUTMA HA...

Gah baş əyib, gah töküb yaş,
Düzüb-qoşdun yavaş-yavaş.
Daş düşəydi o günə kaş. –
Ofsaytda qoydun kişini,
Unutma ha... keçmişini.

Əmrini aldın əlinə,
Qoyma əlini belinə.
Uyub nəfsinin felinə. –
Salma işə vərdişini,
Unutma ha... keçmişini.

Düz yolundan çaşma, dedim,
Qaynamamış daşma, dedim.
Öz həddini aşma, dedim.
Ədalətlə qur işini,
Unutma ha... keçmişini.

Min dəllal girsə araya,
Ağ demə heç vaxt qaraya.
Haqqı satma pul-paraya.
Çıxart, at tamah dişini,
Unutma ha... keçmişini.

Növbə tuturdun qəbula,
Pul demirsən indi pula.
Desələr də meydan sula.
Dəyişmə öz yerişini,
Unutma ha... keçmişini.

Dayın yüz il sağ olsa da,
Arxanda bir dağ olsa da,
Kef-damağın çağ olsa da. –
Yığan tapılar vişini,
Unutma ha... keçmişini.

*2001*

## BİLDİM

Saldım ölüm söhbətini
Dostumu yoxlayım, düzü,
Gəl köməyə sən də – dedim,
Dəyişdi büsbütün üzü.

Yolda görüb dedim ki, bəs,
Mərasimə sən də tələs,
Zərrə qədər çıxmadı səs,
Guya ki, dolmuşdu gözü.

Gəlmədi "dəfn" eyləməyə,
Axtarıram söz deməyə,
Amma ki, bozbaş yeməyə,
Nədənsə, gəlmişdi özü.

Ölən yox idi büsbütün,
Kef eylədim həmənki gün.
Çünki bildim bu dost üçün
Adicə sözdü dost sözü.

## ÖLMƏMİŞDƏN

Ölməmişdən, atasın salmayan əsla yadına,
Dar günündə əlbəəl yetişməyən imdadına.
Qurdurub indi mağar, xələl gəlməsin adına.
Çünki həm vəzifəsi, həm də yəqin ad-sanı var,
Məclisindən görünür, pulludu, hər imkanı var.

Aləmə car çəkilib, çoxdu gələnlərin sayı,
Belə ehsan nədisə, olmayıb heç bəlkə tayı.
Nə desən süfrədə var, bircə araqdan savayı.
Çox güman övladının bir balaca vicdanı var,
Məclisindən görünür, pulludu, hər imkanı var.

Varda, dövlətdə yəqin çox az olar oğluna tən,
Mat qalıblar, özü bəs harda olub indiyəcən?
Niyə vaxtında gəlib soruşmayıb ki, necəsən?
Özü bilmirdi məgər, hər ömrün vida anı var?
Məclisindən görünür, pulludu, hər imkanı var.

Molla cüt-cütdü, görən müftədi yasin, ya nədir?
Elin öz adəti var, bircəciyi azlıq edir?
Təzə dəbdir deyəsən, oğlu da bu dəblə gedir.
Özgə cür olmaz axı, səliqəsi, sahmanı var,
Məclisindən görünür, pulludu, hər imkanı var.

Sağikən qədrini öz oğlu bilməyirsə əgər,
Şübhəsiz ki, atanın qəddini zəmanə əyər.
Toya bənzər belə ehsan günahı yuyar məgər?
Hələ ki, kor atını səyirtməyə meydanı var,
Məclisindən görünür, pulludu, hər imkanı var.

Atanın çəkdiyi zəhmət elə ki, getdi hədər,
Çox sıxıb məngənəsində kişini qüssə, kədər.
Savab olmaz oğula, ağlasa da sübhə qədər.
Hər savab sahibinin tanrı bilən ünvanı var,
Məclisindən görünür, pulludu, hər imkanı var.

*2004*

## YANDIQCA...

Yandıqca yanır, tüstüsü çıxmır, bu nədəndir?
Dərdi, ələmi qəlbini sıxmır, bu nədəndir?
Tənqid seli artırsa da, yıxmır, bu nədəndir?
Çünki yıxılıb, cəhd eyləyir ki, dura bir də,
Şəstlə təzədən stola yumruq vura bir də.

Əlhaydadı, var-gəl eyləyir, kamına çatsın,
Yetsin yetənə, yetməyənə gizli daş atsın.
Öyrəncəlidi, aləmi bir gündəcə qatsın.
Fikrində tutub ki, yenə qurğu qura, bir də,
Şəstlə təzədən stola yumruq vura bir də.

Məclisdə vurur, gah mıxa, gah da nala hərdən,
Fürsət düşən anda çalışır söz ala, hərdən.
Boş-boş danışa, ortaya qovğa sala hərdən.
Vinti boşalıb, əl uzadır ki, bura bir də,
Şəstlə təzədən stola yumruq vura bir də.

Keçmiş yerinin ləzzəti qalmış damağında,
Rütbə gəzir indi yenə pirani çağında.
Yaltaqlıq edənlər qula dönsün qabağında,
Artıb həvəsi lövbəri salsın bura, bir də,
Şəstlə təzədən stola yumruq vura, bir də.

Dünya düzələrmi belə kəslər hələ varsa?
Tənqid edənin alsa canın, bağrını yarsa.
Aləm qarışar, kamına hərgah o çatarsa.
İmkan yaradar cibsoyana, quldura bir də,
Şəstlə təzədən stola yumruq vura bir də.

## BƏH-BƏH

Bəh-bəh, dəyişib abı-hava kefdədi millət,
Çıxdı təzədən ağ günə, çox çəksə də zillət.
Sən də məni təbrik elə bu badəni gillət.
"Əlborcu" düzəltdi işimi, bilməlisən sən,
Fərz et ki, ziyarətdə idim, qayıtmışam mən.

Aləmdi yerim, gəl, görəcəksən necə yerdi,
Dibçəkdəki güllər kabinetdə təzə-tərdi.
Kef əhli bu yerdə unudar, olsa da dərdi.
Nərd atmağa meylin var əgər, gəl ora hərdən,
Fərz et ki, ziyarətdə idim, qayıtmışam mən.

Keçmişdə, nədənsə mənə yanpörtü baxan kəs, –
Böhtan yazan indi görəsən neyləyəcək bəs?!
Əncam çəkəcəm, gec-tezi vardır, çıxacaq səs.
Bilmirdi ki ha çıxmayıb heç kəs hələ yerdən?!
Fərz et ki, ziyarətdə idim, qayıtmışam mən.

Hərçənd ki, gətirmişdi kasıblıq məni zara,
Çox vaxt qayıdırdım evə vallah, üzüqara,
Xoş keçsə güzəran dolanar fəqir-füqara.
Əfsus ki, sənin də xəbərin olmadı məndən,
Fərz et ki, ziyarətdə idim, qayıtmışam mən.

Fərq qoymamışam indiyəcən heç kəsə işdə,
İndi gətirən olsa belə quyruğu şişdə.
Görsəm qudurub, "mat edərəm" üççə gedişdə.
Vardı elə əbləh, baxır indi mənə gendən,
Fərz et ki, ziyarətdə idim, qayıtmışam mən.

Dəllalların hər halda hələ kefləri sazdı,
Əfsus ki, bu dünyanın işin bilən çox azdı.
Bəzən də görürsən ki, fələk bir quyu qazdı.
Düşdü ora hopdum neçə pul "xəstəsi" birdən,
Fərz et ki, ziyarətdə idim, qayıtmışam mən.

*2004*

## ÖMRÜNÜ VURDU BAŞA

Başda oturan sən demə şeypur çalan imiş,
Göstərdiyi yollar da ki, döngə, dalan imiş.
Gec anlamışıq hər cürə vədi – yalan imiş.
Uydurma azadlıq demə şeytan əməliymiş,
Millət sözünü axırı bir gün deməliymiş.

Zülmət, işığı pəncəsi altında əzirmiş,
Hər yerdə ölüm kabusu asudə gəzirmiş.
Yurdumda o vaxt hakim özü "şaha" əliymiş.
Dəymirmiş onun xətrinə, çünki "sağ" əyilmlş,
Millət sözünü axırı bir gün deməliymiş.

Tarixdən otuz yeddi qalıb yaddaşımızda,
Sındırdı qəzəb gürzünü zalım başımızda.
Əfsus ki, boğulduq özümüz göz yaşımızda.
Əl çəkmədi cəllad yenə də, sanki, zəliymiş,
Millət sözünü axırı bir gün deməliymiş.

Ötdü qara yellər elə bildik yanımızdan,
Ağrı-acılar çıxmamış əsla canımızdan.
Yanvarda səma rəngə boyandı qanımızdan.
Bais, demə çiynində paqon zırpı kəl imiş,
Millət sözünü axırı bir gün deməliymiş.

Zülmün yuvası ömrünü vurdu başa, ey dost,
Xallı gədənin də başı dəydi daşa, ey dost.
Ruhən ölüdür, az qalıb ağlı çaşa, ey dost.
Ulduzlu Kremlin özü zülmün təməliymiş,
Millət sözünü axırı bir gün deməliymiş.

*1989*

## QALDI GÖZÜM

Düşünürdüm ki, tərəfkeş yığa bilsəm başıma,
Qatmasa gizli bir əl soyuq su isti aşıma.
Çox güman əl-qol atıb, mız qoyan olmaz yaşıma.
Arxayın səs yığaram və olaram şef mən özüm,
Ümidim çıxdı boşa, qaldı kresloda gözüm.

Arxayındım ki, qurultayda mənə söz verilər,
"Sandığı" qurdalaram, bəzi əsəblər gərilər. –
Dözməyən tənqidimə, bəlkə də tirtap sərilər.
Çox heyif ki, ürəyimdə yığılıb qaldı sözüm,
Ümidim çıxdı boşa, qaldı kresloda gözüm.

Arzuma çatmağıma çoxda inamım yox idi,
Nə danım, çünki ləyaqətli Yazarlar çox idi.
Baxışı bəzisinin sanki mənimçün ox idi.
Əsəbimdən a kişi, yamanca pörtmüşdü üzüm,
Ümidim çıxdı boşa, qaldı kresloda gözüm.

Yəni olmazdı ki, ha... varsa günahım, – keçələr?!
Ya sədr, ya da ki heç olmasa katib seçələr?!
Şəstimə dəydi yaman kefləri kök qulbeçələr.
Çəksələr də mənə dağ, var hələlik məndə dözüm...
Ümidim çıxdı boşa, qaldı kresloda gözüm.

Sən təsəvvür elə ki, orda nə cür halda idim,
Səs verəndə deyəsən, mən biləni, zalda idim.
Azca xatırlayıram, çıxanda lap dalda idim.
Fikrə düşdüm, nə olub, məğzini misraya düzüm...
Ümidim çıxdı boşa, qaldı kresloda gözüm.

Heç rəvadır, məni tək əjdaha ofsaytda qala?!
Vecimə almaram heç əllisi lap zurna çala.
A qohum, öz əməlim saldı məni bax bu hala.
Day keçib, tost demisən, nuş elə, bir yüz də süzüm,
Ümidim çıxdı boşa, qaldı kresloda gözüm.

*2004*

## ÖYRƏNİB MÜFTƏ PULA

Baxma artist babadı, yoxdu məlahətli səsi,
Demə çoxdan tamada olmağa varmış həvəsi.
Toylara getməyini bilməmiş olmaz rəisi.
Kefdədir, lövbərini hər gecə bir toyda salır,
Cəmi üç-dörd saata bir xeyli əlmuzdu alır.

Çox güman səhnədə o, zəhmətə salmır canını,
Toyda ancaq, görəsən heç yerə qoymur yanını.
Məclisin hay-küyü də əsla qaraltmır qanını.
Görsə ki toy uzanır, dilxor olur, fikrə dalır,
Cəmi üç-dörd saata bir xeyli əlmuzdu alır.

Görünür işdə hələ tənə edən yoxdur ona,
Arxayındır ki, girir hər gecə bir başqa dona.
Kaş zəmanə onu bir rəndələyə, azca yona.
Hələ ki, kef-damağı çağdı, gülür, çırtma çalır,
Cəmi üç-dörd saata bir xeyli əlmuzdu alır.

Gəlir artıqca yəqin düşməyir heç işdə yada,
Öyrənib müftə pula, çünki gəlib ağzı dada,
Yoxdu bir ehtiyacı indi daha fəxri ada.
Bülleten dada çatır, toy günü işdən də qalır,
Cəmi üç-dörd saata bir xeyli əlmuzdu alır.

Sənətə xor baxana kimsə yumursa gözünü,
Yeri gəldikdə susursa və demirsə sözünü.
Liberallıq salacaq əngələ bir gün özünü.
Bəzən artist – tamada bax belə yolla “ucalır”,
Cəmi üç-dörd saata bir xeyli əlmuzdu alır.

## YEDƏKDƏ...

Çoxdandı gözaltı eləmişəm neçə postu,
Dartdı yedəyində yuxarı arxalı dostu.
Dost şəninə vardır “kişinin” “osobı” tostu. –
Hər yerdə deyir, aləmə bəlkə eləyib car,
Vallah, yedəyə qoşulmağa sinov gedən var.

Çoxdur yedəyin aludəsi, qoşqu sayağı,
Az-maz ki ucaldı, yerə dəymir ki ayağı.
Vay halına, tək bircə yedəkdirsə dayağı. –
İşdir bu dayaq laxlasa, dünya olacaq dar;
Vallah, yedəyə qoşulmağa sinov gedən var.

Əfsus ki, yedəksiz ucalan cüzidi, azdı,
Ah-vay eləmirsə, demək olmaz kefi sazdı.
Bədxahların hərçənd avazı köhnə avazdı;
Zəhmətlə aşan sədləri olmaz ki, yəqin xar;
Vallah, yedəyə qoşulmağa sinov gedən var.

Vardır eləsi, vadar olur, bekar qalınca,
Lap zorla da olsa sürünür yedək dalınca. –
Ta ki, uca bir mərtəbəyə əmrin alınca.
Yoxdur pulu versin, utanır, ar eyləyir, ar!
Vallah, yedəyə qoşulmağa sinov gedən var.

Yüksəldi bu yolla tutalım varlı olan kəs,
Xamdırsa əgər, bilmir işi, neyləyəcək bəs?
Şəksiz, cibi boş, yumbalananda çıxacaq səs,
Hay-küy düşəcək, ağlayacaq bəlkə də zar-zar;
Vallah, yedəyə qoşulmağa sinov gedən var.

Hər halda yedək dada çatan sirli bir əldi,
Dartır aparır, müftə aparsa, xoş əməldi.
Əl tutmağı öyrətməyə bu yaxşı təməldi.
Canlı yedək olsa, səsini lap eşidər kar!
Vallah, yedəyə qoşulmağa sinov gedən var.

*2004*

## GÖZLƏ BİR AZ DA

Dümsükləmə, onsuz da ayılmaz qara baxtın,
Əncam eyləyən yoxdu sənə, getsə də vaxtın.
Olmaz ki, yəqin heç vədə tacın, nə də taxtın. –
Hərçənd qohumun, dost-tanışın heç sayı yoxdur,
Əfsus ki, qolundan yapışan bir dayı yoxdur.

Bilmir ki, əlifba sırası başlanır A-dan,
Gəl ki, sənə rişxənd eyləyir birpara nadan.
Hardan tapasan arxa-dayaq, yoxsa binadan.
Qondarma dayı gəzmə nahaq, ah-vayı çoxdur,
Əfsus ki, qolundan yapışan bir dayı yoxdur.

Müftə dayılıq olsa edən bil ki, yalandır,
Axtarma nahaq çünki, çoxu rüşvət alandır.
Dostundu filankəs də, nə olsun ki, kalandır.
Tərif eyləyirsən ki, onun heç tayı yoxdur,
Əfsus ki, qolundan yapışan bir dayı yoxdur.

İllərlə sənə can da desə, olsa da dostun,
Düşməz yadına söylədiyin bir dənə tostun.
Gendən dolanar, yad eləməz olmasa postun.
Çünki cibi boşsan bilir orda payı yoxdur,
Əfsus ki, qolundan yapışan bir dayı yoxdur.

Sındırma a dost, sən özünü, gözlə bir az da,
Müşküldü işin, bəlkə düzəlsin təzə yazda.
Yəqin belə qalmaz, dəyişər köhnə avaz da.
Səbr eylə, qabaqda hələ ki, may ayı çoxdur,
Əfsus ki, qolundan yapışan bir dayı yoxdur.

## ÖLMÜŞƏM, YOXSA SAĞAM...

Dost deyən yerdə sənə, kaş quruyaydı bu dilim!
Nanəcib olduğunu mən yetim, hardan, nə bilim?!
Satmışam evdə nə var, bircə qalıb köhnə kilim,
Baş çəkib bircə dəfə dostu yada salmısan heç?
Ölmüşəm, yoxsa sağam, ayə, xəbər almısan heç?!

Görmüsən ki, neçə illər saz olub kef-damağım,
Həftədə lap azı, bir dəfə olurdun qonağım.
Elə ki, bir balaca laxladı arxam, dayağım, –
Kişisən, boynuna al, bir dəfə zəng çalmısan heç?
Ölmüşəm, yoxsa sağam, ayə, xəbər almısan heç?!

İndi yoxdur nə vəzifəm, nə də ki, cah-calalım,
Düşünürsən ki, yəqin bir də çətin ki, ucalım,
Yanılırsan a yazıq, amma sənə var sualım, –
Duz-çörək kəsdiyinin qayğısına qalmısan heç?
Ölmüşəm, yoxsa sağam, ayə, xəbər almısan heç?!

Şənimə məclisdə az gurultulu tost demisən?
Şotuma badə vurub, müftə kabab az yemisən?
Sən demə, vəzifəmin xətrini çox istəmisən.
Yad edib keçmişini, de, xəyala dalmısan heç?
Ölmüşəm, yoxsa sağam, ayə, xəbər almısan heç?!

Səni mən adam bilib, yaxın sanırdım özümə,
İndi bildim, neçə il pərdə asıbsan gözümə.
Eybi yoxdur, dözərəm, irad da tutsan sözümə. –
A kişi, indiyəcən sən belə alçalmısan heç?
Ölmüşəm, yoxsa sağam, ayə, xəbər almısan heç?!

*2004*

## YATMA, MÜDİRCAN

Keçmiş müdirim dalda basıb-kəsdi yalandan,
Hərçənd ki, gəlirdi işə də gizli dalandan.
Söhbət də açırdı hələ bir darda qalandan.
Boş-boş danışıb səndə yalan satma, müdircan,
Aləm ayılıb, mürgü vurub, yatma, müdircan!

İclasda sənə hər dəfə zillənsə də min göz,
Əfsus ki, kəsərsizdi nədənsə dediyin söz.
Hərdən də deyirsən ki, qapaz dəysə, lal ol, döz. –
Boş şeydi deyib, gəl məni aldatma, müdircan,
Aləm ayılıb, mürgü vurub, yatma, müdircan!

Yatmaz döşümə bir havanı min cürə çalsan,
Səbrim tükənibdir, qanıram, sən deme kalsan.
Sussam, mənə bir gün də deyərlər qara malsan.
Arifləri qanmazlara sən qatma, müdircan,
Aləm ayılıb, mürgü vurub, yatma, müdircan!

Olmaz zərəri, sən bada getmişləri ansan,
Tarix səni əfv etməz, əgər keçmişi dansan.
Dünya dağılar, tər tökənin halına yansan?!
Yanpörtü baxıb, qaşlarını çatma, müdircan,
Aləm ayılıb, mürgü vurub, yatma, müdircan!

Dünya dəyişib, indi zaman başqa zamandır,
Xeyrin güdəni iş başına qoyma, amandır!
Onsuz da daha bir çoxunun halı yamandır.
Qurşanma kefə, iş-gücünü atma, müdircan,
Aləm ayılıb, mürgü vurub, yatma, müdircan!

## OLMASA QONŞU PAXIL...

Olmasa qonşu paxıl, bağda çəpər-zad nə gərək,
Kölgəni qamçılayan qohum varsa, yad nə gərək.
Varsa bir nəm-nişanı, tanıtmağa ad nə gərək.
Güman etmə düzələr, quyruğu qalsa tələdə,
Mərəzindən beləsi əl çəkə bilməz ölə də.

Zahirən alicənab görünsə də birparası,
Görsə ki, qonşusunun bir sürüdür mal-qarası.
Od tutub, sanki, yanır, heyif, görünmür harası...
Gündə bir cildə girən var aramızda hələ də,
Mərəzindən beləsi əl çəkə bilməz ölə də.

Ola cürət vurasan böyləsinə yağlı qapaz,
Deyəsən, bəsdi, ay əbləh, sənə azdır, bu da, az!
Kişiyə, başqasına paxıllıq etmək yaramaz
Nadürüst tuş olacaq tənəyə bundan belə də;
Mərəzindən beləsi əl çəkə bilməz ölə də.

Xəstəlikdir görünür bəzilərində belə hal,
Qulağı kar, gözü çəp, hətta dili olsa da lal.
Zənn edir, şakərini bilməsələr, yoxdu zaval. –
Arxayındır ki, çıxar, işdi düşərsə gölə də,
Mərəzindən beləsi əl çəkə bilməz ölə də.

Ah çəkər, görsə ki, bir şadyana məclis qurulub, –
Ya da bir ac tifilin hardasa keyfi durulub.
Gəl ki, alsa qulağı tində filankəs vurulub.
Açılar qaş-qabağı, bəlkə salar lap ələ də,
Mərəzindən beləsi əl çəkə bilməz ölə də.

Desələr cənnət-məkandır lüt-üryanın birisi,
Hay salar ki, ay aman, kefdədi dollar hərisi. –
Ora layiq deyil heç nə ölüsü, nə dirisi.
Atmaz öz vərdişini göydəki Allah gələ də,
Mərəzindən beləsi əl çəkə bilməz ölə də.

*2004*

## QOYMAZ MƏNİ DARDA...

Çoxdandı gəzirdim təzə ortaq – bekar olsun;
Əldən iti, alver bacaran, işgüzar olsun.
Tapdı belə həmkar mənə, qonşum da var olsun.
Saldıq təzə lövbər yenə xudmani bazarda,
Sandım ki, ilişsəm, kişi, qoymaz məni darda.

Baxtım gətiribdir ki, bazarkomla da curdur,
Ötkəm danışandır, səsi dümbək kimi gurdur.
Bir eybi odur ki, üzü məndən də çopurdur.
Vardır həvəsi vurmağa hər gündə naharda,
Sandım ki, ilişsəm, kişi, qoymaz məni darda.

Ah-uf eylədim, geydi, bu zəhmət mənə qaldı,
Qorxdum maya batsın, dilini tez işə saldı.
Gur yerdə olan sərfəli piştaxtanı aldı.
Yığdı başıma dost-tanışın vardısa harda,
Sandım ki, ilişsəm, kişi, qoymaz məni darda.

Tutdum ki, xəbər ortaq olan hansı Namazdır,
Bildim yazacaqdır, aramız çox da ki, sazdır.
Şahid də durur, bax bu da hərçənd mənə azdır.
Çünki mən özüm sirrimi açdım ona barda,
Sandım ki, ilişsəm, kişi, qoymaz məni darda.

Artdıqca qazancım işə can-başla girişdim,
Köhnə evi dərhal təzə mənzilə dəyişdim.
Əfsus ki, yazıbmış, bu dəfə çox tez ilişdim,
Ordan dönəcəm bilmirəm heç hansı baharda.
Getdim güdaza “dostun” əliylə mən axırda,
Qaldım təzədən mən başıdaşlı yenə darda.

## VALOKORDİN

Fikirlərin dənizində
elə bil ki, batır anam,
Dalğaların sədasına
öz səsini qatır anam.
Sorur məndən dönə-dönə
söylə, bala, nədir dərdin?
Niyə səndən bir an belə
ayrı düşür valokordin?
Ürək susur, ürək dözür
hər ağrıya, hər acıya.
Ondan başqa varmı bir kəs
qəlbi yana, həm acıya?
Ərşə çıxıb yuxusu da
əsla yatmır o, gecələr.
Dalır dərin xəyallara
hey düşünür görən nələr?!
Fəqət kimə söyləyim ki,
fəryadımı o da ansın.
Söylədiyim həqiqətdən
qığılcımsız alovlansın?
Tab etməyir sinəmdəki
zəif vuran xəstə ürək,
Pıçıldayır: – "Aç sirrini
anan bunu bilsin gərək".
Dedim: – Ana, dinlə məni
Yüngülləşsin bir az dərdim.
Sonra bil ki, nəyə lazım
Yol-yoldaşım valokordin.
Xəbis ötər əsla sormaz
Ağlayanın dərdi nədir,
Düşünmə bu qəribədir.
Çünki onun qəlbindəki
Ürək deyil, biganədir!

Beləlləri insanlıqdan dəm vuranda
Niyə donmur axan qanı?
Tərk etməyir bu dünyanı?
Daş ürəkli insanlara əsər etməz əsla belə,
Nə bir fəryad, nə bir nalə.
Bircə anda min dona girənlərə,
İnsanlığın ləyaqətin vəzifədə görənlərə,
Dünənini tez unudub, özlərini öyənlərə,
Haqsızlığı görüb susan,
Gözlərini döyənlərə,
Dözmür ürək,
Bir körpətək,
Dilə gəlir, fəryad edir, mənə nicat?
Sən ey həyat!
Nədir əlac? – Valokordin!
Valokordin!
Üzdə bir cür, dalda bir cür
danışanlar,
Haqqı qoyub ağ yalanla barışanlar,
Qaraya ağ söyləyənlər,
Üzgörənlik eyləyənlər,
Vəzifəsi xatirinə yüz baş üstə söyləyənlər,
Tülkü kimi yaltaqlanıb yerli-yersiz baş əyənlər,
Düşünürlər bu həyatda fəqət belə olsun gərək,
Necə dözsün buna ürək?
Təlatümə gəlir səssiz.
Duyan ürək deyil hissiz.
Sızıldayır acı-acı,
Deyin nədir bəs əlacı?
Valokordin!
Valokordin!
Aramızda vardır hələ tək-tük qalan,
Özgəsinin qüssəli bir aləmindən
Nəşələnən, həm zövq alan,
Daşürəkli insanlardır!

Bax, onlardır
Ürəyimə ağrı salan!
Söz-söhbəti ucdantutma min bir yalan.
Rəqqas kimi hazırdırlar
ortalığa atılmağa,
Şan-şöhrətçün razıdırlar
qara rəngə qatılmağa,
Təki rəis olsun barı,
Bir işçisi, bir möhürü,
bir açarı.
Belələri məclislərdə
"mənəm-mənəm" söyləyəndə,
Milçək boyda bir günahı
şişirdib fil eyləyəndə,
Kəmsavad bir ağlı dayaz
alim kimi, danışanda,
Fəlsəfəsi çürük söhbət,
həddi-səddi o aşanda
Dözmür ürək,
Nə eyləmək?
Ana söylə, indi ürək ağrımasın
bəs neyləsin?
O nə qədər gecə-gündüz xısın-xısın
gileylənsin?
Bəlkə ana, dilsiz ürək
söylədiyi rəvayətdir?!
Haqq dalınca bir qeybətdir?
Yox, yox, ana, qeybət deyil, həqiqətdir!
Necə dözsün buna ürək?
Axı, ana, o daş deyil, parça ətdir!
Bu həyatın mənasını qanmayanlar,
Millət üçün zərrə qədər yanmayanlar,
Ana bir gün gələr zaman,
Ürək mənə pıçıldayan bu sözlərə
sən də inan,

Bu dünyanı bax o kəslər tərk edəcək,
Bax, o zaman dilsiz ürək
öz sözünü söyləyəcək:
“Daha mənə valokordin
deyil gərək!”
Anam susur, sormur daha
nəyə lazım valokordin
Baxışları dilə gəlir: –
Oğul, bildim nədir dərdin!

*1973*

## MÜNDƏRİCAT




"Şərq-Qərb" Nəşriyyat evində çapa hazırlanmışdır

| | |
|---|---|
| Buraxılışa məsul: | *Rasim Müzəffərli* |
| Texniki redaktor: | *Rövşən Ağayev* |
| Kompyuter səhifələnməsi: | *Əsmər Şükürova* |
| Korrektor: | *Fərida Səmədova* |
| Üz qabığının dizaynı: | *Tural Ağayev* |

Çapa imzalanmışdır 08.12.2011
Formatı 60×90 $^1/_{16}$. Fiziki çap vərəqi 35,5
Sifariş N303. Tiraj 1000

"Şərq-Qərb" Nəşriyyat evində çap olunmuşdur
AZ 1123, Bakı, Aşıq Ələsgər küçəsi, 17
Tel.: (+99412) 370 68 03; 374 83 43
Faks: (+99412) 370 68 03; 370 18 49
www.eastwest.az